

# Müqəddimə

**Həmd olsun Allaha. Sevimlimiz, əzizimiz və Peyğəmbərimiz Muhəmmədə salat və salam olsun.**

Müsəlman bacım və qardaşım – Allah sizə rəhm etsin – bilin ki, hər birimiz dörd məsələni bilməliyik:

❶ **Elm:** Allahı, Onun peyğəmbərini tanımaq və İslam dinini bilməkdir. Çünki Allaha elmsiz ibadət olunmaz. Kim kor-koranə ibadət edərsə haqq yoldan azmış kimsələrə oxşayar.

❷ **Əməl:** Bildiyinə əməl etməyən insan Allahın qəzəbinə gəlmişlərə bənzəyər. Çünki bildiyinə əməl etməyənlər də Allahın qəzəbinə gəlmişdilər. Bəzən şeytan öz hiyləgərliyini işə salıb insanı elm öyrənməkdən çəkindirir ki, guya elm öyrənməsə Allah yanında cəhaləti ilə üzrxahlıq edə bilər. Amma o bilmir ki, öyrənməyə imkanı olub bu fürsətdən istifadə etməyən insanın üzrxahlığı keçərli deyildir. Nuh tayfası da hiylə işlədib üzrxahlıq üçün özlərinə yer qalsın deyə *"barmaqlarını qulaqlarına tıxadılar, (Nuhu görməsinlər deyə) libaslarına büründülər..."* (Nuh: 7).

❸ **Bildiyinə dəvət etmək:** Alimlər və təbliğatçılar Peyğəmbərlərin varisləridirlər. Uca Allah İsrail oğullarına lənət etmişdi. Çünki *"Onlar bir-birini etdikləri pis əməldən çəkindirmirdilər. Onların gördükləri iş necə də pis idi!"* (əl-Maidə: 79). Təbliğatla məşğul olmaq və elm öyrənmək "fərzul kifayə"dir, yəni bir qrup insan bu işlə məşğul olsa digərləri məsuliyyətdən azaddır. Yox əgər bu işi bütünlüklə tərk etsələr o zaman günah qazanarlar.

❹ **Çətinliklərə səbir etmək:** Elm öyrənərkən, əməl və təbliğ edərkən səbirli olmaq.

Biz də öz növbəmizdə cəhalətin aradan qaldırılması işinə ortaq olmaq və vacib elmi öyrənmək üçün bu müxtəsər kitabda Qurani Kərimin son üç cüzünün təfsiri ilə birlikdə, şəriət elmlərindən ən lazımlı məsələləri də toplamışıq. Qurani Kərimin son üç cüzünün kitaba salınması bu surələrin çox oxunması ilə əlaqədardır. Necə deyərlər: "**Hamısını əldə edə bilmirsənsə, çoxunu əldən buraxma.**"

Kitabdakı məlumatları müxtəsər, hədislərin isə yalnız səhih olanlarını təqdim etmişik. Biz bu kitabın kamil olduğunu iddia etmirik. Kamillik Allahın Özünə məxsus olan bir xüsusiyyətdir. Bu azacıq əmək sərfidir. Məlumatların doğruluğu Allahdan, səhvlər isə nəfsimizdən və şeytandandır. Əgər nədəsə səhvə yol vermişiksə bilin ki, Allah və rəsulu bundan uzaqdır. Eyiblərimizə gözəl şəkildə irad bildirib onları bizə hədiyyə edən hər kimsəyə Allah rəhm etsin.

Kitabın hazırlanmasında, çap edilməsində, oxunmasında və öyrədilməsində əməyi olan hər kəsə Allah tərəfindən ən gözəl mükafat bəxş edilsin, onların bu savab işi məqbul sayılsın, dərəcələrini ucaltsın.

*Daha doğrusunu bilən Allahdır. Peyğəmbərimiz Muhəmmədə, ailəsinə və əshabına Allahın salavatı və salamı olsun.*

**İslam dünyasının bir çox alimləri və elm tələbələri bu kitabı tərifləmiş və tövsiyə etmişlər.**

www.tafseer.info azer@tafseer.info

# Mündəricat





# Quran oxumağın savabı

**Quran Allahın kəlamıdır. Onun digər kəlamlara nisbətən üstünlüyü Allahın məxluqatı üzərindəki üstünlüyü kimidir. Dilin oxuduğu ən gözəl kəlam da odur.**

Quranı öyrənməyin, öyrətməyin və oxumağın çox böyük fəziləti vardır.

**Onu öyrətməyin savabı:** Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: "***Sizin ən xeyirliniz Quranı öyrənən və öyrədəndir***" Buxari.

**Onu oxumağın savabı:** Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: "***Kim Allahın kitabından bir hərf oxuyarsa, ona görə bir savab qazanar. Hər bir savabın isə, on mislində əvəzi ona verilər***" Tirmizi.

**Quran öyrənməyin, əzbərləməyin və gözəl oxumağın üstünlüyü:**

**Peyğəmbər** (*Sallallahu aleyhi və səlləm*) **demişdir:** "***Quranı əzbər bilib oxuyan kimsənin misalı, vəhy daşıyan şərəfli və itaətkar mələklərin misalı kimidir. Çətinlik çəkərək Quran oxumağa davam edən kimsə üçün iki savab vardır***" Buxari və Müslim.

**Digər hədisdə Peyğəmbər** (*Sallallahu aleyhi və səlləm*) **deyir:** "***Quran oxuyan insana deyiləcəkdir: Dünyada etdiyin kimi aramla oxu və yüksəl. Həqiqətən sənin məqamın oxuduğun son ayə məqamında olacaqdır***" Tirmizi.

**Xəttabi deyir:** *"Rəvayətdə deyilir ki, Quran ayələrinin sayı cənnətin pillələri sayındadır. Quran oxuyana deyiləcəkdir: Quran ayələrini oxuduğun qədər pillələrlə yüksəl. Kim Quranı tam oxuyarsa, Axirətdə cənnətin ən yüksək pilləsinə yüksələr. Kim Qurandan bir parça oxuyarsa, onun yüksəlişi oxuduğunun mislində olar. Onun mükafatı qiraəti bitən yerə qədər olar." (s.s.)*

**Övladı Quran öyrənən kimsənin savabı:** Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: "***Kim Quran oxuyar, öyrənər və ona əməl edərsə, Qiyamət günü onun valideynlərinə günəş kimi parıldayan nurlu tac taxılar. Həmçinin onlara dünyada misli olmayan ipəkdən paltar geyindirilər. Onlar təəccüblə soruşarlar: Bunlar bizə nə üçün verilmişdir? Onlara deyilər: Sizin övladlarınız Quran öyrəndikləri üçün***" Hakim.

**Qiyamət günü Quranın öz sahibinə şəfaət etməsi:** Peyğəmbər ﷺ demişdir: "***Quranı oxuyun. Həqiqətən Quran qiyamət günü öz sahibi üçün şəfaətçi olacaqdır***" Müslim.

**Digər hədisdə deyilir:** "***Qiyamət günü oruc və Quran öz sahibi üçün şəfaətçi olacaqlar***" Əhməd və Hakim.

**Quran oxumaq və öyrənmək üçün toplaşanların savabı:** Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: "***Allahın evlərindən birində toplaşıb, Onun kitabını***

***oxuyan və öyrənən topluma mütləq sükunət çökər, mərhəmət onları bürüyər, Mələklər onları əhatəyə alar və uca Allah onları hüzurundakılara xatırladar*"** Əbu Davud.

**Quran oxumağın ədəb-ərkanı:** İbn Kəsir bəzi ədəb qaydalarını qeyd etmiş və demişdir: *"Quran oxuyarkən dəstəmazlı olmaq, misvaklanmaq, gözəl geyimini geyinmək, qibləyə tərəf yönəlmək, əsnəyərkən oxumağı dayandırmaq, zərurət olmadan söhbət edərək qiraəti kəsməmək, fikrini oxuduğuna cəmləmək, müjdə verən ayələrdə dayanıb dua etmək, əzab ayələrində dayanıb Allaha sığınmaq, Quranı açıq saxlamamaq, üzərinə bir şey qoymamaq, digər oxuyanlara baxıb bəhsə girərək səsini yüksəltməmək, bazar və lağ-lağı olan yerlərdə oxumamaq"*.

**Quran necə oxunmalıdır?** Ənəs ﷺ **Peyğəmbərin** ﷺ Quran oxuması haqqında soruşulduqda belə cavab vermişdi: **"*O, qiraətini uzadardı. Bismilləhir Rahmənir Rahim ayəsini oxuyanda, Bismilləh və ər-Rəhman və ər-Rəhim sözlərini uzadardı*"** Buxari.

**Quran oxumağın savabının qat-qat artırılması:** Kim sırf Allah üçün Quran oxuyarsa, savaba nail olar. Lakin insan ürəkdən, düşünərək və anlayaraq oxuduqda bu savab daha çox olur. Hər bir hərfə görə on qat savabdan yeddi yüz qata qədər savab qazanır.

**Sutka ərzində Quran oxumağın miqdarı:** Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) səhabələri hər gün özlərinə Qurandan pay ayırardılar. Onlardan heç kəs yeddi gündən az müddətdə Quranı xətm etməyi özlərinə adət etməzdilər. Hətta üç gündən az müddətdə Quranı xətm etmək qadağan belə olmuşdur.




سُورَةُ الفَاتِحَةِ




# əl-Fatihə surəsi (1)

## *(kitabı açan)*

Quran bu surə ilə başladığı üçün ona "kitabın açarı" adı verilmişdir. Bu surə Quranın yazılış və oxunuş tərtibatında ilk sırada gələn surədir. Amma bu surə ilk nazil olan surə deyil. Bir rəvayətə görə bu surə Məkkədə, digərinə görə isə Mədinədə nazil olmuşdur. Bu surə "Kitabın açarı", "Kitabın anası", "Yeddi səna", "Həmd surəsi", "Namaz surəsi", "əl-Vaqiyə" və s. adlarla adlandırılmışdır. Bu surənin fəziləti barədə bir çox hədislər rəvayət olunmuşdur. Belə hədislərin birində Peyğəmbər (Səllallahu aleyhi və səlləm) deyir: ***"Əlhəmdulillahi rabbil aləmin – yeddi səna və mənə verilən əzəmətli Qurandır"***.

1 **﴾ər-Rəhman və ər-Rəhim Allahın adı ilə!﴿** Bismillah Quran surələrinin əvvəlində ayə olaraq deyil, bir surəni digərindən ayıran bir cümlə olaraq işlədilmişdir. Bunu hər surənin əvvəlində oxumaq müstəhəbdir *(bəyənilləndir)*. Yalnız Tövbə surəsinin əvvəlində oxumaq məkruhdur *(bəyənilmir)*. **﴾Allah﴿** kəlməsi yalnız Allah təalaya məxsus olub Ondan başqasına verilməmişdir. Sözün kökü "İlah"-dan götürülmüşdür. Qeyri-müəyyənlik halında *(yəni əl-ilah deyil, ilah kimi)* işlədildikdə haqq və ya batil olan hər ilaha şamil olunurdu. Amma sonradan bu ad deyildikdə, yalnız haqq olan ilah nəzərdə tutuldu. **﴾Rəhman və Rəhim﴿** Bunlar "rəhmət"-dən düzəldilmiş sözlərdir. *ər-Rəhman* sözü *ər-Rəhim* sözündən daha çox mübaliğə edilmişdir. ər-Rəhman sözü Allahdan başqasına aid edilməmişdir.

2 **﴾Həmd olsun Allaha﴿** **Həmd** Allahın bəxş etdiyi gözəlliklərə dil ilə səna etməkdir. Həmd, yalnız söz ilə olur. Şükr isə, söz, qəlb və əzalarla olur. Şükr nemət müqabilində, həmd isə, həmd olunanın kamilliyinə və həmçinin Onun verdiyi nemətlərə görə də ola bilər. Həmd də, şükür də uca Allaha məxsusdur. **﴾aləmlərin Rəbbinə﴿ ər-Rəbb** sözü uca Allahın adlarından biridir. Bu ad başqasına əlavə ilə deyilə bilər. Məsələn, bu kişi evin rəbbidir *(yəni, sahibidir)*. Rəbb sözü sahib, ağa, islah edən, işləri yoluna qoyan və ibadət olunan deməkdir. **﴾Aləmlər﴿** sözü "aləm" sözünün cəmidir. Bu, Allahdan başqa, mövcud olan hər şeyə şamildir. Aləm sözü əqli olanlara şamil olunur. Bura dörd qism məxluq daxildir: İnsanlar, cinlər, mələklər və şeytanlar.

3 **﴾Rəhman və Rəhim olana.﴿** Uca Allahın aləmlərin rəbbi olaraq vəsf edilməsində bir qorxu nümayişi olduğu üçün bundan sonra, dərhal ümidləndirici **﴾Rəhman və Rəhim﴿** adları qeyd olunmuşdur. Beləliklə, uca Allah Öz sifətlərində Ondan qorxmağı və Ona rəğbət bəsləməyi cəm etmiş olur. Bu isə, məxluq üçün Allahın itaətinə dəstəkdir.

4 **﴾Haqq-Hesab gününün sahibinə!﴿** Sahib uca Allahın etdiyi felin sifətidir. Haqq-Hesab günü uca Allahın bəndələrinə əməllərinin qarşılığını verdiyi gündür. Qatadə deyir: Haqq-Hesab günü uca Allah tərəfindən bəndələrinə etdikləri əməllərə görə qarşılıq verdiyi, yəni cəzalandırdığı və ya mükafat verdiyi gündür.

5 **﴾Biz, yalnız Sənə ibadət edirik və yalnız Səndən kömək diləyirik!﴿** Biz, ibadəti və kömək diləməyi yalnız Sənə yönəldirik. Səndən başqasına ibadət etmir, başqasından kömək diləmirik. İbadət mütiliyin və itaətin ən ali məqamıdır. İbadət kəlməsi şəriət termini olaraq, kamil məhəbbət, mütilik, itaətkarlıq və qorxunu özündə cəm edir. İbadət kəlməsinin kömək sözündən öncə işlədilməsi birincinin ikinciyə vasitə olmasına görədir. İbn Abbas ﷺ **﴾yalnız Səndən kömək diləyirik!﴿** ayəsi haqqında deyir: ***"Ey Rəbbimiz, tövhidi və qorxumuzu başqasına deyil, yalnız Sənə yönəldirik. İtaət və digər işlərimizdə başqasından deyil, yalnız Səndən kömək diləyirik."***

6 **﴾Bizi doğru yola yönəlt!﴿** Yönəltmək *(Hidayət)* iki növdür. ***Birincisi: müvəffəqiyyət hidayətidir.*** Bu növ hidayət, yalnız Allaha məxsusdur. Uca Allah buyurur: ***﴾(Ya Rəsulum!) Şübhəsiz ki, sən, istədiyini doğru yola yönəldə bilməzsən. Amma Allah dilədiyini doğru yola salar...﴿*** (əl-Qəsəs: 56). ***İkincisi: yol göstərmə və yönəltmə hidayətidir.*** Bu isə, peyğəmbərlərə, onların davamçıları olan alimlərə və dəvətçilərə aiddir. Uca Allah buyurur: ***﴾...Sən düz yola yönəldirsən.﴿*** (əş-Şura: 52). Haqqında danışılan ayə hər iki

سُورَةُ المُجَادَلَة
ترتيبها ٥٨ — آياتها ٢٢

بِسْمِ اللَّهِ الرَّحْمَٰنِ الرَّحِيمِ
قَدْ سَمِعَ اللَّهُ قَوْلَ الَّتِي تُجَادِلُكَ فِي زَوْجِهَا وَتَشْتَكِي إِلَى اللَّهِ
وَاللَّهُ يَسْمَعُ تَحَاوُرَكُمَا إِنَّ اللَّهَ سَمِيعٌ بَصِيرٌ ١ الَّذِينَ يُظَاهِرُونَ
مِنكُم مِّن نِّسَائِهِم مَّا هُنَّ أُمَّهَاتِهِمْ إِنْ أُمَّهَاتُهُمْ إِلَّا اللَّائِي
وَلَدْنَهُمْ وَإِنَّهُمْ لَيَقُولُونَ مُنكَرًا مِّنَ الْقَوْلِ وَزُورًا وَإِنَّ
اللَّهَ لَعَفُوٌّ غَفُورٌ ٢ وَالَّذِينَ يُظَاهِرُونَ مِن نِّسَائِهِمْ ثُمَّ يَعُودُونَ
لِمَا قَالُوا فَتَحْرِيرُ رَقَبَةٍ مِّن قَبْلِ أَن يَتَمَاسَّا ذَٰلِكُمْ تُوعَظُونَ
بِهِ وَاللَّهُ بِمَا تَعْمَلُونَ خَبِيرٌ ٣ فَمَن لَّمْ يَجِدْ فَصِيَامُ شَهْرَيْنِ
مُتَتَابِعَيْنِ مِن قَبْلِ أَن يَتَمَاسَّا فَمَن لَّمْ يَسْتَطِعْ فَإِطْعَامُ سِتِّينَ
مِسْكِينًا ذَٰلِكَ لِتُؤْمِنُوا بِاللَّهِ وَرَسُولِهِ وَتِلْكَ حُدُودُ اللَّهِ
وَلِلْكَافِرِينَ عَذَابٌ أَلِيمٌ ٤ إِنَّ الَّذِينَ يُحَادُّونَ اللَّهَ وَرَسُولَهُ كُبِتُوا
كَمَا كُبِتَ الَّذِينَ مِن قَبْلِهِمْ وَقَدْ أَنزَلْنَا آيَاتٍ بَيِّنَاتٍ وَلِلْكَافِرِينَ
عَذَابٌ مُّهِينٌ ٥ يَوْمَ يَبْعَثُهُمُ اللَّهُ جَمِيعًا فَيُنَبِّئُهُم بِمَا
عَمِلُوا أَحْصَاهُ اللَّهُ وَنَسُوهُ وَاللَّهُ عَلَىٰ كُلِّ شَيْءٍ شَهِيدٌ ٦

növü əhatə edir. Çünki xeyirə yönəldən və Onun yolunu bizə göstərən peyğəmbərləri göndərən də uca Allahdır. "Doğru yol" sözü ilə əyriliyi olmayan düz yol nəzərdə tutulur. Sözün ayədəki mənası isə İslam yoludur.

7 **﴾Nemət verdiyin kəslərin yoluna!﴿** Nemət verilənlər uca Allahın bu ayəsində qeyd olunur: ***﴾Allaha və peyğəmbərə itaət edənlər Allahın nemətlər verdiyi nəbilər (peyğəmbərlər), siddiqlər, şəhidlər və salehlərlə bir yerdə olacaqlar. Onlar necə də gözəl yoldaşlardır!﴿*** *(ən-Nisa: 69).* **﴾Qəzəbə düçar olmuşların...﴿** Yəni bəzi yəhudilərin. Çünki onlar haqqı bildikləri halda onu tərk etmiş, ondan üz çevirmiş və buna görə Allahın qəzəbinə layiq olmuşdular. Əhməd və İbn Macə (rəhimə-humallah) Peyğəmbərdən (Sallallahu aleyhi və səlləm) belə bir hədis rəvayət edirlər: ***"Yəhudilər sizin salam və amin deməyinizə həsəd etdikləri kimi başqa şeyə həsəd aparmırlar".*** **﴾və azmışların yoluna yox!﴿** Yəni bəzi xaçpərəstlərin. Çünki onlar cahillikləri ucbatından haqdan azmışdılar. Onlar İsa (əleyhissəlam) barəsində açıq-aşkar şəkildə yollarını azmışdılar. Amin sözünün mənası *"Allahım dualarımızı qəbul et"* – deməkdir.

# əl-Mucadilə surəsi 58

## *(mübahisə edən qadın)*

1 **﴾*(Ya Peyğəmbər!)* Əri barəsində səninlə mübahisə edən və Allaha şikayət edən qadının sözünü Allah eşitdi.﴿** Yəni sənin yanına gələrək bu barədə söhbət açıb **﴾Allaha şikayət edir﴿.** Aişə (radıyallahu anha) deyir: ***"Eşitməyi ilə hər şeyi əhatə edən Allah necə də Ucadır. Mən Xovlə bint Sələbənin (pıçıltılı) söhbətini gah eşidir, gah da eşitmirdim. Qadın öz ərindən Peyğəmbərə (Sallallahu aleyhi və səlləm) şikayət edir və deyirdi: Ey Allahın elçisi, cavanlığımı ona həsr edib, onun üçün övlad dünyaya gətirmişəm. Amma indi qocalıb, hamiləlikdən kəsildikdən sonra məndən zihar edib. Ey Allahım Sənə şikayətlənirəm".*** Aişə (radıyallahu anha) deyir ki, çox keçmədən Cəbrail (əleyhissəlam) bu ayələri gətirdi: **﴾*(Ya Peyğəmbər!)* Əri barəsində səninlə mübahisə edən və Allaha şikayət edən qadının sözünü Allah eşitdi.﴿** Qadının əri Ənsardan olan Ovs ibn əs-Samit (radıyallahu anhu) idi. **﴾Allah sizin danışığınızı eşidir.﴿** Yəni aranızda olan söhbəti eşidir.

2 **﴾Sizdən öz qadınları ilə zihar edən﴿** Ziharın mənası bir kişinin öz arvadına: "*sən mənim üçün anam kimisən*" – deməsidir. Bu ifadənin zihar olması barədə fikir ayrılığı yoxdur. **﴾kimsələrin zövcələri *(əslində)* onların anaları deyillər.﴿** Zövcələri onların anaları deyillər. Bu onlar tərəfindən söylənilmiş yalandır. Bu isə, zihar edənlərə qarşı töhmət və məzəmmətdir. **﴾Onların anaları ancaq özlərini doğan qadınlardır.﴿** başqaları deyildir. **﴾Onlar, əlbəttə, pis və yalan söz danışırlar.﴿** Yəni zihar edənlər bu sözləri ilə pis söz, yəni şəriətin pislədiyi söz danışıb yaxınlıq etdikləri qadınlarını analarına bənzədirlər. Bu isə, anaya qarşı təhqirdir, yalandır. **﴾Şübhəsiz ki, Allah əfv edəndir, bağışlayandır.﴿** Onun əfv etməsi və bağışlaması genişdir. Çünki kəffarə verməyi şərt qoymaqla onları bu pis işdən xilas etmişdir.

3 **﴾Qadınları ilə zihar edib, sonra sözlərindən dönənlər﴿** Yenidən yaxınlıq etmək istəyənlər. **﴾*(kəffarə vermək üçün)* bir kölə azad etməlidirlər.﴿** Kölə kişi və ya qadın ola bilər. **﴾onlarla yaxınlıq etməzdən əvvəl﴿** Yəni cinsi yaxınlıq. Zihar edən kimsə kəffarə verməyincə cinsi yaxınlıq etməməlidir. **﴾Bu﴿** yuxarıda deyilən hökm **﴾sizə *(zihar barəsində)* verilən öyüddür.﴿** Zihardan uzaq olmaq üçün verilən əmrdir, qadağadır.

4 **﴾Kim *(azad etməyə bir kölə)* tapmasa, qadını ilə yaxınlıq etməzdən əvvəl iki ay**

**sərasər oruc tutmalı,** Yəni sahib olduğu var-dövlətdə azad etməyə köləsi olmazsa, yaxud kölə dəyərində mala sahib deyilsə, kölə alıb azad etməyə imkanı yoxdursa, o zaman iki ay ardıcıl oruc tutmalı, arada heç bir gününü orucsuz keçirməməlidir. Əgər üzürsüz olaraq orucun ardıcıllığını pozarsa, yenidən başlamalıdır. Əgər gecə və ya gündüz vaxtı zihar etdiyi arvadı ilə qəsdən yaxınlıq edərsə, orucu yenidən başlamalıdır. **buna da gücü çatmasa,** Yəni iki ay ardıcıl oruc tuta bilməsə **altmış yoxsulu yedirdib doydurmalıdır.** Hər yoxsula yarım saa (1.4 kq) buğda, xurma, düyü və s. bu kimi qida verməlidir. Eləcə də yemək hazırlayıb, hər yoxsulu qarın dolusu yedizdirə, yaxud doyacaqları miqdarda yemək paylaya bilər. **Bu, sizin Allah və Onun Peyğəmbərinə iman gətirməniz üçündür.** Biz bu hökmü ona görə vermişik ki, siz bu işin Allahın əmri və şəriəti olduğunu təsdiqləyəsiniz. Şəriət hüdudlarında dayanıb, onları aşmayasınız. Pis və yalan söz olan zihara bir daha dönməyəsiniz. **Bunlar** deyilən hökmlər **Allahın hədləridir** Sizin üçün qoyduğu bu hədləri aşmayın. Artıq O, sizə ziharın günah olduğunu açıqlamışdır. Bu günahın təyin olunan kəffarəsi isə, onun bağışlanması deməkdir. Allahın hüdudlarını qorumayan **Kafirlərə şiddətli bir əzab gözləyir!** Bu əzab, cəhənnəm əzabıdır.

5 **Allah və Onun Peyğəmbəri əleyhinə çıxanlar,** Əleyhinə çıxmaq nifaq göstərmək, düşmənçilik etmək və müxalif olmaqdır. **özlərindən əvvəlkilər nə cür rüsvay olmuşlarsa, o cür rüsvay olacaqlar.** Alçaldılacaq və şiddətli əzaba düçar olacaqdır.

6 **Allah onların hamısını dirildəcəyi gün** eyni zamanda hamını cəm edəcək, dirilməyən bir kimsə qalmayacaqdır. **etdikləri əməlləri onlara xəbər verəcəkdir.** Tutarlı dəlilləri onlara tam olaraq çatdırmaq üçün dünyada etdikləri pis əməlləri onlara bildirəcəkdir. **Allah sayıb yazmış,** etdikləri hər bir əməli hesaba almış və heç nə unutmamışdır **onlar isə unutmuşlar.** Yadda saxlamamışlar. Hamısını yazılıb hazır vəziyyətdə öz əməl dəftərlərində görmüşlər. **Allah hər bir şeyə şahiddir!** Hər şeyi biləndir və görəndir.

7 **(Ya Peyğəmbər!) Məgər görmürsənmi ki, Allah göylərdə və yerdə nə varsa, (hamısını) bilir.** Onun elmi yeri də, göyü də əhatə etdiyinə görə heç nə Ondan gizli qalmır. **Aralarında gizli söhbət gedən üç adamın** əgər üç nəfər gizli söhbət edərlərsə, onların **dördüncüsü,** Odur. Onların gizli danışıqlarını eşidər. **Beş adamın altıncısı Odur.** Çünki uca Allah istənilən sayda insanın gizlidə və aşkarda etdiklərindən agahdır, heç nə Ona gizli qalmır. **Onlar bundan az da, çox da olsalar** deyilən saydan az; bir-iki nəfər, yaxud çox; altı və yeddi nəfər olsalar, **(Allah) yenə də onların yanındadır.** Onların gizli danışıqlarını bilir və heç nə Ondan gizli qalmır. **və harada olsalar,** İstənilən məkanda olsalar belə, O hər şeyi bilir. **Sonra qiyamət günü (Allah) onlara etdikləri əməlləri (bir-bir) xəbər verəcəkdir.** Onlar bilsinlər ki, məxfi söhbətləri heç də Allaha gizli deyildir. Bu, bir yerə yığışıb, günaha bais olan gizli söhbətlər aparanlar üçün töhmət, danlaq və xəbərdarlıqdır.

8 **(Ya Peyğəmbər!) Məgər məxfi danışmaq qadağan edildikdən sonra yenə də qadağan olunduqları əmələ qayıdıb pıçıldaşanları (münafiqlərlə yəhudiləri) görmədinmi?** Yəhudilərin yanından bir mömin keçdikdə onun pis zənnə qapanmasına nail olmaq üçün dərhal öz aralarında gizli söhbət edərdilər. Uca Allah bu əməli onlara qadağan etdi, amma onlar bundan əl çəkmədilər. Sonra bu ayə nazil oldu: **günah,** möminlərin qeybətini etmək və onlara yalan və zülm ilə əziyyət vermək kimi əməllərlə möminlərə **ədavət** bəsləyən **və Peyğəmbərin əleyhinə çıxmaq barədə öz aralarında pıçıldaşanları (münafiqlərlə yəhudiləri) görmədinmi?** **Onlar yanına gəldikləri zaman səni Allahın salamladığı kimi salamlamır**. Burada məqsəd bəzi yəhudilər idi. Onlar Peyğəmbərin (Sallallahu aleyhi və səlləm) yanına gələr və "əssamu əleykə" *(sənə ölüm olsun)* - deyərdilər. Onlar zahirən salam verir amma əslində onun üçün ölüm arzulayırdılar. Peyğəmbər (Sallallahu aleyhi və səlləm) isə onlara: "Va aleykum" *(sizə də)* cavabını verərdi. **və öz-özlərinə** öz aralarında biri-birinə **"bəs niyə Allah bizi dediklərimizə görə əzaba düçar etmir?" – deyirlər.** Əgər Muhəmməd (Sallallahu aleyhi və səlləm) həqiqi peyğəmbər olsaydı, Allah bizə ona qarşı dediyimiz alçaldıcı sözlərə görə əzab verərdi. Digər mənada isə deyilir ki, əgər Muhəmməd (Sallallahu aleyhi və səlləm) həqiqi peyğəmbər olsaydı, onun: *"va aleykum" (sizə də) sözləri ilə deyib,* bizə qarşı etdiyi duası qəbul olunar və həmin anda ölüm bizi haqlayardı. İndi qarşılaşacaqları ölüm əzabının əvəzində **Onlara girib yanacaqları Cəhənnəm kifayət edər. Ora necə də pis qayıdış yeridir!** Onların qayıdış yeri cəhənnəmdir.

أَلَمْ تَرَ أَنَّ ٱللَّهَ يَعْلَمُ مَا فِى ٱلسَّمَٰوَٰتِ وَمَا فِى ٱلْأَرْضِ مَا يَكُونُ
مِن نَّجْوَىٰ ثَلَٰثَةٍ إِلَّا هُوَ رَابِعُهُمْ وَلَا خَمْسَةٍ إِلَّا هُوَ سَادِسُهُمْ
وَلَآ أَدْنَىٰ مِن ذَٰلِكَ وَلَآ أَكْثَرَ إِلَّا هُوَ مَعَهُمْ أَيْنَ مَا كَانُوا۟ ثُمَّ يُنَبِّئُهُم
بِمَا عَمِلُوا۟ يَوْمَ ٱلْقِيَٰمَةِ إِنَّ ٱللَّهَ بِكُلِّ شَىْءٍ عَلِيمٌ ﴿٧﴾ أَلَمْ تَرَ إِلَى ٱلَّذِينَ
نُهُوا۟ عَنِ ٱلنَّجْوَىٰ ثُمَّ يَعُودُونَ لِمَا نُهُوا۟ عَنْهُ وَيَتَنَٰجَوْنَ بِٱلْإِثْمِ
وَٱلْعُدْوَٰنِ وَمَعْصِيَتِ ٱلرَّسُولِ وَإِذَا جَآءُوكَ حَيَّوْكَ بِمَا لَمْ يُحَيِّكَ
بِهِ ٱللَّهُ وَيَقُولُونَ فِىٓ أَنفُسِهِمْ لَوْلَا يُعَذِّبُنَا ٱللَّهُ بِمَا نَقُولُ حَسْبُهُمْ
جَهَنَّمُ يَصْلَوْنَهَا فَبِئْسَ ٱلْمَصِيرُ ﴿٨﴾ يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوٓا۟ إِذَا
تَنَٰجَيْتُمْ فَلَا تَتَنَٰجَوْا۟ بِٱلْإِثْمِ وَٱلْعُدْوَٰنِ وَمَعْصِيَتِ ٱلرَّسُولِ وَتَنَٰجَوْا۟
بِٱلْبِرِّ وَٱلتَّقْوَىٰ وَٱتَّقُوا۟ ٱللَّهَ ٱلَّذِىٓ إِلَيْهِ تُحْشَرُونَ ﴿٩﴾ إِنَّمَا ٱلنَّجْوَىٰ
مِنَ ٱلشَّيْطَٰنِ لِيَحْزُنَ ٱلَّذِينَ ءَامَنُوا۟ وَلَيْسَ بِضَآرِّهِمْ شَيْـًٔا
إِلَّا بِإِذْنِ ٱللَّهِ وَعَلَى ٱللَّهِ فَلْيَتَوَكَّلِ ٱلْمُؤْمِنُونَ ﴿١٠﴾ يَٰٓأَيُّهَا ٱلَّذِينَ
ءَامَنُوٓا۟ إِذَا قِيلَ لَكُمْ تَفَسَّحُوا۟ فِى ٱلْمَجَٰلِسِ فَٱفْسَحُوا۟ يَفْسَحِ
ٱللَّهُ لَكُمْ وَإِذَا قِيلَ ٱنشُزُوا۟ فَٱنشُزُوا۟ يَرْفَعِ ٱللَّهُ ٱلَّذِينَ ءَامَنُوا۟
مِنكُمْ وَٱلَّذِينَ أُوتُوا۟ ٱلْعِلْمَ دَرَجَٰتٍ وَٱللَّهُ بِمَا تَعْمَلُونَ خَبِيرٌ ﴿١١﴾

(9) **﴾Ey iman gətirənlər!﴿** bu yəhudilər və münafiqlərin etdikləri kimi **﴾Bir-birinizlə xəlvət danışdığınız zaman günah, düşmənçilik və Peyğəmbərin əleyhinə çıxmaq barədə danışmayın;﴿** **﴾yaxşı işlər, Allahdan qorxmaq barədə danışın﴿** Allaha itaət etmək və günahlardan qorunmaq haqqında danışın. **﴾və *(qiyamət günü)* hüzuruna toplanacağınız Allahdan qorxun!﴿** O, etdiyiniz əməllərin qarşılığını sizə verəcəkdir.

(10) **﴾Şübhəsiz ki, məxfi danışma﴿** Günah danışıb, düşmənçilik edib və Peyğəmbərin (Sallallahu aleyhi və səlləm) əleyhinə gizli danışıq aparmaq, hiyləyə düşəcəklərindən ehtiyat edən **﴾iman gətirənləri məyus edib kədərləndirmək üçün olan Şeytan əməlindəndir.﴿** Başqasının deyil, məhz şeytanın bəzədib gözəlləşdirdiyi hiylədir. **﴾Halbuki Allahın izni olmadıqca *(Şeytan)* onlara heç bir zərər yetirə bilməz.﴿** Allahın izni olmadan nə şeytan, nə də şeytanın gözəl göstərdiyi məxfi danışıqlar möminlərə heç bir zərər verən deyil. **﴾Möminlər yalnız Allaha təvəkkül etsinlər!﴿** Möminlər işlərini Ona həvalə edər. Hər işdə Ona bel bağlayar, şeytandan Allaha sığınar, şeytanın gözəl göstərdiyi məxfi danışıqlara əhəmiyyət verməzlər. Buxari, Müslim və digər alimlər İbn Məsuddan ﷺ rəvayət edirlər ki, Peyğəmbər (Sallallahu aleyhi və səlləm) demişdir: ***“Üç nəfər bir yerdə olduğunuz vaxt iki nəfər ayrıca gizli söhbət etməsin. Çünki bu, üçüncü kimsəni kədərləndirir”.***

(11) **﴾Ey iman gətirənlər! Sizə: “Məclislərdə yer verin!” – deyildiyi zaman﴿** Uca Allah möminlərə məclisdə oturarkən yer verməyi və sıxlıq yaratmamağı əmr edərək, onlardan bir-birinə qarşı ədəb-ərkanlı olmalarını tələb edir. Qatadə və Mücahid deyir: Onlar Peyğəmbərin (Sallallahu aleyhi və səlləm) məclisində oturmaq üçün bir-birini sıxışdırırdılar. Sonra onlara bir-birilərinə yer vermələri əmr olundu. **﴾yer verin ki, Allah da sizə geniş yer versin.﴿** Siz onlara məclislərdə yer verin ki, Allah da, sizə cənnətdə geniş yer versin. Bu əmr müsəlmanların xeyirli və savablı iş üçün toplaşdıqları hər bir məclisə şamil olunur. İstər döyüş, istər zikr, istərsə də cümə xütbəsi toplantısında olsun. Hər kəs ilk öncə gəldiyi yerdə oturmağa daha haqlıdır. Lakin bununla yanaşı, bir qədər sıxlaşıb öz qardaşına da yer verməlidir. Peyğəmbər (Sallallahu aleyhi və səlləm) demişdir: ***“Heç kəs bir kimsəni yerindən qaldırıb, özü orada oturmasın. Sadəcə olaraq hər kəs bir qədər sıxlaşıb, digərlərinə yer versin”.*** **﴾Eləcə də sizə: “Qalxın!” deyildikdə qalxın﴿** Məclisdə oturanlardan bəzilərinə qalxıb dində daha fəzilətli və ya elm adamlarından olan kimsələrə yer vermələri tələb olunduqda qalxıb yer versinlər. **﴾Allah sizdən iman gətirənlərin və elm bəxş edilmiş kimsələrin dərəcələrini ucaldar.﴿** Uca Allah sizdən elm bəxş edilmiş kimsələri dünyada yüksək kəramət məqamlarına ucaldar, axirətdə isə, böyük savaba qovuşdurar. Kim iman və elmə sahib olarsa, imanı ilə Allah onu yüksək dərəcələrə qaldırar, sonra elmi ilə onu yenə yüksək dərəcələrə ucaldar. Bunun bir nümunəsi də məclislərdə onların dərəcələrini ucaltmasıdır.

(12) **﴾Ey iman gətirənlər! Peyğəmbərlə məxfi danışacağınız zaman bu danışıqdan əvvəl sədəqə verin.﴿** Əgər siz Peyğəmbərlə (Sallallahu aleyhi və səlləm) hər hansı işlə bağlı gizli danışmaq istəsəniz, bu məxfi danışıqdan öncə sədəqə verin. Bu ayə nazil olduqdan sonra batil düşüncəli insanlar Peyğəmbərlə (Sallallahu aleyhi və səlləm) məxfi danışmaqdan əl çəkdilər. Çünki onlar məxfi danışıqdan öncə, sədəqə vermirdilər. Bu hal iman gətirənlər üçün də bir qədər çətinlik yaratdı. Onlar verməyə sədəqə tapmadıqları üçün məxfi söhbət etməkdən imtina etdilər. Sonra uca Allah qarşıdakı ayə

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوٓاْ إِذَا نَٰجَيۡتُمُ ٱلرَّسُولَ فَقَدِّمُواْ بَيۡنَ يَدَيۡ نَجۡوَىٰكُمۡ
صَدَقَةٗۚ ذَٰلِكَ خَيۡرٞ لَّكُمۡ وَأَطۡهَرُۚ فَإِن لَّمۡ تَجِدُواْ فَإِنَّ ٱللَّهَ غَفُورٞ رَّحِيمٌ
١٢ ءَأَشۡفَقۡتُمۡ أَن تُقَدِّمُواْ بَيۡنَ يَدَيۡ نَجۡوَىٰكُمۡ صَدَقَٰتٖۚ فَإِذۡ لَمۡ تَفۡعَلُواْ
وَتَابَ ٱللَّهُ عَلَيۡكُمۡ فَأَقِيمُواْ ٱلصَّلَوٰةَ وَءَاتُواْ ٱلزَّكَوٰةَ وَأَطِيعُواْ ٱللَّهَ
وَرَسُولَهُۥۚ وَٱللَّهُ خَبِيرُۢ بِمَا تَعۡمَلُونَ ١٣ ۞ أَلَمۡ تَرَ إِلَى ٱلَّذِينَ تَوَلَّوۡاْ قَوۡمًا
غَضِبَ ٱللَّهُ عَلَيۡهِم مَّا هُم مِّنكُمۡ وَلَا مِنۡهُمۡ وَيَحۡلِفُونَ عَلَى ٱلۡكَذِبِ
وَهُمۡ يَعۡلَمُونَ ١٤ أَعَدَّ ٱللَّهُ لَهُمۡ عَذَابٗا شَدِيدًاۖ إِنَّهُمۡ سَآءَ مَا كَانُواْ
يَعۡمَلُونَ ١٥ ٱتَّخَذُوٓاْ أَيۡمَٰنَهُمۡ جُنَّةٗ فَصَدُّواْ عَن سَبِيلِ ٱللَّهِ فَلَهُمۡ
عَذَابٞ مُّهِينٞ ١٦ لَّن تُغۡنِيَ عَنۡهُمۡ أَمۡوَٰلُهُمۡ وَلَآ أَوۡلَٰدُهُم مِّنَ ٱللَّهِ
شَيۡـًٔاۚ أُوْلَٰٓئِكَ أَصۡحَٰبُ ٱلنَّارِۖ هُمۡ فِيهَا خَٰلِدُونَ ١٧ يَوۡمَ يَبۡعَثُهُمُ
ٱللَّهُ جَمِيعٗا فَيَحۡلِفُونَ لَهُۥ كَمَا يَحۡلِفُونَ لَكُمۡ وَيَحۡسَبُونَ أَنَّهُمۡ عَلَىٰ شَيۡءٍۚ أَلَآ
إِنَّهُمۡ هُمُ ٱلۡكَٰذِبُونَ ١٨ ٱسۡتَحۡوَذَ عَلَيۡهِمُ ٱلشَّيۡطَٰنُ فَأَنسَىٰهُمۡ ذِكۡرَ
ٱللَّهِۚ أُوْلَٰٓئِكَ حِزۡبُ ٱلشَّيۡطَٰنِۚ أَلَآ إِنَّ حِزۡبَ ٱلشَّيۡطَٰنِ هُمُ ٱلۡخَٰسِرُونَ
١٩ إِنَّ ٱلَّذِينَ يُحَآدُّونَ ٱللَّهَ وَرَسُولَهُۥٓ أُوْلَٰٓئِكَ فِي ٱلۡأَذَلِّينَ ٢٠
كَتَبَ ٱللَّهُ لَأَغۡلِبَنَّ أَنَا۠ وَرُسُلِيٓۚ إِنَّ ٱللَّهَ قَوِيٌّ عَزِيزٞ ٢١

ilə onların bu işini asanlaşdırdı. **﴾Bu﴿** məxfi söhbətdən öncə, sədəqə vermək **﴾sizin üçün daha xeyirli, daka pakdır.﴿** Çünki bu işdə Allaha itaət vardır. **﴾Əgər bir şey tapmasanız, Allah bağışlayandır, rəhm edəndir!﴿** Kimsə sədəqə vermək iqtidarında deyilsə, sədəqə verməmiş məxfi söhbət etdiyinə görə heç narahat olmasın.

13 **﴾Məgər siz məxfi danışmazdan əvvəl sədəqə verməkdən qorxdunuzmu?﴿** Siz sədəqə verəcəyiniz təqdirdə kasıblıqdan və aclıqdan qorxdunuzmu? Muqatil deyir ki, bu əmr on gün davam etdi, sonra ləğv olundu. **﴾Madam ki, siz etmədiniz﴿** sizə ağır gəldiyi üçün məxfi söhbətdən öncə sədəqə vermədiniz **﴾və Allah da tövbənizi qəbul buyurdu,﴿** sizi bu əməldən azad etdi. **﴾onda namaz qılıb zəkat verin, Allaha və Onun Peyğəmbərinə itaət edin.﴿** Əgər məxfi söhbətdən öncə sədəqə vermək sizin üçün ağırdırsa, o zaman namaz qılıb, zəkat verib, Allah və rəsuluna itaət göstərməkdə sabitqədəm olun. **﴾Allah nə etdiklərinizdən xəbərdardır!﴿** O, sizin cəzanızı və ya mükafatınızı verəcəkdir.

14 **﴾Məgər onların﴿** münafiqlərin **﴾Allahın qəzəbləndiyi bir tayfanı özlərinə dost tutduqlarını görmədinmi?﴿** Qəzəbə düçar olmuşlar yəhudilərdir. **﴾Onlar nə sizdəndirlər, nə də onlardan.﴿** Uca Allah başqa ayədə onlar haqqından belə buyurur: ﴾*(Münafiqlər imanla küfr arasında)* tərəddüd edib nə *(tamamilə)* bunlara *(möminlərə)*, nə də onlara *(kafirlərə)* tərəf dönərlər...﴿ Ehtimal olunur ki, onlar yəhudilərdir. Yəni möminlərə deyilir ki, yəhudilər nə sizdən, nə də münafiqlərdən deyillər. Nə üçün münafiqlər onları özlərinə dost tutmurlar. **﴾Onlar bilə-bilə yalandan and içirlər.﴿** Onlar müsəlman olduqları haqqında, yaxud yəhudilərə gizli xəbər çatdırmadıqları barədə and içirlər. Halbuki onlar, andlarının batil və yalan olduğunu bilirlər.

15 **﴾Allah onlar üçün﴿** bu dostluğa və içdikləri batil anda görə **﴾şiddətli bir əzab hazırlamışdır. Onların etdiyi əməllər necə də pisdir!﴿**

16 **﴾Onlar andlarını özlərinə sipər etdilər.﴿** Kafir olduqları üçün qətlə yetiriləcəklərindən qorxaraq, müsəlman olduqları barədə yalandan and içirdilər. Onlar qanlarını qorumaq üçün andlarını sipər etmişdilər. Qətl qorxusundan dilləri iman gətirmiş, qəlbləri isə, iman gətirməmişdi. **﴾və Allah yolundan döndərdilər.﴿** Onlar maneələr qoymaq, müsəlmanları gözdən salmaq və onları zəiflətmək yolu ilə insanları İslamı qəbul etməkdən yayındırırdılar. **﴾Onları alçaldıcı bir əzab gözləyir.﴿** Bu əzab onları alçaldacaq və rüsvay edəcəkdir.

18 **﴾Allah onların hamısını dirildəcəyi gün onlar sizə and içdikləri kimi, Allaha da and içəcək﴿** Onlar bu dünyada sizə qarşı necə yalandan and içirlərsə, qiyamət günü də Allahın hüzurunda yalandan and içərək deyəcəklər: Ey Rəbbimiz, and olsun ki, biz belə etməmişik. Bu isə onların həddindən artıq səfalət içində olduqlarından irəli gəlir. Amma qiyamət günü bütün həqiqətlər üzə çıxmış, hər şey aydınlaşmışdır. **﴾və bir şey qazanacaqlarını zənn edəcəklər.﴿** Axirətdə elə düşünəcəklər ki, yenə də dünyadakı kimi yalan andlarla mənfəət əldə edəcək, yaxud zərəri dəf edəcəklər. **﴾Bilin ki, onlar əsl yalançıdırlar!﴿**

19 **﴾Şeytan onlara hakim olmuş﴿** qalib gəlmiş və ələ almışdır. **﴾və Allahı zikr etməyi onlara unutdurmuşdur.﴿** Onlar Allahın əmrlərini və Ona itaət etməyi tərk etmişlər. **﴾Onlar Şeytanın firqəsidirlər.﴿**

Onun ordusu, ardıcılları və dəstəsidirlər. **﴾Bilin ki, Şeytanın firqəsi – məhz onlar ziyana uğrayanlardır!﴿** Çünki onlar Cənnəti Cəhənnəmə, doğru yolu azğın yola satmış, Allaha və Peyğəmbərinə (Sallallahu aleyhi və səlləm) qarşı yalan danışmışlar. Onlar həm dünyalarını, həm də axirətlərini uduzacaqlar.

20 **﴾Allahın və Onun Peyğəmbərinin əleyhinə çıxanlar﴿** Dünyada və axirətdə zəlil olmuş **﴾ən zəlil kimsələr içərisində olacaqlar!﴿**

21 **﴾Allah: "And olsun ki, Mən və peyğəmbərlərim qalib gələcəyik!" – deyə yazmışdır.﴿** Öz əzəli elmində Özünün və peyğəmbərlərinin dəlil-sübut və güc ilə qalib gələcəyini yazmışdır. **﴾Həqiqətən Allah yenilməz qüvvət sahibi, qüdrət sahibidir!﴿** Öz övliyalarına kömək etməyə gücü yetəndir. Düşmənlərini isə məğlub edəndir. Heç kəs ona qalib gələ bilməz.

22 **﴾Allaha və axirət gününə inanan heç bir tayfanın Allah və Onun Peyğəmbəri əleyhinə çıxanlarla – öz ataları, oğulları, qardaşları, yaxın qohumları olsalar belə - dostluq etdiyini görməzsən.﴿** Əgər yuxarıda deyilən kimsələr Allaha və rəsuluna qarşı çıxarlarsa, iman bundan uzaq olmağı əmr edir. İmanı qoruyub saxlamaq ata, oğul, qardaş və yaxın qohumlardan irəlidir. **﴾Onlar﴿** Allah və rəsuluna düşmən kəsilənləri dost tutmayanlar **﴾elə kimsələrdir ki, Allah onların qəlblərinə iman yazmış﴿** sabit etmiş və toplamışdır. **﴾və Öz dərgahından onlara ruh vermişdir.﴿** Onları dünyadakı düşmənlərinə qarşı güclü etmişdir. O, Öz köməyini ruh adlandırmışdır. Çünki onların özləri ruh ilə sağ qalırlar. **﴾Onları altından çaylar axan cənnətlərə daxil edəcəkdir. Onlar orada əbədi qalacaqlar.﴿** **﴾Allah onlardan, onlar da Allahdan razıdırlar.﴿** Allah onların əməllərini qəbul etmiş, Öz rəhmətinin təcili və gələcək səmərəsini onlara bəxş etmişdir. Möminlər isə, özlərinə Allah tərəfindən verilmiş təcili və gələcək mükafata görə sevinirlər. **﴾Onlar Allahın firqəsidirlər.﴿** Onun əmrlərinə itaət edən, düşmənlərinə qarşı döyüşən və Allah dostlarına kömək edən kimsələrdir. **﴾Bilin ki, Allahın firqəsi məhz onlar nicat tapıb səadətə qovuşanlardır.﴿** Dünya və axirət səadətinə qovuşanlar onlardır. İbn Əbu Hatim, Təbərani və Hakim rəvayət edirlər ki, Əbu Ubeydə ibn əl-Cərrahın müşrik atası Bədr döyüşündə özü qəsdən Əbu Ubeydənin qarşısına çıxırdı. Əbu Ubeydə isə, özünü ondan yayındırırdı. Atası bu hərəkətini çox təkrar etdikdə Əbu Ubeydə ona tərəf gedib, onu qətlə yetirdi. Sonra bu ayə nazil oldu.

لَا تَجِدُ قَوْمًا يُؤْمِنُونَ بِاللَّهِ وَالْيَوْمِ الْآخِرِ يُوَادُّونَ مَنْ
حَادَّ اللَّهَ وَرَسُولَهُ وَلَوْ كَانُوا آبَاءَهُمْ أَوْ أَبْنَاءَهُمْ
أَوْ إِخْوَانَهُمْ أَوْ عَشِيرَتَهُمْ ۚ أُولَٰئِكَ كَتَبَ فِي قُلُوبِهِمُ
الْإِيمَانَ وَأَيَّدَهُمْ بِرُوحٍ مِنْهُ ۖ وَيُدْخِلُهُمْ جَنَّاتٍ تَجْرِي
مِنْ تَحْتِهَا الْأَنْهَارُ خَالِدِينَ فِيهَا ۚ رَضِيَ اللَّهُ عَنْهُمْ وَرَضُوا
عَنْهُ ۚ أُولَٰئِكَ حِزْبُ اللَّهِ ۚ أَلَا إِنَّ حِزْبَ اللَّهِ هُمُ الْمُفْلِحُونَ ٢٢

آياتها ٢٤ — سُورَةُ الْحَشْرِ — ترتيبها ٥٩

بِسْمِ اللَّهِ الرَّحْمَٰنِ الرَّحِيمِ

سَبَّحَ لِلَّهِ مَا فِي السَّمَاوَاتِ وَمَا فِي الْأَرْضِ ۖ وَهُوَ الْعَزِيزُ الْحَكِيمُ
١ هُوَ الَّذِي أَخْرَجَ الَّذِينَ كَفَرُوا مِنْ أَهْلِ الْكِتَابِ مِنْ دِيَارِهِمْ
لِأَوَّلِ الْحَشْرِ ۚ مَا ظَنَنْتُمْ أَنْ يَخْرُجُوا ۖ وَظَنُّوا أَنَّهُمْ مَانِعَتُهُمْ
حُصُونُهُمْ مِنَ اللَّهِ فَأَتَاهُمُ اللَّهُ مِنْ حَيْثُ لَمْ يَحْتَسِبُوا ۖ وَقَذَفَ
فِي قُلُوبِهِمُ الرُّعْبَ ۚ يُخْرِبُونَ بُيُوتَهُمْ بِأَيْدِيهِمْ وَأَيْدِي الْمُؤْمِنِينَ
فَاعْتَبِرُوا يَا أُولِي الْأَبْصَارِ ٢ وَلَوْلَا أَنْ كَتَبَ اللَّهُ عَلَيْهِمُ
الْجَلَاءَ لَعَذَّبَهُمْ فِي الدُّنْيَا ۖ وَلَهُمْ فِي الْآخِرَةِ عَذَابُ النَّارِ ٣

# əl-Həşr surəsi 59

## *(Toplanma)*

1 **﴾Göylərdə və yerdə nə varsa, Allahı təqdis edib şəninə təriflər deyər. O, yenilməz qüvvət sahibi, hikmət sahibidir!﴿**

2 **﴾Kitab əhlindən kafir olanları ilk dəfə toplayıb öz yurdundan çıxardan Odur.﴿** Ayə Bənu Nəzir qəbiləsindən bəhs edir. Bu qəbilə Harunun nəslindən olan yəhudi tayfasıdır. Bənu İsrailin başına gələn fitnələr zamanı Mədinədə məskunlaşmışdılar. Peyğəmbərlə (Sallallahu aleyhi və səlləm) əhd bağladıqdan sonra ona xəyanət etdilər. Müşriklərə qatılıb ona qarşı çıxdılar. Peyğəmbər (Sallallahu aleyhi və səlləm) onları mühasirəyə aldı və onlar sürgün olunmağa razı oldular. Kəlbi deyir ki, onlar əhli kitab arasında ərəb yarımadasından ilk sürgün olunanlardır. Ömərin ﷺ vaxtında sonuncu dəstə sürgün olundu. Onların sürgün olunması birinci toplanma *(həşr)* idi. Sonuncu toplanma *(həşr)* isə, Ömərin ﷺ vaxtında baş verən sürgündür. Digər rəyə görə sonuncu toplanma bütün insanların məhşər meydanına toplanacağı gündür.

ذَٰلِكَ بِأَنَّهُمْ شَاقُّوا اللَّهَ وَرَسُولَهُ ۖ وَمَن يُشَاقِّ اللَّهَ فَإِنَّ اللَّهَ شَدِيدُ
الْعِقَابِ ﴿٤﴾ مَا قَطَعْتُم مِّن لِّينَةٍ أَوْ تَرَكْتُمُوهَا قَائِمَةً
عَلَىٰ أُصُولِهَا فَبِإِذْنِ اللَّهِ وَلِيُخْزِيَ الْفَاسِقِينَ ﴿٥﴾ وَمَا أَفَاءَ اللَّهُ
عَلَىٰ رَسُولِهِ مِنْهُمْ فَمَا أَوْجَفْتُمْ عَلَيْهِ مِنْ خَيْلٍ وَلَا رِكَابٍ
وَلَٰكِنَّ اللَّهَ يُسَلِّطُ رُسُلَهُ عَلَىٰ مَن يَشَاءُ ۚ وَاللَّهُ عَلَىٰ كُلِّ شَيْءٍ
قَدِيرٌ ﴿٦﴾ مَّا أَفَاءَ اللَّهُ عَلَىٰ رَسُولِهِ مِنْ أَهْلِ الْقُرَىٰ فَلِلَّهِ وَلِلرَّسُولِ
وَلِذِي الْقُرْبَىٰ وَالْيَتَامَىٰ وَالْمَسَاكِينِ وَابْنِ السَّبِيلِ كَيْ لَا يَكُونَ
دُولَةً بَيْنَ الْأَغْنِيَاءِ مِنكُمْ ۚ وَمَا آتَاكُمُ الرَّسُولُ فَخُذُوهُ وَمَا
نَهَاكُمْ عَنْهُ فَانتَهُوا ۚ وَاتَّقُوا اللَّهَ ۖ إِنَّ اللَّهَ شَدِيدُ الْعِقَابِ ﴿٧﴾
لِلْفُقَرَاءِ الْمُهَاجِرِينَ الَّذِينَ أُخْرِجُوا مِن دِيَارِهِمْ وَأَمْوَالِهِمْ
يَبْتَغُونَ فَضْلًا مِّنَ اللَّهِ وَرِضْوَانًا وَيَنصُرُونَ اللَّهَ وَرَسُولَهُ ۚ أُولَٰئِكَ
هُمُ الصَّادِقُونَ ﴿٨﴾ وَالَّذِينَ تَبَوَّءُوا الدَّارَ وَالْإِيمَانَ مِن قَبْلِهِمْ
يُحِبُّونَ مَنْ هَاجَرَ إِلَيْهِمْ وَلَا يَجِدُونَ فِي صُدُورِهِمْ حَاجَةً
مِّمَّا أُوتُوا وَيُؤْثِرُونَ عَلَىٰ أَنفُسِهِمْ وَلَوْ كَانَ بِهِمْ خَصَاصَةٌ ۚ
وَمَن يُوقَ شُحَّ نَفْسِهِ فَأُولَٰئِكَ هُمُ الْمُفْلِحُونَ ﴿٩﴾

**﴾Siz onların çıxacaqlarını güman etmirdiniz.﴿** Ey müsəlmanlar, siz Bənu Nəzir qəbiləsinin güclü və qüvvətli olduğu üçün öz yurdlarından çıxacaqlarını güman etmirdiniz.

Onlar Mədinədə alınmaz qalalara, geniş mal-mülkə, bağ-bağçaya, say və nüfuza sahib idilər. **﴾Onlar isə, öz qalalarının onları Allahdan qoruyacağını zənn edirdilər.﴿** Bənu Nəzir qəbiləsi elə güman edirdi ki, qalaları onları Allahın intiqamından qoruyacaqdır. **﴾Amma Allah onlara gözləmədikləri yerdən gəlib﴿** Allahın intiqamı gözləmədikləri yerdən onları yaxaladı. Uca Allah Öz Peyğəmbərinə (Sallallahu aleyhi və səlləm) onlarla döyüşməyi və sürgün etməyi əmr etdi. Onlar işin bu yerə çatacağını güman etmirdilər. Özlərini çox güclü və izzətli sanırdılar. **﴾ürəklərinə qorxu saldı.﴿** Ayədə deyilən qorxu *(ərəb. ər-Ruub)* sözü dəhşətli qorxu deməkdir. Peyğəmbər (Sallallahu aleyhi və səlləm) demişdir: **"Bir ay qət olunan məsafədən düşməni qorxutmaq ilə mənə kömək olunmuşdur".** **﴾Belə ki, onlar evlərini həm öz əlləri, həm də möminlərin əlləri ilə uçurdub dağıdırdılar.﴿** Onlar sürgün olunacaqlarını bildikdə onlardan sonra müsəlmanların bu yerlərdə yaşayacaqlarına həsəd apararaq, evlərini içəridən, möminlər isə, çöldən dağıdırdılar. Zuhri və Urvə ibn əz-Zubeyr deyirlər ki, Peyğəmbər (Sallallahu aleyhi və səlləm) onlara özləri ilə bir dəvə yükü daşımağa icazə verdikdə onlar özləri ilə taxta və ya dirək götürməyə daha çox üstünlük verirdilər. Evlərini söküb ağac və dirəklərini daşıyırdılar. Geriyə qalanını isə möminlər dağıdırdılar. **﴾Ey bəsirət sahibləri! İbrət alın!﴿** Bilin ki, Allah Ona xəyanət edən və Ona qarşı çıxanları belə bir əzabla cəzalandırar.

(3) **﴾Əgər Allah onlara sürgün olunmağı hökm etməsəydi, onları dünyada mütləq əzaba düçar edərdi.﴿** Əgər Allah onlara sürgün edilməyi nəsib etməsəydi, onları da Bənu Qureyzə qəbiləsini cəzalandırdığı kimi bu dünyada ölüm və əsir düşməklə cəzalandırardı. **﴾Axirətdə isə onları cəhənnəm əzabı gözləyir!﴿**

(4) **﴾Bu onların Allaha və Onun Peyğəmbərinə asi olmalarına görədir.﴿** Onlar Allaha və Peyğəmbərinə (Sallallahu aleyhi və səlləm) düşmənçilik edib, əhdi pozduqlarına görə, bu cəzaya layiq görüldülər.

(5) **﴾hər hansı bir xurma ağacını kəsməyiniz, yaxud onu kökü üstündə salamat qoymağınız Allahın izniləndir.﴿** Bənu Nəzir döyüşündə bəzi müsəlmanlar kafirlərə nifrət etdikləri üçün onların ağaclarını kəsirdilər. Əhli kitabdan olan Bənu Nəzir qəbiləsi dedi: Ey Muhəmməd, sən islah edən və peyğəmbər olduğunu iddia etmirsənmi? Məgər xurma ağaclarını kəsmək və yandırmaq islah etməkdirmi? Sənə nazil olan şəriətdə yer üzündə fəsad törətmək halal hesab olunurmu? Bu sözlər Peyğəmbərə (Sallallahu aleyhi və səlləm) ağır gəldi. Müsəlmanlar isə özlərini təqsirli bildilər. Sonra bu ayə nazil oldu: **﴾və bu fasiqləri rüsvay etməsi üçündür.﴿** Bu, Onun itaətindən çıxanları – yəhudiləri cəzalandırmaq üçün edilən əməldir. Ağacları kəsmək və ya saxlamaq onları hiddətləndirir. Möminlər onların mal-dövlətində istədikləri kimi davrandıqlarında bunu görən kafirlər daha da hiddətlənir və utanırdılar.

(6) **﴾Allahın onların mallarından Öz Peyğəmbərinə verdiyi qənimət üçün siz onların üstünə nə at, nə də dəvə sürdünüz.﴿** Allah taalanın Peyğəmbərinə verdiyi Bənu Nəzir mal-dövlətini əldə etmək üçün siz nə at, nə də dəvə sürüb döyüşə getməmisiniz. Heç bir çətinliklə də qarşılaşmamış, döyüşməmisiniz. Bura Mədinədən iki mil aralıqda yerləşirdi. Uca Allah bu səbəb ilə Bənu Nəzir qəbiləsinin mal-dövlətini Peyğəmbərinə (Sallallahu aleyhi və səlləm)

məxsus etmişdir. Peyğəmbər (Sallallahu aleyhi və səlləm) buranı sülh ilə fəth edib, mal-dövləti qənimət götürdü və heç kəsə qənimət payı bölmədi.

7 **﴿Allah Öz Peyğəmbərinə məmləkətlərin əhalisindən verdiyi qənimət﴾** Bu ayə qənimətin Peyğəmbərə (Sallallahu aleyhi və səlləm) aid olmasından sonra onun necə bölünməsini açıqlayır. Bu Peyğəmbərin (Sallallahu aleyhi və səlləm) və ondan sonra yaşayan müsəlmanların qiyamətə qədər döyüşsüz, sülh ilə, at və dəvə çapmadan fəth etdikləri məmləkətlərdən əldə olunan qənimətlərə şamil olunan hökmdür. **﴿Allaha,﴾** məxsusdur və O istədiyi kimi bölər. **﴿Peyğəmbərə,﴾** və müsəlmanların işlərinə sərf olunan mülkdür. **﴿qohum-əqrabaya,﴾** Haşim və Əbdülmüttalib oğullarından olan kasıblara bu maldan pay düşür. Onlar sədəqə götürməkdən məhrum olduqları üçün onlara qənimətdən pay verilmişdir. **﴿yetimlərə,﴾** yetim, həddi buluğa çatmamış atasını itirəndir. **﴿yoxsullara və müsafirə məxsusdur.﴾** Müsafir xərcliyi qurtarmış qərib insandır. **﴿Bu ona görədir ki, içərinizdəki zənginlər arasında əldən-ələ dolaşan bir sərvət olmasın.﴾** Varlılar kasıbları üstələməsin, bu mal-dövləti öz aralarında bölməsinlər. **﴿Peyğəmbər sizə nə verirsə, onu götürün; nəyi qadağan edirsə, ondan əl çəkin.﴾** Sizə qənimətdən nə verirsə, onu götürün, nədən çəkindirirsə, ondan əl çəkin, götürməyin.

8 **﴿yurdlarından qovulub çıxardılmış,﴾** Məkkədən zorla çıxarılan mühacirləri varlandırmaq üçün qənimətdən onlara pay ayırmışdır. **﴿Allahdan mərhəmət və riza diləyən,﴾** Dünyada ruzi, axirətdə isə riza diləyirlər. Kafirlərə qarşı döyüşərək **﴿Allaha və Onun Peyğəmbərinə kömək edən yoxsul mühacirlərə məxsusdur. Onlar doğru olan kimsələrdir!﴾**

9 **﴿Onlardan əvvəl yurd salmış və iman gətirmiş kimsələr﴾** Mühacirlərdən öncə Mədinədə yaşayıb, Allaha və rəsuluna iman gətirən Ənsarlar **﴿öz yanlarına mühacirət edənləri sevər,﴾** onlara yaxşılıq edər, mal-dövlətlərinə və ev-eşiklərinə ortaq edərlər. **﴿Onlara verilən qənimətə görə ürəklərində həsəd,﴾** kin, nifrət **﴿duymaz,﴾**. Peyğəmbər (Sallallahu aleyhi və səlləm) Bənu Nəzir qəbiləsinin mal-dövlətini qənimət olaraq götürdükdə ənsarları çağırıb, mühacirlərə evlərində yer verib, mal-dövlətlərini onlarla bölərək etdikləri yaxşılıqlara görə təşəkkür etdi və dedi: ***"Əgər istəyirsinizsə, Allahın mənə verdiyi Bənu Nəzir mal-dövlətini sizinlə mühacirlər arasında bölüm. Mühacirlər isə, evlərinizdə və mal-dövlətinizdə sizə ortaq olaraq qalsınlar. Yaxud istəsəniz, qəniməti yalnız onlara verim, sizin evinizdən ayrılsınlar".*** Ənsarlar bununla razılaşdılar və ürəklərində heç bir sıxıntı duymadılar. **﴿özləri ehtiyac içində olsalar belə, onları özlərindən üstün tutarlar.﴾** Özləri kasıb və ehtiyac içində olduqları halda dünya işlərində mühacirləri özlərindən üstün tutarlar. **﴿Nəfsinin xəsisliyindən qorunub saxlanılan kimsələr – məhz onlar nicat tapıb səadətə qovuşanlardır!﴾** Allah kimi nəfsinin hərisliyindən, paxıllığından qoruyar, şəriətin ona malında vacib buyurduğu zəkatı verər və digər haqları ödəyərsə, nicat tapmış olar. Kim bu işdə paxıllıq və xəsislik edərsə, nicat tapmaz.

وَٱلَّذِينَ جَآءُو مِنۢ بَعۡدِهِمۡ يَقُولُونَ رَبَّنَا ٱغۡفِرۡ لَنَا
وَلِإِخۡوَٰنِنَا ٱلَّذِينَ سَبَقُونَا بِٱلۡإِيمَٰنِ وَلَا تَجۡعَلۡ فِي قُلُوبِنَا
غِلّٗا لِّلَّذِينَ ءَامَنُواْ رَبَّنَآ إِنَّكَ رَءُوفٞ رَّحِيمٌ ١٠ ۞ أَلَمۡ تَرَ إِلَى
ٱلَّذِينَ نَافَقُواْ يَقُولُونَ لِإِخۡوَٰنِهِمُ ٱلَّذِينَ كَفَرُواْ مِنۡ أَهۡلِ
ٱلۡكِتَٰبِ لَئِنۡ أُخۡرِجۡتُمۡ لَنَخۡرُجَنَّ مَعَكُمۡ وَلَا نُطِيعُ فِيكُمۡ
أَحَدًا أَبَدٗا وَإِن قُوتِلۡتُمۡ لَنَنصُرَنَّكُمۡ وَٱللَّهُ يَشۡهَدُ إِنَّهُمۡ لَكَٰذِبُونَ
١١ لَئِنۡ أُخۡرِجُواْ لَا يَخۡرُجُونَ مَعَهُمۡ وَلَئِن قُوتِلُواْ لَا يَنصُرُونَهُمۡ
وَلَئِن نَّصَرُوهُمۡ لَيُوَلُّنَّ ٱلۡأَدۡبَٰرَ ثُمَّ لَا يُنصَرُونَ ١٢
لَأَنتُمۡ أَشَدُّ رَهۡبَةٗ فِي صُدُورِهِم مِّنَ ٱللَّهِۚ ذَٰلِكَ بِأَنَّهُمۡ قَوۡمٞ
لَّا يَفۡقَهُونَ ١٣ لَا يُقَٰتِلُونَكُمۡ جَمِيعًا إِلَّا فِي قُرٗى
مُّحَصَّنَةٍ أَوۡ مِن وَرَآءِ جُدُرِۭۚ بَأۡسُهُم بَيۡنَهُمۡ شَدِيدٞۚ تَحۡسَبُهُمۡ
جَمِيعٗا وَقُلُوبُهُمۡ شَتَّىٰۚ ذَٰلِكَ بِأَنَّهُمۡ قَوۡمٞ لَّا يَعۡقِلُونَ ١٤
كَمَثَلِ ٱلَّذِينَ مِن قَبۡلِهِمۡ قَرِيبٗاۖ ذَاقُواْ وَبَالَ أَمۡرِهِمۡ وَلَهُمۡ عَذَابٌ
أَلِيمٞ ١٥ كَمَثَلِ ٱلشَّيۡطَٰنِ إِذۡ قَالَ لِلۡإِنسَٰنِ ٱكۡفُرۡ فَلَمَّا كَفَرَ
قَالَ إِنِّي بَرِيٓءٞ مِّنكَ إِنِّيٓ أَخَافُ ٱللَّهَ رَبَّ ٱلۡعَٰلَمِينَ ١٦

10 **﴿Onlardan sonra gələnlər﴾** Yaxşı işlər görüb onların ardınca gedənlər **﴿belə deyirlər: "Ey Rəbbimiz! Bizi və bizdən əvvəlki iman gətirmiş﴾** mühacir və ənsar **﴿qardaşlarımızı bağışla. Bizim qəlblərimizdə iman gətirənlərə qarşı kinə yer vermə﴾**. Qəlbimizdə onlara qarşı yalan, nifrət və həsədə yer vermə. Bu dua ilk növbədə səhabələrə çatır. Çünki onlar möminlərin ən şərəflilərididir və ayələr də onların haqqındadır. Kim öz qəlbində onlara qarşı nifrət hiss edərsə, şeytanın ona təsiri

toxunmuşdur. Allahın dostlarına və Peyğəmbər (Səllallahu aleyhi və səlləm) ümmətinin ən xeyirli insanlarına göstərdiyi ədavətə görə Allahdan ona bir bəla gəlmişdir. Səhabələri söyənlər, təhqir edənlər və alçaldanlar da eyni hökmdədirlər. ﴾Ey Rəbbimiz! Sən, həqiqətən şəfqətlisən, mərhəmətlisən!"﴿

11 ﴾Məgər kitab əhlindən kafir olan qardaşlarına: "Əgər çıxarılsanız, biz də sizinlə birlikdə mütləq çıxacaq, sizin əleyhinizə heç vaxt heç kəsə qoşulub tabe olmayacağıq. Əgər *(möminlər)* sizinlə vuruşsalar, şübhəsiz ki, sizə yardım edəcəyik!" – deyən münafiqləri görmədinmi?﴿ Ayədə nəzərdə tutulan münafiqlər Abdullah ibn Ubeyy və onun yoldaşlarıdır. Deməli, onlar müsəlmanlara qarşı döyüşən Bənu Nəzir qəbiləsinə xəbər göndərmişdilər ki, siz sabitqədəm olun, təslim olmayın. Biz də sizi ayağa verən deyilik. Əgər siz döyüşsəniz, biz də sizinlə döyüşə qatılacağıq. Əgər sizi sürgün etsələr biz də sizinlə çıxacağıq. Sizinlə yola çıxmağımıza mane olanlara heç vaxt tabe olmayacağıq. Əgər siz döyüşsəniz biz də sizə kömək edəcəyik. Amma uca Allah onları yalanlayaraq deyir: ﴾Allah onların xalis yalançı olduğuna şahiddir!﴿ Onlar köməklik və birlik haqqında verdikləri sözlərində yalançıdırlar.

12 ﴾And olsun ki, əgər onlar *(Bənu Nəzir qəbiləsi)* yurdlarından çıxarılsalar, *(münafiqlər)* onlarla birlikdə *(öz yurdlarından)* çıxmazlar. Əgər *(möminlər)* onlarla vuruşsalar, *(münafiqlər)* onlara *(yəhudilərə)* kömək etməzlər.﴿ Bu, doğrudan da, belə oldu. Münafiqlər öz diyarlarından çıxarılan Bənu Nəzir yəhudiləri ilə çıxmadılar, Bənu Qureyzə və Xeybər yəhudiləri ilə döyüşə getmədilər. ﴾Yox, əgər *(münafiqlər)* onlara yardım etmiş olsalar, *(özləri məğlubiyyətə uğrayaraq)* arxa çevirib qaçar, sonra da onlara heç bir kömək olunmaz!﴿ Bundan sonra münafiqlərə heç bir kömək olmaz, Allah onları zəlil edər, ikiüzlülükləri də, onlara fayda verməz.

13 ﴾Onların *(münafiqlərlə yəhudilərin)* ürəklərində Allah qorxusundan çox sizdən qorxu vardır.﴿ Ey müsəlmanlar, siz münafiqlərin və yəhudilərin ürəklərinə Allahdan daha çox qorxu salırsınız. ﴾Bu isə, onların anlamaz bir qövm olduqlarına görədir.﴿ Əgər onlar anlayan bir qövm olsaydılar, sizi onların üzərində qalib edənin Allah olduğunu dərk edər və sizdən deyil, Allahdan daha çox qarmağın gərəkli olduğunu anlayardılar.

14 ﴾Onlar hamılıqla sizə qarşı ancaq möhkəm şəhərlərdə, yaxud divar arxasında *(qala içərisində)* olarkən döyüşərlər.﴿ Bu, onların qorxaqlıqlarından irəli gəlirdi. ﴾Onların öz aralarındakı vuruşmaları *(və düşmənçilikləri)* isə, çox güclüdür. Sən, onların əlbir olduqlarını güman edirsən, lakin onların qəlbləri dağınıqdır.﴿ Onlar zahirən əlbir görsənsələr də, əslində qəlbləri, fikirləri və istəkləri bir-birindən ayrıdır. ﴾Bunun səbəbi onların ağılsız bir qövm olmalarıdır﴿. Əgər ağılları olsaydı, haqqı tanıyıb itaət edər, birlik yaradar və ixtilafa düşməzdilər.

15 ﴾Onlar özlərindən bir az əvvəl əməllərinin cəzasını dadmış kimsələrə bənzəyirlər. Onları *(axirətdə)* şiddətli bir əzab gözləyir.﴿ Münafiqlər, kafirliklərinin cəzasını dünyada alan Bədrdə qətlə yetirilmiş Məkkə müşriklərinə bənzəyirlər. Bu döyüş Bənu Nəzir döyüşündən altı ay öncə baş vermişdi.

16 ﴾Münafiqlər şeytana bənzəyir.﴿ Münafiqlər onları aldatmaqla və onlara kömək etməməklə insanı aldadan şeytan kimi hərəkət ediblər. Şeytan da insanı küfr ilə aldadaraq ﴾O, insana: "Kafir ol !" – deyər. *(İnsan)* kafir olan kimi *(Şeytan onu qoyub qaçaraq)*: "Mənim səninlə heç bir əlaqəm yoxdur. Mən aləmlərin Rəbbi olan Allahdan qorxuram!" – deyər.﴿ Bu, şeytanın insandan üz döndərməsi üçün dediyi sözləridir.

17 ﴾Onların hər ikisinin aqibəti cəhənnəm odu içində həmişəlik qalmaqdır. Zalımların *(kafirlərin)* cəzası budur!﴿

18 ﴾Ey iman gətirənlər! Allahdan qorxun!﴿ Əmr etdiklərini yerinə yetirib, qadağan etdiklərindən çəkinməklə Onun əzabından qorxun. ﴾Hər kəs sabah üçün nə etdiyinə nəzər salsın.﴿ Qiyamət günü üçün nə hazırladığına baxsın. ﴾Allahdan qorxun. Həqiqətən, Allah etdiklərinizdən xəbərdardır!﴿

19 ﴾Allahı unutduqları üçün Allahın da onları özlərinə unutdurduğu kimsələrə bənzəməyin!﴿ Allahın əmrlərini tərk edib, itaətinə laqeydlik göstərərək Onu unudan kimsələr kimi olmayın. Belə etdikləri üçün Allah da onları özlərinə unutdurdu və onlar özlərini əzabdan xilas edən əməllərlə məşğul olmadılar. Xoş günlərində Allahı unutdular, Allah da dar gündə onları özlərinə unutdurdu. ﴾Onlar fasiqlərdir!﴿ Allahın itaətindən çıxmış kimsələrdir.

20 ﴾Cəhənnəm əhli ilə cənnət əhli eyni ola bilməz. Cənnət əhli nicat tapıb﴿ hər tələbi yerinə yetirib, bütün sıxıntılardan qurtulub əbədi ﴾səadətə qovuşanlardır!﴿

فَكَانَ عَٰقِبَتَهُمَآ أَنَّهُمَا فِي ٱلنَّارِ خَٰلِدَيۡنِ فِيهَاۚ وَذَٰلِكَ جَزَٰٓؤُاْ
ٱلظَّٰلِمِينَ ١٧ يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُواْ ٱتَّقُواْ ٱللَّهَ وَلۡتَنظُرۡ
نَفۡسٞ مَّا قَدَّمَتۡ لِغَدٖۖ وَٱتَّقُواْ ٱللَّهَۚ إِنَّ ٱللَّهَ خَبِيرُۢ بِمَا تَعۡمَلُونَ
١٨ وَلَا تَكُونُواْ كَٱلَّذِينَ نَسُواْ ٱللَّهَ فَأَنسَىٰهُمۡ أَنفُسَهُمۡۚ أُوْلَٰٓئِكَ
هُمُ ٱلۡفَٰسِقُونَ ١٩ لَا يَسۡتَوِيٓ أَصۡحَٰبُ ٱلنَّارِ وَأَصۡحَٰبُ
ٱلۡجَنَّةِۚ أَصۡحَٰبُ ٱلۡجَنَّةِ هُمُ ٱلۡفَآئِزُونَ ٢٠ لَوۡ أَنزَلۡنَا هَٰذَا
ٱلۡقُرۡءَانَ عَلَىٰ جَبَلٖ لَّرَأَيۡتَهُۥ خَٰشِعٗا مُّتَصَدِّعٗا مِّنۡ خَشۡيَةِ
ٱللَّهِۚ وَتِلۡكَ ٱلۡأَمۡثَٰلُ نَضۡرِبُهَا لِلنَّاسِ لَعَلَّهُمۡ يَتَفَكَّرُونَ
٢١ هُوَ ٱللَّهُ ٱلَّذِي لَآ إِلَٰهَ إِلَّا هُوَۖ عَٰلِمُ ٱلۡغَيۡبِ وَٱلشَّهَٰدَةِۖ
هُوَ ٱلرَّحۡمَٰنُ ٱلرَّحِيمُ ٢٢ هُوَ ٱللَّهُ ٱلَّذِي لَآ إِلَٰهَ إِلَّا هُوَ
ٱلۡمَلِكُ ٱلۡقُدُّوسُ ٱلسَّلَٰمُ ٱلۡمُؤۡمِنُ ٱلۡمُهَيۡمِنُ ٱلۡعَزِيزُ
ٱلۡجَبَّارُ ٱلۡمُتَكَبِّرُۚ سُبۡحَٰنَ ٱللَّهِ عَمَّا يُشۡرِكُونَ
٢٣ هُوَ ٱللَّهُ ٱلۡخَٰلِقُ ٱلۡبَارِئُ ٱلۡمُصَوِّرُۖ لَهُ ٱلۡأَسۡمَآءُ ٱلۡحُسۡنَىٰۚ
يُسَبِّحُ لَهُۥ مَا فِي ٱلسَّمَٰوَٰتِ وَٱلۡأَرۡضِۖ وَهُوَ ٱلۡعَزِيزُ ٱلۡحَكِيمُ ٢٤

ترتيبها ٦٠ — سُورَةُ ٱلۡمُمۡتَحَنَةِ — آياتها ١٣

21 **﴾Əgər Biz bu Quranı bir dağa nazil etsəydik, sən onun Allahın qorxusundan parça-parça olduğunu görərdin.﴿** Qurani-Kərim öz adına, əzəmətinə, bəlağətinə və qəbləri yumuşaldan öyüd-nəsihətlərinə görə elə bir kitabdır ki, bu halda dağlara nazil olsaydı, ucalığı və möhkəmliyi ilə seçilən dağlar Allah qorxusundan parça-parça olardı. **﴾Biz bu misalları insanlar üçün çəkirik ki, bəlkə, düşünələr.﴿** Öyüd-nəsihətlərdən ibrət alar, vəd olunan əzabdan çəkinərlər.

22 **﴾O Özündən başqa heç bir tanrı olmayan, gizlini də, aşkarı da bilən Allahdır. O rəhmlidir, mərhəmətlidir!﴿** Gizli, hissiyatdan uzaq olan qeybdir. Aşkar isə, göz ilə görsənəndir.

23 **﴾O Özündən başqa heç bir tanrı olmayan, ixtiyar sahibi,** *(eyiblərdən və nöqsanlardan)* **müqəddəs olan,** *(bəndələrinə)* **əmin-amanlıq bəxş edən,** *(hər şeydən)* **göz-qulaq olub** *(onu)* **qoruyan, yenilməz qüdrət** *(qüvvət)* **sahibi,** *(hamını istədiyi hər hansı bir şeyə)* **məcbur etməyə qadir olan, Məğrur Allahdır.﴿** Məğrur sifəti Allah barəsində mədh, məxluq barəsində isə məzəmmət sayılır. **﴾Allah** *(müşriklərin)* **Ona** *(şərik)* **qoşduqlarından ucadır﴿.**

24 **﴾O,** *(hər şeyi istədiyi kimi)* **yaradan, yoxdan var edən,** *(hər şeyə)* **surət verən Allahdır. Ən gözəl adlar** *(əsmayi-hüsna)* **ancaq Ona məxsusdur. Göylərdə və yerdə nə varsa** *(hamısı)* **Onu təqdis edib şəninə tariflər deyər. O, yenilməz qüvvət sahibi, hikmət sahibidir!﴿**

## əl-Mumtəhinə surəsi 60

### *(imtahana çəkilən qadın)*

1 **﴾Ey iman gətirənlər! Nə mənim düşmənimi, nə də özünüzün düşməninizi dost** *(vəli)* **tutun!﴿** Bu ayə, Hatib ibn Əbu Bəltəə haqqında nazil olmuşdu. O, Qureyşli müşriklərə məktub yazıb, Peyğəmbərin (Sallallahu aleyhi və səlləm) onlara tərəf yürüş edəcəyini xəbər vermişdi. Hadisə hicrətin səkkizinci ilində Məkkənin fəthində baş vermişdi. Ayə hər hansı vasitə ilə kafirləri özünə dost tutmağı qadağan edir. **﴾Onlar sizə gələn haqqı inkar etdikləri halda, siz onlarla dostluq edirsiniz.﴿** Aranızda olan mehribançılıq səbəbi ilə Peyğəmbərin (Sallallahu aleyhi və səlləm) xəbərlərini onlara çatdırırsınız. Halbuki onlar, Allaha, Peyğəmbərə, sizə göndərilən Qurana və ilahi hidayətə küfr edirlər. **﴾Siz Rəbbiniz olan Allaha iman gətirdiyiniz üçün onlar Peyğəmbəri və sizi çıxardırlar.﴿** Onlar sizin iman gətirməyinizdən xoşlanmayıb, sizə göndərilən şəriətə küfr etdikləri üçün sizi Məkkədən çıxardıblar. Siz onları necə dost tutursunuz? **﴾Əgər siz Mənim yolumda və Mənim rizamı qazanmaq uğrunda cihada çıxmısınızsa﴿,** Mənim və özünüzün düşmənlərinizi dost tutmayın. **﴾Siz onlarla gizlində dostluq edirsiniz...﴿** Dostluq üzündən onlara sirr verirsiniz. **﴾Mən sizin gizli saxladığınız və aşkar etdiyiniz hər şeyi bilirəm.﴿** Hər birinizin nə etdiyini, kimin xəbər göndərdiyini bilirəm. **﴾Sizdən kim bunu etsə, o, şübhəsiz ki, haqq yoldan azmışdır!﴿**

2 **﴾Əgər onlar sizi ələ keçirsələr, sizə düşmən olar, sizə pisliklə əl və dil uzadar, sizin kafir olmanızı istəyərlər﴿.** Sizinlə qarşılaşdıqları zaman qəlblərindəki düşmənçiliyi büruzə verər, əlləri ilə sizi vurmaq, dilləri ilə söymək istəyərlər. Hərçənd onlar sizin dininizdən dönmənizi və kafir olmanızı arzu edirlər.

3 **﴾Nə qohum-əqrabanız, nə də oğul-uşağınız sizə bir fayda verəcəkdir.﴿** Qiyamət günü qohum-əqraba, oğul-uşaq sizə bir fayda verməyəcək ki, onlara görə

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُواْ لَا تَتَّخِذُواْ عَدُوِّي وَعَدُوَّكُمۡ أَوۡلِيَآءَ تُلۡقُونَ
إِلَيۡهِم بِٱلۡمَوَدَّةِ وَقَدۡ كَفَرُواْ بِمَا جَآءَكُم مِّنَ ٱلۡحَقِّ يُخۡرِجُونَ ٱلرَّسُولَ
وَإِيَّاكُمۡ أَن تُؤۡمِنُواْ بِٱللَّهِ رَبِّكُمۡ إِن كُنتُمۡ خَرَجۡتُمۡ جِهَٰدٗا فِي سَبِيلِي
وَٱبۡتِغَآءَ مَرۡضَاتِيۚ تُسِرُّونَ إِلَيۡهِم بِٱلۡمَوَدَّةِ وَأَنَا۠ أَعۡلَمُ بِمَآ أَخۡفَيۡتُمۡ
وَمَآ أَعۡلَنتُمۡۚ وَمَن يَفۡعَلۡهُ مِنكُمۡ فَقَدۡ ضَلَّ سَوَآءَ ٱلسَّبِيلِ ١ إِن
يَثۡقَفُوكُمۡ يَكُونُواْ لَكُمۡ أَعۡدَآءٗ وَيَبۡسُطُوٓاْ إِلَيۡكُمۡ أَيۡدِيَهُمۡ وَأَلۡسِنَتَهُم
بِٱلسُّوٓءِ وَوَدُّواْ لَوۡ تَكۡفُرُونَ ٢ لَن تَنفَعَكُمۡ أَرۡحَامُكُمۡ وَلَآ أَوۡلَٰدُكُمۡۚ
يَوۡمَ ٱلۡقِيَٰمَةِ يَفۡصِلُ بَيۡنَكُمۡۚ وَٱللَّهُ بِمَا تَعۡمَلُونَ بَصِيرٞ ٣ قَدۡ
كَانَتۡ لَكُمۡ أُسۡوَةٌ حَسَنَةٞ فِيٓ إِبۡرَٰهِيمَ وَٱلَّذِينَ مَعَهُۥٓ إِذۡ قَالُواْ لِقَوۡمِهِمۡ
إِنَّا بُرَءَٰٓؤُاْ مِنكُمۡ وَمِمَّا تَعۡبُدُونَ مِن دُونِ ٱللَّهِ كَفَرۡنَا بِكُمۡ وَبَدَا بَيۡنَنَا
وَبَيۡنَكُمُ ٱلۡعَدَٰوَةُ وَٱلۡبَغۡضَآءُ أَبَدًا حَتَّىٰ تُؤۡمِنُواْ بِٱللَّهِ وَحۡدَهُۥٓ إِلَّا
قَوۡلَ إِبۡرَٰهِيمَ لِأَبِيهِ لَأَسۡتَغۡفِرَنَّ لَكَ وَمَآ أَمۡلِكُ لَكَ مِنَ ٱللَّهِ مِن شَيۡءٖۖ
رَّبَّنَا عَلَيۡكَ تَوَكَّلۡنَا وَإِلَيۡكَ أَنَبۡنَا وَإِلَيۡكَ ٱلۡمَصِيرُ ٤ رَبَّنَا لَا تَجۡعَلۡنَا
فِتۡنَةٗ لِّلَّذِينَ كَفَرُواْ وَٱغۡفِرۡ لَنَا رَبَّنَآۖ إِنَّكَ أَنتَ ٱلۡعَزِيزُ ٱلۡحَكِيمُ ٥

kafirlərə dost münasibəti bəsləyəsiniz. Sizə fayda verən kafirlərə düşmən kimi baxıb, onlara qarşı cihad etmək və onları dost tutmamaq haqqında Allahın əmrinə əməl etməkdir. **﴾Allah qiyamət günü sizi bir-birinizdən ayıracaqdır.﴿** İtaət edənləri cənnətə, asilik göstərənləri cəhənnəmə salacaqdır. **﴾Allah nə etdiklərinizi görəndir!﴿**

(4) **﴾İbrahim və onunla birlikdə olanlar sizin üçün gözəl örnəkdir.﴿** Peyğəmbər (Sallallahu aleyhi və səlləm) Hatibə belə deyirdi: ***"Ey Hatib, məgər İbrahimi ﷺ özünə örnək götürərək atasından və qövmindən imtina etdiyi kimi sən də ailəndən imtina edə bilmirdinmi?"*** **﴾O zaman onlar öz qövmünə belə demişdilər:﴿** Siz, Allaha iman gətirmirsiniz deyə, **﴾"şübhəsiz ki, bizim sizinlə və sizin Allahdan başqa ibadət etdiklərinizlə heç bir əlaqəmiz yoxdur. Biz, sizi inkar edirik.﴿** Sizin dininizi və etdiklərinizi inkar edirik. **﴾Siz, bir olan Allaha iman gətirməyincə, bizimlə sizin aranızda həmişə ədavət və nifrət olacaqdır!"﴿** Əgər siz, Allaha şərik qoşmaqdan əl çəksəniz, o zaman bu düşmənçilik dostluğa, nifrət isə, sevgiyə çevrilər. **﴾Ancaq İbrahim öz atasına: "Mən mütləq sənin bağışlanmağını diləyəcəm – deməsi istisnadır.﴿** İbrahimin ﷺ bütün sözlərində sizin üçün örnək vardır. Yalnız atası haqqında dediyi bu sözlərdən başqa. Siz bu işdə onu örnək tutub müşriklər üçün bağışlanma diləməyin. İbrahim ﷺ bunu verdiyi vədə əsasən demişdi. ***﴾Atasının Allaha düşmən olması İbrahimə aydın olduqda o öz atasından uzaqlaşdı﴿*** *(Tövbə: 114).* **﴾Mən heç vəchlə səni Allahdan qurtara bilmərəm!"﴿** Allahın əzabından heç bir şeyi səndən uzaqlaşdıra bilmərəm. İbrahim ﷺ və onunla olanlar belə dedilər: **﴾"Ey Rəbbimiz! Biz ancaq Sənə təvəkkül etdik, tövbə edib ancaq Sənə tərəf qayıtdıq. Axır dönüş də, ancaq Sənin hüzurunadır.﴿**

(5) **﴾Ey Rəbbimiz! Bizi kafirlər üçün sınaq vasitəsi etmə!﴿** Mücahid deyir: İman gətirməyənlər "Əgər onlar haqq üzərində olsaydılar, başlarına belə iş gəlməzdi" – deməsinlər deyə, nə kafirlərin əli ilə, nə də Öz dərgahından bizə bəla göndərmə. **﴾Bizi bağışla. Ey Rəbbimiz! Həqiqətən Sən, yenilməz qüvvət sahibi, hikmət sahibisən!"﴿**

(6) **﴾And olsun ki, onlar sizin üçün, Allaha və axirət gününə ümid bəsləyənlər üçün gözəl örnəkdir.﴿** Dünyada və axirətdə xeyirə can atanlar üçün İbrahimdə və onunla iman gətirənlərdə gözəl örnək vardır. **﴾Kim üz döndərsə. Allah möhtac deyildir;﴿** Bu deyilənlərdən üz döndərən kimsə bilməlidir ki, bununla Allaha heç bir zərər vurmur. Allah heç bir məxluqa möhtac deyil. Onun dostlarının etiqadına görə **﴾O, tərifə layiqdir!﴿**

(7) **﴾Ola bilsin ki, Allah sizinlə düşmənçilik etdiyiniz kimsələr arasında dostluq yaratsın.﴿** İslama gəldikdən sonra sizinlə Məkkə müşrikləri arasında dostluq ola bilər. Bu belə də oldu. Məkkənin fəthindən sonra bir dəstə insan İslamı qəbul edib ona gözəl şəkildə riayət etdilər. Özlərindən əvvəl İslamı qəbul edənlərlə isti münasibət qurub birlikdə cihad edib xeyirli işlər gördülər. Peyğəmbər (Sallallahu aleyhi və səlləm) Əbu Süfyanın qızı Ummu Həbibə ilə evləndi. Əbu Süfyan Məkkənin fəthi günü İslamı qəbul edib öz ədavətindən əl çəkdikdən sonra onunla mehriban münasibət quruldu. Əbu Hureyrə ﷺ deyir ki, Allahın dininə riayət etməkdən imtina edən mürtədlərə qarşı ilk döyüşən kişi Əbu Süfyan ibn Hərb idi. Elə bu ayə də, onun haqqında nazil olmuşdu. ***﴾Ola bilsin ki, Allah sizinlə düşmənçilik etdiyiniz kimsələr arasında dostluq yaratsın.﴿*** İnadkarların qəlblərini yönəldib, Öz məğfirətinə və mərhəmətinə daxil etməyə **﴾Allah qadirdir. Allah bağışlayandır, rəhm edəndir!﴿**

لَقَدْ كَانَ لَكُمْ فِيهِمْ أُسْوَةٌ حَسَنَةٌ لِّمَن كَانَ يَرْجُوا اللَّهَ وَالْيَوْمَ الْآخِرَ
وَمَن يَتَوَلَّ فَإِنَّ اللَّهَ هُوَ الْغَنِيُّ الْحَمِيدُ ٦ عَسَى اللَّهُ أَن يَجْعَلَ
بَيْنَكُمْ وَبَيْنَ الَّذِينَ عَادَيْتُم مِّنْهُم مَّوَدَّةً وَاللَّهُ قَدِيرٌ وَاللَّهُ غَفُورٌ رَّحِيمٌ
٧ لَّا يَنْهَاكُمُ اللَّهُ عَنِ الَّذِينَ لَمْ يُقَاتِلُوكُمْ فِي الدِّينِ وَلَمْ يُخْرِجُوكُم
مِّن دِيَارِكُمْ أَن تَبَرُّوهُمْ وَتُقْسِطُوا إِلَيْهِمْ إِنَّ اللَّهَ يُحِبُّ الْمُقْسِطِينَ
٨ إِنَّمَا يَنْهَاكُمُ اللَّهُ عَنِ الَّذِينَ قَاتَلُوكُمْ فِي الدِّينِ وَأَخْرَجُوكُم
مِّن دِيَارِكُمْ وَظَاهَرُوا عَلَىٰ إِخْرَاجِكُمْ أَن تَوَلَّوْهُمْ وَمَن يَتَوَلَّهُمْ فَأُولَٰئِكَ
هُمُ الظَّالِمُونَ ٩ يَا أَيُّهَا الَّذِينَ آمَنُوا إِذَا جَاءَكُمُ الْمُؤْمِنَاتُ
مُهَاجِرَاتٍ فَامْتَحِنُوهُنَّ اللَّهُ أَعْلَمُ بِإِيمَانِهِنَّ فَإِنْ عَلِمْتُمُوهُنَّ مُؤْمِنَاتٍ
فَلَا تَرْجِعُوهُنَّ إِلَى الْكُفَّارِ لَا هُنَّ حِلٌّ لَّهُمْ وَلَا هُمْ يَحِلُّونَ لَهُنَّ وَآتُوهُم
مَّا أَنفَقُوا وَلَا جُنَاحَ عَلَيْكُمْ أَن تَنكِحُوهُنَّ إِذَا آتَيْتُمُوهُنَّ أُجُورَهُنَّ
وَلَا تُمْسِكُوا بِعِصَمِ الْكَوَافِرِ وَاسْأَلُوا مَا أَنفَقْتُمْ وَلْيَسْأَلُوا مَا أَنفَقُوا
ذَٰلِكُمْ حُكْمُ اللَّهِ يَحْكُمُ بَيْنَكُمْ وَاللَّهُ عَلِيمٌ حَكِيمٌ ١٠ وَإِن فَاتَكُمْ
شَيْءٌ مِّنْ أَزْوَاجِكُمْ إِلَى الْكُفَّارِ فَعَاقَبْتُمْ فَآتُوا الَّذِينَ ذَهَبَتْ
أَزْوَاجُهُم مِّثْلَ مَا أَنفَقُوا وَاتَّقُوا اللَّهَ الَّذِي أَنتُم بِهِ مُؤْمِنُونَ ١١

8 **﴾Allah din yolunda sizinlə vuruşmayan və sizi yurdunuzdan çıxartmayan kimsələrə yaxşılıq etməyi və onlarla ədalətlə rəftar etməyi sizə qadağan etməz.﴿** Allah belə insanlarla qohumluq əlaqələrini qorumağı, qonşuya yaxşılıq etməyi, gələn qonağı xoş qarşılamağı sizə qadağan etmir. Siz, onlara qarşı ədalətli olun, haqqlarını tapdalamayın, vədinizə vəfalı çıxın, əmanəti qoruyun, aldığınızın pulunu tam ödəyin. **﴾Allah, ədalətli olanları sevər!﴿** Allah, sülh şəraitində yaşayıb döyüşməmək və düşmənə kömək etməmək barədə əhd bağlayan kafirlərlə yaxşı davranmağı, onlara qarşı ədalətli olmağı qadağan etmir.
9 **﴾Allah sizə, ancaq sizinlə din yolunda vuruşan, sizi yurdunuzdan çıxardan və çıxartmağa kömək edən kimsələrlə dostluq etmənizi qadağan edər.﴿** Qüreyş qəbiləsindən olan küfr havadarlarını, müsəlmanlara qarşı düşmənçilik edənləri, sizi öz yurdunuzdan çıxardanlara yardım göstərən Məkkə camaatını və yaxın ətrafda yaşayanları özünüzə dost tutmayın. **﴾Onlarla dostluq edənlər əsl zalımlardır!﴿** Çünki onlar, Allahın, Peyğəmbərin və Quranın düşmənlərinə dostluq münasibəti göstərirlər.
10 **﴾Ey iman gətirənlər! Mömin qadınlar﴿** kafirlərdən üz döndərib **﴾sizin yanınıza mühacir kimi gəldikləri zaman onları imtahana çəkin.﴿** Peyğəmbər (Sallallahu aleyhi və səlləm) Qureyş qəbiləsi ilə Hudeybiyyə sülhündə razılaşmışdılar ki, bundan sonra kim islamı qəbul edib, müsəlmanların yanına gələrsə, onu geri qaytaracaqlar. Sonra qadınlar Peyğəmbərin (Sallallahu aleyhi və səlləm) yanına hicrət etdikdə, Allah onların müşriklərə qaytarılmasını istəmədiyi üçün onları imtahan etməyi əmr etdi ki, onların islama olan rəğbətləri aşkar olsun. Onlardan ərlərinə nifrət, bir yerdən digərinə köç etmək və ya dünya mənfəəti əldə etmək üçün deyil, Allahı, Peyğəmbərini (Sallallahu aleyhi və səlləm) və dinini sevib gəlmələri haqqında and götürürdülər. Əgər onlar bunun üçün and içsəydilər, Peyğəmbər (Sallallahu aleyhi və səlləm) onların mehrlərini və xərclərini ərlərinə qaytarar, onları isə, qaytarmazdı. **﴾Allah, onların imanını çox gözəl bilir.﴿** Onların həqiqi vəziyyətini Allah bilir və bunu bilməyi sizdən tələb etmir. Sizdən onları imtahan etmək tələb olunur ki, bununla siz, onların həqiqətən də, İslama rəğbət bəslədiklərinin şahidi olasınız. **﴾Əgər﴿** sizə əmr olunan imtahanı etdikdən sonra zahirən **﴾bunların mömin olduqlarını bilsəniz, artıq onları kafirlərin yanına qaytarmayın.﴿** Onları kafir ərlərinə təslim etməyin. **﴾Nə bunlar onlara, nə də onlar bunlara halaldır.﴿** Mömin qadın kafir kişiyə halal deyil. Qadının İslamı qəbul etməsi təkcə hicrət etməyi deyil, kafir ərindən ayrılmasını da vacib edir. **﴾Onların xərclədiklərini özlərinə qaytarıb verin.﴿** İslamı qəbul edib, hicrət edən bu qadınların kafir ərlərinə mehrlərini qaytarın. Şafii deyir: Əgər bunu qadının əri deyil, digər qohumu tələb edərsə, ona verilməz. **﴾Bunların mehrlərini özlərinə verdiyiniz təqdirdə onlarla evlənməyinizdən sizə heç bir günah gəlməz.﴿** Onlar da sizin dininizdə olduqları üçün iddə gözlədikdən və mehr verdikdən sonra onlarla evlənə bilərsiniz. **﴾Kafir qadınları öz kəbininiz altında saxlamayın.﴿** Dini fərqliliyə görə, kafir qadın müsəlman kişinin arvadı olaraq qala bilməz. Əvvəllər kafirlər müsəlmanları evləndirir, müsəlmanlar da müşrik qadınlarla evlənirdilər. Sonra bu ayə ilə həmin ənənə ləğv olundu. Deyilən hökm əhli kitaba deyil, müşrik kafirlərə aiddir. İslamı qəbul etməyib kafirlikdə qalan qadınlarınızdan **﴾verdiyiniz mehri istəyin.﴿** Kafirlər də **﴾sərf etdikləri mehri istəsinlər.﴿** Təfsir alimləri deyirlər: Hər hansı müsəlman qadın İslamdan çıxıb Əhd

يَٰٓأَيُّهَا ٱلنَّبِيُّ إِذَا جَآءَكَ ٱلْمُؤْمِنَٰتُ يُبَايِعْنَكَ عَلَىٰٓ أَن لَّا يُشْرِكْنَ
بِٱللَّهِ شَيْـًٔا وَلَا يَسْرِقْنَ وَلَا يَزْنِينَ وَلَا يَقْتُلْنَ أَوْلَٰدَهُنَّ وَلَا يَأْتِينَ
بِبُهْتَٰنٍ يَفْتَرِينَهُۥ بَيْنَ أَيْدِيهِنَّ وَأَرْجُلِهِنَّ وَلَا يَعْصِينَكَ
فِى مَعْرُوفٍ فَبَايِعْهُنَّ وَٱسْتَغْفِرْ لَهُنَّ ٱللَّهَ إِنَّ ٱللَّهَ غَفُورٌ رَّحِيمٌ
١٢ يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوا۟ لَا تَتَوَلَّوْا۟ قَوْمًا غَضِبَ ٱللَّهُ عَلَيْهِمْ
قَدْ يَئِسُوا۟ مِنَ ٱلْءَاخِرَةِ كَمَا يَئِسَ ٱلْكُفَّارُ مِنْ أَصْحَٰبِ ٱلْقُبُورِ ١٣

## سُورَةُ الصَّفِّ

آياتها ١٤ — ترتيبها ٦١

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

سَبَّحَ لِلَّهِ مَا فِى ٱلسَّمَٰوَٰتِ وَمَا فِى ٱلْأَرْضِ وَهُوَ ٱلْعَزِيزُ ٱلْحَكِيمُ
١ يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوا۟ لِمَ تَقُولُونَ مَا لَا تَفْعَلُونَ ٢
كَبُرَ مَقْتًا عِندَ ٱللَّهِ أَن تَقُولُوا۟ مَا لَا تَفْعَلُونَ ٣ إِنَّ
ٱللَّهَ يُحِبُّ ٱلَّذِينَ يُقَٰتِلُونَ فِى سَبِيلِهِۦ صَفًّا كَأَنَّهُم
بُنْيَٰنٌ مَّرْصُوصٌ ٤ وَإِذْ قَالَ مُوسَىٰ لِقَوْمِهِۦ يَٰقَوْمِ لِمَ
تُؤْذُونَنِى وَقَد تَّعْلَمُونَ أَنِّى رَسُولُ ٱللَّهِ إِلَيْكُمْ فَلَمَّا
زَاغُوٓا۟ أَزَاغَ ٱللَّهُ قُلُوبَهُمْ وَٱللَّهُ لَا يَهْدِى ٱلْقَوْمَ ٱلْفَٰسِقِينَ ٥

bağlayan kafirlərin yanına getsəydi, o zaman kafirlərdən o qadının mehri tələb olunar və müsəlman ərinə verilərdi. Eləcə də, əgər qadın kafirlərin yanından gəlib islamı qəbul etsəydi, onun mehrini kafir ərinə verərdilər. Hudeybiyyədə əhd bağladığınız müşriklərin mehrlərinin qaytarılması haqqında **﴾Allahın hökmü budur.﴿** Bu hökm digər müşriklərə aid deyil. Çünki hökmü ləğv *(nəsx)* olunub. Qurtubi deyir: "Mehrlərin qaytarılmasına aid bu hökm o zaman baş vermiş hadisələrə aid idi. O zaman ikisindən biri İslamı qəbul edən ər və ya arvad arasında fərq yox idi". **﴾O, sizin aranızda hökm edər. Allah biləndir, hikmət sahibidir!﴿**

(11) **﴾Əgər zövcələrinizdən biri sizdən qaçıb kafirlərə qoşulsa və siz də qənimət əldə etsəniz, zövcələri getmiş kimsələrə onların sərf etdikləri mehr qədər verin.﴿** Arvadı qaçıb müşriklər tərəfə keçən kimsələr mehrlərini ala bilməsələr, o zaman bu mehrin əvəzində döyüşdən əldə olunan qənimətdən həmin adama pay verin. Sizə əzab qazandıracaq əməllərdən çəkinib **﴾İman gətirdiyiniz Allahdan qorxun!﴿**

(12) **﴾Ya Peyğəmbər! Mömin qadınlar﴿** Məkkənin fəthi günü beyət etmək üçün sənin yanına gəldikdə onlardan **﴾Allaha heç bir şərik qoşmayacaqları, oğurluq və zina etməyəcəkləri,﴿** Cahiliyyət dövründəki kimi, **﴾övladlarını öldürməyəcəkləri,﴿ ﴾özgə kişilərdən olan uşaqlarını yalandan ərlərinə isnad etməyəcəkləri﴿** Fərra adlı alim deyir: Cahiliyyət dövründə bir qadın uşaq tapar və ərinə deyərdi: "bu səndən olan uşağımdır". İbn Abbas isə deyir: "Qadın qız uşağı doğduqda ərinin xəbəri olmadan onu oğlan ilə dəyişdirərdi". **﴾və heç bir yaxşı işdə sənin əleyhinə çıxmayacaqları﴿** Allaha itaət sayılan hər əmrə itaət edib insan öldükdə vay-şivən qoparmamaq, paltarını cırmamaq, saç yolmamaq, sinə paltarını didməmək, üzünü cırmaqlamamaq və əzab istəyi ilə dua etməmək **﴾barədə sənə beyət etmək üçün yanına gəldikləri zaman onların beyətini qəbul et və﴿** bu beyətlərinə görə **﴾Allahdan onların bağışlanmasını dilə. Həqiqətən Allah bağışlayandır, rəhm edəndir!﴿**

(13) **﴾Ey iman gətirənlər! Allahın qəzəbinə düçar olmuş bir qövmlə dostluq etməyin.﴿** Bu, bütün kafirlərə şamildir. **﴾Kafirlər qəbiristan əhlindən ümidlərini üzdükləri kimi, onlar da axirətdən ümidlərini üzmüşlər!﴿** Kafirlər ölülərin qiyamət günü diriləcəyindən ümidlərini üzdükləri kimi onlar da küfr əməlləri səbəbi ilə tam yəqinliklə axirətə inanmırlar.

# əs-Saff surəsi 61

## *(Səf)*

(1) **﴾Göylərdə və yerdə nə varsa, *(hamısı, bütün məxluqat)* Allahı təqdis edib şəninə təriflər deyər. O, yenilməz qüvvət sahibi, hikmət sahibidir!﴿**

(2) **﴾Ey iman gətirənlər! Etməyəcəyiniz bir şeyi niyə deyirsiniz?﴿** İbn Abbas ؓ deyir: Cihad vacib buyurulmadan öncə bəzi möminlər belə deyərdilər: "Allah Özünə hansı əməlin daha xoş getdiyini bizə bildirsəydi, onu edərdik." Uca Allah Özünə cihadın daha sevimli olduğunu bildirdikdə bu bəzi möminlərin xoşuna gəlmədi və bu əmri özlərinə ağır gördülər. Sonra bu ayə nazil oldu.

(3) **﴾Etməyəcəyiniz bir şeyi demək Allah yanında böyük qəzəbə səbəb olar.﴿** Allah bu əməlinizə çox qəzəblənir. Bəzi təfsirçilərin rəyinə görə bəzi insanlar Peyğəmbərin *(Səllallahu aleyhi və səlləm)* yanına gələr və heç nə etmədikləri halda özlərini öyərək: "Mən öz qılıncımla

وَإِذْ قَالَ عِيسَى ابْنُ مَرْيَمَ يَٰبَنِيٓ إِسْرَٰٓءِيلَ إِنِّي رَسُولُ ٱللَّهِ إِلَيْكُم مُّصَدِّقًا
لِّمَا بَيْنَ يَدَيَّ مِنَ ٱلتَّوْرَىٰةِ وَمُبَشِّرًۢا بِرَسُولٍ يَأْتِي مِنۢ بَعْدِي ٱسْمُهُۥٓ أَحْمَدُ فَلَمَّا
جَآءَهُم بِٱلْبَيِّنَٰتِ قَالُوا۟ هَٰذَا سِحْرٌ مُّبِينٌ ﴿٦﴾ وَمَنْ أَظْلَمُ مِمَّنِ ٱفْتَرَىٰ
عَلَى ٱللَّهِ ٱلْكَذِبَ وَهُوَ يُدْعَىٰٓ إِلَى ٱلْإِسْلَٰمِ وَٱللَّهُ لَا يَهْدِي ٱلْقَوْمَ ٱلظَّٰلِمِينَ
﴿٧﴾ يُرِيدُونَ لِيُطْفِـُٔوا۟ نُورَ ٱللَّهِ بِأَفْوَٰهِهِمْ وَٱللَّهُ مُتِمُّ نُورِهِۦ وَلَوْ كَرِهَ
ٱلْكَٰفِرُونَ ﴿٨﴾ هُوَ ٱلَّذِيٓ أَرْسَلَ رَسُولَهُۥ بِٱلْهُدَىٰ وَدِينِ ٱلْحَقِّ لِيُظْهِرَهُۥ
عَلَى ٱلدِّينِ كُلِّهِۦ وَلَوْ كَرِهَ ٱلْمُشْرِكُونَ ﴿٩﴾ يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوا۟ هَلْ أَدُلُّكُمْ
عَلَىٰ تِجَٰرَةٍ تُنجِيكُم مِّنْ عَذَابٍ أَلِيمٍ ﴿١٠﴾ تُؤْمِنُونَ بِٱللَّهِ وَرَسُولِهِۦ وَتُجَٰهِدُونَ
فِي سَبِيلِ ٱللَّهِ بِأَمْوَٰلِكُمْ وَأَنفُسِكُمْ ذَٰلِكُمْ خَيْرٌ لَّكُمْ إِن كُنتُمْ تَعْلَمُونَ ﴿١١﴾
يَغْفِرْ لَكُمْ ذُنُوبَكُمْ وَيُدْخِلْكُمْ جَنَّٰتٍ تَجْرِي مِن تَحْتِهَا ٱلْأَنْهَٰرُ وَمَسَٰكِنَ
طَيِّبَةً فِي جَنَّٰتِ عَدْنٍ ذَٰلِكَ ٱلْفَوْزُ ٱلْعَظِيمُ ﴿١٢﴾ وَأُخْرَىٰ تُحِبُّونَهَا نَصْرٌ
مِّنَ ٱللَّهِ وَفَتْحٌ قَرِيبٌ وَبَشِّرِ ٱلْمُؤْمِنِينَ ﴿١٣﴾ يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوا۟ كُونُوٓا۟
أَنصَارَ ٱللَّهِ كَمَا قَالَ عِيسَى ٱبْنُ مَرْيَمَ لِلْحَوَارِيِّـۧنَ مَنْ أَنصَارِيٓ إِلَى ٱللَّهِ
قَالَ ٱلْحَوَارِيُّونَ نَحْنُ أَنصَارُ ٱللَّهِ فَـَٔامَنَت طَّآئِفَةٌ مِّنۢ بَنِيٓ إِسْرَٰٓءِيلَ
وَكَفَرَت طَّآئِفَةٌ فَأَيَّدْنَا ٱلَّذِينَ ءَامَنُوا۟ عَلَىٰ عَدُوِّهِمْ فَأَصْبَحُوا۟ ظَٰهِرِينَ ﴿١٤﴾

belə döyüşdüm, belə zərbə vurdum" – deyərdilər. Ayə də belələri haqqında nazil olub.

(4) **﴾Şübhəsiz ki, Allah Öz yolunda möhkəm divar kimi səf çəkib döyüşənləri sevər!﴿** Uca Allah bu ayədə onlara bildirir ki, Onun üçün bəndələri tərəfindən edilən ən sevimli əməl Allah yolunda döyüşməkdir. Hədislərin birində isə deyilir: **"İşin başı islam, dirəyi namaz, ən ali məqamı isə Allah yolunda döyüşməkdir".** Allah yolunda döyüşənlər ayrılmaz bir hissə kimi bir-birinə sıx dayanmış halda cərgə-cərgə düzülərlər. Bu isə, Allahın əmrinə ürəkdən və tam səmimiyyətlə bağlanmaqdan irəli gəlir. Onlar bu işdən yorulmaz və heç bir düşmən onları bu yoldan döndərə bilməz.

(5) **﴾Xatırla ki, bir zaman Musa öz qövmünə demişdi: "Ey qövmüm! Mənim Allahın sizə göndərilmiş peyğəmbəri olduğumu bildiyiniz halda, niyə məni incidirsiniz?" Onlar *(haqdan)* üz döndərdikdə Allah da onların qəlbini azdırdı. Allah fasiqləri doğru yola yönəltməz!﴿** Uca Allah Onun yolunda döyüşənləri sevdiyini bəyan etdikdən sonra Musa ﷺ və İsanın ﷺ da insanlara tövhid əqidəsini əmr edib Allah yolunda cihad etmələrini xatırladaraq, onlara qarşı çıxanların isə cəzalandırıldığını bildirərək, Muhəmməd (Sallallahu aleyhi və səlləm) ümmətinə İsa və Musa ümmətinin etdiklərini təkrar etməmək barədə xəbərdarlıq etmişdir. Allahın sizə vacib buyurduğu şəriət hökmlərini əmr etdikdə müxalif olub, təhqir edib, **﴾Mənim Allahın sizə göndərilmiş peyğəmbəri olduğumu bildiyiniz halda, niyə məni incidirsiniz?﴿** Siz mənim peyğəmbər olduğumu bilə-bilə necə olur ki, mənə əziyyət verirsiniz. Axı peyğəmbərə hörmət edilməlidir. Siz peyğəmbərliyimi etiraf etmək məcburiyyətində qalacaq qədər möcüzələrin şahidi olmusunuz. Əslində, bundan sonra siz, şəkk etməməlisiniz. Siz, peyğəmbərlik haqqında yəqin bilgiyə sahib olmalısınız. **﴾Onlar haqdan üz döndərdikdə Allah da onların qəlblərini haqdan döndərdi.﴿** Onlar peyğəmbərlərinə əziyyət verib haqqı tərk etdikdə bu əməllərinin cəzası olaraq Allah da onların qəlblərini haqdan yayındırdı.

(6) **﴾Bir vaxt Məryəm oğlu İsa belə demişdi: "Ey İsrail oğulları! Həqiqətən, mən özümdən əvvəl nazil olmuş Tövratı təsdiq edən və məndən sonra gələcək Əhməd adlı bir peyğəmbərlə müjdə verən Allahın elçisiyəm!" Sonra onlara açıq-aşkar möcüzələr gətirdikdə onlar: "Bu, açıq-aydın sehrdir!" – dedilər.﴿** Mən İncil kitabını gətirən Allah elçisiyəm. Tövrata zidd olan heç nə gətirməmişəm. Əksinə, bu kitab da mənim gəlişimi müjdələyib. Elə isə nə üçün siz, məndən üz döndərir və müxalif olursunuz. **﴾məndən sonra gələcək Əhməd adlı bir peyğəmbərlə﴿** müjdə verirəmsə, mənim təkzib edilməyimə də əsas yoxdur. Əhməd bizim Peyğəmbərin (Sallallahu aleyhi və səlləm) adıdır. Bu sözün mənası xeyirli xüsusiyyətləri ilə başqalarından fərqləndiyi üçün digərlərindən çox təriflənən deməkdir. **﴾Sonra onlara açıq-aşkar möcüzələr gətirdikdə onlar: "Bu, açıq-aydın sehrdir!" – dedilər.﴿** İsa peyğəmbər onlara möcüzələr göstərdikdə onlar bunun açıq-aydın sehr olduğunu dedilər. Bəzi təfsirçilərə görə bu ayədə Peyğəmbərimiz (Sallallahu aleyhi və səlləm) *nəzərdə tutulur. Yəni, o* öz möcüzələrini göstərdikdə ona da sehrbaz dedilər.

(7) **﴾İslama dəvət olunduğu halda, Allaha qarşı yalan uydurandan daha zalım kim ola bilər?! Allah zalım qövmü doğru yola yönəltməz!﴿** Dinlərin ən xeyirlisi və şərəflisi bu dindir. Belə məziyyətlərə sahib olan başqasına qarşı yalan iftira atmırsa, Rəbbinə qarşı necə iftira ata bilər?! **﴾Allah zalım**

qövmü doğru yola yönəltməz!﴿ Haqqında danışılanlar da zalımlardandır.

8 ﴾Onlar Allahın nurunu öz ağızları ilə söndürmək istəyirlər. Allah isə - kafirlərin xoşuna gəlməsə də, öz nurunu tamamlayacaqdır.﴿ Onların yalan sözlər danışıb islamı boğmaq və insanları ondan yayındırmaq üçün etdikləri səylər, ətrafa işıq saçan əzəmətli nuru söndürməyə cəhd etmək kimidir. Amma bütün bunlara baxmayaraq, Allah İslam dinini dünyanın hər yanında yaymaqla Öz nurunu artıracaq, onu digərlərindən üstün edəcəkdir.

9 ﴾Müşriklərin xoşuna gəlməsə də, onu bütün dinlərdən üstün etmək üçün Öz Peyğəmbərini hidayət və haqq dinlə göndərən Odur!﴿ Onlar bunu istəməsələr də, mütləq Allah onu bütün dinlərə qalib, üstün edər.

10 ﴾Ey iman gətirənlər! Sizə elə bir ticarət göstərimmi ki, o sizi şiddətli əzabdan xilas etsin?﴿ Uca Allah bu ayədə əməlləri ticarətə bənzətmişdir. Ticarətdə qazanc məqsədi olduğu kimi burada da savab məqsədi vardır. Onların məqsədi cəhənnəmdən qurtulub, cənnətə daxil olmaqdır. Qarşıdakı iki ayədə bu ticarətin mahiyyəti açıqlanacaqdır. İki ayəyə görə iman gətirmək və cihad eyməyin Allah tərəfindən olan mükafatı cənnətdir. Bu, əsl uğurlu ticarətdir.

11 ﴾Allaha və Onun Peyğəmbərinə iman gətirəsiniz. Allah yolunda malınız və canınızla vuruşasınız. Bilsəniz, bu sizin üçün nə qədər xeyirlidir!﴿

12 ﴾O sizin günahlarınızı bağışlayar və sizi altından çaylar axan cənnətlərə və Ədn cənnətlərindəki gözəl saraylara daxil edər. Bu, böyük qurtuluşdur!﴿ Öncəki ayədə onların ticarət edəcəkləri vasitə, burada isə onlara vəd edilən mükafat qeyd edilir. Deyilir ki, əgər siz, iman gətirsəniz, sizin günahlarınız bağışlanar, əbədi olaraq ədn cənnətlərində yaşayarsınız. Siz oradan çıxmaz, orada ölüm dadmazsınız. Bu şəkildə bağışlanmaya qovuşmaq və cənnətə daxil olmaq böyük qurtuluşdur. Bundan böyük qurtuluş və zəfər ola bilməz.

13 ﴾sevdiyiniz başqa bir nemət də - Allah dərgahından kömək və yaxın qələbə gözləyir. Möminlərə müjdə ver!﴿ Allah tərəfindən sizə müjdə vardır. Siz Qureyş üzərində qələbə çalacaq və Məkkəni fəth edəcəksiniz. Əta ibn Əbu Rəbah deyir: "Ayədə fars və roma vilayətlərinin fəthi nəzərdə tutulur". Ey Muhəmməd (Səllallahu aleyhi və səlləm), möminləri bu dünyada zəfərlə, axirətdə isə cənnətlə müjdələ.

14 ﴾Ey iman gətirənlər! Allahın köməkçiləri olun. Necə ki, Məryəm oğlu İsa həvarilərə: "Allah yolunda mənim köməkçilərim kimdir?" – demiş, həvarilər də: "Allahın köməkçiləri bizik!" – deyə cavab vermişdilər. Nəhayət, İsrail oğullarından bir tayfa iman gətirdi, bir tayfa isə kafir oldu. Biz də iman gətirənləri düşmənlərinə qarşı qüvvətləndirdik və onlar qələbə çaldılar.﴿ Ey möminlər! Bir zamanlar İsa həvarilərə "Allah yolunda mənim köməkçilərim kimdir?" – deyə müraciət edəndə həvarilər: "Allahın köməkçiləri bizik!" – demişdilər. Siz də onlar kimi Allahın dininə kömək etməkdə davam edin. Həvarilər Məsihin ən saf dostları, ona birinci iman gətirən və onun köməkçiləridir. Onlar on iki nəfər idilər. ﴾Nəhayət, İsrail oğullarından bir tayfa﴿ İsa Peyğəmbərə ﴾iman gətirdi, bir tayfa isə kafir oldu. Biz də iman gətirənləri düşmənlərinə qarşı qüvvətləndirdik...﴿ Haqq tərəfdarlarını gücləndirməklə batil tərəfdarlarına qarşı kömək etdik ﴾və onlar qələbə çaldılar.﴿ Qatadə ﴾Ey iman gətirənlər! Allahın köməkçiləri olun﴿ - ayəsi haqqında deyir: Allaha şükürlər olsun! Bu hal baş vermişdir. Yetmiş nəfər Peyğəmbərin yanına gəlib Aqəbə adlı yerdə ona beyət etdilər, Allahın dini ucalana qədər ona sığınacaq verib kömək etdilər. Peyğəmbər (Səllallahu aleyhi və səlləm) Aqəbədə görüşdüyü nümayəndələrə demişdi: *"Aranızdan on iki nəfər seçin ki, İsanın həvariləri İsa üçün zamin durduqları kimi, onlar da öz tayfalarına görə zamin dursunlar."* Peyğəmbər (Səllallahu aleyhi və səlləm) zamin duranlara dedi: *"Həvarilər İsaya zamin durduqları kimi, siz də öz qövminizə zaminsiniz. Mən isə öz qövmimə zaminəm."* Onlar: "Bəli" – deyib razılıq verdilər.

## əl-Cümə surəsi 62

1 ﴾Göylərdə və yerdə olanların hamısı Hökmran, Müqəddəs, Qüdrətli, Müdrik Allahın şəninə təriflər deyir.﴿ Ayədəki "**əl-Quddus**" Müqəddəs sözü bütün naqisliklərdən və eyiblərdən pak olan deməkdir.

2 ﴾Ümmilərə özlərindən peyğəmbər göndərən Odur. Əvvəllər haqq yoldan açıq-aşkar azsalar da, onlara ayələrini oxuyar, onları təmizləyər, onlara Kitabı və hikməti öyrədər.﴿ Ümmilər, yazıb-oxumağı bilən və ya bilməyən ərəblərdir. Çünki onlar kitab əhli deyildilər. Ümmi sözü yazıb-oxumaq bilməyən deməkdir. O zaman ərəblərin əksəriyyəti də belə idi. Yazıb-oxumaq bilməyən, təlim keçməyən savadsız Peyğəmbər onlara Quran ayələrini oxuyar,

سُورَةُ الجُمُعَةِ
ترتيبها ٦٢ — آياتها ١١

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

يُسَبِّحُ لِلَّهِ مَا فِى ٱلسَّمَٰوَٰتِ وَمَا فِى ٱلْأَرْضِ ٱلْمَلِكِ ٱلْقُدُّوسِ ٱلْعَزِيزِ
ٱلْحَكِيمِ ١ هُوَ ٱلَّذِى بَعَثَ فِى ٱلْأُمِّيِّـۧنَ رَسُولًا مِّنْهُمْ يَتْلُوا۟
عَلَيْهِمْ ءَايَٰتِهِۦ وَيُزَكِّيهِمْ وَيُعَلِّمُهُمُ ٱلْكِتَٰبَ وَٱلْحِكْمَةَ وَإِن كَانُوا۟
مِن قَبْلُ لَفِى ضَلَٰلٍ مُّبِينٍ ٢ وَءَاخَرِينَ مِنْهُمْ لَمَّا يَلْحَقُوا۟ بِهِمْ ۚ
وَهُوَ ٱلْعَزِيزُ ٱلْحَكِيمُ ٣ ذَٰلِكَ فَضْلُ ٱللَّهِ يُؤْتِيهِ مَن يَشَآءُ ۚ وَٱللَّهُ
ذُو ٱلْفَضْلِ ٱلْعَظِيمِ ٤ مَثَلُ ٱلَّذِينَ حُمِّلُوا۟ ٱلتَّوْرَىٰةَ ثُمَّ لَمْ
يَحْمِلُوهَا كَمَثَلِ ٱلْحِمَارِ يَحْمِلُ أَسْفَارًۢا ۚ بِئْسَ مَثَلُ ٱلْقَوْمِ
ٱلَّذِينَ كَذَّبُوا۟ بِـَٔايَٰتِ ٱللَّهِ ۚ وَٱللَّهُ لَا يَهْدِى ٱلْقَوْمَ ٱلظَّٰلِمِينَ ٥
قُلْ يَٰٓأَيُّهَا ٱلَّذِينَ هَادُوٓا۟ إِن زَعَمْتُمْ أَنَّكُمْ أَوْلِيَآءُ لِلَّهِ مِن
دُونِ ٱلنَّاسِ فَتَمَنَّوُا۟ ٱلْمَوْتَ إِن كُنتُمْ صَٰدِقِينَ ٦ وَلَا يَتَمَنَّوْنَهُۥٓ
أَبَدًۢا بِمَا قَدَّمَتْ أَيْدِيهِمْ ۚ وَٱللَّهُ عَلِيمٌۢ بِٱلظَّٰلِمِينَ ٧ قُلْ إِنَّ
ٱلْمَوْتَ ٱلَّذِى تَفِرُّونَ مِنْهُ فَإِنَّهُۥ مُلَٰقِيكُمْ ۖ ثُمَّ تُرَدُّونَ
إِلَىٰ عَٰلِمِ ٱلْغَيْبِ وَٱلشَّهَٰدَةِ فَيُنَبِّئُكُم بِمَا كُنتُمْ تَعْمَلُونَ ٨

onları küfr, şirk və pis əxlaq çirkabından təmizləyərdi. İmanı öyrədib qəlblərini təmizləyərdi. Onlara Quranı və hədisləri öyrədərdi. Halbuki onlar, əvvəllər haqdan uzaq düşmüş və şirk içində idilər.

3 **﴾Ərəblərdən savayı, hələ onlara qoşulmamış başqalarını da.﴿** paklığa çıxaracaq, təmizləyəcəkdir. Peyğəmbər Kitabı və hikməti səhabələrdən sonra qiyamətə qədər islamı qəbul edəcək ərəb və qeyri-ərəb müsəlmanlara da öyrədər. Buxarinin Əbu Hureyrədən rəvayət etdiyi hədisdə deyilir: *"Cümə surəsi nazil olanda Peyğəmbərin yanında oturmuşduq. O surəni oxuyub* 4 **﴾Ərəblərdən savayı, hələ onlara qoşulmamış başqalarını da.﴿** - ayəsinə çatanda bir nəfər dedi: Ey Allahın elçisi! Bizə qoşulmayan bu insanlar kimlərdir? Peyğəmbər əlini Salman əl-Farisinin çiyninə qoyub dedi: "*Canım əlində olan Allaha and olsun! Əgər iman Sürəyya ulduzu uzaqlığında olsa, bunun kimi insanlar onu əldə edərlər*". **﴾O, Qüdrətli və Müdrikdir!﴿** Onun qüdrəti və hikməti çox genişdir.

5 **﴾Tövrata əməl etməyə mükəlləf olduqdan sonra ona əməl etməyənlər belində çoxlu kitab daşıyan ulağa bənzərlər. Allahın ayələrini yalan sayanlar barədə çəkilən məsəl necə də pisdir! Allah zalım qövmü doğru yola yönəltməz!﴿** Uca Allah bu məsəli tövrata əməl etməyən yəhudilər üçün çəkmişdir. Onlar bu kitabdakı əmr və qadağalara əməl etməyə mükəlləf olundular. Belində kitab yükü daşıyan eşşək daşıdığı yükün kitab və ya zibil olduğunu dərk etmədiyi kimi, bunlar da, o kitabdakı əmr və qadağalara əməl etmədilər. Bu şəriəti yalan hesab edənlər üçün çəkiləcək ən pis misaldır. Ey müsəlmanlar, siz də onlar kimi olmayın. Bu ayə Peyğəmbər (*Səllallahu aleyhi və səlləm*) xütbə verərkən onu minbərdə tərk edib ticarət dalınca qaçan müsəlmanlara xəbərdarlıq olsun deyə nazil edilmişdi. Bu gün cümə xütbəsini eşidib onu dinləməyənlər də, bu xəbərdarlıqla agah olsunlar. Bu haqda Peyğəmbərin (*Səllallahu aleyhi və səlləm*) hədisində belə deyilir: "*Cümə günü imam xütbə verərkən danışan insan belində yük daşıyan ulaq kimidir. Kim yanındakına "sus" deyərsə, onun da cüməsi batildir*".

6 **﴾De: "Ey yəhudilər! Əgər bütün insanlardan fərqli olaraq, özünüzün Allahın dostları olduğunuzu iddia edirsinizsə, doğru deyirsinizsə, onda ölüm diləyin!﴿** Bu ayədə yəhudilərdən danışmağın səbəbi onların özlərini insanlardan üstün hesab etmələridir. Onlar özlərinin insanlardan fərqli olaraq Allahın dostları, oğulları və sevimliləri olduqlarını iddia edirdilər. Onlar bu batil iddianı irəli sürdükdə uca Allah Peyğəmbərinə bunu deməyi əmr etdi. **﴾əgər doğru deyirsinizsə, onda ölüm diləyin!﴿** ki, iddia etdiyiniz kəramətə nail olasınız. Çünki cənnət əhlindən olduğunu bilən insan bu dünyadan qurtulmaq istəyər.

7 **﴾Halbuki onlar öz əlləri ilə etdikləri﴿** küfr, asilik, təhrif və yalançı **﴾əməllərə görə heç vaxt ölüm diləməzlər. Allah zalımları çox gözəl tanıyandır!﴿**

8 **﴾De: "qaçdığınız ölüm﴿** elə o istiqamətdə **﴾sizi mütləq yaxalayacaqdır. Sonra siz gizlini də, aşkarı da biləninin hüzuruna qaytarılacaqsınız. O da sizə nələr etdiyinizi xəbər verəcəkdir!﴿** Pis və çirkin əməllərinizə görə sizi cəzalandıracaqdır.

9 **﴾Ey iman gətirənlər! Cümə günü namaza çağırıldığınız zaman Allahı zikr etməyə tələsin və alış-verişi buraxın. Bilsəniz, bu sizin üçün nə qədər xeyirlidir!﴿** Namaza çağırılmaq anı cümə günü imamın minbərə qalxıb oturmasıdır. Çünki Peyğəmbərin vaxtında bundan başqa çağırış yox idi. Osman ibn Əffanın vaxtında Mədinə şəhəri böyüdüyü

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوٓاْ إِذَا نُودِيَ لِلصَّلَوٰةِ مِن يَوۡمِ ٱلۡجُمُعَةِ
فَٱسۡعَوۡاْ إِلَىٰ ذِكۡرِ ٱللَّهِ وَذَرُواْ ٱلۡبَيۡعَۚ ذَٰلِكُمۡ خَيۡرٞ لَّكُمۡ إِن كُنتُمۡ
تَعۡلَمُونَ ٩ فَإِذَا قُضِيَتِ ٱلصَّلَوٰةُ فَٱنتَشِرُواْ فِي ٱلۡأَرۡضِ
وَٱبۡتَغُواْ مِن فَضۡلِ ٱللَّهِ وَٱذۡكُرُواْ ٱللَّهَ كَثِيرٗا لَّعَلَّكُمۡ تُفۡلِحُونَ
١٠ وَإِذَا رَأَوۡاْ تِجَٰرَةً أَوۡ لَهۡوًا ٱنفَضُّوٓاْ إِلَيۡهَا وَتَرَكُوكَ قَآئِمٗاۚ قُلۡ
مَا عِندَ ٱللَّهِ خَيۡرٞ مِّنَ ٱللَّهۡوِ وَمِنَ ٱلتِّجَٰرَةِۚ وَٱللَّهُ خَيۡرُ ٱلرَّٰزِقِينَ ١١

ترتيبها ٦٣ — سُورَةُ ٱلۡمُنَافِقُونَ — آياتها ١١

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

إِذَا جَآءَكَ ٱلۡمُنَٰفِقُونَ قَالُواْ نَشۡهَدُ إِنَّكَ لَرَسُولُ ٱللَّهِۗ وَٱللَّهُ يَعۡلَمُ
إِنَّكَ لَرَسُولُهُۥ وَٱللَّهُ يَشۡهَدُ إِنَّ ٱلۡمُنَٰفِقِينَ لَكَٰذِبُونَ ١
ٱتَّخَذُوٓاْ أَيۡمَٰنَهُمۡ جُنَّةٗ فَصَدُّواْ عَن سَبِيلِ ٱللَّهِۚ إِنَّهُمۡ سَآءَ مَا كَانُواْ
يَعۡمَلُونَ ٢ ذَٰلِكَ بِأَنَّهُمۡ ءَامَنُواْ ثُمَّ كَفَرُواْ فَطُبِعَ عَلَىٰ قُلُوبِهِمۡ
فَهُمۡ لَا يَفۡقَهُونَ ٣ ۞ وَإِذَا رَأَيۡتَهُمۡ تُعۡجِبُكَ أَجۡسَامُهُمۡۖ
وَإِن يَقُولُواْ تَسۡمَعۡ لِقَوۡلِهِمۡۖ كَأَنَّهُمۡ خُشُبٞ مُّسَنَّدَةٞۖ يَحۡسَبُونَ كُلَّ
صَيۡحَةٍ عَلَيۡهِمۡۚ هُمُ ٱلۡعَدُوُّ فَٱحۡذَرۡهُمۡۚ قَٰتَلَهُمُ ٱللَّهُۖ أَنَّىٰ يُؤۡفَكُونَ ٤

üçün o cümə günü namazdan öncə iki dəfə azan oxumağı əmr etdi. Bu əməl səhabələrin yaşadıqları bir dövrdə baş verirdi. **﴾Allahı zikr etməyə tələsin﴿** Buradakı zikr, qüsl və dəstəmaz alıb mərkəzi məscidlərdə cümə xütbəsinin oxunması və cümə namazının qılınmasıdır. **﴾alış-verişi buraxın.﴿** Eləcə də digər dünya işlərini tərk edin. Cümə günü müəzzin azan oxuduqdan sonra alış-veriş haram olur. **﴾Bilsəniz, bu﴿** alış-verişi tərk etmək və Allahı zikr etməyə tələsmək **﴾sizin üçün nə qədər xeyirlidir!﴿**

10 **﴾Namaz qılınıb qurtardıqdan sonra yer üzünə dağılın﴿** ticarətinizi edin, işinizə baxın **﴾və Allahın lütfündən ruzi diləyib axtarın! Və Allahı çox zikr edin ki, nicat tapıb səadətə qovuşasınız!﴿** Sizə dünya və axirət xeyirini bəxş edənə şükr olaraq Onu xatırlamağı unutmayın. "Əlhəmdulilləh", "Sübhənəllah", "Allahu Əkbər", "Əstəğfirullah" kimi zikrləri oxuyub Ona yaxınlaşın. Belə olan təqdirdə həm dünyada, həm də axirətdə qurtuluşa nail olarsınız.

11 **﴾Onlar bir alış-veriş, yaxud bir əyləncə gördükləri zaman səni ayaq üstə qoyub, ona tərəf cumdular. De: "Allah dərgahında olan savab əyləncədən də, ticarətdən də xeyirlidir. Allah ruzi verənlərin ən yaxşısıdır!"﴿** Ayənin nazil olma səbəbi belədir: Mədinə şəhərinin aclıq yaşadığı günlərin birində Peyğəmbər minbərdə cümə namazı xütbəsi oxuyurdu. Bu zaman Şamdan ərzaqla yüklənmiş bir karvanın gəldiyi xəbər verildi. Bunu eşidən camaat məscidi tərk edərək karvanın qabağına qaçdı. Məsciddə cəmi on iki adam qalmışdı. Digər rəvayətə görə, yeddi nəfər qadın da qalmışdı. Bu məqamda uca Allah onlara etdiklərinin pis iş olduğunu çatdırıb dedi ki, Allah dərgahındakı cənnət sizin dalınca qaçdığınız dünya malından qat-qat xeyirlidir. **﴾Allah ruzi verənlərin ən yaxşısıdır!"﴿**

## əl-Münafiqun surəsi 63

*(münafiqlər)*

1 **﴾Münafiqlər sənin yanına gəldikləri zaman: "Biz sənin, doğrudan da, Allahın Peyğəmbəri olduğuna şəhadət veririk!" – deyirlər. Allah sənin Onun həqiqi Peyğəmbəri olduğunu bilir. Allah həm də münafiqlərin xalis yalançı olduqlarına şəhadət verir.﴿** Münafiqlər sənin məclisinə gəldikdə, sənin yanında olduqda sənə şəhadət verərlər. Onlar bunu səmimi qəlbdən dediklərini göstərməyə çalışırlar. Amma onların şəhadəti bilmək mənasında olduğu üçün uca Allah onların şəhadətinə qarşı **﴾Allah sənin Onun həqiqi Peyğəmbəri olduğunu bilir.﴿** – cavabını vermiş və bundan dərhal sonra **﴾Allah həm də münafiqlərin xalis yalançı olduqlarına şəhadət verir.﴿** - deməklə münafiqlərin dediklərinin öz-özlüyündə haqq olduğunu, amma Muhəmmədin (Sallallahu aleyhi və səlləm) həqiqi peyğəmbər olduğuna dair iddia etdikləri şəhadətdə yalançı olduqlarını qeyd etmişdir.

2 **﴾Onlar andlarını özlərinə sipər edib, Allah yolundan döndərirlər. Həqiqətən onların törətdikləri əməllər necə də pisdir!﴿** Onlar and içərək özlərini sizdən qoruyur, ölmək və əsir düşmək qarşısında sipər edirlər. Peyğəmbərliyə dair yaydıqları şübhələrlə insanları Allah yolundan çəkindirirlər. Onların bu ikiüzlü əməlləri necə də pisdir.

3 **﴾Bunun səbəbi odur ki, onlar iman gətirdilər, sonra isə kafir oldular. Buna görə də onların ürəklərinə möhür vurulmuş, özləri isə anlamaz kimsələr olmuşlar.﴿** Onlar ikiüzlülük göstərib, zahirən iman gətirib, daxilən isə kafir olublar. Bəzi alimlər deyirlər ki, bu ayə ilk əvvəl iman gətirib, sonra mürtəd olanlar haqqında nazil olmuşdur. Küfr etdikləri üçün qəlbləri

وَإِذَا قِيلَ لَهُمْ تَعَالَوْا يَسْتَغْفِرْ لَكُمْ رَسُولُ ٱللَّهِ لَوَّوْا رُءُوسَهُمْ
وَرَأَيْتَهُمْ يَصُدُّونَ وَهُم مُّسْتَكْبِرُونَ ٥ سَوَآءٌ عَلَيْهِمْ
أَسْتَغْفَرْتَ لَهُمْ أَمْ لَمْ تَسْتَغْفِرْ لَهُمْ لَن يَغْفِرَ ٱللَّهُ لَهُمْ إِنَّ
ٱللَّهَ لَا يَهْدِى ٱلْقَوْمَ ٱلْفَٰسِقِينَ ٦ هُمُ ٱلَّذِينَ يَقُولُونَ
لَا تُنفِقُوا۟ عَلَىٰ مَنْ عِندَ رَسُولِ ٱللَّهِ حَتَّىٰ يَنفَضُّوا۟ وَلِلَّهِ
خَزَآئِنُ ٱلسَّمَٰوَٰتِ وَٱلْأَرْضِ وَلَٰكِنَّ ٱلْمُنَٰفِقِينَ لَا يَفْقَهُونَ
٧ يَقُولُونَ لَئِن رَّجَعْنَآ إِلَى ٱلْمَدِينَةِ لَيُخْرِجَنَّ ٱلْأَعَزُّ
مِنْهَا ٱلْأَذَلَّ وَلِلَّهِ ٱلْعِزَّةُ وَلِرَسُولِهِۦ وَلِلْمُؤْمِنِينَ وَلَٰكِنَّ
ٱلْمُنَٰفِقِينَ لَا يَعْلَمُونَ ٨ يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوا۟ لَا تُلْهِكُمْ
أَمْوَٰلُكُمْ وَلَآ أَوْلَٰدُكُمْ عَن ذِكْرِ ٱللَّهِ وَمَن يَفْعَلْ
ذَٰلِكَ فَأُو۟لَٰٓئِكَ هُمُ ٱلْخَٰسِرُونَ ٩ وَأَنفِقُوا۟ مِن مَّا رَزَقْنَٰكُم
مِّن قَبْلِ أَن يَأْتِىَ أَحَدَكُمُ ٱلْمَوْتُ فَيَقُولَ رَبِّ لَوْلَآ أَخَّرْتَنِىٓ
إِلَىٰٓ أَجَلٍ قَرِيبٍ فَأَصَّدَّقَ وَأَكُن مِّنَ ٱلصَّٰلِحِينَ ١٠ وَلَن
يُؤَخِّرَ ٱللَّهُ نَفْسًا إِذَا جَآءَ أَجَلُهَا وَٱللَّهُ خَبِيرٌۢ بِمَا تَعْمَلُونَ ١١

ترتيبها ٦٤ — سُورَةُ ٱلتَّغَابُنِ — آياتها ١٨

möhürlənmişdir. Bir daha belə qəlbə iman girən deyil. Onlar özlərini islah edən və düz yolu göstərən əməllərdən bixəbərdirlər.

4 **﴾Sən onları gördükdə cüssələri xoşuna gəlir, danışanda sözlərinə qulaq asırsan. Onlar, sanki söykədilmiş dirəklərdir. Onlar hər bir qışqırığın öz əleyhlərinə olduğunu zənn edirlər. Onlar düşməndirlər, sən onlardan həzər et! Allah onları öldürsün, necə də haqdan döndərilirlər!﴿** Onlara baxarkən ilk baxışdan boy-buxunları və yaraşıqları insanın xoşuna gəlir, adam onların fəsahətli danışıqlarını eşitdikdə haqq və doğru olduğunu hesab edir. Münafiqlərin başçısı sayılan Abdullah ibn Ubeyy ibn Səlul boy-buxunlu, fəsahətli və yaraşıqlı idi. Münafiqlər Peyğəmbərin (Sallallahu aleyhi və səlləm) məclisində oturduqda divara söykədilmiş anlamaz və bilməz dirək kimi onu dinləyərdilər. Çünki onlar da faydalı anlayışdan və elmdən məhrum idilər. Münafiqlər onların iç üzünü açıb, mallarını və qanlarını halal edəcək ayənin nazil olacağından qorxur və bu səbəblə hər dəfə hay-küy eşidəndə təlaşa düşürdülər. Uca Allah da öz Peyğəmbərinə onların düşmən olduqlarını xatırladır və öz sirlərini onlara bildirməməyi əmr edir. Çünki onlar kafirlərin daxili qulağı idilər. Onlar haqdan üz döndərib, küfrə yönəldikləri üçün uca Allah onları lənətləmişdir. Bu, möminlər üçün təlimdir.

5 **﴾Onlara: "Gəlin Allahın Peyğəmbəri sizin bağışlanmağınızı diləsin!" – deyildiyi zaman başlarını bulayar və sən onların təkəbbürlə üz çevirdiklərini görərsən.﴿** Onlara belə dedikdə istehza edər və bağışlanma diləməkdən üz çevirər, özlərini daha üstün sayıb, Peyğəmbərin (Sallallahu aleyhi və səlləm) hüzuruna gəlməyə təkəbbürlük edər və özləri üçün bağışlanma diləməyi təhqir sayırdılar.

6 **﴾Sən onların bağışlanmasını diləsən də, diləməsən də, fərqi yoxdur. Onsuz da Allah onları bağışlamayacaqdır. Şübhəsiz ki, Allah fasiq qövmü doğru yola yönəltməz!﴿** Onlar münafiqlikdə davam edib, küfrdə qaldıqları müddətdə sənin onlar üçün bağışlanma diləməyin onlara fayda verməz, nə də Allah onları bağışlamaz. Allah tam şəkildə itaətdən çıxan fasiqləri hidayətə yönəltməz. Fasiqlər dəstəsinə ilk daxil olanlar münafiqlərdir.

7 **﴾Onlar: "Allahın Peyğəmbəri yanında olanlara bir şey verməyin ki, dağılıb getsinlər!" – deyən kimsələrdir. Halbuki göylərin və yerin xəzinələri Allaha məxsusdur, lakin münafiqlər anlamazlar.﴿** Onlar bunu kasıb mühacirlərə qarşı deyirdilər. Amma göylərin və yerin xəzinəsi Allahın əlindədir və mühacirlərin ruzisini verən də odur. Lakin münafiqlər ruzinin Allahın əlində olmasını və möminlərə geniş ruzi verəcəyini dərk etməzlər.

8 **﴾Onlar: "Əgər biz Mədinəyə qayıtsaq, ən güclülər ən zəifləri əlbəttə, oradan çıxardacaqlar!" – deyirlər. Halbuki şərəf-şan da, yalnız Allaha, Onun Peyğəmbərinə və möminlərə məxsusdur, lakin münafiqlər bilməzlər!﴿** Bu sözləri münafiqlərin başçısı Abdullah ibn Ubeyy ibn Səlul döyüşlərin birindən qayıdanda demişdi. O özünü və ətrafındakıları ən güclü kimi vəsf edir, Peyğəmbəri (Sallallahu aleyhi və səlləm) və onunla olanları isə, ən zəif kimi qələmə verirdi. Zeyd ibn Ərqam deyir: Mən, döyüşlərin birində Peyğəmbərlə (Sallallahu aleyhi və səlləm) idim. Yolda Abdullah ibn Ubeyy dedi: **"Əgər biz Mədinəyə qayıtsaq, ən güclülər ən zəifləri əlbəttə oradan çıxardacaqlar!"** Mən Peyğəmbərin (Sallallahu aleyhi və səlləm) yanına gəlib, onun dediklərini xəbər verdim. Amma Abdullah ibn Ubeyy and içdi ki, belə bir söhbət olmayıb. Zeyd deyir: Qəbiləm məni qınayıb dedi: "Bununla nə əldə etmək istəyirdin?" Zeyd deyir: Mən kədər və sıxıntı içində gəlib yatdım. Az keçməmiş

Peyğəmbər (Sallallahu aleyhi və sələm) yanıma adam göndərib dedi: "***Allah sənin dediklərini təsdiq edən ayə nazil etdi***". Ötən ayələr nazil oldu.

9 **﴾Ey iman gətirənlər! Nə mal-dövlətiniz, nə də oğul-uşağınız sizi Allahın zikrindən yayındırmasın! Hər kəs bunu etsə, bələləri əsl ziyana uğrayanlardır.﴿** Uca Allah möminləri münafiqlərin mal və övladları ilə Allah zikrindən, islamın fərz əməllərindən və Quran oxumaqdan yayındıran pis əxlaqlarından çəkindirir. Kim dünyanı tutub dindən uzaqlaşarsa, həqiqətən də təmamən xəsarət içində olar.

10 **﴾Birinizin ölümü çatıb: "Ey Rəbbim! Mənə bir az möhlət versəydin, sədəqə verib salehlərdən olardım! – deməmişdən əvvəl sizə verdiyim ruzidən xərcləyin.﴿** Sizə verdiyim bəzi şeyləri xeyirxahlıq yolunda xərcləyin. Yaxud malınızın zəkatını verin. Hələ ki, ölüm səbəbləri və əlamətləri yoxdur, bunu edin. Bu fürsətindən istifadə etməyənlər bir gün belə deyəcəklər: "Ey Rəbbim! Ölümümü gecikdirib mənə möhlət versəydin, malımı sədəqə edər və əməlisalehlərdən olardım".

11 **﴾Və Allah əcəli çatan heç kəsə möhlət verməz. Allah sizin nə etdiklərinizdən xəbərdardır!﴿** Etdiyiniz heç bir əməl Ona gizli qalan deyil və O sizin mükafatınızı verəcəkdir.

# Təğabun surəsi 64

## *(Qarşılıqlı aldanma)*

بِسْمِ اللَّهِ الرَّحْمَٰنِ الرَّحِيمِ

يُسَبِّحُ لِلَّهِ مَا فِي السَّمَاوَاتِ وَمَا فِي الْأَرْضِ لَهُ الْمُلْكُ وَلَهُ الْحَمْدُ
وَهُوَ عَلَىٰ كُلِّ شَيْءٍ قَدِيرٌ ﴿١﴾ هُوَ الَّذِي خَلَقَكُمْ فَمِنْكُمْ كَافِرٌ
وَمِنْكُمْ مُؤْمِنٌ وَاللَّهُ بِمَا تَعْمَلُونَ بَصِيرٌ ﴿٢﴾ خَلَقَ السَّمَاوَاتِ
وَالْأَرْضَ بِالْحَقِّ وَصَوَّرَكُمْ فَأَحْسَنَ صُوَرَكُمْ وَإِلَيْهِ الْمَصِيرُ ﴿٣﴾
يَعْلَمُ مَا فِي السَّمَاوَاتِ وَالْأَرْضِ وَيَعْلَمُ مَا تُسِرُّونَ وَمَا تُعْلِنُونَ وَاللَّهُ
عَلِيمٌ بِذَاتِ الصُّدُورِ ﴿٤﴾ أَلَمْ يَأْتِكُمْ نَبَأُ الَّذِينَ كَفَرُوا مِنْ قَبْلُ
فَذَاقُوا وَبَالَ أَمْرِهِمْ وَلَهُمْ عَذَابٌ أَلِيمٌ ﴿٥﴾ ذَٰلِكَ بِأَنَّهُ كَانَتْ تَأْتِيهِمْ
رُسُلُهُمْ بِالْبَيِّنَاتِ فَقَالُوا أَبَشَرٌ يَهْدُونَنَا فَكَفَرُوا وَتَوَلَّوْا وَاسْتَغْنَى
اللَّهُ وَاللَّهُ غَنِيٌّ حَمِيدٌ ﴿٦﴾ زَعَمَ الَّذِينَ كَفَرُوا أَنْ لَنْ يُبْعَثُوا قُلْ بَلَىٰ وَرَبِّي
لَتُبْعَثُنَّ ثُمَّ لَتُنَبَّؤُنَّ بِمَا عَمِلْتُمْ وَذَٰلِكَ عَلَى اللَّهِ يَسِيرٌ ﴿٧﴾ فَآمِنُوا بِاللَّهِ
وَرَسُولِهِ وَالنُّورِ الَّذِي أَنْزَلْنَا وَاللَّهُ بِمَا تَعْمَلُونَ خَبِيرٌ ﴿٨﴾ يَوْمَ
يَجْمَعُكُمْ لِيَوْمِ الْجَمْعِ ذَٰلِكَ يَوْمُ التَّغَابُنِ وَمَنْ يُؤْمِنْ بِاللَّهِ وَيَعْمَلْ
صَالِحًا يُكَفِّرْ عَنْهُ سَيِّئَاتِهِ وَيُدْخِلْهُ جَنَّاتٍ تَجْرِي مِنْ تَحْتِهَا
الْأَنْهَارُ خَالِدِينَ فِيهَا أَبَدًا ذَٰلِكَ الْفَوْزُ الْعَظِيمُ ﴿٩﴾

1 **﴾Göylərdə və yerdə nə varsa, Allahı təqdis edib şəninə təriflər deyər. Hökm Onundur, həmd-səna da Ona məxsusdur. O, hər şeyə qadirdir!﴿**

2 **﴾Sizi yaradan Odur. Kiminiz kafirsiniz, kiminiz mömin. Allah nə etdiklərinizi görəndir!﴿** Uca Allah kafiri yaratmışdır. Etdiyi küfrü isə, onun öz əməli və qazancıdır. Mömini də Allah yaratmışdır. İmanı da onun əməli və qazancıdır. Kafir küfr edir və küfrü seçir. Mömin isə iman gətirir və imanı seçir. Bütün bunlar Allahın izni ilə baş verir. Uca Allah buyurur: "***Aləmlərin Rəbbi olan Allah istəməsə, siz istəyə bilməzsiniz!***"

3 **﴾O, göyləri və yeri haqq-ədalətlə xəlq etdi, sizə surət verdi, surətlərinizi də gözəl yaratdı. Axır dönüş də Onun hüzurunadır!﴿** Uca Allah sizi ən gözəl simada və ən gözəl qəddi-qamətdə yaratmışdır. Adəm övladının gözəl yaradılışı göz önündədir. Bu nümunə ağıl sahiblərinə yaradanın qüdrətini, hikmətini və əzəmətini xatırladır. Üstəlik insanın nəfsi və əqlinin hüdudsuz bacarıqları daha böyük sübutdur. Uca Allah ayələrin birində buyurur: "***Yerdə tam yəqinliklə inananlar üçün əlamətlər vardır. Sizin özünüzdə də əlamətlər vardır. Məgər görmürsünüz?***" (əz-Zariyat: 20,21).

4 **﴾O, göylərdə və yerdə olanları da, sizin gizlində və aşkarda nə etdiyinizi də bilir. Allah ürəklərdə olanları biləndir!﴿**

5 **﴾Məgər sizdən əvvəl kafir olanların xəbəri sizə gəlib çatmadımı? Onlar öz gördükləri işlərin cəzasını dünyada daddılar. Onları şiddətli bir əzab gözləyir!﴿** Ayədə Nuh, Ad, Səmud kimi keçmiş ümmətlərin kafir toplumundan danışılır. Uca Allah buyurur ki, Quranda onlar haqqında məlumat verilmişdir. Belə ki, Peyğəmbərləri onları tövhid inancı ilə iman gətirməyə və yalnız Allaha ibadət etməyə, Allahdan başqa tapındıqları havadarları isə tərk etməyə çağırmış, onları yalançı hesab edən tayfalar həlaka məruz qalmış, Peyğəmbərlər və onlara iman gətirənlər isə qurtuluşa nail olmuşlar. Kafir olanlar bu dünyada çətin və ağır həyatla, axirətdə isə cəhənnəm atəşi ilə cəzalandırılacaqlar.

6 **﴾Çünki peyğəmbərləri onlara açıq-aşkar möcüzələr gətirir, onlar isə: "Məgər**

وَٱلَّذِينَ كَفَرُواْ وَكَذَّبُواْ بِـَٔايَٰتِنَآ أُوْلَٰٓئِكَ أَصۡحَٰبُ
ٱلنَّارِ خَٰلِدِينَ فِيهَاۖ وَبِئۡسَ ٱلۡمَصِيرُ ١٠ مَآ أَصَابَ مِن
مُّصِيبَةٍ إِلَّا بِإِذۡنِ ٱللَّهِۗ وَمَن يُؤۡمِنۢ بِٱللَّهِ يَهۡدِ قَلۡبَهُۥۚ وَٱللَّهُ بِكُلِّ
شَيۡءٍ عَلِيمٞ ١١ وَأَطِيعُواْ ٱللَّهَ وَأَطِيعُواْ ٱلرَّسُولَۚ فَإِن
تَوَلَّيۡتُمۡ فَإِنَّمَا عَلَىٰ رَسُولِنَا ٱلۡبَلَٰغُ ٱلۡمُبِينُ ١٢ ٱللَّهُ لَآ إِلَٰهَ
إِلَّا هُوَۚ وَعَلَى ٱللَّهِ فَلۡيَتَوَكَّلِ ٱلۡمُؤۡمِنُونَ ١٣ يَٰٓأَيُّهَا
ٱلَّذِينَ ءَامَنُوٓاْ إِنَّ مِنۡ أَزۡوَٰجِكُمۡ وَأَوۡلَٰدِكُمۡ عَدُوّٗا
لَّكُمۡ فَٱحۡذَرُوهُمۡۚ وَإِن تَعۡفُواْ وَتَصۡفَحُواْ وَتَغۡفِرُواْ
فَإِنَّ ٱللَّهَ غَفُورٞ رَّحِيمٌ ١٤ إِنَّمَآ أَمۡوَٰلُكُمۡ وَأَوۡلَٰدُكُمۡ
فِتۡنَةٞۚ وَٱللَّهُ عِندَهُۥٓ أَجۡرٌ عَظِيمٞ ١٥ فَٱتَّقُواْ ٱللَّهَ مَا ٱسۡتَطَعۡتُمۡ
وَٱسۡمَعُواْ وَأَطِيعُواْ وَأَنفِقُواْ خَيۡرٗا لِّأَنفُسِكُمۡۗ وَمَن
يُوقَ شُحَّ نَفۡسِهِۦ فَأُوْلَٰٓئِكَ هُمُ ٱلۡمُفۡلِحُونَ ١٦ إِن تُقۡرِضُواْ
ٱللَّهَ قَرۡضًا حَسَنٗا يُضَٰعِفۡهُ لَكُمۡ وَيَغۡفِرۡ لَكُمۡۚ وَٱللَّهُ شَكُورٌ
حَلِيمٌ ١٧ عَٰلِمُ ٱلۡغَيۡبِ وَٱلشَّهَٰدَةِ ٱلۡعَزِيزُ ٱلۡحَكِيمُ ١٨

ترتيبها ٦٥ — سُورَةُ الطَّلَاقِ — آياتها ١٢

**bizi doğru yola bir insanmı salacaqdır?!" – deyərək inkar edir və üz döndərirlər. Allahın ehtiyacı yoxdur. Allah heç bir şeyə möhtac deyildir. O, şükrə layiqdir!»** Onların dünya və axirət əzabına düçar olmalarına səbəb göndərilən Peyğəmbərləri ayədə deyilən bəhanə ilə inkar etmələri idi. Onlar Peyğəmbərlərə və onların şəriətinə küfr edir, üz çevirir, dedikləri barədə düşünmürdülər. Allah da onları ibadətindən kənarlaşdırdı. Çünki Allah onların ibadətinə möhtac deyildir. Onsuz da bəndələri dil və ya əməl ilə Ona şükr edirlər.

7 **«Kafir olanlar əsla dirildilməyəcəklərini iddia edirlər. De: "Bəli, Rəbbimə and olsun ki, siz mütləq dirildiləcəksiniz. Sonra da etdiyiniz əməllər sizə xəbər veriləcəkdir. Bu, Allah üçün çox asandır!»** Uca Allah bu ayədə haqqında danışılan insanlara xəbərdarlıq etməyi əmr edir və bildirir ki, bir gün onları dirildib qəbirlərindən çıxardacaq və etdiklərini bir-bir onlara xatırladacaqdır. Bu diriltmə və haqq-hesab soruşma Allah üçün çox asan bir işdir.

8 **«Elə isə Allaha, Onun Peyğəmbərinə və nazil etdiyimiz nura iman gətirin! Allah etdiyiniz əməllərdən agahdır!»** Allahın nazil etdiyi nur Qurandır. Çünki insan bu Quranla azğınlıq zülmətindən işığa çıxır.

9 **«Allah sizi toplanma gününə cəm edəcək. O gün qarşılıqlı aldanma günüdür! Kim Allaha iman gətirib yaxşı əməllər etsə, onun günahlarının üstünü örtər və onu altından çaylar axan cənnətlərə daxil edər. Belələri orada əbədi qalacaqlar. Bu, böyük qurtuluşdur!»** Toplanma günü qiyamət günüdür. Uca Allah bu gündə haqq-hesab etmək üçün bütün məxluqatı: hər bir insanı öz əməli ilə birlikdə, hər peyğəmbəri öz ümməti ilə birlikdə məhşər meydanına toplayacaqdır. Bu gündə zalım ilə məzlum üz-üzə gələcəklər. Bu gündə insanlar bir-birini unudacaqdır. Haqq əhli batil əhlini alçaldacaqdır. Cənnət əhlinin cəhənnəm əhlini alçaltmasından böyük alçaltma yoxdur. Sanki cəhənnəm əhli xeyiri şərə, yaxşını pisə, naz-nəməti əzaba dəyişiblər. Cənnət əhli isə, tam əksini ediblər. Bu alış-veriş edərkən sənin qazanıb qarşı tərəfin uduzması kimidir. Allaha iman gətirib, yaxşı əməllər görənlər isə, günahlarının bağışlanmasına nail olarlar.

10 **«Kafir olub ayələrimizi yalan sayanlara gəldikdə isə, onlar cəhənnəmlikdirlər. Onlar orada həmişəlik qalacaqlar. Ora necə də pis məskəndir!»**

11 **«Allahın izni olmadıqca heç bir müsibət üz verməz. Kim Allaha iman gətirsə, onun qəlbini haqqa doğru yönəldər. Allah hər şeyi biləndir!»** Baş verənlərin hamısı Allahın qəza-qədəri ilə olur. Ayənin nazil olma səbəbi kafirlərin *"əgər müsəlmanların tutduqları yol doğru olsaydı, o zaman dünya əzabı onlara toxunmazdı"* – dedikləridir. Halbuki kim başına gələn müsibətlərin Allahdan olmasını, başına gələcək işin ondan yan ötməyəcəyini, ondan yan keçən işin başına gəlməyəcəyini təsdiq edib, iman gətirər və qəza-qədərlə razılaşar, bəlalara səbr edər, nemətlərə şükr edərsə, müsibət anında qəlbi doğru yola yönəldilər. Bilmək lazımdır ki, etdiyimiz əməllərin, düşündüyümüz fikirlərin heç biri Allahdan gizli qalmır.

12 **«Allaha itaət edin, Onun Peyğəmbərinə itaət edin; hər kəs üz döndərsə, bilsin ki, Peyğəmbərimizin öhdəsinə düşən yalnız açıq-aşkar təbliğdir!»** Allaha və Peyğəmbərinə itaət etməkdən boyun qaçıranlar özlərinə günah qazanırlar. Bunun Peyğəmbərə heç bir aidiyyatı yoxdur. Onun vəzifəsi deyilənləri təbliğ etməkdir.

13 **«Allahdan başqa heç bir məbud yoxdur. Buna görə də möminlər, ancaq Allaha təvəkkül etsinlər!»**

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

يَٰٓأَيُّهَا ٱلنَّبِيُّ إِذَا طَلَّقْتُمُ ٱلنِّسَآءَ فَطَلِّقُوهُنَّ لِعِدَّتِهِنَّ وَأَحْصُوا۟
ٱلْعِدَّةَ ۖ وَٱتَّقُوا۟ ٱللَّهَ رَبَّكُمْ ۖ لَا تُخْرِجُوهُنَّ مِنۢ بُيُوتِهِنَّ
وَلَا يَخْرُجْنَ إِلَّآ أَن يَأْتِينَ بِفَٰحِشَةٍ مُّبَيِّنَةٍ ۚ وَتِلْكَ حُدُودُ
ٱللَّهِ ۚ وَمَن يَتَعَدَّ حُدُودَ ٱللَّهِ فَقَدْ ظَلَمَ نَفْسَهُۥ ۚ لَا تَدْرِى لَعَلَّ
ٱللَّهَ يُحْدِثُ بَعْدَ ذَٰلِكَ أَمْرًا ١ فَإِذَا بَلَغْنَ أَجَلَهُنَّ فَأَمْسِكُوهُنَّ
بِمَعْرُوفٍ أَوْ فَارِقُوهُنَّ بِمَعْرُوفٍ وَأَشْهِدُوا۟ ذَوَىْ عَدْلٍ مِّنكُمْ
وَأَقِيمُوا۟ ٱلشَّهَٰدَةَ لِلَّهِ ۚ ذَٰلِكُمْ يُوعَظُ بِهِۦ مَن كَانَ يُؤْمِنُ
بِٱللَّهِ وَٱلْيَوْمِ ٱلْءَاخِرِ ۚ وَمَن يَتَّقِ ٱللَّهَ يَجْعَل لَّهُۥ مَخْرَجًا ٢ وَيَرْزُقْهُ
مِنْ حَيْثُ لَا يَحْتَسِبُ ۚ وَمَن يَتَوَكَّلْ عَلَى ٱللَّهِ فَهُوَ حَسْبُهُۥٓ ۚ إِنَّ ٱللَّهَ
بَٰلِغُ أَمْرِهِۦ ۚ قَدْ جَعَلَ ٱللَّهُ لِكُلِّ شَىْءٍ قَدْرًا ٣ وَٱلَّٰٓـِٔى يَئِسْنَ
مِنَ ٱلْمَحِيضِ مِن نِّسَآئِكُمْ إِنِ ٱرْتَبْتُمْ فَعِدَّتُهُنَّ ثَلَٰثَةُ أَشْهُرٍ
وَٱلَّٰٓـِٔى لَمْ يَحِضْنَ ۚ وَأُو۟لَٰتُ ٱلْأَحْمَالِ أَجَلُهُنَّ أَن يَضَعْنَ حَمْلَهُنَّ ۚ
وَمَن يَتَّقِ ٱللَّهَ يَجْعَل لَّهُۥ مِنْ أَمْرِهِۦ يُسْرًا ٤ ذَٰلِكَ أَمْرُ ٱللَّهِ أَنزَلَهُۥٓ
إِلَيْكُمْ ۚ وَمَن يَتَّقِ ٱللَّهَ يُكَفِّرْ عَنْهُ سَيِّـَٔاتِهِۦ وَيُعْظِمْ لَهُۥٓ أَجْرًا ٥

**14 ﴾Ey iman gətirənlər! Şübhəsiz ki, zövcələrinizdən və övladınızdan sizə düşmən olanlar vardır. Onlardan özünüzü gözləyin! Amma onları əfv etsəniz, günahlarından keçsəniz və bağışlasanız bilin ki, Allah bağışlayandır, rəhm edəndir!﴿** Onlar sizi yaxşı əməllərdən yayındırarlar. Ayənin nazil olma səbəbi belədir. Demək, bəzi insanlar islamı qəbul edib, Məkkədən Mədinəyə hicrət etmək istədikdə arvad və uşaqları onlara mane oldular. Mücahid adlı alim deyir: *"Allaha and olsun! Onlara qarşı düşmənçilikləri yox idi. Onlar aralarındakı sevgi bağlılığına görə haram işə yol verdilər."* Uca Allah bu əməldən çəkindirib bildirir ki, ey möminlər arvad və uşaqlarınıza olan sevginizi Allaha itaətdən üstün tutmayın. Onlara göstərmək istədiyiniz yaxşılıqları üstün tutub digər tərəfdən Allaha asilik göstərməklə ruzi qazanmayın. Bu hala düşüb özünün gerilədiyini, hicrət edən qardaşlarının isə, dində irəli getdiklərini görənlər arvad və uşaqlarını cəzalandırmaq fikrinə düşdülər. Uca Allah isə, bu ayəni nazil etdi: **﴾Amma onları əfv etsəniz, günahlarından keçsəniz və bağışlasanız, bilin ki, Allah bağışlayandır, rəhm edəndir!﴿**

**15 ﴾Həqiqətən mal-dövlətiniz və oğul-uşağınız, ancaq bir imtahandır. Ən böyük mükafat isə, Allah dərgahındadır!﴿** Bu imtahan sizi haramlarla və Allahın haqqı ilə sınayır. Allaha itaəti mal-dövlət və övlad sevgisindən öndə tutaraq, bu imtahandan salamat keçənlər üçün böyük mükafat vardır.

**16 ﴾Allahdan bacardığınız qədər qorxun. Qulaq asın və itaət edin və xərcləyin. Bu, sizin özünüz üçün xeyirli olar. Nəfsinin xəsisliyindən qorunub saxlanılan kimsələr – məhz onlar nicat tapıb, səadətə qovuşanlardır!﴿** Bacardığınız qədər müti olun, Allahın və Peyğəmbərinin əmrlərini eşidib itaət edin. Mal-dövlətinizdən Allah yolunda xərcləyin, paxıl olmayın. Allah kimi paxıllıqdan qoruyar və həmin adam xeyirxah işlərdə mal-dövləti xərcləyərsə, bütün xeyirləri əldə edər.

**17 ﴾Əgər Allaha gözəl bir borc versəniz, sizin üçün onun əvəzini qat-qat artırar və sizi bağışlayar. Allah qədirbiləndir, həlimdir!﴿** Xalis niyyət və səmimi qəlblə mal-dövlətinizi Allah yolunda xərcləsəniz, bir savabın əvəzini on qatından yeddi yüz qata qədər artıraraq geri verər. Bu artırma ilə bərabər, sizin günahlarınızı da bağışlayar. Allah Ona itaət edənlərə qat-qat mükafat, asilik göstərənlərə isə, möhlət verəndir.

**18 ﴾gizlini də, aşkarı da biləndir, yenilməz qüdrət sahibi, hikmət sahibidir!﴿**

# Talaq surəsi 65

## *(Boşanma)*

**1 ﴾Ey Peyğəmbər! Övrətləri boşadığınız zaman onları gözləmə müddətlərində boşayın. Gözləmə müddətini sayın. Rəbbiniz olan Allahdan qorxun. Onları – açıq-aşkar bir pis iş etməyənə qədər –yaşadıqları evlərdən çıxartmayın və onlar özləri də çıxmasınlar. Bu, Allahın hədləridir. Allahın müəyyən etdiyi hədləri aşan kimsə özünə zülm etmiş olar. Nə bilirsən, ola bilsin ki, Allah bundan sonra bir iş icad etsin.﴿** Uca Allah Peyğəmbərin (Sallallahu aleyhi və səlləm) hörmətini saxlayıb ilk olaraq ona, daha sonra ümmətinə müraciət edir və bildirir ki, əgər zövcələrinizi boşamaq istəsəniz, onları aybaşıdan təmizlənib yaxınlıq etmədiyiniz təmizlikdə boşayın. Sonra gözləmə müddəti bitənə qədər yaxınlıq etməyin. Əgər belə boşasalar, onları gözləmə müddətində boşamış olarlar. İbn Ömər *"yoldaşını aybaşı olarkən boşamışdı. Ömər bunu Peyğəmbərə*

(*Sallallahu aleyhi və səlləm*) *xəbər verdikdə o, çox qəzəbləndi və dedi: "Ona de yoldaşını geri qaytarsın. Aybaşıdan təmizlənənə qədər saxlasın. Sonra bir daha aybaşı olub təmizlənsin. Əgər bundan sonra boşamaq istəsə, cinsi yaxınlıq etmədiyi aybaşıdan təmizlik vaxtında onu boşasın. Bu Allahın qadınları boşamaq haqqında əmr etdiyi gözləmə müddətidir."* Uca Allah boşanma qərarının verildiyi vaxtdan sonra gözləmə müddətlərini saya almağı da əmr edir. Bu müddət üç dəfə aybaşıdan təmizlənməkdir. Həmçinin kişilərə bu işdə Allah qorxusunu göz önünə almaq əmr olunur ki, zülmə yol verməsinlər. Gözləmə müddətində onları yaşadıqları evlərindən çıxartmasınlar. Deyilən müddət ərzində qadınların bu evlərdə yaşamaq üçün tam hüquqları çatır. Elə buna görə uca Allah evləri qadınlara nisbət etmişdir. Həmçinin qadın da bu müddət ərzində evi tərk etməməlidir. Bu zəruri amildir. Əgər qadın zinakarlıq günahını edərsə, o zaman onu evdən çıxarmaq olar. Bəzi alimlər isə deyirlər ki, əgər qadın eyni evdə yaşadığı digər insanlara qarşı pis sözlərlə davranarsa, o zaman onu həmin evdən çıxartmaq olar. Bütün bu deyilənlər Allahın qoyduğu qanunlardır. Bəndələrin bu qanunları tapdalayıb, başqa yol tutmaları halal deyildir. Doğrudan da, kim Allahın hədlərini aşarsa, o öz nəfsinə zülm etmiş olar. Həmçinin bu qaydaların qoyulması ona görədir ki, boşanma prosesinin getdiyi bu uzun müddət ərzində Allah ərlə arvadın qəlbini bir-birinə bağlayar.

2 **﴾Bunların gözləmə müddəti başa çatdıqda onları yaxşılıqla saxlayın, ya da xoşluqla yola salın. İçərinizdən iki ədalətli şahid tutun. Allah üçün şahidlik edin! Bununla Allaha və axirət gününə iman gətirənlərə öyüd-nəsihət verilir. Kim Allahdan qorxsa, Allah ona bir çıxış yolu əta edər.﴿** Gözləmə müddəti başa çatdıqdan sonra istəsəniz, xoş rəftarla, heç bir zorakılığa yol vermədən saxlayın. Əgər istəməsəniz, o zaman gözləmə müddəti bitdikdə onların haqqlarını kəsmədən xoşluqla ayrılın, onlara heç bir zərər vurmayın, haqlarından məhrum etməyin. Bu, sizə halal olmaz. İşdi əgər qaytarsanız və ya ayrılsanız, problemləri önləmək üçün iki nəfər ədalətli insanı bu işdə şahid tutun. Şahidlər isə, haqqa şahidlik etməli və bunu Allaha edilən ibadət kimi qəbul etməlidirlər. Yalnız möminlər bu öyüd-nəsihətdən faydalandıqları üçün ayədə də onların adı keçmişdir. Beləliklə Allahdan qorxaraq, Onun hədləri qarşısında dayanıb itaət edənlər üçün düşdükləri çətinliklərdən Allah tərəfindən çıxış yolu göstərilər.

3 **﴾Və ona gözləmədiyi yerdən ruzi verər. Kim Allaha təvəkkül etsə, (*Allah*) ona kifayət edər. Allah Öz əmrini yerinə yetirəndir. Allah hər şey üçün bir ölçü təyin etmişdir.﴿** Beləları üçün ağlına gəlmədiyi və güman etmədiyi yerdən ruzi yetirər. Yoldaşını boşayıb gözləmə müddəti başa çatdıqda, yaxud barışdıqda şahid tutanlar üçün Allah tərəfindən çıxış yolu əta edilər. Sıxıntı, Allahın talaq və ya qaytarmaq xüsusunda qoyduğu qaydalara müxalif olanlar üçündür. Gördüyü işdə Allaha arxalanan insana Allah kömək edər və heç nə, heç kəs Onu aciz edə bilməz. Uca Allah çətinlik və rahatlığın sonu üçün bir vaxt təyin etmişdir. Suddi adlı alim deyir: "*Ayədə deyilən ölçü aybaşı və gözləmə müddətidir*".

4 **﴾Heyzdən kəsilmiş qadınlarınız barədə şübhə etsəniz, onların və həmçinin hələ heyz görməmiş olanların gözləmə müddəti üç aydır. Hamilə qadınların gözləmə müddəti isə, onlar bari-həmlini yerə qoyduqda başa çatır. Kim Allahdan qorxsa, Allah onun işini asan edər.﴿** Heyzdən kəsilmiş qadınların gözləmə müddətini hesablamaqda şübhə etsəniz, o zaman onların gözləmə müddətini üç ay götürün. Həmçinin aybaşı olmamış azyaşlıların da gözləmə müddəti üç aydır. Hamilə qadınların gözləmə müddəti isə, hamiləliklərini bitirdikdə tamamlanır. Kim bu işdə Allah qorxusunu gözü önünə alarsa, onun işi rahat olar. Dəhhak adlı alim deyir: "*Kim Allahdan qorxaraq sünnədə deyilən qaydada boşayarsa, qaytaranda onun işi rahat olar*".

5 **﴾Bu, Allahın sizə nazil etdiyi buyuruğudur. Kim Allahdan qorxsa, Allah onun günahlarının üstünü örtər və mükafatını artırar.﴿** Axirətdəki mükafatını cənnət edər.

6 **﴾Onları imkanınız çatdığı qədər öz yaşadığınız yerdə sakin edin. Sıxışdırmaq məqsədilə onlara zərər verməyə cəhd göstərməyin. Əgər onlar hamilədirlərsə, bari-həmləni yerə qoyana qədər xərclərini verin. Sizin üçün uşaq əmizdirirlərsə, onların haqqını verin. Öz aranızda yaxşılıqla sazişə gəlin. Əgər çətinliyə düşsəniz, onu başqa bir qadın əmizdirə bilər.﴿** Ayədə boşanmış qadınların evdə yaşamaq haqlarından danışılır. Demək, boşanmış qadın gözləmə müddətində ərinin imkanı daxilində onun evində yaşayır. Bu təkrar qaytarılması mümkün olan (*rici*) talaqla boşanmış qadınlara aiddir. Üçüncü

أَسْكِنُوهُنَّ مِنْ حَيْثُ سَكَنتُم مِّن وُجْدِكُمْ وَلَا تُضَآرُّوهُنَّ لِتُضَيِّقُوا۟
عَلَيْهِنَّ ۚ وَإِن كُنَّ أُو۟لَٰتِ حَمْلٍ فَأَنفِقُوا۟ عَلَيْهِنَّ حَتَّىٰ يَضَعْنَ حَمْلَهُنَّ ۚ
فَإِنْ أَرْضَعْنَ لَكُمْ فَـَٔاتُوهُنَّ أُجُورَهُنَّ ۖ وَأْتَمِرُوا۟ بَيْنَكُم بِمَعْرُوفٍ ۖ وَإِن
تَعَاسَرْتُمْ فَسَتُرْضِعُ لَهُۥٓ أُخْرَىٰ ٦ لِيُنفِقْ ذُو سَعَةٍ مِّن سَعَتِهِۦ ۖ
وَمَن قُدِرَ عَلَيْهِ رِزْقُهُۥ فَلْيُنفِقْ مِمَّآ ءَاتَىٰهُ ٱللَّهُ ۚ لَا يُكَلِّفُ ٱللَّهُ نَفْسًا
إِلَّا مَآ ءَاتَىٰهَا ۚ سَيَجْعَلُ ٱللَّهُ بَعْدَ عُسْرٍ يُسْرًا ٧ وَكَأَيِّن مِّن قَرْيَةٍ
عَتَتْ عَنْ أَمْرِ رَبِّهَا وَرُسُلِهِۦ فَحَاسَبْنَٰهَا حِسَابًا شَدِيدًا وَعَذَّبْنَٰهَا
عَذَابًا نُّكْرًا ٨ فَذَاقَتْ وَبَالَ أَمْرِهَا وَكَانَ عَٰقِبَةُ أَمْرِهَا خُسْرًا ٩
أَعَدَّ ٱللَّهُ لَهُمْ عَذَابًا شَدِيدًا ۖ فَٱتَّقُوا۟ ٱللَّهَ يَٰٓأُو۟لِى ٱلْأَلْبَٰبِ ٱلَّذِينَ ءَامَنُوا۟ ۚ
قَدْ أَنزَلَ ٱللَّهُ إِلَيْكُمْ ذِكْرًا ١٠ رَّسُولًا يَتْلُوا۟ عَلَيْكُمْ ءَايَٰتِ ٱللَّهِ مُبَيِّنَٰتٍ
لِّيُخْرِجَ ٱلَّذِينَ ءَامَنُوا۟ وَعَمِلُوا۟ ٱلصَّٰلِحَٰتِ مِنَ ٱلظُّلُمَٰتِ إِلَى ٱلنُّورِ ۚ
وَمَن يُؤْمِنۢ بِٱللَّهِ وَيَعْمَلْ صَٰلِحًا يُدْخِلْهُ جَنَّٰتٍ تَجْرِى مِن تَحْتِهَا
ٱلْأَنْهَٰرُ خَٰلِدِينَ فِيهَآ أَبَدًا ۖ قَدْ أَحْسَنَ ٱللَّهُ لَهُۥ رِزْقًا ١١ ٱللَّهُ ٱلَّذِى خَلَقَ
سَبْعَ سَمَٰوَٰتٍ وَمِنَ ٱلْأَرْضِ مِثْلَهُنَّ يَتَنَزَّلُ ٱلْأَمْرُ بَيْنَهُنَّ لِتَعْلَمُوٓا۟ أَنَّ
ٱللَّهَ عَلَىٰ كُلِّ شَىْءٍ قَدِيرٌ وَأَنَّ ٱللَّهَ قَدْ أَحَاطَ بِكُلِّ شَىْءٍ عِلْمًۢا ١٢

talaqla boşanmış qadının xərci və yaşayış yeri ilə təmin edilməsi kişiyə aid deyil. Qadına gözləmə müddətində məskən verməmək, yaxud xərclərdən məhrum etmək üçün sıxışdırmaq və əziyyət vermək olmaz. Əgər hamilədirsə, hamiləliyin sonuna qədər onun xərcləri ödənilməlidir. Boşanmış, lakin hamilə olan qadının xərclərinin və yaşayış yeri ilə təmin edilməsinin kişiyə vacib olunmasında heç bir fikir ayrılığı yoxdur. Hamiləlikdən sonra uşağa süd verərsə, süd haqqı da ödənilməlidir. Boşanmış kişi və qadınlara uşaq barədə bir-biriləri ilə xoş rəftar etmək, məşvərət və məsləhətli olmaq tövsiyə olunur. Əgər süd haqqının ödənilməsində kişi qadının tələb etdiyi məbləği ödəməsə və buna görə qadın üşağa süd verməkdən imtina edərsə, o zaman uşağa süd vermək üçün başqa bir qadın tutsun.

(7) **«Varlı-karlı olan öz varına görə versin. İmkanı az olan isə, Allahın ona verdiyindən versin. Allah heç kəsi Özünün ona verdiyindən artıq xərcləməyə məcbur etməz. Allah hər bir çətinlikdən sonra asanlıq əta edər.»** İmkanlı kişilərdən süd verən qadınların haqlarını artıqlaması ilə vermək tələb olunur. Kasıb olanlar isə, Allahın onlara verdiyindən imkan daxilində versinlər. Allah hər kəsi öz gücü çatan qədər yüklədiyi üçün varlı insandan tələb olunan xərc kasıb insandan tələb olunmur. Allah hər bir sıxıntıdan və çətinlikdən sonra rahatlıq verər.

(8) **«Neçə-neçə məmləkət öz Rəbbinin və Onun peyğəmbərinin əmrindən çıxdı. Biz də onları çətin haqq-hesab edib müdhiş əzaba düçar etdik.»** Bir çox insanlar Allahın və rəsullarının əmrinə asi olub onlardan üz çevirdikləri üçün dünyada etdikləri əməllərə görə onları çətin haqq-hesaba cəlb edib bu dünyada aclıq və qıtlığa, axirətdə isə, misli görünməmiş şiddətli əzaba düçar etdik.

(9) **«Onlar əməllərinin cəzasını aldılar və axırda işləri ziyana uğramaq oldu.»** Onlar mal-dövlətlərini, ailələrini və özlərini itirib ziyana uğradılar.

(10) **«Allah onlar üçün şiddətli əzab hazırladı. Ey iman gətirmiş ağıl sahibləri, Allahdan qorxun! Allah sizin üçün Quran nazil etmiş,»**

(11) **«Və iman gətirib yaxşı işlər görənləri zülmətdən nura çıxartmaq üçün Allahın açıq-aşkar ayələrini sizə oxuyan bir peyğəmbər göndərmişdir. Kim Allaha iman gətirib yaxşı iş görsə, onu əbədi qalacaqları, altından çaylar axan cənnətlərə daxil edər. Həqiqətən Allah ona gözəl ruzi əta etmişdir!»** Vəd olunan şiddətli əzab cəhənnəm əzabıdır. Daha sonra, uca Allah Muhəmməd (Sallallahu aleyhi və səlləm) ümmətinə xitab edərək deyir: Allaha təslim olun və Muhəmmədə (Sallallahu aleyhi və səlləm) itaət edin. İmanınızda sadiq olun. Asilik göstərib nəticədə çətin haqq-hesab və şiddətli əzabla cəzalandırılan əvvəlki ümmətlər kimi olmayın. Yoxsa, sizi də, eyni cəza gözləyər. İnsanların ehtiyac duyduqları hökmləri açıqlasın deyə, Allah sizə Quranı və onunla bərabər Peyğəmbər göndərmişdir. Allah bununla iman gətirənləri zəlalət zülmətindən hidayət nuruna, küfr zülmətindən iman aydınlığına çıxarar.

(12) **«Yeddi göyü və bir o qədər də yeri yaradan Allahdır. Allahın hər şeyə qadir olduğunu, Allahın hər şeyi elmi ilə ehtiva etdiyini biləsiniz deyə, əmri onların arasında nazil olar.»** Uca Allah yeri də yeddi qat yaratmışdır. Birbaşa Peyğəmbərə (Sallallahu aleyhi və səlləm) ünvanlanan səhih hədisdə deyilir: *"Kim başqasının bir qarış yerini alaraq ona zülm edərsə, yeddi qat yerin yükünü daşıyar".* Allahın əmri yeddi qat göydən yeddi qat yerə nazil olar. Yağış yağdırıb bitkiləri yetişdirər, gecə və gündüzün, yay və qışın hərəsini öz növbəsində gətirər.





# Təhrim surəsi 66

## (Qadağan)

1 **﴾Ya Peyğəmbər! Zövcələrinin razı qalmasını diləyərək Allahın sənə halal etdiyi şeyi niyə özünə haram edirsən? Allah bağışlayandır, rəhm edəndir!﴿** Peyğəmbər (Səllallahu aleyhi və səlləm) yoldaşı Zeynəbin yanında bal içirdi. Zeynəbi qısqanan Aişə və Hafsə sözləşdilər ki, Peyğəmbər (Səllallahu aleyhi və səlləm) onların yanına gələndə "Səndən qəribə iy gəlir" – desinlər. Bundan sonra Peyğəmbər (Səllallahu aleyhi və səlləm) balı özünə haram etdi. Uca Allah isə onun bu əməlinə irad tutaraq bildirdi ki, nə üçün Allahın halal etdiyini özünə haram edirsən? Məgər yoldaşlarının razı qalmalarını istəyirsən? Amma sənin bu əməlinə görə Allah səni bağışlayır.

2 **﴾Həqiqətən Allah, andlarınızı geri götürməyi vacib etmişdir. Allah sizin ixtiyar sahibinizdir. O biləndir, hikmət sahibidir!﴿** Uca Allah andlarımızı pozmağın əvəzində kəffarə verməyi şərt qoymuşdur. Eyni hökm bu ayədə də verilmişdir: **﴾lakin bilə-bilə içdiyiniz andlara görə sizi cəzalandırar. Belə bir andı pozmağın kəffarəsi ailənizə yedirtdiyinizin orta hesabından on yoxsulu yedirdib doyurmaq, yaxud geyindirmək, yaxud da bir kölə azad etməkdir. Bunları etməyə imkanı olmayan şəxs üç gün oruc tutmalıdır...﴿** Allahın halal etdiyini haram etməyə heç kəsin haqqı yoxdur. Əgər kimsə belə bir işə and içərsə, onun andı sayılmır və buna görə kəffarə vermir. Nəyinsə halal və ya halal olmasını təyin etmək Allaha aiddir. Lakin əgər kimsə belə bir şeyə görə and içər və özünə hansısa geyimi, qidanı və ya Allahın halal etdiyi hər-hansı bir nеməti haram edərsə, bəzi fiqh alimlərinə görə bu, and içmək sayılır. Əgər o özünə haram etdiyini yenidən istifadə edərsə, and içib andını pozanın kəffarəsi kimi kəffarə verməlidir. Əgər o kəffarə verərsə, özünə qoyduğu qadağanın hökmü ləğv edilir. Bu hər bir işə, hətta öz arvadını özünə haram etməyə də aiddir. Bəzi alimlərin fikrinə görə əgər arvadını özünə haram etməklə boşamağı niyyət edərsə, bu, boşamaq sayılır. Daha doğrusunu Allah bilir.
Allah sizin vəlinizdir, sizə kömək edəndir. O sizin üçün xeyirli olanları yaxşı bilən, Öz fellərində və sözlərində hikmətli olandır.

3 **﴾Bir zaman Peyğəmbər öz zövcələrindən birinə gizli bir söz demişdi. Bu sözü xəbər verdikdə və Allah bunu ona əyan etdikdə bunun bir qismini bildirmiş, bir qismini bildirməkdən isə, vaz keçmişdi. Əhvalatı bildirdikdə o** *(Peyğəmbərdən)*: **"Bunu sənə kim xəbər verdi?" – deyə soruşmuş, o da: "Bunu mənə bilən, agah olan xəbər verdi!" – deyə cavab vermişdi.﴿** Sirri açan Həfsə, gizli danışıq isə, bal haqqında olan söhbətdir. Həfsə ﵂ Peyğəmbərin (Səllallahu aleyhi və səlləm) ona sirr olaraq dediyi sözləri Aişəyə ﵂ çatdırdıqda Peyğəmbər (Səllallahu aleyhi və səlləm) bundan agah oldu. Həfsə onun haradan xəbər tutduğunu soruşduqda Peyğəmbər (Səllallahu aleyhi və səlləm) ona Allah tərəfindən xəbər verildiyini çatdırdı. Çünki heç bir şey Allahdan gizli qala bilməz.

4 **﴾Əgər ikiniz də Allaha tövbə etsəniz. Çünki qəlbləriniz günaha meyl etmişdir. Əgər ona qarşı bir-birinizə kömək etsəniz, onun mövlası Allah, yardım göstərənləri isə Cəbrail, əməlisaleh möminlər və bundan sonra da mələklərdir.﴿** Bu Aişəyə və Həfsəyə ünvanlanan müracitədir. Əgər siz tövbə etsəniz, qəlbləriniz haqqa meyl edər. Yox əgər bir-birinizə dəstək verib qısqanclıq göstərərək onun sirrini açsanız, o zaman bilin ki, ona Allah, Cəbrail və Əbu Bəkr və Ömər kimi əməlisaleh mömin bəndələri kömək edərlər. O köməkçi sarıdan korluq çəkən deyil. Hələ bundan əlavə, mələklər də ona köməyə

سُورَةُ التَّحْرِيمِ — آياتها ١٢ — ترتيبها ٦٦

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

يَٰٓأَيُّهَا ٱلنَّبِيُّ لِمَ تُحَرِّمُ مَآ أَحَلَّ ٱللَّهُ لَكَۖ تَبۡتَغِي مَرۡضَاتَ أَزۡوَٰجِكَۚ وَٱللَّهُ
غَفُورٞ رَّحِيمٞ ١ قَدۡ فَرَضَ ٱللَّهُ لَكُمۡ تَحِلَّةَ أَيۡمَٰنِكُمۡۚ وَٱللَّهُ مَوۡلَىٰكُمۡۖ
وَهُوَ ٱلۡعَلِيمُ ٱلۡحَكِيمُ ٢ وَإِذۡ أَسَرَّ ٱلنَّبِيُّ إِلَىٰ بَعۡضِ أَزۡوَٰجِهِۦ حَدِيثٗا
فَلَمَّا نَبَّأَتۡ بِهِۦ وَأَظۡهَرَهُ ٱللَّهُ عَلَيۡهِ عَرَّفَ بَعۡضَهُۥ وَأَعۡرَضَ عَنۢ بَعۡضٖۖ
فَلَمَّا نَبَّأَهَا بِهِۦ قَالَتۡ مَنۡ أَنۢبَأَكَ هَٰذَاۖ قَالَ نَبَّأَنِيَ ٱلۡعَلِيمُ ٱلۡخَبِيرُ
٣ إِن تَتُوبَآ إِلَى ٱللَّهِ فَقَدۡ صَغَتۡ قُلُوبُكُمَاۖ وَإِن تَظَٰهَرَا عَلَيۡهِ
فَإِنَّ ٱللَّهَ هُوَ مَوۡلَىٰهُ وَجِبۡرِيلُ وَصَٰلِحُ ٱلۡمُؤۡمِنِينَۖ وَٱلۡمَلَٰٓئِكَةُ
بَعۡدَ ذَٰلِكَ ظَهِيرٌ ٤ عَسَىٰ رَبُّهُۥٓ إِن طَلَّقَكُنَّ أَن يُبۡدِلَهُۥٓ أَزۡوَٰجًا
خَيۡرٗا مِّنكُنَّ مُسۡلِمَٰتٖ مُّؤۡمِنَٰتٖ قَٰنِتَٰتٖ تَٰٓئِبَٰتٍ عَٰبِدَٰتٖ سَٰٓئِحَٰتٖ
ثَيِّبَٰتٖ وَأَبۡكَارٗا ٥ يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُواْ قُوٓاْ أَنفُسَكُمۡ وَأَهۡلِيكُمۡ
نَارٗا وَقُودُهَا ٱلنَّاسُ وَٱلۡحِجَارَةُ عَلَيۡهَا مَلَٰٓئِكَةٌ غِلَاظٞ شِدَادٞ
لَّا يَعۡصُونَ ٱللَّهَ مَآ أَمَرَهُمۡ وَيَفۡعَلُونَ مَا يُؤۡمَرُونَ ٦ يَٰٓأَيُّهَا
ٱلَّذِينَ كَفَرُواْ لَا تَعۡتَذِرُواْ ٱلۡيَوۡمَۖ إِنَّمَا تُجۡزَوۡنَ مَا كُنتُمۡ تَعۡمَلُونَ ٧

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُواْ تُوبُوٓاْ إِلَى ٱللَّهِ تَوۡبَةٗ نَّصُوحًا عَسَىٰ رَبُّكُمۡ
أَن يُكَفِّرَ عَنكُمۡ سَيِّـَٔاتِكُمۡ وَيُدۡخِلَكُمۡ جَنَّٰتٖ تَجۡرِي
مِن تَحۡتِهَا ٱلۡأَنۡهَٰرُ يَوۡمَ لَا يُخۡزِي ٱللَّهُ ٱلنَّبِيَّ وَٱلَّذِينَ ءَامَنُواْ
مَعَهُۥۖ نُورُهُمۡ يَسۡعَىٰ بَيۡنَ أَيۡدِيهِمۡ وَبِأَيۡمَٰنِهِمۡ يَقُولُونَ رَبَّنَآ
أَتۡمِمۡ لَنَا نُورَنَا وَٱغۡفِرۡ لَنَآۖ إِنَّكَ عَلَىٰ كُلِّ شَيۡءٖ قَدِيرٞ ٨
يَٰٓأَيُّهَا ٱلنَّبِيُّ جَٰهِدِ ٱلۡكُفَّارَ وَٱلۡمُنَٰفِقِينَ وَٱغۡلُظۡ عَلَيۡهِمۡۚ
وَمَأۡوَىٰهُمۡ جَهَنَّمُۖ وَبِئۡسَ ٱلۡمَصِيرُ ٩ ضَرَبَ ٱللَّهُ مَثَلٗا
لِّلَّذِينَ كَفَرُواْ ٱمۡرَأَتَ نُوحٖ وَٱمۡرَأَتَ لُوطٖۖ كَانَتَا تَحۡتَ
عَبۡدَيۡنِ مِنۡ عِبَادِنَا صَٰلِحَيۡنِ فَخَانَتَاهُمَا فَلَمۡ يُغۡنِيَا عَنۡهُمَا
مِنَ ٱللَّهِ شَيۡـٔٗا وَقِيلَ ٱدۡخُلَا ٱلنَّارَ مَعَ ٱلدَّٰخِلِينَ ١٠
وَضَرَبَ ٱللَّهُ مَثَلٗا لِّلَّذِينَ ءَامَنُواْ ٱمۡرَأَتَ فِرۡعَوۡنَ إِذۡ
قَالَتۡ رَبِّ ٱبۡنِ لِي عِندَكَ بَيۡتٗا فِي ٱلۡجَنَّةِ وَنَجِّنِي مِن فِرۡعَوۡنَ
وَعَمَلِهِۦ وَنَجِّنِي مِنَ ٱلۡقَوۡمِ ٱلظَّٰلِمِينَ ١١ وَمَرۡيَمَ ٱبۡنَتَ
عِمۡرَٰنَ ٱلَّتِيٓ أَحۡصَنَتۡ فَرۡجَهَا فَنَفَخۡنَا فِيهِ مِن رُّوحِنَا
وَصَدَّقَتۡ بِكَلِمَٰتِ رَبِّهَا وَكُتُبِهِۦ وَكَانَتۡ مِنَ ٱلۡقَٰنِتِينَ ١٢

gələrlər. Bunun üçün xüsusi mələklər də seçilər.

(5) **﴾Əgər o sizi boşasa, ola bilsin ki, Rəbbi sizin əvəzinizə ona sizdən daha yaxşı zövcələr – müsəlman, mömin, itaətkar, tövbəkar, ibadət edən, oruc tutan dul qadınlar və bakirə qızlar versin!﴿** Uca Allah Peyğəmbərin (Sallallahu aleyhi və səlləm) zövcələrinə xəbərdarlıq edib bildirir ki, əgər Peyğəmbər (Sallallahu aleyhi və səlləm) sizi boşasa, mən ona sizdən daha xeyirli zövcələr qismət edərəm.

(6) **﴾Ey iman gətirənlər! Özünüzü və əhli-əyalınızı elə bir oddan qoruyun ki, onun yanacağı insanlar və daşlar, xidmətçiləri isə, Allahın onlara verdiyi əmrlərə asi olmayan, buyurduqlarını yerinə yetirən daş qəlbli və çox sərt təbiətli mələklərdir.﴿** Allahın əmrlərini yerinə yetirib, qadağalarından çəkinməklə özünüzü qoruyun. Ailənizə Allaha itaət etməyi və qadağalarından çəkinməyi əmr edin. Çünki Allahın əmr və qadağalarına məhəl qoymayanlar üçün insanlar və daşlardan alışdırılan bir od vardır. İbn Cərir deyir: Biz, övladlarımıza dinimizi, xeyirli işləri və hər kəsin bilməsi vacib olan ədəb-əxlaq qaydalarını öyrətməliyik. Daha sonra uca Allah cəhənnəm zəbanilərini vəsf edərək işin nə qədər ciddi olduğunu xatırladır. Cəhənnəmdə keşik çəkən bu mələklər Allahın əmrlərinə asi olmaz və onlara əmr olunanı icra edərlər.

(7) **﴾"Ey kafir olanlar! Bu gün heç bir üzrxahlıq etməyin. Siz ancaq törətdiyiniz əməllərin cəzasını çəkəcəksiniz!"﴿** Kafirlər cəhənnəmə atıldıqları zaman onlara kədər vermək və ümidlərinin boşa çıxdığını bildirmək üçün bu sözlər deyiləcəkdir. Belə ki, onlar bu dünyada etdiklərinin əvəzini alacaqlar.

(8) **﴾Ey iman gətirənlər! Allaha səmimi-qəlbdən tövbə edin. Ola bilsin ki, Rəbbiniz günahlarınızın üstünü örtsün və sizi altından çaylar axan cənnətlərə daxil etsin. O gün Allah Öz Peyğəmbərini və onunla birlikdə iman gətirənləri xəcil etməz. Onların nuru önlərindən və sağ tərəflərindən axıb şölə saçarkən onlar belə deyəcəklər: "Ey Rəbbimiz! Bizim nurumuzu tamam-kamal elə və bizi bağışla. Həqiqətən Sən, hər şeyə qadirsən!"﴿** Səmimi-qəlbdən edilən tövbə keçmiş günaha qəlbən peşman olmaq, dil ilə bağışlanma diləmək, əməldə günahdan əl çəkmək və bir daha bu günaha qayıtmamaqdır. Möminlər sirat körpüsü üzərindən keçərkən nurları onlar ilə birlikdə olacaqdır.

(9) **﴾Ya Peyğəmbər! Kafirlərə qarşı, münafiqlərə qarşı vuruş. Onlarla sərt rəftar et. Onların məskəni Cəhənnəmdir. Ora necə də pis sığınacaqdır!﴿** Kafirlərə qarşı silahla, münafiqlərə qarşı isə, cəzaları tətbiq etməklə müharibə et. Münafiqlər hüdudları aşaraq, cəzaya layiq olan əməllər edərdilər. Bu səbəbdən uca Allah müsəlmanların izzətini və nüfuzunu qoruyub saxlamaq üçün hər iki dəstəyə qarşı sərt olmağı əmr etdi.

(10) **﴾Allah kafirlərə Nuhun övrəti ilə Lutun övrətini misal çəkdi. Onlar Bizim qullarımızdan iki saleh bəndənin kəbini altında idilər. Onlar ərlərinə xəyanət etdilər və onları Allahdan heç vəchlə qurtara bilmədilər. Onlara: "girənlərlə birlikdə siz ikiniz də Cəhənnəmə girin!" – deyildi.﴿** Hər iki arvad ərlərinə xəyanət edirdilər. Nuhun arvadı insanlara ərinin dəli olduğu deyir, Lutun arvadı isə, ərinin qonaqları haqqında camaata xəbər verirdi. Onların Nuh və Lut peyğəmbər kimi bəndələrin arvadları olmaları heç bir fayda vermədi. Küfr və asi insanlarla birlikdə cəhənnəmə girdilər.

(11) **﴾Allah, iman gətirənlərə isə, Fironun zövcəsini misal çəkdi. O zaman o: "Ey Rəbbim! Mənim üçün Öz dərgahında – Cənnətdə bir ev tik. Məni Firondan və onun əməlindən qurtar. Məni zalım qövmdən xilas et!" – demişdi.﴿** Küfrün hakim olması Fironun arvadına ziyan vurmadığı kimi,

سُورَةُ المُلْكِ

آياتها ٣٠ — ترتيبها ٦٧

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

تَبَٰرَكَ ٱلَّذِي بِيَدِهِ ٱلۡمُلۡكُ وَهُوَ عَلَىٰ كُلِّ شَيۡءٖ قَدِيرٌ ١ ٱلَّذِي خَلَقَ
ٱلۡمَوۡتَ وَٱلۡحَيَوٰةَ لِيَبۡلُوَكُمۡ أَيُّكُمۡ أَحۡسَنُ عَمَلٗاۚ وَهُوَ ٱلۡعَزِيزُ ٱلۡغَفُورُ ٢
ٱلَّذِي خَلَقَ سَبۡعَ سَمَٰوَٰتٖ طِبَاقٗاۖ مَّا تَرَىٰ فِي خَلۡقِ ٱلرَّحۡمَٰنِ مِن
تَفَٰوُتٖۖ فَٱرۡجِعِ ٱلۡبَصَرَ هَلۡ تَرَىٰ مِن فُطُورٖ ٣ ثُمَّ ٱرۡجِعِ ٱلۡبَصَرَ كَرَّتَيۡنِ
يَنقَلِبۡ إِلَيۡكَ ٱلۡبَصَرُ خَاسِئٗا وَهُوَ حَسِيرٞ ٤ وَلَقَدۡ زَيَّنَّا ٱلسَّمَآءَ
ٱلدُّنۡيَا بِمَصَٰبِيحَ وَجَعَلۡنَٰهَا رُجُومٗا لِّلشَّيَٰطِينِۖ وَأَعۡتَدۡنَا لَهُمۡ عَذَابَ
ٱلسَّعِيرِ ٥ وَلِلَّذِينَ كَفَرُواْ بِرَبِّهِمۡ عَذَابُ جَهَنَّمَۖ وَبِئۡسَ ٱلۡمَصِيرُ
٦ إِذَآ أُلۡقُواْ فِيهَا سَمِعُواْ لَهَا شَهِيقٗا وَهِيَ تَفُورُ ٧ تَكَادُ تَمَيَّزُ
مِنَ ٱلۡغَيۡظِۖ كُلَّمَآ أُلۡقِيَ فِيهَا فَوۡجٞ سَأَلَهُمۡ خَزَنَتُهَآ أَلَمۡ يَأۡتِكُمۡ نَذِيرٞ ٨
قَالُواْ بَلَىٰ قَدۡ جَآءَنَا نَذِيرٞ فَكَذَّبۡنَا وَقُلۡنَا مَا نَزَّلَ ٱللَّهُ مِن شَيۡءٍ إِنۡ أَنتُمۡ
إِلَّا فِي ضَلَٰلٖ كَبِيرٖ ٩ وَقَالُواْ لَوۡ كُنَّا نَسۡمَعُ أَوۡ نَعۡقِلُ مَا كُنَّا فِيٓ أَصۡحَٰبِ
ٱلسَّعِيرِ ١٠ فَٱعۡتَرَفُواْ بِذَنۢبِهِمۡ فَسُحۡقٗا لِّأَصۡحَٰبِ ٱلسَّعِيرِ ١١
إِنَّ ٱلَّذِينَ يَخۡشَوۡنَ رَبَّهُم بِٱلۡغَيۡبِ لَهُم مَّغۡفِرَةٞ وَأَجۡرٞ كَبِيرٞ ١٢

iman əhlinə də heç bir ziyan vurmaz. O kafirlər kafirinin arvadı idi, amma buna baxmayaraq nəim cənnətlərinə daxil oldu. O dua edib, uca Allahdan Onun dərgahında bir ev istəyir, Firon və onun şər əməllərindən, eləcə də kafir qibtilərdən yaxa qurtarmaq üçün dua edirdi.

12 **﴾həmçinin namusunu möhkəm qoruyub saxlamış İmranın qızı Məryəmi də misal çəkdi. Biz libasının yaxasından ona Öz ruhumuzdan üfürdük. Məryəm Rəbbinin sözlərini, kitablarını təsdiq etdi və itaət edənlərdən oldu.﴿** Məryəmin asilik göstərən tayfanın içərisində yaşamasına baxmayaraq, uca Allah ona bu dünyada və axirətdə Öz lütfünü əta etmiş, onu dünya qadınlarından fərqləndirmişdir. O, öz iffətini və ismətini qorumuşdu. Mələk Cəbrail ﷺ onun paltarının qolundan ruh üfürdü və o, İsaya hamilə qaldı. O, Rəbbinin göndərdiyi şəriəti təsdiqlədi və mələyin "rəbbi tərəfdən göndərilən elçi olması, İsanın dünyaya gələcəyi ilə müjdə verməsi və onun Peyğəmbər olacağı barədə" dediklərini qəbul etdi. O həmçinin əvvəl göndərilmiş kitabları qəbul edirdi. O, Rəbbinə itaətkar bəndələrdən idi. Onun ailəsi də əməlisaleh və itaətkar idi.

# Mülk surəsi 67

1 **﴾Hökm əlində olan Allah nə qədər ucadır. O, hər şeyə qadirdir!﴿** Allahın xeyirləri çox və genişdir, dünyada və axirətdə göylərin və yerin hökmü Allahın əlindədir.

2 **﴾Hansınızın əməlcə daha gözəl olduğunu sınamaq üçün ölümü və həyatı yaradan Odur. O, yenilməz qüvvət sahibidir, bağışlayandır.﴿** Ölüm ruhun bədəndən ayrılması, həyat isə, ruhun bədənə qovuşmasıdır. Həyat insanın yaradılıb ona ruh verilməsidir. Ölüm və həyat verməkdə məqsəd insanlara əmrlər verib, sonra onları imtahana çəkərək, qarşılığını verməkdir. İmtahandan əsas məqsəd ən yaxşıları və itaətkarları üzə çıxarmaqdır.

3 **﴾Yeddi göyü qat-qat yaradan da Odur. Sən Rəhmanın yaratdığında heç bir uyğunsuzluq görməzsən. Bir gözünü qaldırıb bax, heç orada bir yarıq görə bilərsənmi?!﴿** Bu yaradılış yaradanın qüdrətinin bir nümunəsidir.

4 **﴾Sonra gözünü qaldırıb iki dəfə bax. Göz orada zəif, yorğun düşərək yenə də sənə tərəf qayıdacaqdır!﴿** Allahın yaratdığı səmada heç bir nöqsan tapa bilməyəcəkdir.

5 **﴾And olsun ki, Biz dünya səmasını qəndillərlə bəzədik, onları şeytanlara atılan mərmilər etdik və onlar üçün yandırıb-yaxan alovlu atəş əzabı hazırladıq.﴿** Qatadə deyir ki, uca Allah ulduzları üç şey üçün – səmanı bəzətmək, şeytanları qovmaq, dənizdə və ya quruda istiqamətləri təyin edib hərəkət etmək üçün – yaratmışdır. Şeytanları bu dünyada atılan mərmi ulduzlarla, axirətdə isə, şiddətli atəşlə cəzalandıracaqdır.

6 **﴾Rəbbini inkar edənləri cəhənnəm əzabı gözləyir. Ora necə də pis məskəndir!﴿**

7 **﴾Onlar qaynayan Cəhənnəmə atıldıqları zaman onun dəhşətli uğultusunu eşidəcəklər!﴿**

8 **﴾O, qeyzindən az qala parça-parça olsun. Hər hansı bir tayfa ora atıldıqca onun gözətçiləri onlardan: "Məgər sizə qorxudan bir peyğəmbər gəlməmişdimi?" – deyə soruşacaqlar﴿.**

9 **﴾Onlar deyəcəklər: "Bəli, bizə qorxudan peyğəmbər gəlmişdi. Amma biz onu yalançı sayıb demişdik: "Allah heç bir şey nazil etməmişdir. Siz sadəcə olaraq çox azmısınız!"** Göndərilmiş Peyğəmbər bizi xəbərdar etmiş, Allahın əzabı ilə qorxutmuş və bu günü bizə xatırlatmışdı, biz isə, onu yalançı sayıb demişdik: ***"Allah sizin***

وَأَسِرُّوا۟ قَوْلَكُمْ أَوِ ٱجْهَرُوا۟ بِهِۦٓ ۖ إِنَّهُۥ عَلِيمٌۢ بِذَاتِ ٱلصُّدُورِ ﴿١٣﴾ أَلَا
يَعْلَمُ مَنْ خَلَقَ وَهُوَ ٱللَّطِيفُ ٱلْخَبِيرُ ﴿١٤﴾ هُوَ ٱلَّذِى جَعَلَ لَكُمُ
ٱلْأَرْضَ ذَلُولًا فَٱمْشُوا۟ فِى مَنَاكِبِهَا وَكُلُوا۟ مِن رِّزْقِهِۦ ۖ وَإِلَيْهِ ٱلنُّشُورُ
﴿١٥﴾ ءَأَمِنتُم مَّن فِى ٱلسَّمَآءِ أَن يَخْسِفَ بِكُمُ ٱلْأَرْضَ فَإِذَا هِىَ
تَمُورُ ﴿١٦﴾ أَمْ أَمِنتُم مَّن فِى ٱلسَّمَآءِ أَن يُرْسِلَ عَلَيْكُمْ حَاصِبًا ۖ
فَسَتَعْلَمُونَ كَيْفَ نَذِيرِ ﴿١٧﴾ وَلَقَدْ كَذَّبَ ٱلَّذِينَ مِن قَبْلِهِمْ فَكَيْفَ
كَانَ نَكِيرِ ﴿١٨﴾ أَوَلَمْ يَرَوْا۟ إِلَى ٱلطَّيْرِ فَوْقَهُمْ صَٰٓفَّٰتٍ وَيَقْبِضْنَ ۚ مَا
يُمْسِكُهُنَّ إِلَّا ٱلرَّحْمَٰنُ ۚ إِنَّهُۥ بِكُلِّ شَىْءٍۭ بَصِيرٌ ﴿١٩﴾ أَمَّنْ هَٰذَا ٱلَّذِى
هُوَ جُندٌ لَّكُمْ يَنصُرُكُم مِّن دُونِ ٱلرَّحْمَٰنِ ۚ إِنِ ٱلْكَٰفِرُونَ إِلَّا فِى غُرُورٍ
﴿٢٠﴾ أَمَّنْ هَٰذَا ٱلَّذِى يَرْزُقُكُمْ إِنْ أَمْسَكَ رِزْقَهُۥ ۚ بَل لَّجُّوا۟ فِى عُتُوٍّ
وَنُفُورٍ ﴿٢١﴾ أَفَمَن يَمْشِى مُكِبًّا عَلَىٰ وَجْهِهِۦٓ أَهْدَىٰٓ أَمَّن يَمْشِى سَوِيًّا
عَلَىٰ صِرَٰطٍ مُّسْتَقِيمٍ ﴿٢٢﴾ قُلْ هُوَ ٱلَّذِىٓ أَنشَأَكُمْ وَجَعَلَ لَكُمُ ٱلسَّمْعَ
وَٱلْأَبْصَٰرَ وَٱلْأَفْـِٔدَةَ ۖ قَلِيلًا مَّا تَشْكُرُونَ ﴿٢٣﴾ قُلْ هُوَ ٱلَّذِى ذَرَأَكُمْ
فِى ٱلْأَرْضِ وَإِلَيْهِ تُحْشَرُونَ ﴿٢٤﴾ وَيَقُولُونَ مَتَىٰ هَٰذَا ٱلْوَعْدُ إِن كُنتُمْ
صَٰدِقِينَ ﴿٢٥﴾ قُلْ إِنَّمَا ٱلْعِلْمُ عِندَ ٱللَّهِ وَإِنَّمَآ أَنَا۠ نَذِيرٌ مُّبِينٌ ﴿٢٦﴾

*dilinizlə qeybdən, axirətdən və şəriət məsələlərindən heç bir şey nazil etməmişdir.*" Üstəlik biz onlara "**Siz sadəcə olaraq çox azmısınız!**" – deyirdik.

(10) **﴾Onlar: "Əgər biz qulaq asıb ağlımızı başımıza yığsaydıq, cəhənnəm əhli içində olmazdıq!" – deyəcəklər.﴿** Əgər biz aqil insanlar kimi onları dinləyib, sözlərinə əməl etsəydik, cəhənnəm əhlindən olmazdıq.

(11) **﴾Və beləcə öz günahlarını etiraf edəcəklər. Rədd olsun Cəhənnəm əhli!﴿** Onlar cəhənnəm əzabına layiq görüldükləri günahları, küfrü və Peyğəmbərləri təkzib etdiklərini etiraf edəcəklər. Onlar öz günahlarını etiraf etdikdən sonra Allah da onları əzaba düçar edəcəkdir. Çünki onlar öz günahlarını etiraf etməklə üzrxahlığa yer qoymayacaqlar.

(12) **﴾Rəbbindən görmədən qorxanları isə bağışlanma və böyük bir mükafat gözləyir!﴿**

(13) **﴾İstər sözünüzü gizli saxlayın, istər açıq deyin. *(Allah)* ürəklərdə olanları biləndir!﴿** heç nə Ondan gizli qalmaz.

(14) **﴾Məgər yaradan bilməzmi?! O, incəliyinə qədər biləndir, xəbərdardır!﴿** Məgər yaradan öz yaratdığının ürəyindən və ağlından keçənləri bilməzmi? Axı uca Allah insanı Öz əli ilə yaradıb. Yaradılmış haqqında ən mükəmməl elmə onu yaradan sahib ola bilər. Ona görə də O ürəyin dərinliyində olanları da bilir.

(15) **﴾Yeri sizə ram edən Odur. Onun qoynunda gəzin, ruzisindən yeyin. Axır dönüş də Onadır!﴿** O sizin üçün yer üzünü yaşaya biləcəyiniz qədər rahat etmişdir. Onu kor-kobud, keçilməz etməmişdir. Siz də bu rahat yer üzünün hər yanında gəzin dolaşın, orada olan ruzilərlə qidalanın. Bu uca Allahın xatırlatmasıdır. Belə nemətlərin müqabilində onlar da qayıdış gününü unutmamalıdırlar. Bilməlidirlər ki, bir gün qəbirlərindən çıxacaq və Onun hüzuruna gedəcəklər.

(16) **﴾Göydə olanın yer hərəkətə gəlib çalxalandığı zaman sizi onun dibinə batırmayacağına əminsinizmi?!﴿** Bir vaxtlar yeri aralayıb, yer üzündə rahat gəzib-dolaşan Qarunu yerin dibinə batırdığı kimi, sizi də belə etməyəcəyinə əminsinizmi? Əgər siz yerin altını görsəydiniz, oranın necə qaynayıb-qarışdığına şahid olardınız.

(17) **﴾Yaxud göydə olanın sizin üstünüzə daş yağdıran bir yel göndərməyəcəyinə arxayınsınızmı?! Onda Mənim qorxutmağımın necə olduğunu mütləq biləcəksiniz.﴿** Əvvəllər Lut tayfasının və fil döyüşünü edənlərin üstünə daş yağdırılmışdı. Əgər siz də belə bir əzabı görsəniz, xəbərdarlıqların nə olduğunu anlayarsınız. Təəssüf ki, o zaman bu elm fayda verən deyil.

(18) **﴾Onlardan əvvəlkilər də təkzib etmişdilər. Mənim onları cəzalandırmağım necə oldu.﴿** Onlara olan inkarımı verdiyim əzabla göstərdim.

(19) **﴾Məgər onlar başları üstündə qanad çalaraq uçan quşları görmürlərmi? Onları ancaq Rəhman saxlayır. Həqiqətən O, hər şeyi görəndir!﴿** Quşların çəkisini yüngül edib, onlara qanad verib və bu qanadları havada tərpətməklə müəyyən üsulla üçmağı öyrədən nöqsanlardan və eyiblərdən pak olan Allahdır. O hər şeyi biləndir.

(20) **﴾Yaxud bu əsgərləriniz kimdir ki, onlar sizi Rəhmanın əzabından qurtara bilsinlər?! Kafirlər, sadəcə olaraq, aldanmaqdadırlar!﴿** Sizi Allahın əzabından heç kəs qoruya bilməz. Əgər Allah rəhmət və dəstəyi ilə sizə kömək göstərməsə, kim sizə kömək edə bilər. Kafirlər şeytan tərəfindən çox böyük hiyləgərliklə aldadılırlar.

(21) **﴾Əgər Öz ruzisini kəssə, sizə kim ruzi verə bilər?! Xeyr onlar dikbaşlıqdan və nifrət etməkdən əl çəkmirlər.﴿** Əgər Allah sizə verdiyi ruzini yağışı və s. kəssə, Ondan başqa sizə kim ruzi verə bilər. Amma

فَلَمَّا رَأَوْهُ زُلْفَةً سِيٓـَٔتْ وُجُوهُ ٱلَّذِينَ كَفَرُوا۟ وَقِيلَ هَٰذَا ٱلَّذِى
كُنتُم بِهِۦ تَدَّعُونَ ﴿٢٧﴾ قُلْ أَرَءَيْتُمْ إِنْ أَهْلَكَنِىَ ٱللَّهُ وَمَن مَّعِىَ
أَوْ رَحِمَنَا فَمَن يُجِيرُ ٱلْكَٰفِرِينَ مِنْ عَذَابٍ أَلِيمٍ ﴿٢٨﴾ قُلْ هُوَ
ٱلرَّحْمَٰنُ ءَامَنَّا بِهِۦ وَعَلَيْهِ تَوَكَّلْنَا فَسَتَعْلَمُونَ مَنْ هُوَ فِى ضَلَٰلٍ مُّبِينٍ
﴿٢٩﴾ قُلْ أَرَءَيْتُمْ إِنْ أَصْبَحَ مَآؤُكُمْ غَوْرًا فَمَن يَأْتِيكُم بِمَآءٍ مَّعِينٍۭ ﴿٣٠﴾

ترتيبها ٦٨ — سُورَةُ القَلَمِ — آياتها ٥٢

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

نٓ ۚ وَٱلْقَلَمِ وَمَا يَسْطُرُونَ ﴿١﴾ مَآ أَنتَ بِنِعْمَةِ رَبِّكَ بِمَجْنُونٍ ﴿٢﴾
وَإِنَّ لَكَ لَأَجْرًا غَيْرَ مَمْنُونٍ ﴿٣﴾ وَإِنَّكَ لَعَلَىٰ خُلُقٍ عَظِيمٍ ﴿٤﴾
فَسَتُبْصِرُ وَيُبْصِرُونَ ﴿٥﴾ بِأَييِّكُمُ ٱلْمَفْتُونُ ﴿٦﴾ إِنَّ رَبَّكَ هُوَ
أَعْلَمُ بِمَن ضَلَّ عَن سَبِيلِهِۦ وَهُوَ أَعْلَمُ بِٱلْمُهْتَدِينَ ﴿٧﴾ فَلَا تُطِعِ
ٱلْمُكَذِّبِينَ ﴿٨﴾ وَدُّوا۟ لَوْ تُدْهِنُ فَيُدْهِنُونَ ﴿٩﴾ وَلَا تُطِعْ كُلَّ
حَلَّافٍ مَّهِينٍ ﴿١٠﴾ هَمَّازٍ مَّشَّآءٍۭ بِنَمِيمٍ ﴿١١﴾ مَّنَّاعٍ لِّلْخَيْرِ مُعْتَدٍ
أَثِيمٍ ﴿١٢﴾ عُتُلٍّۭ بَعْدَ ذَٰلِكَ زَنِيمٍ ﴿١٣﴾ أَن كَانَ ذَا مَالٍ وَبَنِينَ
﴿١٤﴾ إِذَا تُتْلَىٰ عَلَيْهِ ءَايَٰتُنَا قَالَ أَسَٰطِيرُ ٱلْأَوَّلِينَ ﴿١٥﴾

kafirlər yenə də haqqa qarşı inadkardır. Onlar nə düşünər, nə də ibrət alarlar.

(22) **«Elə isə, üzüstə sürünən daha haqq yoldadır, yoxsa düz yolda düz gedən?!»** Üzü üstə yeriyən Allaha asilik göstərərək, günahlara qərq olan kafirdir. Allah onları elə üzləri üstə həşr edəcəkdir. Düz yolda gedən isə mömindir. O, bu dünyada Allahın yolunu tutub, elm və bəsirətlə irəliləyər. Qiyamət günündə də Allah onu həşr edib, düz yol ilə cənnətə aparar.

(23) **«De: "Sizi yoxdan yaradan, sizə qulaq, göz və qəlb verən Odur. Nə az şükür edirsiniz!"»**

(24) **«De: "Sizi yer üzünə yayıb səpələyən Odur. Onun hüzuruna toplanacaqsınız!"»**

(25) **«Onlar deyirlər: "Əgər doğru danışanlardansınızsa, bir xəbər verin görək, bu vəd, nə vaxt yerinə yetəcəkdir?"»**

(26) **«De: "Onu bilmək yalnız Allaha məxsusdur. Mən isə ancaq açıq-aşkar qorxudan bir peyğəmbərəm!"»** Qiyamətin nə vaxt qopacağını bilmək yalnız Allaha məxsusdur. Mən sadəcə olaraq sizi xəbərdar edir, küfrünüzün aqibəti ilə sizi qorxuduram. Allahın mənə çatdırılmasını əmr etdiklərini çatdırıram. O, mənə qiyamətin nə vaxt qopacağını sizə bildirməyi əmr etməmişdir.

(27) **«Kafirlər əzabın yaxınlaşdığını gördükləri zaman üzləri eybəcər kökə düşəcək və onlara: "Sizin istədiyiniz əzab budur!" – deyiləcəkdir.»** Dünyada istehza edib Peyğəmbərdən tələb etdiyiniz əzab budur.

(28) **«De: "Bir deyin görək, istər Allah məni və mənimlə birlikdə olanları məhv etsin, istərsə də bizə bir mərhəmət əta etsin; siz kafirləri şiddətli əzabdan kim qurtara bilər?!»** Hətta bu halda siz əzabdan qurtula bilməyəcəksiniz.

(29) **«De: "O bizim iman gətirdiyimiz və təvəkkül etdiyimiz Rəhmandır. Kimin açıq-aydın azmış olduğunu biləcəksiniz!"»**

(30) **«De: "Bir söyləyin görək, əgər suyunuz çəkilib getsə, kim sizə axar su gətirə bilər?!»** İçmək üçün sizə nemət kimi verilmiş qar, yağış, quyu və çay suyu tükənsə, axar suyu sizə yenidən kim verə bilər. Təbii ki, bunu Allahdan başqa heç kəs edə bilməz. O sizə yağış və ya çaylar vasitəsi ilə nemətini bəxş edər.

## əl-Qələm surəsi 68

(1) **«Nun! And olsun qələmə və yazdıqlarına»** "Nun" heca hərflərindən biridir. Həqiqi mənasını Allahdan başqa heç kəs bilmir. Uca Allah bu ayədə qələmə və qələmlə yazılan elmə and içir. Çünki qələm bir açıqlama vasitəsidir. Bu yazılan hər bir qələmə şamildir.

(2) **«Sən Rəbbinin neməti sayəsində dəli deyilsən!»** Ey Muhəmməd sən Rəbbinin sənə bəxş etdiyi Peyğəmbərlik və rəhbərlik neməti ilə dəlilikdən uzaqsan.

(3) **«Və həqiqətən, səni minnətsiz mükafat gözləyir!»** Daşıdığın ağır Peyğəmbərlik yükü və qarşılaşdığın məşəqqətlərə görə səni tükənməz və ya insanların minnət edə bilməyəcəkləri nemətlər gözləyir.

(4) **«Şübhəsiz ki, sən böyük bir əxlaq üzərindəsən!»** Sən Allahın sənə Quranda əmr etdiyi əxlaq üzərindəsən. Səhih Buxaridə rəvayət olunur ki, Aişədən ﵁ Peyğəmbərin (Sallallahu aleyhi və səlləm) əxlaqı haqqında soruşduqda belə cavab vermişdir: "*Onun əxlaqı Quran idi*".

(5) **«Sən də görəcəksən, onlar da görəcəklər,»**

(6) **«Hansınızın divanə olduğunu!»** Ey Muhəmməd örtük açılıb haqq üzə çıxdığı zaman, yəni qiyamət günündə sən də, kafirlər də, kimin məftun və dəli olduğunu görəcəksiniz. Bu ayə kafirlərin *"Muhəmməd (Sallallahu aleyhi və səlləm) yolunu azmış məftundur"* – sözünə cavabdır. Ona görə digər ayədə deyilir:

(7) **«Həqiqətən, sənin Rəbbin öz yolundan çıxanları da, doğru yolda olanları da ən**

سَنَسِمُهُۥ عَلَى ٱلْخُرْطُومِ ١٦ إِنَّا بَلَوْنَٰهُمْ كَمَا بَلَوْنَآ أَصْحَٰبَ ٱلْجَنَّةِ إِذْ أَقْسَمُوا۟
لَيَصْرِمُنَّهَا مُصْبِحِينَ ١٧ وَلَا يَسْتَثْنُونَ ١٨ فَطَافَ عَلَيْهَا طَآئِفٌ مِّن رَّبِّكَ
وَهُمْ نَآئِمُونَ ١٩ فَأَصْبَحَتْ كَٱلصَّرِيمِ ٢٠ فَتَنَادَوْا۟ مُصْبِحِينَ ٢١ أَنِ
ٱغْدُوا۟ عَلَىٰ حَرْثِكُمْ إِن كُنتُمْ صَٰرِمِينَ ٢٢ فَٱنطَلَقُوا۟ وَهُمْ يَتَخَٰفَتُونَ ٢٣
أَن لَّا يَدْخُلَنَّهَا ٱلْيَوْمَ عَلَيْكُم مِّسْكِينٌ ٢٤ وَغَدَوْا۟ عَلَىٰ حَرْدٍ قَٰدِرِينَ ٢٥ فَلَمَّا
رَأَوْهَا قَالُوٓا۟ إِنَّا لَضَآلُّونَ ٢٦ بَلْ نَحْنُ مَحْرُومُونَ ٢٧ قَالَ أَوْسَطُهُمْ أَلَمْ أَقُل
لَّكُمْ لَوْلَا تُسَبِّحُونَ ٢٨ قَالُوا۟ سُبْحَٰنَ رَبِّنَآ إِنَّا كُنَّا ظَٰلِمِينَ ٢٩ فَأَقْبَلَ
بَعْضُهُمْ عَلَىٰ بَعْضٍ يَتَلَٰوَمُونَ ٣٠ قَالُوا۟ يَٰوَيْلَنَآ إِنَّا كُنَّا طَٰغِينَ ٣١ عَسَىٰ
رَبُّنَآ أَن يُبْدِلَنَا خَيْرًا مِّنْهَآ إِنَّآ إِلَىٰ رَبِّنَا رَٰغِبُونَ ٣٢ كَذَٰلِكَ ٱلْعَذَابُ ۖ وَلَعَذَابُ
ٱلْءَاخِرَةِ أَكْبَرُ ۚ لَوْ كَانُوا۟ يَعْلَمُونَ ٣٣ إِنَّ لِلْمُتَّقِينَ عِندَ رَبِّهِمْ جَنَّٰتِ ٱلنَّعِيمِ
٣٤ أَفَنَجْعَلُ ٱلْمُسْلِمِينَ كَٱلْمُجْرِمِينَ ٣٥ مَا لَكُمْ كَيْفَ تَحْكُمُونَ ٣٦ أَمْ
لَكُمْ كِتَٰبٌ فِيهِ تَدْرُسُونَ ٣٧ إِنَّ لَكُمْ فِيهِ لَمَا تَخَيَّرُونَ ٣٨ أَمْ لَكُمْ أَيْمَٰنٌ
عَلَيْنَا بَٰلِغَةٌ إِلَىٰ يَوْمِ ٱلْقِيَٰمَةِ ۙ إِنَّ لَكُمْ لَمَا تَحْكُمُونَ ٣٩ سَلْهُمْ أَيُّهُم
بِذَٰلِكَ زَعِيمٌ ٤٠ أَمْ لَهُمْ شُرَكَآءُ فَلْيَأْتُوا۟ بِشُرَكَآئِهِمْ إِن كَانُوا۟ صَٰدِقِينَ ٤١
يَوْمَ يُكْشَفُ عَن سَاقٍ وَيُدْعَوْنَ إِلَى ٱلسُّجُودِ فَلَا يَسْتَطِيعُونَ ٤٢

**gözəl tanıyandır!»** Uca Allah həqiqətdə kimin azmış olduğunu yaxşı bilir. Sən, yoxsa səni azğınlıqda ittiham edənlər?! Əlbəttə səni ittiham edənlər dünya və axirətdə özlərinə fayda verəcək şəriəti inkar edib, ziyanlı işlərlə məşğul olduqları üçün azğınlıq içərisindədirlər. Rəbbin vəd olunan səadət yolu ilə gedənləri yaxşı tanıyır.

8 **«Elə isə yalan sayanlara itaət etmə!»**

9 **«İstərdilər ki, sən onlara yumşaqlıq göstərəsən, onlar da sənə yumşaqlıq göstərsinlər!»** Onlar istəyirlər ki, sən haqq-ədalət yolunu tərk edib onların yoluna meyl edəsən, onlar da sənə qarşı mülayim olsunlar.

10 **«İtaət etmə hər and içənə, alçağa;»** Yalandan boş-boşuna and içən alçaqlara inanma.

11 **«Qeybət edənə, söz gəzdirənə;»** İnsanın üzünə durub şər danışana, qeybət edənə və insanların münasibətini korlamaq üçün arada söz gəzdirənlərə itaət etmə.

12 **«Xeyrə mane olana, həddi aşana, günaha batana;»**

13 **«Daş ürəkliyə, əsli-nəsəbi bilinməyən haramzadaya –»** ədəbsiz və kobud rəftarlı olduğu üçün tayfasından silinmişlərə, habelə

14 **«O, mal-dövlət, oğul-uşaq sahibi olsa belə!»** buna görə onlara itaət etmə.

15 **«Ayələrimiz ona oxunduğu zaman o: “(Bunlar) qədimlərin əfsanələridir!” – dedi.»**

16 **«Biz onun burnuna damğa basacağıq!»** Cəhənnəmə atılmadan öncə, hər kəs onu tanısın deyə, onun burnuna qara damğa vurulacaqdır. Bu onun üçün əbədi ar olacaqdır.

17 **«Biz, vaxtilə o bağ sahiblərini imtahana çəkdiyimiz kimi, bunları da imtahana çəkdik. O vaxt səhər açılanda mütləq dərəcəklərinə and içmişdilər.»** Peyğəmbərin (Sallallahu aleyhi və sallam) duası ilə bu Məkkə müşriklərini də aclıq və qıtlıq ilə imtahana çəkmişik. Bundan əvvəl isə, Yəmən vilayətində Səna şəhəri yaxınlığında bir kişinin bağı var idi. O daima bağının zəkatını çıxarardı. Kişi öldükdən sonra bağın mülkiyyət hüququ övladlarına keçir. Övladları bağı ələ keçirdikdən sonra kasıbların haqqını kəsdilər. Allahın təyin etdiyi haqqı ödəməyə xəsislik edib: *"Mal-dövlətimiz az, ailəmiz isə olduqca böyükdür. Biz atamız kimi edə bilmərik"* – deyib, kasıbların zəkat haqqını mənimsədilər. Onların aqibəti isə uca Allahın Öz kitabında bizə xəbər verdiyi kimi oldu. O vaxt onlar səhər açılanda mütləq meyvələri dərəcəklərinə and içmişdilər.

18 **«Və heç bir istisna yeri də qoymamışdılar».** İnşallah deməmişdilər, yaxud atalarının onlara verdiyi paydan kasıbların payını ayırmamışdılar.

19 **«Onlar yuxuda ikən sənin Rəbbindən o bağa bir bəla gəldi.»** Onlar yuxuda ikən Allah oraya bir od göndərdi.

20 **«Və o qapqara qaraldı.»** külə döndü. Sanki bu bağda heç meyvə bitməmişdi.

21 **«Onlar səhər qalxıb bir-birini belə səslədilər:»**

22 **«Əgər yığacaqsınızsa, bağınıza tez gedin!”»** ki, kasıb-kusub gəlmədən orada olasınız.

23 **«Nəhayət, yola düşdülər, bir-birinə xəlvətcə belə deyirdilər:»**

24 **«“bu gün orada yanınıza heç bir yoxsul soxulmasın!”»** ki, birdən atamızın verdiyi haqqı yenidən istəyərlər.

25 **«Onlar bu yolla bağa buraxmamağa qadir olacaqlarını güman edərək erkən getdilər.»**

26 **«Bu vəziyyəti gördükdə dedilər: “Yəqin ki, azmışıq!»** Onlar gördüklərinə inanmayıb, yolu səhv saldıqlarını düşündülər. Amma sonradan bunun öz bağları olduğuna əmin oldular. Onlar bunun Allah tərəfindən göndərilmiş bir cəza olduğunu anlayıb dedilər:

27 **«Xeyr, biz məhrum olmuşuq!”»** biz, kasıbları öz haqlarından məhrum etmək istədiyimiz üçün Allah da bizi bağımızın

meyvəsindən məhrum edib.
28 **«Onların ən ağıllısı dedi: "Məgər mən sizə həmd-səna ilə təqdis etməli olduğunuzu demədimmi?!"»** Məgər mən sizə kasıbların haqqını kəsməyin zülm olduğunu demədimmi?! Allahın zülmə qarşı amansız cəza verdiyini gördükdən sonra Onu təqdis edib itaətkar olun.
29 **«Onlar: "Rəbbimiz pakdır, müqəddəsdir! Həqiqətən, biz zalım idik!" – dedilər.»** Rəbbimiz bağımıza etdiklərində heç bir zülmə yol verməmişdir, bu, bizim kasıbları öz haqlarından məhrum edərək əldə etdiyimiz "qazancdır".
30 **«Onlar bir-birini danlamağa başladılar.»**
31 **«Və dedilər: "Vay halımıza! Biz azğınlıq edirdik.»**
32 **«Ola bilsin ki, Rəbbimiz onun əvəzinə, bizə daha yaxşısını versin. Biz, Rəbbimizdən diləyirik!"»** Ondan xeyir və məğfirət diləyirik.
33 **«Əzab belədir. Şübhəsiz ki, axirət əzabı daha şiddətlidir. Kaş biləydilər!»** Kafirlərə də bu dünyada onlara verdiyimiz əzab kimi bir əzab verərik. Axirətin əzabı isə, bundan daha ağırdır. Amma onlar bunu dərk etmirlər.
34 **«Həqiqətən, Allahdan qorxub pis əməllərdən çəkinənləri Rəbbi yanında Nəim cənnətləti gözləyir!»**
35 **«Məgər Biz müsəlmanları kafirlərlə eynimi tutacağıq?!»** Qureyş qəbiləsinin kafir ağaları belə deyərdilər: Əgər Muhəmmədin iddia etdikləri doğru olsaydı, o zaman bizimlə müsəlmanların halı dünyadakı kimi olar. Axirətdə onlar üçün olduğu kimi bizim üçün də cənnət nemətləri olar. Amma uca Allah bildirir ki, Onun itaətində sadiq olanlarla, Ona asilik edib haram içində batanlar bir olmaz.
36 **«Sizə nə olub, necə mühakimə yürüdürsünüz?»** Bu, olduqca yersiz qərardır. Elə bil hökm vermək əmri sizə tapşırılıb?
37 **«Yoxsa bir kitabınız vardır ki, orada oxuyursunuz?!»** Bəlkə orada itaətkarların asilərlə bərabər olduğu yazılıb?!
38 **«Yaxud orada bəyənib seçdiyiniz hər şeyin sizin olacağı yazılmışdır?!»** Yoxsa axirətdə ixtiyarınızın öz əlinizdə olacağı yazılmışdır?!
39 **«Və ya hökm edib istədiklərinizin sizin olacağına dair Bizdən qiyamət gününədək davam edəcək əhd almısınız?!»** sizi cənnətə salacağına dair və qiyamətə qədər dəyişdirilməmək şərti ilə Allahdan and almısınız?!
40 **«Onlardan soruş ki, hansı biri buna zamindir?»** Aralarından kim buna zamin dura bilər?
41 **«Yoxsa onların şərikləri vardır?! Əgər doğru deyirlərsə, qoy şəriklərini gətirsinlər!»** axirətdə onları müsəlmanlarla eyni edə biləcək şərikləri vardırmı? Əgər varsa, ortaya çıxarsınlar.
42 **«Baldırın açılacağı və səcdəyə dəvət olunacaqları gün onlar qadir olmayacaqlar.»** Uca Allahın Öz baldırını açması, o günün şiddətini bildirir. Buxari və qeyriləri Əbu Səiddən ﷺ rəvayət edirlər ki, Peyğəmbər (Sallallahu aleyhi və səlləm) demişdir: "*Uca Rəbbimiz baldırını açacaq və hər bir mömin kişi və qadın ona səcdə edəcək. Bu dünyada riyakarlıq və öyünmək üçün səcdə edənlər də səcdəyə getmək istəyəndə belləri qatlanmayacaqdır.*" Onlar səcdə edə bilməyəcəklər. Bütün məxluqat Allaha bir səcdə edəcək. Kafirlər və münafiqlər səcdə etməyə cəhd edəcəklər, amma bacarmayacaqlar. Çünki onların beli quruyacaq və səcdə edə bilməyəcəklər. Çünki onlar bu dünyada olarkən Allaha iman gətirməmiş, Ona səcdə etməmişdilər.
43 **«Gözləri zəlilcəsinə yerə dikiləcək, özlərini də zillət bürüyəcəkdir. Halbuki onlar sağlam olduqları ikən səcdəyə dəvət olunurdular.»** Onlar kor-peşman olacaq, xəcalət çəkəcəklər. Halbuki dünyada sağlam olarkən səcdə etməyə çağırılır, amma onlar buna məhəl qoymurdular. İbrahim ət-Teymi deyir: *"Onlar azan və iqamə ilə namaza çağrılsalar da, bundan imtina edirdilər"*.
44 **«Artıq bu kəlamı yalan sayanları Mənə tapşır. Biz onları özləri də bilmədən tədriclə əzaba giriftar edərik.»** Sən Quranı yalan sayanları Mənim öhdəmə burax. Biz onları tədriclə əzaba düçar edəcəyik. Heç onlar özləri də oraya necə düşdüklərini bilməyəcəklər. Onlar özlərini tədriclə əzaba aparan yolun nemət olduğunu zənn edəcək, yolun sonunda onları nə gözlədiyini dərk etməyəcəklər.
45 **«Onlara möhlət verərəm. Həqiqətən Mənim əzabım dözülməz dərəcədə şiddətlidir.»** Mən onlara əzablarını böyütmək üçün möhlət verərəm.
46 **«Yoxsa sən, onlardan ücrət istəyirsən və onlar ağır borc yükü altında qalıblar?!»** Məgər sən, Allaha iman gətirməyə çağırarkən, onlardan pul-para istəyirsən ki, bu da onlara ağır yük olur? Məgər onlar bu səbəblə səndən üz döndərirlər?
47 **«Yoxsa qeyb yanlarındadır və onlar yazırlar?!»** Onlar gətirdikləri bu iddiaları qeybdənmi yazırlar?
48 **«Sən öz Rəbbinin hökmünə səbr et və balıq sahibi kimi olma. O zaman o, qəmkədər içində boğularaq dua etmişdi.»** Balıq

خَٰشِعَةً أَبْصَٰرُهُمْ تَرْهَقُهُمْ ذِلَّةٌ ۖ وَقَدْ كَانُوا۟ يُدْعَوْنَ إِلَى ٱلسُّجُودِ وَهُمْ سَٰلِمُونَ
﴿٤٣﴾ فَذَرْنِى وَمَن يُكَذِّبُ بِهَٰذَا ٱلْحَدِيثِ ۖ سَنَسْتَدْرِجُهُم مِّنْ حَيْثُ
لَا يَعْلَمُونَ ﴿٤٤﴾ وَأُمْلِى لَهُمْ ۚ إِنَّ كَيْدِى مَتِينٌ ﴿٤٥﴾ أَمْ تَسْـَٔلُهُمْ أَجْرًا فَهُم
مِّن مَّغْرَمٍ مُّثْقَلُونَ ﴿٤٦﴾ أَمْ عِندَهُمُ ٱلْغَيْبُ فَهُمْ يَكْتُبُونَ ﴿٤٧﴾ فَٱصْبِرْ
لِحُكْمِ رَبِّكَ وَلَا تَكُن كَصَاحِبِ ٱلْحُوتِ إِذْ نَادَىٰ وَهُوَ مَكْظُومٌ ﴿٤٨﴾ لَّوْلَآ
أَن تَدَٰرَكَهُۥ نِعْمَةٌ مِّن رَّبِّهِۦ لَنُبِذَ بِٱلْعَرَآءِ وَهُوَ مَذْمُومٌ ﴿٤٩﴾ فَٱجْتَبَٰهُ رَبُّهُۥ
فَجَعَلَهُۥ مِنَ ٱلصَّٰلِحِينَ ﴿٥٠﴾ وَإِن يَكَادُ ٱلَّذِينَ كَفَرُوا۟ لَيُزْلِقُونَكَ بِأَبْصَٰرِهِمْ
لَمَّا سَمِعُوا۟ ٱلذِّكْرَ وَيَقُولُونَ إِنَّهُۥ لَمَجْنُونٌ ﴿٥١﴾ وَمَا هُوَ إِلَّا ذِكْرٌ لِّلْعَٰلَمِينَ ﴿٥٢﴾

ترتيبها ٦٩ — سُورَةُ الحَاقَّةِ — آياتها ٥٢

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

ٱلْحَآقَّةُ ﴿١﴾ مَا ٱلْحَآقَّةُ ﴿٢﴾ وَمَآ أَدْرَىٰكَ مَا ٱلْحَآقَّةُ ﴿٣﴾ كَذَّبَتْ ثَمُودُ
وَعَادٌۢ بِٱلْقَارِعَةِ ﴿٤﴾ فَأَمَّا ثَمُودُ فَأُهْلِكُوا۟ بِٱلطَّاغِيَةِ ﴿٥﴾ وَأَمَّا
عَادٌ فَأُهْلِكُوا۟ بِرِيحٍ صَرْصَرٍ عَاتِيَةٍ ﴿٦﴾ سَخَّرَهَا عَلَيْهِمْ
سَبْعَ لَيَالٍ وَثَمَٰنِيَةَ أَيَّامٍ حُسُومًا فَتَرَى ٱلْقَوْمَ فِيهَا صَرْعَىٰ
كَأَنَّهُمْ أَعْجَازُ نَخْلٍ خَاوِيَةٍ ﴿٧﴾ فَهَلْ تَرَىٰ لَهُم مِّنۢ بَاقِيَةٍ ﴿٨﴾

sahibi Yunusdur عليه السلام. Sən də onun kimi qəzəbli və çılğın olma. Uca Allah Peyğəmbərinə (Səllallahu aleyhi və səlləm) səbirli olmağı öyrədir və əmr edir. Ona balıq sahibi kimi tələsməməyi tapşırır. Bu haqda əl-Ənbiya, Yunus və əs-Saffat surələrində danışılır. O zaman Yunus عليه السلام qəm-kədər içində Rəbbinə belə səslənərdi: *"Həqiqətən Səndən başqa ibadətə layiq haqq məbud yoxdur. Ey nöqsanlardan pak olan (Rəbbim), həqiqətən mən zalımlardan olmuşam!"*

49 **﴾Əgər Rəbbindən ona bir mərhəmət yetişməsəydi, o, məzəmmət olunaraq quru yerə atılacaqdı.﴿** Rəbbin onun tövbəsini qəbul etməsəydi, onu balığın qarnından səhraya atar və etdiyi günaha görə qınaq yeri olub, Allahın rəhmətindən məhrum olardı.

50 **﴾Amma Rəbbi onu seçdi və salehlərdən etdi.﴿** Rəbbi onu xilas etdi və onu seçilmiş peyğəmbərlərdən etdi. Kamil əməlisaleh bəndələrdən oldu. Bəzi təfsirçilər deyirlər ki, Allah təala onun peyğəmbərliyini özünə qaytardı. Onu sayı yüz mindən çox olan bir topluma peyğəmbər olaraq göndərdi. Onların hamısı ona iman gətirdilər.

51 **﴾Həqiqətən, kafirlər Quranı eşitdikləri zaman az qala səni gözləri ilə yeyələr. Onlar: "O divanədir!" – deyirlər.﴿** Sən Quran oxuyan zaman, sanki səni yerə yıxacaq qədər qəzəb və kin-küdurət baxışları ilə baxarlar.

52 **﴾Halbuki bu aləmlərə ancaq bir öyüd-nəsihətdir!﴿**

# əl-Haqqə surəsi 69

## *(Haqq olan qiyamət)*

1 **﴾Haqq olan qiyamət!﴿** Ərəb dilində "əl-Haqqə" sözü ilə ifadə olunub "haqq olan" mənasını verən bu söz, qiyamət gününün vəsfidir. Çünki bu gündə həqiqətlər üzə çıxacaqdır.

2 **﴾Nədir qiyamət?!﴿**

3 **﴾Nə bilirsən ki, nədir qiyamət?!﴿**

4 **﴾Səmud da, Ad da o qiyaməti yalan saymışdılar!﴿** Qiyamət günü baş verəcək hadisələr insanların qəlbini dəhşətə gətirdiyi üçün "əl-Qariə" adı ilə vəsf edilmişdir.

5 **﴾Səmud hədsiz dərəcədə dəhşətli səslə həlak edildi.﴿** Səmud Saleh peyğəmbərin qövmi idi. Onlar yüksək səslə həlak edilmişdilər.

6 **﴾Ad isə uğultulu, çox siddətli bir küləklə tar-mar oldu.﴿** Ad isə Hud peyğəmbərin qövmi idi. Onlar uzun müddət sürətlə əsən və hədsiz soyuqla müşayiət olunan küləklə həlak olmuşdular.

7 **﴾Allah o küləyi yeddi gecə, səkkiz gün ardı-arası kəsilmədən onların üstünə əsdirdi. Belə ki, sən onları orada yıxılıb ölmüş görərdin. Onlar, sanki içi bomboş xurma kötükləri idilər.﴿** Bu günlər ərzində külək durmadan əsir, səngimək bilmirdi. Külək insanları ətrafa çırparaq öldürür, məhv edirdi. O zaman onları görsəydin, yerə yıxılmış xurma kötükləri kimi idilər.

8 **﴾İndi sən onlardan heç bir əsər-əlamət görə bilərsənmi?!﴿** Sən onların nəslini davam etdirən, aralarından sağ qalan bir kimsə görürsənmi?! Onlar hamılıqla məhv olmuşdular.

9 **﴾Firon da, ondan əvvəlkilər də, alt-üst olmuş Mötəfikə əhli də günah törətmişdilər.﴿** Firon və ondan öncəki kafir qövmlər, eləcə də Lutun Mötəfikə qövmü də, şirk və digər günah işlər edirdilər.

10 **﴾Onlar Rəbbinin peyğəmbərinə asi olmuş, O da onları şiddəti getdikcə artan bir əzabla yaxalamışdı.﴿** Uca Allah onları daha şiddətli əzabla cəzalandırmış, yaşadıqları yerin altını üstünə çevirmiş, göydən başlarına daş yağdırmışdı.

11 **﴾Həqiqətən, hər tərəfi su basdığı zaman sizi gəmiyə Biz daşıdıq.﴿** Siz atalarınızın belində olarkən, biz sizi gəmidə saxlayaraq, Nuhun عليه السلام tufanından xilas etmişdik.

وَجَآءَ فِرْعَوْنُ وَمَن قَبْلَهُۥ وَٱلْمُؤْتَفِكَٰتُ بِٱلْخَاطِئَةِ ﴿٩﴾ فَعَصَوْا۟ رَسُولَ
رَبِّهِمْ فَأَخَذَهُمْ أَخْذَةً رَّابِيَةً ﴿١٠﴾ إِنَّا لَمَّا طَغَا ٱلْمَآءُ حَمَلْنَٰكُمْ فِى ٱلْجَارِيَةِ
﴿١١﴾ لِنَجْعَلَهَا لَكُمْ تَذْكِرَةً وَتَعِيَهَآ أُذُنٌ وَٰعِيَةٌ ﴿١٢﴾ فَإِذَا نُفِخَ فِى ٱلصُّورِ
نَفْخَةٌ وَٰحِدَةٌ ﴿١٣﴾ وَحُمِلَتِ ٱلْأَرْضُ وَٱلْجِبَالُ فَدُكَّتَا دَكَّةً وَٰحِدَةً ﴿١٤﴾
فَيَوْمَئِذٍ وَقَعَتِ ٱلْوَاقِعَةُ ﴿١٥﴾ وَٱنشَقَّتِ ٱلسَّمَآءُ فَهِىَ يَوْمَئِذٍ وَاهِيَةٌ
﴿١٦﴾ وَٱلْمَلَكُ عَلَىٰٓ أَرْجَآئِهَا ۚ وَيَحْمِلُ عَرْشَ رَبِّكَ فَوْقَهُمْ يَوْمَئِذٍ ثَمَٰنِيَةٌ
﴿١٧﴾ يَوْمَئِذٍ تُعْرَضُونَ لَا تَخْفَىٰ مِنكُمْ خَافِيَةٌ ﴿١٨﴾ فَأَمَّا مَنْ أُوتِىَ
كِتَٰبَهُۥ بِيَمِينِهِۦ فَيَقُولُ هَآؤُمُ ٱقْرَءُوا۟ كِتَٰبِيَهْ ﴿١٩﴾ إِنِّى ظَنَنتُ أَنِّى مُلَٰقٍ
حِسَابِيَهْ ﴿٢٠﴾ فَهُوَ فِى عِيشَةٍ رَّاضِيَةٍ ﴿٢١﴾ فِى جَنَّةٍ عَالِيَةٍ ﴿٢٢﴾
قُطُوفُهَا دَانِيَةٌ ﴿٢٣﴾ كُلُوا۟ وَٱشْرَبُوا۟ هَنِيٓـًٔۢا بِمَآ أَسْلَفْتُمْ فِى ٱلْأَيَّامِ
ٱلْخَالِيَةِ ﴿٢٤﴾ وَأَمَّا مَنْ أُوتِىَ كِتَٰبَهُۥ بِشِمَالِهِۦ فَيَقُولُ يَٰلَيْتَنِى لَمْ أُوتَ كِتَٰبِيَهْ
﴿٢٥﴾ وَلَمْ أَدْرِ مَا حِسَابِيَهْ ﴿٢٦﴾ يَٰلَيْتَهَا كَانَتِ ٱلْقَاضِيَةَ ﴿٢٧﴾ مَآ أَغْنَىٰ
عَنِّى مَالِيَهْ ﴿٢٨﴾ هَلَكَ عَنِّى سُلْطَٰنِيَهْ ﴿٢٩﴾ خُذُوهُ فَغُلُّوهُ ﴿٣٠﴾ ثُمَّ ٱلْجَحِيمَ
صَلُّوهُ ﴿٣١﴾ ثُمَّ فِى سِلْسِلَةٍ ذَرْعُهَا سَبْعُونَ ذِرَاعًا فَٱسْلُكُوهُ ﴿٣٢﴾ إِنَّهُۥ
كَانَ لَا يُؤْمِنُ بِٱللَّهِ ٱلْعَظِيمِ ﴿٣٣﴾ وَلَا يَحُضُّ عَلَىٰ طَعَامِ ٱلْمِسْكِينِ ﴿٣٤﴾

(12) **﴾Ona görə ki, bunu sizə bir ibrət dərsi edək və dərk edən qulaq bunu eşidib yadda saxlasın!﴿** Ey Muhəmməd ümməti! Sizə ibrət dərsi olsun deyə, Nuh tayfasının həlak olmasını xatırladırıq. Qoy hər kəs uca Allahın qüdrətini və amansız intiqamını dərk etsin. Bunu eşidib dərk edən qulaqlar unutmasınlar.

(13) **﴾Sur bircə dəfə üfürüləcəyi;﴿**

(14) **﴾Yer və dağlar qaldırılıb bircə dəfə bir-birinə çırpılacağı zaman –﴿** Yer ilə göy yalnız bir dəfə bir-birinə çırpıldıqda toza dönəcəkdir.

(15) **﴾Məhz o gün qiyamət qopacaqdır!﴿** Ayədə qiyamət günü baş verən, qopan mənasını daşıyan "əl-Vaqiə" sözü ilə təsvir olunur.

(16) **﴾Və göy süst düşüb parçalanacaqdır!﴿** Səmada olan mələklərin enməsi ilə göy parçalanacaq. O gün göy zəif və aciz olacaqdır.

(17) **﴾Mələklər də onun ətrafında olacaq və həmin gün sənin Rəbbinin ərşini onların üstündə səkkiz mələk daşıyacaqdır!﴿** Mələklər səmanın ətrafında dayanacaq və uca Allah onlara yerə enməyi əmr etdikdə enəcək və yer üzünü əhatəyə alacaqlar. O gün yaxın mələklərin səkkizi Rəbbinin ərşini daşıyacaqdır.

(18) **﴾O gün siz gətiriləcəksiniz. Sizin heç bir sirriniz gizli qalmayacaqdır!﴿** İnsanlar haqq-hesab olunmaq üçün Allahın hüzuruna gətiriləcəklər. Sizin qəlbinizdə, əməlinizdə və ya sözünüzdə olan heç nə Allaha gizli qalan deyildir.

(19) **﴾Əməl dəftəri sağ əlinə verilən kimsə deyəcəkdir: "Alın, əməl dəftərimi oxuyun!﴿** Əməl dəftəri sağ tərəfdən verilən insan orada qarşılaşdığı düzgün etiqadı və saleh əməllərini gördükdə sevincindən və fərəh hissi keçirdiyindən ətrafındakılara belə xitab edəcəkdir:

(20) **﴾Mən öz hesabıma yetişəcəyimə inanmışdım!"﴿** Mən axirətdə haqq-hesab olunacağımı yəqinliklə bilirdim.

(21) **﴾Bundan belə o, xoş güzəran içində,﴿** Rahat, heç bir zorakılıq olmayan həyatda olacaqdır.

(22) **﴾Yüksək bir Cənətdə olacaqdır.﴿** Cənnət səmada olduğu üçün onun ali mərtəbələri də yüksəkdə olacaqdır.

(23) **﴾Onun meyvələri çox yaxındadır.﴿** Oranın meyvələri o qədər yaxın olacaqdır ki, ayaq üstə olanda da, oturanda da, uzananda da yemək olacaqdır.

(24) **﴾"Keçmiş günlərdə etdiyiniz əməllər müqabilində yeyin-için!"﴿** Dünyada etdiyiniz yaxşı əməllərin müqabilində bu nemət sizə verilir.

(25) **﴾Əməl dəftəri sol əlinə verilən isə deyəcəkdir: "Kaş əməl dəftərim mənə verilməyəydi!﴿** Əməl dəftərində pis əməllərini görən insan kədər və hüzn içərisində deyəcəkdir: **"Kaş əməl dəftərim mənə verilməyəydi!"**

(26) **﴾Hesabımın nə olduğunu bilməyəydim!﴿** Əməl dəftəri başdan-ayağa pisliklərlə dolu olduğundan haqq-hesabımın nə olduğunu da bilmirəm.

(27) **﴾Kaş o qəti olaydı!﴿** Kaş o ölüm birdəfəlik olaydı. Ondan sonra dirilməyəydim. Özünün pis əməllərini qarşısında gördükdə və cəzasının əzab olacağını biləndə əbədi ölümü arzu edəcəkdir.

(28) **﴾Mal-dövlətim mənə heç bir fayda vermədi.﴿** Mal-dövlətim məni Allahın əzabından qurtara bilmədi.

(29) **﴾Mülküm də məhv olub getdi!"﴿** Əlimdə heç bir əsas qalmadı. Vəzifəm, hörmətim və mal-mülküm əlimdən çıxdı. Bu zaman uca Allah deyəcəkdir:

(30) **﴾"Onu tutub qandallayın!﴿** Əlini boğazına qandallayın.

(31) **﴾Sonra da Cəhənnəmə atın!﴿** ki, oranın əzabını dadsın.

(32) **﴾Daha sonra onu yetmiş arşın uzunluğunda zəncirlə bağlayın!﴿** Sufyan əs-Sovri deyir: "Bizim bildiyimiz qədər zəncir

فَلَيۡسَ لَهُ ٱلۡيَوۡمَ هَٰهُنَا حَمِيمٞ ٣٥ وَلَا طَعَامٌ إِلَّا مِنۡ غِسۡلِينٖ ٣٦ لَّا يَأۡكُلُهُۥٓ
إِلَّا ٱلۡخَٰطِـُٔونَ ٣٧ فَلَآ أُقۡسِمُ بِمَا تُبۡصِرُونَ ٣٨ وَمَا لَا تُبۡصِرُونَ ٣٩
إِنَّهُۥ لَقَوۡلُ رَسُولٖ كَرِيمٖ ٤٠ وَمَا هُوَ بِقَوۡلِ شَاعِرٖۚ قَلِيلٗا مَّا تُؤۡمِنُونَ ٤١
وَلَا بِقَوۡلِ كَاهِنٖۚ قَلِيلٗا مَّا تَذَكَّرُونَ ٤٢ تَنزِيلٞ مِّن رَّبِّ ٱلۡعَٰلَمِينَ ٤٣ وَلَوۡ
تَقَوَّلَ عَلَيۡنَا بَعۡضَ ٱلۡأَقَاوِيلِ ٤٤ لَأَخَذۡنَا مِنۡهُ بِٱلۡيَمِينِ ٤٥ ثُمَّ لَقَطَعۡنَا
مِنۡهُ ٱلۡوَتِينَ ٤٦ فَمَا مِنكُم مِّنۡ أَحَدٍ عَنۡهُ حَٰجِزِينَ ٤٧ وَإِنَّهُۥ لَتَذۡكِرَةٞ
لِّلۡمُتَّقِينَ ٤٨ وَإِنَّا لَنَعۡلَمُ أَنَّ مِنكُم مُّكَذِّبِينَ ٤٩ وَإِنَّهُۥ لَحَسۡرَةٌ عَلَى
ٱلۡكَٰفِرِينَ ٥٠ وَإِنَّهُۥ لَحَقُّ ٱلۡيَقِينِ ٥١ فَسَبِّحۡ بِٱسۡمِ رَبِّكَ ٱلۡعَظِيمِ ٥٢

## سُورَةُ المَعَارِجِ

ترتيبها ٧٠ — آياتها ٤٤

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

سَأَلَ سَآئِلُۢ بِعَذَابٖ وَاقِعٖ ١ لِّلۡكَٰفِرِينَ لَيۡسَ لَهُۥ دَافِعٞ ٢ مِّنَ
ٱللَّهِ ذِي ٱلۡمَعَارِجِ ٣ تَعۡرُجُ ٱلۡمَلَٰٓئِكَةُ وَٱلرُّوحُ إِلَيۡهِ فِي
يَوۡمٖ كَانَ مِقۡدَارُهُۥ خَمۡسِينَ أَلۡفَ سَنَةٖ ٤ فَٱصۡبِرۡ صَبۡرٗا جَمِيلًا ٥
إِنَّهُمۡ يَرَوۡنَهُۥ بَعِيدٗا ٦ وَنَرَىٰهُ قَرِيبٗا ٧ يَوۡمَ تَكُونُ ٱلسَّمَآءُ كَٱلۡمُهۡلِ
٨ وَتَكُونُ ٱلۡجِبَالُ كَٱلۡعِهۡنِ ٩ وَلَا يَسۡـَٔلُ حَمِيمٌ حَمِيمٗا ١٠

onun arxasından keçib, ağzından çıxacaqdır".

(33) **﴾Çünki o, böyük olan Allaha iman gətirmirdi.﴿**

(34) **﴾O, yoxsulu yedirtməyə rəğbət oyatmırdı.﴿**

(35) **﴾Bu gün bax burda onun yaxın bir dostu yoxdur.﴿** Qiyamət günü ona kömək edəcək heç bir yaxını, şəfaətçisi olmayacaqdır. Çünki o gündə yaxın qohumlar, sevgililər bir-birindən uzaq qaçacaqlar.

(36) **﴾İrindən başqa, bir yeməyi də yoxdur.﴿** Bədənlərindən süzülən irin onların qidası olacaqdır.

(37) **﴾Onu ancaq günahkarlar yeyər!"﴿**

(38) **﴾And içirəm gördüklərinizə,﴿**

(39) **﴾Və görmədiklərinizə ki,﴿** Uca Allah bizim gördüyümüz və hələ görmədiyimiz hər şeyə and içir ki,

(40) **﴾Bu çox möhtərəm bir elçinin sözüdür!﴿** Bu Quran möhtərəm peyğəmbərin, yəni Muhəmmədin (Sallallahu aleyhi və səlləm) oxuduğu Qurandır, yaxud möhtərəm elçinin, yəni mələk Cəbrailin ﷺ çatdırdığı Qurandır.

(41) **﴾O, şair sözü deyildir! Nə az iman edirsiniz!﴿** Sizin iddia etdiyiniz kimi şair sözü də deyildir. Siz az iman gətirir, çox az təsdiq edirsiniz.

(42) **﴾O, kahin sözü də deyildir! Nə az düşünürsünüz!﴿** İddia etdiyiniz kimi kahin də deyildir. Çünki kahinliklə bunun böyük fərqi vardır. Amma siz çox az düşünürsünüz.

(43) **﴾O, aləmlərin Rəbbi tərəfindən nazil edilmişdir.﴿** Bu Quran uca Allahın Peyğəmbərinə çatdırdığı kəlamıdır.

(44) **﴾Əgər o özündən bəzi sözlər uydurub, Bizə isnad etsəydi,﴿** İstər Muhəmməd (Sallallahu aleyhi və səlləm), istərsə də Cəbrail mələk ﷺ dediymizə nə isə əlavə edib, Allaha nisbət etsəydi,

(45) **﴾Biz onun sağ əlini tutar!﴿**

(46) **﴾Sonra onun şah damarını qopardardıq!﴿**

(47) **﴾Və heç biriniz də ondan dəf edə bilməzdiniz.﴿** Bu halda heç biriniz onu bizdən qoruya bilməzdiniz. Belə olan təqdirdə, nə üçün o, sizə görə, Allahın adından yalan danışmalıdır?!

(48) **﴾Şübhəsiz ki, bu müttəqilərə bir öyüd-nəsihətdir.﴿** Quran ondan faydalanan təqva əhli üçün öyüd-nəsihət kitabıdır.

(49) **﴾İçərinizdə onu yalan hesab edənlər olduğunu da, əlbəttə, bilirik.﴿** Bəzilərinin Quranı təkzib etdiyi Bizə məlumdur və Biz ona əməlinə layiq cəza verəcəyik.

(50) **﴾Şübhəsiz ki, bu kafirlər üçün bir peşmançılıqdır.﴿** Qiyaemət günü Quran kafirlər üçün peşmançılıq olacaqdır.

(51) **﴾Doğrudan da, bu gerçək bir həqiqətdir.﴿** Bu kitab Allah dərgahından nazil olduğu üçün onda heç bir şəkk-şübhəyə yer qalmamalıdır.

(52) **﴾Elə isə sən, əzəmətli Rəbbinin adını təsbih et!﴿**

# əl-Məaric surəsi 70

*(dərəcələr)*

(1) **﴾Biri vaqe olacaq əzabı istədi.﴿** Yəni bir nəfər özünə reallıqda əzab olunmasını istədi. Rəvayətlərdə deyilir ki, bu adam ən-Nadr ibn əl-Harisdir. O belə demişdi: **﴾Bir zaman da: "Ya Allah! Əgər bu Sənin tərəfindən gəlmiş haqdırsa, onda başımıza göydən daş yağdır və ya bizə şiddətli bir əzab göndər!" – demişdilər.﴿** (Ənfal: 32).

(2) **﴾O əzabı kafirlərdən dəf edə biləcək bir kimsə yoxdur!﴿**

(3) **﴾Dərəcələr sahibi olan Allahdandır!﴿** Bu dərəcələr mələklərin qalxdıqları dərəcələrdir.

(4) **﴾Mələklər və ruh Onun dərgahına müddəti əlli min il olan bir gündə qalxarlar.﴿** Uca Allahın onlar üçün təyin etdiyi dərəcələrə yüksəlırlər. Ruh isə Cəbraildir ﷺ. Əlli min il olan gün qiyamət günüdür. Bu müddət bəndələrin haqq-hesab olunmaq üçün gözlədikləri müddətdir.

يُبَصَّرُونَهُمْ ۚ يَوَدُّ ٱلْمُجْرِمُ لَوْ يَفْتَدِى مِنْ عَذَابِ يَوْمِئِذٍۭ بِبَنِيهِ ﴿١١﴾
وَصَٰحِبَتِهِۦ وَأَخِيهِ ﴿١٢﴾ وَفَصِيلَتِهِ ٱلَّتِى تُـْٔوِيهِ ﴿١٣﴾ وَمَن فِى ٱلْأَرْضِ
جَمِيعًا ثُمَّ يُنجِيهِ ﴿١٤﴾ كَلَّآ ۖ إِنَّهَا لَظَىٰ ﴿١٥﴾ نَزَّاعَةً لِّلشَّوَىٰ ﴿١٦﴾ تَدْعُوا۟
مَنْ أَدْبَرَ وَتَوَلَّىٰ ﴿١٧﴾ وَجَمَعَ فَأَوْعَىٰٓ ﴿١٨﴾ ۞ إِنَّ ٱلْإِنسَٰنَ خُلِقَ هَلُوعًا
﴿١٩﴾ إِذَا مَسَّهُ ٱلشَّرُّ جَزُوعًا ﴿٢٠﴾ وَإِذَا مَسَّهُ ٱلْخَيْرُ مَنُوعًا ﴿٢١﴾ إِلَّا
ٱلْمُصَلِّينَ ﴿٢٢﴾ ٱلَّذِينَ هُمْ عَلَىٰ صَلَاتِهِمْ دَآئِمُونَ ﴿٢٣﴾ وَٱلَّذِينَ فِىٓ
أَمْوَٰلِهِمْ حَقٌّ مَّعْلُومٌ ﴿٢٤﴾ لِّلسَّآئِلِ وَٱلْمَحْرُومِ ﴿٢٥﴾ وَٱلَّذِينَ يُصَدِّقُونَ
بِيَوْمِ ٱلدِّينِ ﴿٢٦﴾ وَٱلَّذِينَ هُم مِّنْ عَذَابِ رَبِّهِم مُّشْفِقُونَ ﴿٢٧﴾ إِنَّ عَذَابَ
رَبِّهِمْ غَيْرُ مَأْمُونٍ ﴿٢٨﴾ وَٱلَّذِينَ هُمْ لِفُرُوجِهِمْ حَٰفِظُونَ ﴿٢٩﴾ إِلَّا عَلَىٰٓ
أَزْوَٰجِهِمْ أَوْ مَا مَلَكَتْ أَيْمَٰنُهُمْ فَإِنَّهُمْ غَيْرُ مَلُومِينَ ﴿٣٠﴾ فَمَنِ ٱبْتَغَىٰ وَرَآءَ
ذَٰلِكَ فَأُو۟لَٰٓئِكَ هُمُ ٱلْعَادُونَ ﴿٣١﴾ وَٱلَّذِينَ هُمْ لِأَمَٰنَٰتِهِمْ وَعَهْدِهِمْ رَٰعُونَ
﴿٣٢﴾ وَٱلَّذِينَ هُم بِشَهَٰدَٰتِهِمْ قَآئِمُونَ ﴿٣٣﴾ وَٱلَّذِينَ هُمْ عَلَىٰ صَلَاتِهِمْ يُحَافِظُونَ
﴿٣٤﴾ أُو۟لَٰٓئِكَ فِى جَنَّٰتٍ مُّكْرَمُونَ ﴿٣٥﴾ فَمَالِ ٱلَّذِينَ كَفَرُوا۟ قِبَلَكَ مُهْطِعِينَ
﴿٣٦﴾ عَنِ ٱلْيَمِينِ وَعَنِ ٱلشِّمَالِ عِزِينَ ﴿٣٧﴾ أَيَطْمَعُ كُلُّ ٱمْرِئٍ مِّنْهُمْ
أَن يُدْخَلَ جَنَّةَ نَعِيمٍ ﴿٣٨﴾ كَلَّآ ۖ إِنَّا خَلَقْنَٰهُم مِّمَّا يَعْلَمُونَ ﴿٣٩﴾

Bundan sonra, cənnətliklər cənnətə, cəhənnəmliklər isə, cəhənnəmə daxil olacaqlar.

5 **«Mətanətlə səbr et!»** Narahat olma və Allahdan başqa heç kəsə şikayətlənmə.

6 **«Şübhəsiz ki, onlar onu uzaq görürlər.»** Onun baş verəcəyini mümkünsüz hesab edirlər.

7 **«Biz isə onu yaxın görürük.»**

8 **«O gün göy əridilmiş metal kimi olacaq;»** Səma sanki əridilmiş mis, gümüş və ya qurquşun kimi olacaqdır.

9 **«Dağlar da rəngbərəng yun kimi olacaqdır.»**

10 **«Və dost dostu arayıb axtarmayacaqdır.»** Gördükləri qorxunc mənzərənin vahiməsindən heç kəs başqası ilə maraqlanmayacaq.

11 **«Onlar bir-birinə göstəriləcəklər. O günün əzabından qurtarmaq üçün günahkar istərdi ki, fəda etsin öz oğullarını;»**

12 **«Övrətini və qardaşını;»** Hər kəs öz yaxınını, sevdiyi insanı görəcək və tanıyacaqdır. Heç biri digərindən gizlənə bilməyəcəkdir. Bununla belə, onlar bir-biri ilə danışmayacaq, hal-əhval tutmayacaqdır. Çünki hərə öz hayında olacaqdır. Əzaba layiq görülən hər bir günahkar insan öz oğlunu, arvadını və ya qardaşını fəda edib, o günün əzabından qurtulmaq istəyəcəkdir. Bu insanlar ona ən yaxın və ən əziz olduqları halda, onun bu fidyəsi qəbul olunsaydı, onların hamısını fəda edər və özünü əzabdan qurtarardı.

13 **«Ona sığınacaq verən əşirətini;»** Onu müdafiə edən yaxın qohumlarını da fəda edər.

14 **«Və yer üzündə olanların hamısını – təki özünü qurtarsın!»** Günahkar insan əzabdan qurtulmaq üçün yer üzündə mövcud olan bütün məxluqatı fəda etmək istəyər, təki o əzabdan xilas olsun.

15 **«Xeyr. Həqiqətən o, alovlu atəşdir.»**

16 **«Başın dərisini sıyırıb çıxardır.»**

17 **«Çağırır çıxanı, üz döndərəni.»** Cəhənnəm dünyada haqqdan üz döndərib, onu qəbul etməyənləri çağıracaqdır.

18 **«Və yığıb saxlayanı!»** Mal-dövləti topalayıb, ondan Allah yolunda xərcləməyənləri səsləyəcəkdir.

19 **«Həqiqətən insan, çox həris yaradılmışdır!»** İnsan çox həris və çox pis təlaşa düşəndir.

20 **«Ona bir pislik üz verdikdə fəryad qoparar.»**

21 **«Ona bir xeyir nəsib olduqda isə, xəsis olar.»** İnsan kasıblıq, möhtaclıq, xəstəlik və s. bu kimi hallarla üzləşdikdə çox təlaşa düşər, həyəcanlanar. Var-dövlət, bolluq, rahatlıq və s. bu kimi əldə etdikdə isə, daha çox xəsislik edər.

22 **«Namaz qılanlar istisnadır!»** Burada namaz qılanlar istisnadırlar. Onlar təlaşlanmaz, həris və xəsis olmazlar.

23 **«O kəslər ki, daim namaz qılarlar;»** Heç bir iş onları namazdan yayındırmaz. Fərz namazları vaxtlı-vaxtında qılarlar.

24 **«O kəslər ki, onların mallarında müəyyən bir haqq vardır –»** Burada vacib zəkat nəzərdə tutulur. Bəzi təfsirçilərin fikrinə görə qohumluq əlaqələrini qorumaq nəzərdə tutulur.

25 **«Dilənən və məhrum olan kimsə üçün;»** Məhrum olan kimsə ehtiyacı ola-ola abır-həya edib dilənməyən kimsədir.

26 **«O kəslər ki, haqq-hesab gününü təsdiq edərlər;»** Haqq-hesab günü qiyamət günüdür. Onlar bu gün barədə şübhə və inkar etməzlər.

27 **«O kəslər ki, Rəbbinin əzabından qorxub tir-tir əsərlər;»** Saleh əməllər görsələr də, yenə Allahın əzabından qorxar, ehtiyat edərlər.

28 **«Çünki onların Rəbbinin əzabından arxayın olmaq olmaz;»** Hər kəs bu əzabdan qorxmalı, ehtiyat etməlidir.

29 **«O kəslər ki, ayıb yerlərini qoruyub saxlayarlar;»**

30 **«Övrətləri və cariyələri istisna olmaqla. Onlara yaxınlıq etməyə görə əsla qınanmazlar;»**

فَلَآ أُقۡسِمُ بِرَبِّ ٱلۡمَشَٰرِقِ وَٱلۡمَغَٰرِبِ إِنَّا لَقَٰدِرُونَ ﴿٤٠﴾ عَلَىٰٓ أَن نُّبَدِّلَ خَيۡرٗا مِّنۡهُمۡ
وَمَا نَحۡنُ بِمَسۡبُوقِينَ ﴿٤١﴾ فَذَرۡهُمۡ يَخُوضُواْ وَيَلۡعَبُواْ حَتَّىٰ يُلَٰقُواْ يَوۡمَهُمُ ٱلَّذِي
يُوعَدُونَ ﴿٤٢﴾ يَوۡمَ يَخۡرُجُونَ مِنَ ٱلۡأَجۡدَاثِ سِرَاعٗا كَأَنَّهُمۡ إِلَىٰ نُصُبٖ يُوفِضُونَ
﴿٤٣﴾ خَٰشِعَةً أَبۡصَٰرُهُمۡ تَرۡهَقُهُمۡ ذِلَّةٞۚ ذَٰلِكَ ٱلۡيَوۡمُ ٱلَّذِي كَانُواْ يُوعَدُونَ ﴿٤٤﴾

ترتيبها ٧١ — سُورَةُ نُوحٍ — آياتها ٢٨

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

إِنَّآ أَرۡسَلۡنَا نُوحًا إِلَىٰ قَوۡمِهِۦٓ أَنۡ أَنذِرۡ قَوۡمَكَ مِن قَبۡلِ أَن يَأۡتِيَهُمۡ
عَذَابٌ أَلِيمٞ ﴿١﴾ قَالَ يَٰقَوۡمِ إِنِّي لَكُمۡ نَذِيرٞ مُّبِينٌ ﴿٢﴾ أَنِ ٱعۡبُدُواْ
ٱللَّهَ وَٱتَّقُوهُ وَأَطِيعُونِ ﴿٣﴾ يَغۡفِرۡ لَكُم مِّن ذُنُوبِكُمۡ وَيُؤَخِّرۡكُمۡ
إِلَىٰٓ أَجَلٖ مُّسَمًّىۚ إِنَّ أَجَلَ ٱللَّهِ إِذَا جَآءَ لَا يُؤَخَّرُۚ لَوۡ كُنتُمۡ تَعۡلَمُونَ
﴿٤﴾ قَالَ رَبِّ إِنِّي دَعَوۡتُ قَوۡمِي لَيۡلٗا وَنَهَارٗا ﴿٥﴾ فَلَمۡ يَزِدۡهُمۡ دُعَآءِيٓ إِلَّا
فِرَارٗا ﴿٦﴾ وَإِنِّي كُلَّمَا دَعَوۡتُهُمۡ لِتَغۡفِرَ لَهُمۡ جَعَلُوٓاْ أَصَٰبِعَهُمۡ
فِيٓ ءَاذَانِهِمۡ وَٱسۡتَغۡشَوۡاْ ثِيَابَهُمۡ وَأَصَرُّواْ وَٱسۡتَكۡبَرُواْ ٱسۡتِكۡبَارٗا
﴿٧﴾ ثُمَّ إِنِّي دَعَوۡتُهُمۡ جِهَارٗا ﴿٨﴾ ثُمَّ إِنِّيٓ أَعۡلَنتُ لَهُمۡ وَأَسۡرَرۡتُ
لَهُمۡ إِسۡرَارٗا ﴿٩﴾ فَقُلۡتُ ٱسۡتَغۡفِرُواْ رَبَّكُمۡ إِنَّهُۥ كَانَ غَفَّارٗا ﴿١٠﴾

31 **﴾Bundan artığını istəyənlər isə, həddi aşanlardır;﴿** Möminlər tənasül orqanlarını haramdan qoruyarlar. Onlar halal arvadları və sahib olduqları cariyələri ilə yaxınlıq edə bilərlər. Buna görə onlar qınanmazlar. Bundan başqa yolla şəhvət ehtiyacını ödəmək halal deyildir. Masturbasiya kimi əməllər də haramdır.
32 **﴾O kəslər ki, əmanətə xəyanət etməz, verdikləri sözü yerinə yetirərlər;﴿** Onlara tapşırılan əmanətə xəyanət etməz, əhdlərini pozmazlar.
33 **﴾O kəslər ki, düzgün şəhadət verərlər.﴿** Yaxın, uzaq, kasıb, varlı olmasından asılı olmayaraq onlar hər bir insana qarşı eyni şəkildə, ədalətlə şahidlik edərlər.
34 **﴾Və o kəslər ki, namazlarını hifz edərlər-﴿** Onlar heç bir halda namazdan yayınmaz, onu batil edən və ya savabını azaldan işlər görməzlər.
35 **﴾Məhz onlar cənnətlərdə ehtiram olunacaq kimsələrdir!﴿** Onlar orada daim qalacaq və cürbəcür nemətlərdən dadacaqlar.
36 **﴾Kafirlərə nə olub ki, sənə tərəf tələsirlər?﴿** Səni lağa qoyur, təkzib edirlər.
37 **﴾Sağdan və soldan dəstə-dəstə gəlirlər?﴿** Peyğəmbərin (Sallallahu aleyhi və səlləm) sağından və solundan dəstə-dəstə yığılışarlar.
38 **﴾Məgər onların hər biri Nəim cənnətlərinəmi daxil olacağına ümid edir?﴿**
39 **﴾Xeyr! Biz onları özlərinin bildiyi şeydən yaratdıq!﴿** İnsan bir qətrə natəmiz nütfədən xəlq edilmişdir. Onlara belə təkəbbürlülük etmək yaraşmaz. İmam Əhməd, İbn Macə və İbn Səəd rəvayət edirlər ki, "Peyğəmbər (Sallallahu aleyhi və səlləm) **﴾Kafirlərə nə olub ki, sənə tərəf tələsirlər? Sağdan və soldan dəstə-dəstə gəlirlər? Məgər onların hər biri Nəim cənnətlərinəmi daxil olacağına ümid edir? Xeyr! Biz onları özlərinin bildiyi şeydən yaratdıq!﴿** – ayələrini oxudu və sonra ovucuna tüpürüb barmağını da onun üzərinə qoyaraq dedi: "**Uca Allah deyər ki, ey Adəm övladı! Mən səni belə bir şeydən yaratmışam axı sən Məni necə aciz edə bilərsən?!**"
40 **﴾Məşriqlərin və məğriblərin Rəbbinə and olsun ki, Biz, həqiqətən qadirik.﴿**
41 **﴾Onları özlərindən daha yaxşısı ilə əvəz etməyə. Və heç kəs Bizim qarşımıza keçə bilməz!﴿** Onları məhv edib, yerlərinə Allaha müti olan başqa bir məxluq gətirməyə qadirik.
42 **﴾Elə isə, qoy onlar vəd olunduqları günə qovuşanadək dalsınlar və oynayıb-əylənsinlər!﴿** Qoy hələlik batil əməllərə dalsınlar, dünyada oynasınlar. Sən isə, sənə əmr olunanla məşğul ol. Onların əlində olan imkanlar sənə böyük görsənməsin. Sənin işin dini təbliğ etməkdir.
43 **﴾O gün onlar bütlərin yanına tələsirmişlər kimi qəbirlərdən tez-tələsik çıxacaqlar.﴿**
44 **﴾Onların gözləri zəlilcəsinə yerə dikiləcək, özlərini də zillət bürüyəcəkdir. Bu onlara vəd olunmuş həmin qiyamət günüdür!﴿** Onlar özlərini gözləyən əzabı təxmin edib gözlərini qaldırmayacaq, zəlil və alçaq şəkildə olacaqlar.

# Nuh surəsi 71

1 **﴾Həqiqətən Biz, Nuhu: "Qövmünə şiddətli bir əzab gəlməmişdən əvəl onları qorxut!" – deyə öz tayfasına peyğəmbər göndərdik.﴿**
2 **﴾O dedi: "Ey qövmüm! Həqiqətən mən, sizi açıq-aşkar qorxudan bir peyğəmbərəm!﴿**
3 **﴾Allaha ibadət edin, Ondan qorxun və mənə də itaət edin!﴿** Nuh Allahın ilk göndərdiyi elçidir. O öz qövmini doqquz yüz əlli il dəvət etmişdi. Uca Allah ona demişdi ki, Mənim əzabım gəlmədən öncə, öz qövmini dəvət et. Uca Allah onlara şiddətli od və tufan əzabı vəd etmişdi.

4 **«O sizin günahlarınızdan keçər, sizə müəyyən vaxtadək möhlət verər. Allahın müəyyən etdiyi əcəl gəlib çatdıqda isə, o əsla təxirə salınmaz. Kaş biləydiniz!"»** Əgər belə etsəniz, sizin əvvəllər etdiyiniz bəzi günahlarınızı bağışlayar və sizin əcəlinizi uzadıb, daha çox yaşamağınız üçün möhlət verər. Təki siz itaətdə olasınız. Çünki Allahın müəyyən etdiyi əcəl gəldikdə siz küfr üzərində qalsanız, o zaman əcəliniz gecikməz. Siz imana və itaətə gəlin ki, bundan xilas olasınız. Əgər siz, Allahın müəyyən etdiyi əcəlin vaxtından gecikməyəcəyini anlasanız, bunu da başa düşərsiniz.

5 **«O dedi: "Ey Rəbbim! Mən qövmümü gecə-gündüz dəvət etdim!»**

6 **«Lakin dəvətim onların qaçmalarını daha da artırmaqdan başqa bir şeyə yaramadı.»** Nuh onları Allahın yoluna, imana və itaətə çağırdıqca onlar küfrdə və şirkdə israr edirdilər.

7 **«Sənin onları bağışlamağın üçün mən nə zaman onları dəvət etdimsə, onlar barmaqlarını qularlarına tıxadılar, libaslarına büründülər, israr edib durdular və təkəbbür göstərdilər.»** Mən hər dəfə onları iman gətirib bağışlanmağa nail olmağa dəvət etdimsə, onlar məni eşitməmək üçün barmaqlarını qulaqlarına tıxayır, məni görməmək və eşitməmək üçün paltarlarını başlarına çəkir, olduqları küfr yolunda davam edir, haqqı qəbul etməkdə təkəbbürlülük göstərirdilər.

8 **«Sonra mən onları uca səslə dəvət etdim.»** Mən onları gizlidə deyil, açıq-aşkar şəkildə dəvət etdim.

9 **«Daha sonra onları gizli yolla dəfələrlə dəvət etdim".»** Nuh onları açıq-aşkar dəvət edib, dəvəti qəbul etmədiklərini gördükdə onları tək-tək dəvət etməyə başladı. O, dəvətini müxtəlif yollar və mövzular əsasında qururdu. Bəzi mənbələrə görə Nuh, insanların evlərinə qonaq kimi gedir və onları dəvət edirdi.

10 **«Və dedim: "Rəbbinizdən bağışlanmağınızı diləyin. Çünki O, çox bağışlayandır!»**

11 **«O sizə göydən bol yağış göndərər;»** Ayə göstərir ki, bağışlanma diləmək yağışın və ruzinin bol olması üçün ən əsas səbəbdir.

12 **«O sizə mal-dövlət, oğul-uşaq əta edər. O sizin üçün bağlar-bağçalar yaradır və çaylar axıdar!»**

13 **«Sizə nə olub ki, Allahın əzəmətindən çəkinmirsiniz?»**

14 **«Halbuki O, sizi mərhələlərlə xəlq etdi.»** Əvvəl nütfə, sonra laxtalanmış qan, sonra bir parça ət yaradıb, sonra insan

يُرْسِلِ ٱلسَّمَآءَ عَلَيْكُم مِّدْرَارًا ﴿١١﴾ وَيُمْدِدْكُم بِأَمْوَٰلٍ وَبَنِينَ وَيَجْعَل
لَّكُمْ جَنَّـٰتٍ وَيَجْعَل لَّكُمْ أَنْهَـٰرًا ﴿١٢﴾ مَّا لَكُمْ لَا تَرْجُونَ لِلَّهِ وَقَارًا ﴿١٣﴾
وَقَدْ خَلَقَكُمْ أَطْوَارًا ﴿١٤﴾ أَلَمْ تَرَوْا۟ كَيْفَ خَلَقَ ٱللَّهُ سَبْعَ سَمَـٰوَٰتٍ
طِبَاقًا ﴿١٥﴾ وَجَعَلَ ٱلْقَمَرَ فِيهِنَّ نُورًا وَجَعَلَ ٱلشَّمْسَ سِرَاجًا ﴿١٦﴾
وَٱللَّهُ أَنۢبَتَكُم مِّنَ ٱلْأَرْضِ نَبَاتًا ﴿١٧﴾ ثُمَّ يُعِيدُكُمْ فِيهَا وَيُخْرِجُكُمْ
إِخْرَاجًا ﴿١٨﴾ وَٱللَّهُ جَعَلَ لَكُمُ ٱلْأَرْضَ بِسَاطًا ﴿١٩﴾ لِّتَسْلُكُوا۟ مِنْهَا
سُبُلًا فِجَاجًا ﴿٢٠﴾ قَالَ نُوحٌ رَّبِّ إِنَّهُمْ عَصَوْنِى وَٱتَّبَعُوا۟ مَن لَّمْ يَزِدْهُ
مَالُهُۥ وَوَلَدُهُۥٓ إِلَّا خَسَارًا ﴿٢١﴾ وَمَكَرُوا۟ مَكْرًا كُبَّارًا ﴿٢٢﴾ وَقَالُوا۟
لَا تَذَرُنَّ ءَالِهَتَكُمْ وَلَا تَذَرُنَّ وَدًّا وَلَا سُوَاعًا وَلَا يَغُوثَ وَيَعُوقَ
وَنَسْرًا ﴿٢٣﴾ وَقَدْ أَضَلُّوا۟ كَثِيرًا ۖ وَلَا تَزِدِ ٱلظَّـٰلِمِينَ إِلَّا ضَلَـٰلًا ﴿٢٤﴾
مِّمَّا خَطِيٓـَٔـٰتِهِمْ أُغْرِقُوا۟ فَأُدْخِلُوا۟ نَارًا فَلَمْ يَجِدُوا۟ لَهُم مِّن دُونِ
ٱللَّهِ أَنصَارًا ﴿٢٥﴾ وَقَالَ نُوحٌ رَّبِّ لَا تَذَرْ عَلَى ٱلْأَرْضِ مِنَ ٱلْكَـٰفِرِينَ
دَيَّارًا ﴿٢٦﴾ إِنَّكَ إِن تَذَرْهُمْ يُضِلُّوا۟ عِبَادَكَ وَلَا يَلِدُوٓا۟ إِلَّا فَاجِرًا
كَفَّارًا ﴿٢٧﴾ رَّبِّ ٱغْفِرْ لِى وَلِوَٰلِدَىَّ وَلِمَن دَخَلَ بَيْتِىَ
مُؤْمِنًا وَلِلْمُؤْمِنِينَ وَٱلْمُؤْمِنَـٰتِ وَلَا تَزِدِ ٱلظَّـٰلِمِينَ إِلَّا تَبَارًۢا ﴿٢٨﴾

şəklinə salmışdır. Sonra siz çağalıq, uşaqlıq, gənclik, qocalıq dövrünü yaşayırsınız. Sizi bu bədahətlə yaradanın əzəmətliliyinə necə küfr edə bilərsiniz?!

15 **«Məgər görmürsünüz ki, Allah yeddi göyü qat-qat necə yaratdı?!»**

16 **«Orada ayı bir nur, günəşi də bir çıraq etdi.»**

17 **«Və Allah sizi yerdən bir bitki kimi göyərtdi.»** Yəni Adəmi torpaqdan yaratmış, yer üzündə bitən bitkiləri və yaşayan heyvanları isə onun övladları üçün qida mənbəyi etmişdir.

18 **«Sonra sizi yenə ora qaytaracaq və çıxardacaqdır.»** Öldükdən sonra torpağa basdıracaq və təkrar torpağa döndərəcəkdir. Qiyamət günü isə, sizi bir daha dirildəcəkdir. Bu diriltmə birinci dəfədəki kimi mərhələ ilə deyil, bir dəfəyə baş verəcəkdir.

19 **«Allah yeri sizin üçün xalı etdi ki,»**

20 **«Onun geniş yollarında gəzəsiniz!"»** Dağların arasında sizin üçün geniş yollar saxlamışdır.

21 **«Nuh dedi: "Ey Rəbbim! Onlar mənə qarşı çıxdılar və mal-dövləti, oğul-uşağı özlərinə ziyandan başqa bir şey artırmayan**

**kimsələrə tabe oldular.﴿** Sıravi insanlar öz kafir başçılarına, varlı insanlara tabe oldular. Amma bol var-dövlət və övlad onları dünyada azğınlığa, axirətdə isə, daha çox əzaba məhkum etdi.

(22) **﴾Çox böyük bir hiylə qurdular.﴿** Başçıları məni öldürmək üçün insanları bu işə təhrik edərək tələ qururdular.

(23) **﴾Və dedilər: “Öz tanrılarınızı tərk etməyin, Vəddi, Suvaı, Yəğusu, Yəuqu və Nəsri atmayın!”﴿** Başçıları sıravi insanları Nuha ﷺ qarşı qaldırmaq üçün onlara deyərdilər: "Öz tanrılarınıza ibadət etməyi tərk etməyin." Bu tanrılar bütlər və şəkillərdən ibarət idi. Daha sonra bu ilahlara ərəblər ibadət etdilər. Ayədə qeyd olunan adlar Adəm ilə Nuh arasında yaşayan əməlisaleh insanların adlarıdır. İnsanlar onların xatirəsini ucaltmaq üçün onların şəkillərini məbədlərə vurmuşdular. Bir neçə nəsil keçdikdən sonra İblis həmin insanlara: "sizdən əvvəlkilər bunlara ibadət edərdilər siz də onlara ibadət edin" – dedi. Bütlərə ibadət etmək də, o zamandan başladı. Sonradan bu bütlərin sorağı ərəb yarımadasına gəlib çatdı və bazi qəbilələr də onlara ibadət etməyə başladılar.

(24) **﴾Onlar çoxlarını yoldan çıxartdılar. Sən də ancaq onların zəlalətini artır!”﴿** Bu başçılar çox insanları haqq yoldan azdırıblar. Bəzi təfsirçilərə görə insanları azdıran bütlər olmuşdur.

(25) **﴾Onlar öz günahlarından dolayı suda boğdurulub Cəhənnəmə daxil edildilər və özlərinə onları Allahdan qurtaracaq köməkçilər də tapa bilmədilər!﴿** Günahları onların suda boğulub ölmələrinə, qəbir əzabına və cəhənnəm oduna düçar olmalarına səbəb oldu.

(26) **﴾Nuh dedi: “Ey Rəbbim! Yer üzündə bir nəfər belə kafir qoyma!﴿** Nuh onların iman gətirəcəklərinə ümidini kəsdikdə və qövmindən daha heç kəsin iman gətirməyəcəyi xəbəri vəhy ilə ona çatdırıldıqdan sonra, o, qövminə qarşı bəd dua etdi. Allah da onun duasını qəbul edib onları suya qərq etdi.

(27) **﴾Çünki sən, onları buraxsan, onlar Sənin bəndələrini yoldan çıxardacaq, ancaq pozğun və kafir doğub-törədəcəklər.﴿**

(28) **﴾Ey Rəbbim! Məni, ata-anamı, mənim evimə mömin kimi daxil olan kimsəni və bütün mömin kişiləri və qadınları bağışla. Zalımların isə, ancaq və ancaq həlakını artır!”﴿** Nuhun bu duası qiyamətə qədər olan hər bir zalıma çatır.

## (AL-JINN) 72

*(cinlər)*

ترتيبها ٧٢ — سُورَةُ الجِنِّ — آياتها ٢٨

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

قُلْ أُوحِيَ إِلَيَّ أَنَّهُ ٱسْتَمَعَ نَفَرٌ مِّنَ ٱلْجِنِّ فَقَالُوٓا۟ إِنَّا سَمِعْنَا قُرْءَانًا
عَجَبًا ﴿١﴾ يَهْدِىٓ إِلَى ٱلرُّشْدِ فَـَٔامَنَّا بِهِۦ ۖ وَلَن نُّشْرِكَ بِرَبِّنَآ أَحَدًا ﴿٢﴾
وَأَنَّهُۥ تَعَٰلَىٰ جَدُّ رَبِّنَا مَا ٱتَّخَذَ صَٰحِبَةً وَلَا وَلَدًا ﴿٣﴾ وَأَنَّهُۥ كَانَ
يَقُولُ سَفِيهُنَا عَلَى ٱللَّهِ شَطَطًا ﴿٤﴾ وَأَنَّا ظَنَنَّآ أَن لَّن تَقُولَ ٱلْإِنسُ
وَٱلْجِنُّ عَلَى ٱللَّهِ كَذِبًا ﴿٥﴾ وَأَنَّهُۥ كَانَ رِجَالٌ مِّنَ ٱلْإِنسِ يَعُوذُونَ بِرِجَالٍ
مِّنَ ٱلْجِنِّ فَزَادُوهُمْ رَهَقًا ﴿٦﴾ وَأَنَّهُمْ ظَنُّوا۟ كَمَا ظَنَنتُمْ أَن لَّن يَبْعَثَ
ٱللَّهُ أَحَدًا ﴿٧﴾ وَأَنَّا لَمَسْنَا ٱلسَّمَآءَ فَوَجَدْنَٰهَا مُلِئَتْ حَرَسًا
شَدِيدًا وَشُهُبًا ﴿٨﴾ وَأَنَّا كُنَّا نَقْعُدُ مِنْهَا مَقَٰعِدَ لِلسَّمْعِ ۖ فَمَن
يَسْتَمِعِ ٱلْـَٔانَ يَجِدْ لَهُۥ شِهَابًا رَّصَدًا ﴿٩﴾ وَأَنَّا لَا نَدْرِىٓ أَشَرٌّ أُرِيدَ
بِمَن فِى ٱلْأَرْضِ أَمْ أَرَادَ بِهِمْ رَبُّهُمْ رَشَدًا ﴿١٠﴾ وَأَنَّا مِنَّا ٱلصَّٰلِحُونَ
وَمِنَّا دُونَ ذَٰلِكَ ۖ كُنَّا طَرَآئِقَ قِدَدًا ﴿١١﴾ وَأَنَّا ظَنَنَّآ أَن لَّن نُّعْجِزَ
ٱللَّهَ فِى ٱلْأَرْضِ وَلَن نُّعْجِزَهُۥ هَرَبًا ﴿١٢﴾ وَأَنَّا لَمَّا سَمِعْنَا ٱلْهُدَىٰ
ءَامَنَّا بِهِۦ ۖ فَمَن يُؤْمِنۢ بِرَبِّهِۦ فَلَا يَخَافُ بَخْسًا وَلَا رَهَقًا ﴿١٣﴾

(1) **﴾De: “Mənə vəhy olundu ki, bir dəstə cin dedilər: “Biz çox qəribə bir Quran eşitdik.﴿** Ey Muhəmməd (Sallallahu aleyhi və səlləm), ümmətinə çatdır ki, Allah mənə Cəbrail vasitəsi ilə bildirdi ki, bir dəstə cin mənim Quran oxumağımı eşidib demişlər: "biz fəsahət və bəlağətlə dolu çox qəribə bir kəlam eşitdik". Onların eşitdikləri surə "əl-Aləq" surəsi idi. Ümumiyyətlə, uca Allah, cinlərə özlərindən peyğəmbər göndərməmişdir. Peyğəmbərlərin hamısı Adəm övladı olmuşdur.

(2) **﴾O, haqq yolu göstərir. Biz ona iman gətirdik və biz bir daha heç kəsi Rəbbimizə şərik qoşmayacağıq.﴿**

(3) **﴾Həqiqətən, Rəbbimizin calalı çox ucadır. O Özünə nə bir zövcə götürmüşdür, nə də bir uşaq!﴿**

(4) **﴾Doğrusu, bizim səfehimiz Allah barəsində tamamilə yalan söyləyirmiş.﴿** İman gətirən cinlər digər müşrik və səfeh cinlərin Allah barəsində söylədikləri zövcə və övlad iddialarına etiraz edir, onların bu sözlərlə kafir olduqlarını və haqq yoldan azdıqlarını söyləyirdilər.

وَأَنَّا مِنَّا ٱلْمُسْلِمُونَ وَمِنَّا ٱلْقَـٰسِطُونَ ۖ فَمَنْ أَسْلَمَ فَأُو۟لَـٰٓئِكَ
تَحَرَّوْا۟ رَشَدًا ﴿١٤﴾ وَأَمَّا ٱلْقَـٰسِطُونَ فَكَانُوا۟ لِجَهَنَّمَ حَطَبًا ﴿١٥﴾
وَأَلَّوِ ٱسْتَقَـٰمُوا۟ عَلَى ٱلطَّرِيقَةِ لَأَسْقَيْنَـٰهُم مَّآءً غَدَقًا ﴿١٦﴾ لِّنَفْتِنَهُمْ
فِيهِ ۚ وَمَن يُعْرِضْ عَن ذِكْرِ رَبِّهِۦ يَسْلُكْهُ عَذَابًا صَعَدًا ﴿١٧﴾ وَأَنَّ
ٱلْمَسَـٰجِدَ لِلَّهِ فَلَا تَدْعُوا۟ مَعَ ٱللَّهِ أَحَدًا ﴿١٨﴾ وَأَنَّهُۥ لَمَّا قَامَ عَبْدُ ٱللَّهِ
يَدْعُوهُ كَادُوا۟ يَكُونُونَ عَلَيْهِ لِبَدًا ﴿١٩﴾ قُلْ إِنَّمَآ أَدْعُوا۟ رَبِّى وَلَآ أُشْرِكُ
بِهِۦٓ أَحَدًا ﴿٢٠﴾ قُلْ إِنِّى لَآ أَمْلِكُ لَكُمْ ضَرًّا وَلَا رَشَدًا ﴿٢١﴾ قُلْ إِنِّى
لَن يُجِيرَنِى مِنَ ٱللَّهِ أَحَدٌ وَلَنْ أَجِدَ مِن دُونِهِۦ مُلْتَحَدًا ﴿٢٢﴾ إِلَّا بَلَـٰغًا
مِّنَ ٱللَّهِ وَرِسَـٰلَـٰتِهِۦ ۚ وَمَن يَعْصِ ٱللَّهَ وَرَسُولَهُۥ فَإِنَّ لَهُۥ نَارَ جَهَنَّمَ
خَـٰلِدِينَ فِيهَآ أَبَدًا ﴿٢٣﴾ حَتَّىٰٓ إِذَا رَأَوْا۟ مَا يُوعَدُونَ فَسَيَعْلَمُونَ
مَنْ أَضْعَفُ نَاصِرًا وَأَقَلُّ عَدَدًا ﴿٢٤﴾ قُلْ إِنْ أَدْرِىٓ أَقَرِيبٌ
مَّا تُوعَدُونَ أَمْ يَجْعَلُ لَهُۥ رَبِّىٓ أَمَدًا ﴿٢٥﴾ عَـٰلِمُ ٱلْغَيْبِ فَلَا
يُظْهِرُ عَلَىٰ غَيْبِهِۦٓ أَحَدًا ﴿٢٦﴾ إِلَّا مَنِ ٱرْتَضَىٰ مِن رَّسُولٍ فَإِنَّهُۥ
يَسْلُكُ مِنۢ بَيْنِ يَدَيْهِ وَمِنْ خَلْفِهِۦ رَصَدًا ﴿٢٧﴾ لِّيَعْلَمَ أَن قَدْ أَبْلَغُوا۟
رِسَـٰلَـٰتِ رَبِّهِمْ وَأَحَاطَ بِمَا لَدَيْهِمْ وَأَحْصَىٰ كُلَّ شَىْءٍ عَدَدًۢا ﴿٢٨﴾

(5) **﴿Biz elə güman edirdik ki, nə insan, nə də cin tayfası Allah barəsində yalan danışmaz.﴾** İnsanlar və cinlər Allahın ortağı, zövcəsi və övladı olduğunu dedikdə, biz elə düşünürdük ki, onlar Allahın adından yalan danışmazlar. Buna görə də biz, onların dediklərini təsdiq edirdik.

(6) **﴿Həqiqətən, bəzi insanlar bir para cinlərə pənah aparır, bununla da onların tüğyanını artırırdılar.﴾** Rəvayətlərdə deyilir ki, cahiliyyət dövründə ərəblər bir vadidə gecələdikdə belə deyərdilər: *"Mən bu vadinin ağasının tayfasından olan səfehlərin şərrindən onun özünə sığınıram, pənah aparıram"*. Beləliklə cinlərə sığınıb orada gecələyərdilər. Belə olan halda cinlər daha çox təkəbbürlənir, insanlar da bir o qədər zəif və qorxaq görsənirdilər.

(7) **﴿Onlar da sizin kimi elə güman edirdilər ki, Allah heç kəsi diriltməyəcəkdir.﴾**

(8) **﴿Biz göyə qalxmaq istədik, amma onun güclü gözətçilər və yandırıb-yaxan ulduzlarla dolu olduğunu gördük.﴾** Adətimiz üzrə səmanın söhbətlərinə qulaq asmaq üçün oraya qalxmaq istəyəndə oranın mələklər tərəfindən güclü şəkildə qorunduğunu və axan mərmi kimi ulduzlarla dolu olduğunu gördük. Bu qorunma Muhəmməd peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) elçi göndərilməsindən sonra başlamışdır.

(9) **﴿Biz qulaq asmaq üçün göyün bəzi yerlərində otururduq. Lakin indi kim qulaq asmış olsa, yandırıb-yaxan bir ulduzun onu gözlədiyini görər.﴾** Onlarda səmada danışılan söhbətlərə qulaq asıb sonra onları kahinlərə ötürmək üçün yuxarı qalxardılar. İndi isə bunu etmək istəyəni orada yandıran bir ulduzun gözlədiyini görər.

(10) **﴿Biz bilmirik ki, yerdə olanlara bir pislik etmək istənilmişdir, yoxsa Rəbbi onlara bir xeyir diləmişdir.﴾** Onlar bu cür qorunmanı gördükdə bunun insanlar üçün xeyirli və ya zərərli olduğunu bilmirdilər. İbn Zeyd adlı alim deyir: İblis belə demişdi: Allah bu qorunmanı işə salmaqla yer əhalisinə əzab vermək, yoxsa onlara özlərindən peyğəmbər göndərmək istədiyini bilmirik.

(11) **﴿Şübhəsiz ki, aramızda əməlisaleh olanlar da var, olmayanlar da. Biz müxtəlif firqələrə ayrılmışıq.﴾** Cinlər digərlərini Muhəmmədə (*Sallallahu aleyhi və səlləm*) iman gətirməyə dəvət etdikdən sonra öz aralarında söhbət edərkən deyərdilər: "biz Quranı eşitdikdən sonra aramızda mömin və ya kafir olanlar oldu. Biz əvvəllər müxtəlif firqələrə və təbəqələrə bölünmüşdük". Səid deyir: *"Onlar müsəlman, yəhudi, nəsrani və ataşpərəst firqələrə bölünmüşdülər"*.

(12) **﴿Biz anladıq ki, yerdə olsaq da, qaçsaq da, Allahdan canımızı qurtara bilmərik.﴾** Biz dərk etdik ki, əgər Allah bizə bir şey etmək istəsə, heç yana qaçıb gizlənə bilmərik.

(13) **﴿Doğrusu, biz hidayət yolunu göstərəni dinlədiyimiz zaman ona iman gətirdik. Kim Rəbbinə iman gətirsə, nə əskilməkdən, nə də haqsızlığa məruz qalmaqdan qorxar.﴾**

(14) **﴿Şübhəsiz ki, aramızda müsəlmanlar da var, haqq yoldan çıxanlar da. Müsəlman olanlar haqq yolu axtarıb tapanlardır.﴾** Müsəlman olanlar haqq yolu axtarıb, sonda ona nail olanlardır. [Bu ayə göstərir ki, insan haqq yolu axtarmalıdır. Evində oturub, dünyaya başı qarışıb sonra isə: *"Allah istəsə, məni haqq yola yönəldər"* – deməməlidir].

(15) **﴿Haqq yoldan çıxanlar isə, Cəhənnəm üçün odun olacaqlar"﴾**

(16) **﴿Əgər onlar o yolda doğru olsaydılar, Biz onlara bol yağış verərdik ki,﴾**

(17) **﴿Onları bununla imtahana çəkək. Kim öz Rəbbini yad etməkdən üz çevirsə, onu məşəqqətli bir əzaba düçar edər.﴾** Muhəmməd Peyğəmbərə (*Sallallahu aleyhi və səlləm*) vəhy olunur ki, əgər cinlər və insanlar, yaxud

onlardan biri islam dininə tutunsalar, biz onlara bol-bol yağış verərik ki, onların bu nemətlərə qarşı nə qədər şükürlü olduqlarını görək. Doğrudan da, kim, Qurandan, haqq sözdən üz çevirərsə, uca Allah onu məşəqqətli və çətin əzaba düçar edər.

18 **﴾Şübhəsiz ki, məscidlər Allaha məxsusdur. Allahdan başqa heç kəsə ibadət etməyin!﴿** Məscidlər Allaha məxsusdur, bütlərə yox. Siz də Allahdan başqa, heç kəsin qadir olmadığı işlərdə kimliyindən asılı olmayaraq, heç kəsi köməyə çağırmayın, dua edib onlara yalvarmayın. Çünki dua etməyin özü bir növ ibadətdir.

19 **﴾Allahın bəndəsi Ona ibadət etmək üçün qalxdıqda az qalmışdı ki, onun ətrafında keçə kimi bir-birinə keçsinlər.﴿** Peyğəmbər (Sallallahu aleyhi və səlləm) uca Allaha dua edib, ibadət etdikdə cinlər onun oxuduğu Quranı dinləmək üçün izdihamla onun ətrafına toplaşdılar.

20 **﴾De: "Mən ancaq öz Rəbbimə ibadət edirəm və heç kəsi Ona şərik qoşmuram!"﴿**

21 **﴾De: "Mən sizə nə bir zərər, nə də bir xeyir vermək qüdrətinə malik deyiləm!"﴿**

22 **﴾De: "Məni Allahdan heç kəs qurtara bilməz və mən də Ondan başqa, heç bir sığınacaq tapa bilmərəm!﴿**

23 **﴾Mənim Allah dərgahından olanı və Onun göndərdiklərini təbliğ etməkdən başqa yolum yoxdur. Allah və Onun Peyğəmbərinə asi olanları cəhənnəm odu gözləyir. Onlar orada həmişəlik qalacaqlar!"﴿** Əgər bu yola dəvət edib, özüm də əməl etsəm, o zaman Allahın əzabından qurtula bilərəm.

24 **﴾Onlar təhdid olunduqlarını gördükləri zaman kimin köməkçisinin daha zəif və sayca daha az olduğunu biləcəklər.﴿**

25 **﴾De: "Mən sizin qorxudulduğunuz əzabın yaxın olduğunu, yaxud Rəbbimin onun üçün uzun bir müddət təyin edəcəyini bilmirəm!﴿** Qiyamətin nə zaman qopacağını Allahdan başqa heç kəs bilmir.

26 **﴾Qeybi bilən ancaq Odur və Öz qeybini heç kəsə əyan etməz;﴿**

27 **﴾Bəyənib seçdiyi peyğəmbərdən başqa!﴿** Uca Allah seçdiyi peyğəmbərlərə vəhy yolu ilə qeybindən xəbər verər və bunu onların peyğəmbərliklərini təsdiq edən açıq-aşkar möcüzə sübut edər. Qeybdən "xəbər verən" münəccim, falçı, fincana və ya karta baxan insanlar Allah tərəfindən bəyənilib seçilmişlər deyildir. Onlar Allaha küfr edib kafir olan, təxmin və ehtimalları ilə Ona böhtan atanlardır. **﴾Allah onların önündə və arxasında gözətçilər qoyar ki,﴿** şeytanlar Peyğəmbərə göndərilən qeybdən heç nə oğurlaya bilməsinlər.

28 **﴾Öz Rəbbinin göndərdiklərini təbliğ etdiyini bilsin. Onlarda olanların hamısını əhatə etmişdir. O, hər şeyi bir-bir sayıb hesaba almışdır!"﴿** Peyğəmbərlərinin risaləti çatdırdıqlarını qeybən bilməkdən əlavə əyani olaraq bilmək üçün mələkləri gözətçi qoyar. Uca Allah Mələklərdə və Peyğəmbərlərdə olan xəbərlərin hamısını və onların nə iş gördüklərini öz elmi ilə əhatə etmişdir.

## əl-Muzzəmmil surəsi 73

*(bürünmüş)*

1 **﴾Ey örtünüb bürünən!﴿** Bu Peyğəmbərə (Sallallahu aleyhi və səlləm) edilən müraciətdir. Cəbrail ﷺ ona ilk dəfə vəhy gətirəndə qorxmuş və qorxudan paltarına bürünmüş halda uzanırdı. O ilk dəfə mələyin səsini eşidib onu görəndə qorxu onu bürümüş və ailəsinin yanına gəlib: "mənim üstümü örtün, libasa bürüyün" – demişdi. Bundan sonra, peyğəmbərlik haqqında ona məlumat verildi və Cəbraili özünə yaxın bildi.

2 **﴾Gecəni – az bir hissəsi istisna olmaqla – qalxıb namaz qıl!﴿**

3 **﴾Gecənin yarısına qədər, yaxud bir qədər ondan az;﴿**

4 **﴾Və ya bir qədər ondan çox! Həm də aramla Quran oxu!﴿** Sanki uca Allah ona, gecənin üçdə ikisini, yaxud yarısını və ya üçdə birini namaz qılmağı əmr edir. Əhməd və Müslim öz kitablarında Səd ibn Hişamdan rəvayət edirlər ki, o Aişədən ؓ Peyğəmbərin (Sallallahu aleyhi və səlləm) gecə namazları haqqında soruşmuş, Aişə ؓ isə cavabında belə demişdir: *"Məgər "ey libasına bürünmüş" – surəsini oxumursan?"* Mən dedim: Bəli oxuyuram. Aişə dedi: *"Uca Allah bu surənin əvvəlində gecə namazlarını fərz etmişdi. Peyğəmbər (Sallallahu aleyhi və səlləm) və əshabı bir il bu namazı qıldılar. Hətta ayaq üstə dayanmaqdan ayaqları şişirdi. On iki aydan sonra bu əməlin vacibliyi ləğv edildi. Bu surənin sonunda asanlaşdırıcı xəbər göndərildi. Becə namazları fərz olduqdan sonra müstəhəb hökmünə keçirildi".* Həmçinin Peyğəmbərə (Sallallahu aleyhi və səlləm) Quranı aramla, mənasını düşünərək oxumaq əmr olunur. Quranın aramla oxunması *(ərəb. Tərtil)* dedikdə sözün bütün hərflərini lazımi qaydada tam oxumaq anlaşılır.

5 **﴾Həqiqətən Biz, sənə ağır bir kəlam vəhy edəcəyik.﴿** Biz sənə Quranı vəhy edəcəyik. Onun fərzləri və qayda-qanunları, halalı və haramı ağırdır. Yalnız müvəffəqiyyət verilmiş və tövhid inancı ilə bəzədilmiş qəlblər bu yükü daşıya bilərlər.

6 **﴿Şübhəsiz ki, gecə qalxmaq olduqca çətin və oxumaq daha münasibdir!﴾** Gecə yatmaq üçün nəzərdə tutulduğu üçün bu vaxt qalxıb namaz qılmaq insan nəfsinə ağır gəlir. Gecə vaxtı həyat sakitləşdiyi üçün insanın oxuduğu onun qəlbinə daha xoş gəlir.

7 **﴿Çünki gündüz sənin uzun-uzadı davam edən işlərin vardır.﴾** Buna görə də gecələr ibadət et.

8 **﴿Rəbbinin adını zikr et və Ona tərəf yönəl.﴾** Vaxtını Ona ibadət etməklə keçirt və Onda olanları dilə.

9 **﴿O, məşriqin və məğribin Rəbbidir. Ondan başqa heç bir tanrı yoxdur. Ancaq Onu vəkil et!﴾** Bütün işlərində Ona bel bağla.

10 **﴿Onların sənə deyəcəklərinə səbr et. Onlardan gözəl tərzdə ayrıl!﴾** Müşriklərin söyüşlərinə, istehza və təkziblərinə qarşı səbirli ol, bunlar səni özündən çıxarmasın. Sən onlara cavab verməklə vaxtını keçirmə. Bəzi təfsir alimləri deyirlər: "gözəl tərzdə ayrılmaq hökmü döyüş əmrlərindən öncə nazil olmuşdur".

11 **﴿Yalan sayan var-dövlət sahiblərini mənə tapşır və onlara bir az möhlət ver!﴾** Sənin onlarla işin olmasın. Mən Özüm onların cəzasını verəcəyəm, sənin intiqamını alacağam. Onlara əcəlləri çatana və ya dünya əzabının gələcəyi vaxta qədər möhlət ver.

12 **﴿Dərgahımızda qandallar və Cəhənnəm vardır.﴾**

13 **﴿Boğaza tıxanıb qalan yemək və şiddətli əzab vardır!﴾**

14 **﴿O gün yer və dağlar lərzəyə gəlib titrəyəcək, dağlar yumşaq qum təpəsinə dönəcəkdir.﴾**

15 **﴿Həqiqətən Biz, - Firona peyğəmbər göndərdiyimiz kimi – sizə də şahidlik edəcək peyğəmbər göndərdik.﴾** Necə ki, Musanı ﷺ Firona peyğəmbər olaraq göndərdik, sizə də bir peyğəmbər göndərdik ki, qiyamət günü asilik etdiyiniz işlərdə sizə qarşı şahidlik etsin.

16 **﴿Firon, o peyğəmbərə asi oldu və Biz də onu şiddətli əzabla yaxaladıq.﴾** Musanın dediklərini inkar etdi, ona iman gətirmədi. Biz də Fironu suda boğub öldürməklə şiddətli əzaba düçar etdik.

17 **﴿Elə isə, əgər küfr etmiş olsanız, uşaqları ağ saçlı qocalara döndərəcək gündən özünüzü necə qoruyacaqsınız?!﴾** Əgər siz küfr etməkdə israrlı olsanız, o günün əzabından necə qorunacaqsınız?!

18 **﴿O gün göy parçalanacaq. Allahın vədi yerinə yetəcəkdir.﴾** Qiyamətin şiddəti və mələklərin səmadan enişi səbəbi ilə göy parça-parça olacaqdır.

آياتها ٢٠ — سُورَةُ المُزَّمِّلِ — ترتيبها ٧٣

بِسْمِ اللَّهِ الرَّحْمَٰنِ الرَّحِيمِ

يَا أَيُّهَا الْمُزَّمِّلُ ﴿١﴾ قُمِ اللَّيْلَ إِلَّا قَلِيلًا ﴿٢﴾ نِصْفَهُ أَوِ انْقُصْ مِنْهُ قَلِيلًا
﴿٣﴾ أَوْ زِدْ عَلَيْهِ وَرَتِّلِ الْقُرْآنَ تَرْتِيلًا ﴿٤﴾ إِنَّا سَنُلْقِي عَلَيْكَ قَوْلًا
ثَقِيلًا ﴿٥﴾ إِنَّ نَاشِئَةَ اللَّيْلِ هِيَ أَشَدُّ وَطْئًا وَأَقْوَمُ قِيلًا ﴿٦﴾ إِنَّ لَكَ فِي
النَّهَارِ سَبْحًا طَوِيلًا ﴿٧﴾ وَاذْكُرِ اسْمَ رَبِّكَ وَتَبَتَّلْ إِلَيْهِ تَبْتِيلًا ﴿٨﴾
رَبُّ الْمَشْرِقِ وَالْمَغْرِبِ لَا إِلَٰهَ إِلَّا هُوَ فَاتَّخِذْهُ وَكِيلًا ﴿٩﴾ وَاصْبِرْ
عَلَىٰ مَا يَقُولُونَ وَاهْجُرْهُمْ هَجْرًا جَمِيلًا ﴿١٠﴾ وَذَرْنِي وَالْمُكَذِّبِينَ
أُولِي النَّعْمَةِ وَمَهِّلْهُمْ قَلِيلًا ﴿١١﴾ إِنَّ لَدَيْنَا أَنْكَالًا وَجَحِيمًا ﴿١٢﴾
وَطَعَامًا ذَا غُصَّةٍ وَعَذَابًا أَلِيمًا ﴿١٣﴾ يَوْمَ تَرْجُفُ الْأَرْضُ وَالْجِبَالُ
وَكَانَتِ الْجِبَالُ كَثِيبًا مَهِيلًا ﴿١٤﴾ إِنَّا أَرْسَلْنَا إِلَيْكُمْ رَسُولًا شَاهِدًا
عَلَيْكُمْ كَمَا أَرْسَلْنَا إِلَىٰ فِرْعَوْنَ رَسُولًا ﴿١٥﴾ فَعَصَىٰ فِرْعَوْنُ الرَّسُولَ
فَأَخَذْنَاهُ أَخْذًا وَبِيلًا ﴿١٦﴾ فَكَيْفَ تَتَّقُونَ إِنْ كَفَرْتُمْ يَوْمًا يَجْعَلُ
الْوِلْدَانَ شِيبًا ﴿١٧﴾ السَّمَاءُ مُنْفَطِرٌ بِهِ كَانَ وَعْدُهُ مَفْعُولًا ﴿١٨﴾
إِنَّ هَٰذِهِ تَذْكِرَةٌ فَمَنْ شَاءَ اتَّخَذَ إِلَىٰ رَبِّهِ سَبِيلًا ﴿١٩﴾

19 **﴿Həqiqətən bu, öyüd-nəsihətdir. Hər kəs istəsə, Rəbbinə tərəf bir yol tutar!﴾** Ötən ayələr möminlər üçün öyüd-nəsihətdir. İstəyən kimsə Allaha itaət, tövhid və digər saleh əməllərlə cənnətə aparan yolu tapıb gedə bilər.

20 **﴿Həqiqətən, Rəbbin bilir ki, sən qalxıb bəzən gecənin təqribən üçdə ikisini, bəzən yarısını, bəzən də üçdə birini namaz qılırsan. Səninlə birlikdə olan bir zümrə də belədir. Gecəni də, gündüzü də ölçüb-biçən ancaq Allahdır. O sizin bunu ölçüb saya bilməyəcəyinizi bildiyi üçün sizi əfv etdi. Qurandan sizə müyəssər olanı oxuyun. Allah bilir ki, içərinizdə xəstələr də olacaq, bəziləri Allahın lütfündən ruzi axtarmaq üçün yer üzünü gəzib dolaşacaq, digərləri isə, Allah yolunda vuruşacaqdır. Elə isə, ondan sizə müyəssər olanı oxuyun, namaz qılın, zəkat verin və Allah yolunda gözəl bir borc verin. Özünüz üçün öncə nə yaxşı iş görsəniz, Allah dərgahında onun daha xeyirli və daha böyük mükafatı olduğunu görəcəksiniz. Allahdan bağışlanmağınızı diləyin. Həqiqətən Allah, bağışlayandır, rəhm edəndir!﴾** Uca Allah

۞ إِنَّ رَبَّكَ يَعْلَمُ أَنَّكَ تَقُومُ أَدْنَىٰ مِن ثُلُثَيِ ٱلَّيْلِ وَنِصْفَهُۥ وَثُلُثَهُۥ وَطَآئِفَةٌ
مِّنَ ٱلَّذِينَ مَعَكَ ۚ وَٱللَّهُ يُقَدِّرُ ٱلَّيْلَ وَٱلنَّهَارَ ۚ عَلِمَ أَن لَّن تُحْصُوهُ فَتَابَ
عَلَيْكُمْ ۖ فَٱقْرَءُوا۟ مَا تَيَسَّرَ مِنَ ٱلْقُرْءَانِ ۚ عَلِمَ أَن سَيَكُونُ مِنكُم مَّرْضَىٰ ۙ
وَءَاخَرُونَ يَضْرِبُونَ فِى ٱلْأَرْضِ يَبْتَغُونَ مِن فَضْلِ ٱللَّهِ ۙ وَءَاخَرُونَ
يُقَٰتِلُونَ فِى سَبِيلِ ٱللَّهِ ۖ فَٱقْرَءُوا۟ مَا تَيَسَّرَ مِنْهُ ۚ وَأَقِيمُوا۟ ٱلصَّلَوٰةَ وَءَاتُوا۟
ٱلزَّكَوٰةَ وَأَقْرِضُوا۟ ٱللَّهَ قَرْضًا حَسَنًا ۚ وَمَا تُقَدِّمُوا۟ لِأَنفُسِكُم مِّنْ خَيْرٍ تَجِدُوهُ
عِندَ ٱللَّهِ هُوَ خَيْرًا وَأَعْظَمَ أَجْرًا ۚ وَٱسْتَغْفِرُوا۟ ٱللَّهَ ۖ إِنَّ ٱللَّهَ غَفُورٌ رَّحِيمٌۢ ﴿٢٠﴾

ترتيبها ٧٤ — سُورَةُ المُدَّثِّر — آياتها ٥٦

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

يَٰٓأَيُّهَا ٱلْمُدَّثِّرُ ﴿١﴾ قُمْ فَأَنذِرْ ﴿٢﴾ وَرَبَّكَ فَكَبِّرْ ﴿٣﴾ وَثِيَابَكَ فَطَهِّرْ ﴿٤﴾
وَٱلرُّجْزَ فَٱهْجُرْ ﴿٥﴾ وَلَا تَمْنُن تَسْتَكْثِرُ ﴿٦﴾ وَلِرَبِّكَ فَٱصْبِرْ ﴿٧﴾
فَإِذَا نُقِرَ فِى ٱلنَّاقُورِ ﴿٨﴾ فَذَٰلِكَ يَوْمَئِذٍ يَوْمٌ عَسِيرٌ ﴿٩﴾ عَلَى ٱلْكَٰفِرِينَ
غَيْرُ يَسِيرٍ ﴿١٠﴾ ذَرْنِى وَمَنْ خَلَقْتُ وَحِيدًا ﴿١١﴾ وَجَعَلْتُ لَهُۥ مَالًا
مَّمْدُودًا ﴿١٢﴾ وَبَنِينَ شُهُودًا ﴿١٣﴾ وَمَهَّدتُّ لَهُۥ تَمْهِيدًا ﴿١٤﴾ ثُمَّ يَطْمَعُ
أَنْ أَزِيدَ ﴿١٥﴾ كَلَّآ ۖ إِنَّهُۥ كَانَ لِءَايَٰتِنَا عَنِيدًا ﴿١٦﴾ سَأُرْهِقُهُۥ صَعُودًا ﴿١٧﴾

bilir ki, Peyğəmbəri (Sallallahu aleyhi və səlləm) bəzi hallarda gecənin üçdə ikisindən az ibadət edir. Bəzən yarısını, bəzən də üçdə birini ibadət edir. Bu barədə əmr surənin əvvəlində qeyd olunmuşdu. Əshabələrindən də bu qədər namaz qılanlar vardır. Allah gecə və gündüzün hesabını daha dəqiq biləndir. O sizin nə qədər ibadət etdiyinizi də yaxşı bilir. Allah bilir ki, siz gecə və gündüzün vaxt hesabını dəqiq apara bilməyəcəksiniz. Yaxud gecə namazlarını qılmağa gücünüz yetməyəcəkdir. Elə bu səbəblə sizi əfv etdi və gecə namazlarını qılmamaq üçün sizə rüsxət verdi. Sizin aciz olduğunuzu görüb çətin hökmü rahatlaşdırdı. Elə isə siz də gecə ibadətləri üçün vaxt təyin etmədən Qurandan bir qədər oxuyun. Bu ayə gecə namazlarının vacibliyini ləğv edən ayədir. Uca Allah bilir ki, sizin aranızda gecə namazlarını qılmağa imkanı olmayan xəstələr olacaqdır. Bəziləri Allahın verdiyi ruzidən qazanmaq üçün ticarət səfərlərinə çıxacaq və gecə namazlarını qıla bilməyəcəklər. Bir qrup insanlar isə, Allah yolunda döyüşmək üçün cihada gedəcək və gecə namazlarını qıla bilməyəcəklər. [Bu ayə Mədinədə cihadın vacib edilməsindən öncə nazil olmuşdur.] Uca Allah bu ayədə rüsxətə əsas verən üç amili qeyd etmiş və bu səbəblə gecə namazlarını qeyri vacib buyurmuşdur. Əvəzində fərz namazları qılmağı, zəkat verməyi əmr etmişdir. Həmçinin Allah yolunda sədəqə verməklə, ailənin ehtiyacları üçün xərcləməklə, zəkat çıxarmaqla Allaha gözəl bir borc verməyi əmr edir. Adı çəkilən və çəkilməyən hər hansı xeyirli işi görən kimsə bu əməllərinin Allah yanında daha xeyirli və daha çox savablı olduğunu görəcəkdir.

# əl-Müddəssir surəsi 74

## (örtülmüş)

Təfsir alimləri deyirlər ki, Peyğəmbərə (Sallallahu aleyhi və səlləm) vəhy gəlməyə başlayanda Cəbrail ﷺ onun yanına gəldi və Peyğəmbər (Sallallahu aleyhi və səlləm) onu göy ilə yerin arasında parlayan bir nur olduğunu gördükdə qorxub ürəyi getdi. Özünə gəldikdə qalxıb Xədicənin ﷺ yanına getdi və bir qab su istəyib üzərinə tökdü və sonra: "Mənim üstümü örtün, örtün" – dedi. Onu toxunma paltara bürüdülər.

(1) **﴾Ey libasına bürünüb sarınan!﴿**

(2) **﴾Qalx qorxut!﴿** Məkkə əhlinə xəbərdarlıq et. Əgər onlar islamı qəbul etməsələr, onları əzab gözləyir.

(3) **﴾Öz Rəbbini uca tut!﴿** Səni yaradan və işlərini sahamana salan Rəbbini Ona şərik qoşmaqdan uca tut.

(4) **﴾Libasını təmizlə!﴿** Paltarını murdar şeylərdən, nəfsini isə, günahlardan təmizlə.

(5) **﴾Pis şeylərdən uzaqlaş!﴿** Bütləri tərk et, onlara ibadət etmə. Çünki onlara ibadət etmək insanların əzab çəkmələri üçün əsas səbəblərdəndir.

(6) **﴾Yaxşılığı, daha çoxunu əldə etmək üçün etmə!﴿** Özgəsi səbəbi ilə çətinliyə düşüb, minnət edən insan kimi Peyğəmbərlik (Sallallahu aleyhi və səlləm) yolunda qarşılaşdığın çətinlikləri rəbbinə minnət etmə. Yaxud kiməsə, nə isə versən, bunu Allah üçün et. Verdiyin şeyə görə insanlara minnət qoyma.

(7) **﴾Rəbbinin yolunda səbr et!﴿** Sən böyük bir yükün altındasan. Bu yolda ərəblər və əcəmlər sənə qarşı döyüşəcəklər. Sən isə, Allah üçün bu yolda səbirli ol.

(8) **﴾Elə ki, Sur çalındı,﴿**

(9) **﴾O gün çox ağır bir gün olacaqdır;﴿**

(10) **﴾O gün kafirlər üçün asan olmayacaqdır!﴿** Onların əziyyətlərinə döz. Qarşıda onları etdiklərinin cəzasını verəcək ağır gün gözləyir.

(11) **﴾Məni tənhalıqda yaratdığım kimsə ilə tək burax!﴿** Anasının bətnində tənha olarkən

إِنَّهُۥ فَكَّرَ وَقَدَّرَ ﴿١٨﴾ فَقُتِلَ كَيْفَ قَدَّرَ ﴿١٩﴾ ثُمَّ قُتِلَ كَيْفَ قَدَّرَ ﴿٢٠﴾ ثُمَّ نَظَرَ
﴿٢١﴾ ثُمَّ عَبَسَ وَبَسَرَ ﴿٢٢﴾ ثُمَّ أَدْبَرَ وَٱسْتَكْبَرَ ﴿٢٣﴾ فَقَالَ إِنْ هَٰذَآ إِلَّا سِحْرٌ
يُؤْثَرُ ﴿٢٤﴾ إِنْ هَٰذَآ إِلَّا قَوْلُ ٱلْبَشَرِ ﴿٢٥﴾ سَأُصْلِيهِ سَقَرَ ﴿٢٦﴾ وَمَآ أَدْرَىٰكَ
مَا سَقَرُ ﴿٢٧﴾ لَا تُبْقِى وَلَا تَذَرُ ﴿٢٨﴾ لَوَّاحَةٌ لِّلْبَشَرِ ﴿٢٩﴾ عَلَيْهَا تِسْعَةَ عَشَرَ
﴿٣٠﴾ وَمَا جَعَلْنَآ أَصْحَٰبَ ٱلنَّارِ إِلَّا مَلَٰٓئِكَةً وَمَا جَعَلْنَا عِدَّتَهُمْ إِلَّا فِتْنَةً
لِّلَّذِينَ كَفَرُوا۟ لِيَسْتَيْقِنَ ٱلَّذِينَ أُوتُوا۟ ٱلْكِتَٰبَ وَيَزْدَادَ ٱلَّذِينَ ءَامَنُوٓا۟ إِيمَٰنًا
وَلَا يَرْتَابَ ٱلَّذِينَ أُوتُوا۟ ٱلْكِتَٰبَ وَٱلْمُؤْمِنُونَ وَلِيَقُولَ ٱلَّذِينَ فِى قُلُوبِهِم مَّرَضٌ
وَٱلْكَٰفِرُونَ مَاذَآ أَرَادَ ٱللَّهُ بِهَٰذَا مَثَلًا كَذَٰلِكَ يُضِلُّ ٱللَّهُ مَن يَشَآءُ وَيَهْدِى
مَن يَشَآءُ وَمَا يَعْلَمُ جُنُودَ رَبِّكَ إِلَّا هُوَ وَمَا هِىَ إِلَّا ذِكْرَىٰ لِلْبَشَرِ ﴿٣١﴾ كَلَّا
وَٱلْقَمَرِ ﴿٣٢﴾ وَٱلَّيْلِ إِذْ أَدْبَرَ ﴿٣٣﴾ وَٱلصُّبْحِ إِذَآ أَسْفَرَ ﴿٣٤﴾ إِنَّهَا لَإِحْدَى
ٱلْكُبَرِ ﴿٣٥﴾ نَذِيرًا لِّلْبَشَرِ ﴿٣٦﴾ لِمَن شَآءَ مِنكُمْ أَن يَتَقَدَّمَ أَوْ يَتَأَخَّرَ ﴿٣٧﴾ كُلُّ
نَفْسٍۭ بِمَا كَسَبَتْ رَهِينَةٌ ﴿٣٨﴾ إِلَّآ أَصْحَٰبَ ٱلْيَمِينِ ﴿٣٩﴾ فِى جَنَّٰتٍ يَتَسَآءَلُونَ
﴿٤٠﴾ عَنِ ٱلْمُجْرِمِينَ ﴿٤١﴾ مَا سَلَكَكُمْ فِى سَقَرَ ﴿٤٢﴾ قَالُوا۟ لَمْ نَكُ مِنَ
ٱلْمُصَلِّينَ ﴿٤٣﴾ وَلَمْ نَكُ نُطْعِمُ ٱلْمِسْكِينَ ﴿٤٤﴾ وَكُنَّا نَخُوضُ مَعَ
ٱلْخَآئِضِينَ ﴿٤٥﴾ وَكُنَّا نُكَذِّبُ بِيَوْمِ ٱلدِّينِ ﴿٤٦﴾ حَتَّىٰٓ أَتَىٰنَا ٱلْيَقِينُ ﴿٤٧﴾

yaratdığım insanla məni tək burax. O zaman onun nə mal-dövləti, nə də oğul-uşağı var idi. Mən Özüm ondan intiqam alacağam. Təfsir alimləri bu adamın əl-Valid ibn əl-Muğirə olduğunu deyirlər.

(12) **«Mən ona bollu mal-dövlət əta etdim;»**

(13) **«Yanında hazır duran oğullar verdim;»** Onunla Məkkədə qalan oğullar verdim. Atalarına bolluca mal-dövlət vermişəm. Onların kənara səfər edib, ruzi qazanmasına ehtiyac yoxdur.

(14) **«Ona artıqlaması ilə müyəssər etdim.»** Onun yaşayışını rahat, ömrünü uzun edib, Qureyş qəbiləsində başçı təyin etdim.

(15) **«Sonra yenə də var-dövlətini artırmağımı istəyir.»**

(16) **«Xeyr. Çünki o, ayələrimizə qarşı inadkar oldu.»**

(17) **«Mən onu məşəqqətli bir əzaba düçar edəcəyəm!»** Bu insanın dözə bilməyəcəyi şiddətli bir əzabdır.

(18) **«O fikirləşdi və tədbir aldı.»** O Peyğəmbər (Sallallahu aleyhi və səlləm) haqqında fikirləşdi və ona nə deyəcəyi haqqında qərara gəldi. Allah isə onu məzəmmət etdi.

(19) **«Ölüm olsun ona! Necə tədbir aldı?!»** Ona lənət və əzab olsun.

(20) **«Yenə də ölüm olsun ona! Necə tədbir aldı?!»**

(21) **«Sonra baxdı.»** Görək Qurana nə ilə ləkə yaxa bilir. Ləkə yaxmağa bir əsas tapmadıqdan

(22) **«Sonra üz-gözünü turşutdu, qaşqabağını tökdü.»** üz-gözü dəyişdi.

(23) **«Sonra da üz çevirdi, təkəbbür göstərdi.»**

(24) **«Və dedi: "Bu, öyrənilən sehrdən başqa bir şey deyildir!»** Bu Quran Muhəmmədin (Sallallahu aleyhi və səlləm) başqalarından öyrənib oxuduğu sehrdən başqa bir şey deyildir.

(25) **«Bu, yalnız bəşər sözüdür!"»** Allahın sözü deyildir.

(26) **«Biz onu Səqərə atacağıq.»** Səqər cəhənnəmin adlarından biridir.

(27) **«Sən, nə bilirsən ki, nədir Səqər!»**

(28) **«O heç kəsi sağ qoymaz və salamat buraxmaz!»**

(29) **«İnsanı yandırıb-yaxar!»**

(30) **«Onun üstündə on doqquz nəfər gözətçi vardır.»** Cəhənnəmin on doqquz nəfər gözətçi mələyi vardır. Bəzi təfsirçilərin fikrincə gözətçilər on doqquz növ mələkdən ibarətdir.

(31) **«Biz, cəhənnəm gözətçilərini yalnız mələklərdən etdik. Biz, onların sayını ancaq kafirlərin imtahana çəkilməsi, kitab verilənlərin yəqinlik hasil etməsi, iman gətirənlərin imanının daha da artması, kitab əhlinin və möminlərin şübhəyə düşməməsi, həmçinin qəlblərində mərəz olanların və kafirlərin: "Allah bu misalla nə demək istəyir?" – demələri üçün etdik. Allah istədiyi kimsəni belə sapdırır və istədiyini də doğru yola salır. Rəbbinin ordularını özündən başqası bilməz. Bu, insanlar üçün ancaq bir öyüd-nəsihətdir!»** Uca Allahın *«Onun üstündə on doqquz nəfər gözətçi vardır.»* ayəsi nazil olanda Əbu Cəhl dedi: *"Muhəmmədin yalnız on doqquz nəfər köməkçisi var? Məgər sizdən yüz nəfər onlardan birini əzişdirib cəhənnəmdən çıxa bilməz?"* Sonra bu ayə nazil oldu və bildirildi ki, biz cəhənnəm gözətçilərini yalnız mələklər etmişik. Mələklərə kimin gücü çatar, onlara kim qalib gələ bilər. Onlar Allahın haqqını qorumaq üçün var-gücünü sərf edən, bu işdə qətiyyətli olan varlıqlardır. Onların intiqamı şiddətli və kəsərlidir. Kafirləri sınağa çəkmək üçün cəhənnəm gözətçiləri olan mələklərin sayını on doqquz etmişik. Bu həmçinin kitab əhlinin də iman gətirməsi üçün bir əsasdır. Çünki onların kitablarında da eyni say göstərilmişdir. Qəlbində xəstəlik olan münafiqlər və Məkkə əhalisindən olan kafirlər bu ayəni eşidəndə təəcüblə *"Allah bu məsəli çəkməklə nə demək istəyir?"* – dedilər. Uca Allah isə onlara

فَمَا تَنفَعُهُمْ شَفَٰعَةُ ٱلشَّٰفِعِينَ ﴿٤٨﴾ فَمَا لَهُمْ عَنِ ٱلتَّذْكِرَةِ مُعْرِضِينَ
﴿٤٩﴾ كَأَنَّهُمْ حُمُرٌ مُّسْتَنفِرَةٌ ﴿٥٠﴾ فَرَّتْ مِن قَسْوَرَةٍۭ ﴿٥١﴾ بَلْ يُرِيدُ
كُلُّ ٱمْرِئٍ مِّنْهُمْ أَن يُؤْتَىٰ صُحُفًا مُّنَشَّرَةً ﴿٥٢﴾ كَلَّا ۖ بَل لَّا يَخَافُونَ
ٱلْءَاخِرَةَ ﴿٥٣﴾ كَلَّآ إِنَّهُۥ تَذْكِرَةٌ ﴿٥٤﴾ فَمَن شَآءَ ذَكَرَهُۥ ﴿٥٥﴾
وَمَا يَذْكُرُونَ إِلَّآ أَن يَشَآءَ ٱللَّهُ ۚ هُوَ أَهْلُ ٱلتَّقْوَىٰ وَأَهْلُ ٱلْمَغْفِرَةِ ﴿٥٦﴾

ترتيبها ٧٥ — **سُورَةُ القِيَامَةِ** — آياتها ٤٠

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

لَآ أُقْسِمُ بِيَوْمِ ٱلْقِيَٰمَةِ ﴿١﴾ وَلَآ أُقْسِمُ بِٱلنَّفْسِ ٱللَّوَّامَةِ ﴿٢﴾ أَيَحْسَبُ
ٱلْإِنسَٰنُ أَلَّن نَّجْمَعَ عِظَامَهُۥ ﴿٣﴾ بَلَىٰ قَٰدِرِينَ عَلَىٰٓ أَن نُّسَوِّىَ بَنَانَهُۥ ﴿٤﴾ بَلْ
يُرِيدُ ٱلْإِنسَٰنُ لِيَفْجُرَ أَمَامَهُۥ ﴿٥﴾ يَسْـَٔلُ أَيَّانَ يَوْمُ ٱلْقِيَٰمَةِ ﴿٦﴾ فَإِذَا بَرِقَ ٱلْبَصَرُ
﴿٧﴾ وَخَسَفَ ٱلْقَمَرُ ﴿٨﴾ وَجُمِعَ ٱلشَّمْسُ وَٱلْقَمَرُ ﴿٩﴾ يَقُولُ ٱلْإِنسَٰنُ يَوْمَئِذٍ
أَيْنَ ٱلْمَفَرُّ ﴿١٠﴾ كَلَّا لَا وَزَرَ ﴿١١﴾ إِلَىٰ رَبِّكَ يَوْمَئِذٍ ٱلْمُسْتَقَرُّ ﴿١٢﴾ يُنَبَّؤُا۟ ٱلْإِنسَٰنُ
يَوْمَئِذٍۭ بِمَا قَدَّمَ وَأَخَّرَ ﴿١٣﴾ بَلِ ٱلْإِنسَٰنُ عَلَىٰ نَفْسِهِۦ بَصِيرَةٌ ﴿١٤﴾ وَلَوْ أَلْقَىٰ
مَعَاذِيرَهُۥ ﴿١٥﴾ لَا تُحَرِّكْ بِهِۦ لِسَانَكَ لِتَعْجَلَ بِهِۦٓ ﴿١٦﴾ إِنَّ عَلَيْنَا جَمْعَهُۥ
وَقُرْءَانَهُۥ ﴿١٧﴾ فَإِذَا قَرَأْنَٰهُ فَٱتَّبِعْ قُرْءَانَهُۥ ﴿١٨﴾ ثُمَّ إِنَّ عَلَيْنَا بَيَانَهُۥ ﴿١٩﴾

bildirdi ki, Allahın ordusu çoxdur və onların sayını Özündən başqa heç kəs bilməz. Əgər cəhənnəmin gözətçiləri on doqquz nəfərdirsə, onların köməkçiləri saysız-hesabsızdır. Bütün bu deyilənlər ağıl sahibləri üçün öyüd-nəsihətdir. Onlar bilməlidirlər ki, Allahın qüdrəti genişdir. Onun heç bir köməkçiyə ehtiyacı yoxdur.

32 **﴾Xeyr! And olsun aya;﴿**

33 **﴾Dönüb-qayıdan gecəyə﴿**

34 **﴾Və sökülməkdə olan dan yerinə ki,﴿**

35 **﴾Cəhənnəm böyük bəlalardan biridir!﴿**

36 **﴾O, Allahın əzabı ilə qorxudur insanları –﴿**

37 **﴾Sizdən irəli düşmək, yaxud geri qalmaq istəyənləri!﴿** İman gətirib irəli gedənləri, yaxud küfr edib arxada qalanları bu əzabla xəbərdar edir.

38 **﴾Hər kəs öz əməlinin girovudur!﴿** Hər kəs etdiyi əməlinə uyğun olaraq mühakimə olunacaqdır.

39 **﴾Sağ tərəf sahibləri istisna olmaqla!﴿** Yalnız möminlər öz günahlarının girovu olmayacaqlar. Onların yalnız yaxşı əməlləri göstəriləcəkdir.

40 **﴾Onlar cənnətlərdədirlər; bir-birindən soruşacaqlar;﴿**

41 **﴾Günahkarlar barəsində:﴿** Cənnət əhli bir-biri ilə söhbət edib günahları üzündən cəhənnəmə düşənlər haqqında soruşacaqlar.

42 **﴾"Sizi Səqərə salan nədir?"﴿** Sizi cəhənnəmə salan nədir? "Səqər" cəhənnəmin adlarından biridir.

43 **﴾Onlar deyəcəklər: "Biz, namaz qılanlardan deyildik;﴿**

44 **﴾Yoxsulu da yedirtməzdik;﴿**

45 **﴾Batilə dalanlarla birlikdə biz də dalardıq;﴿** Batil inanclı insanların batil işlərində onlarla əlbir olardıq. Hər kim batil söz danışsaydı biz də onun yanında yer alardıq.

46 **﴾Haqq-hesab gününü yalan sayardıq.﴿**

47 **﴾Ölüm bizi haqlayana qədər".﴿** bu vəziyyətdə qaldıq.

48 **﴾Şəfaət edənlərin şəfaəti onlara fayda verməz!﴿**

49 **﴾Onlara nə olub ki, öyüd-nəsihətdən üz çevirirlər.﴿** Onlar nə səbəblə böyük günü xatırladan və öyüd-nəsihət verən bir kitabdan Qurandan üz döndərirlər.

50 **﴾Onlar sanki hürkən vəhşi eşşəklərdir.﴿**

51 **﴾O eşşəklər ki, aslandan hürküb qaçarlar!﴿**

52 **﴾Xeyr, onların hər biri özünə nazil olmuş səhifələr verilməsini istəyər.﴿** Təfsirçilər deyirlər ki, Qüreyş kafirləri Muhəmmədə (*Səllallahu aleyhi və səlləm*) belə deyirdilər: "qoy bizim hər birimizin başı altında sənin peyğəmbər olduğunu isbat edən Allah tərəfindən göndərilmiş bir məktub peyda olsun".

53 **﴾Xeyr, daha doğrusu, onlar axirətdən qorxmazlar!﴿**

54 **﴾Xeyr, bu bir öyüd-nəsihətdir!﴿**

55 **﴾İstəyənlər ondan öyüd alar.﴿**

56 **﴾Bununla belə, Allah istəməsə, onlar əsla öyüd ala bilməzlər. Qorxub çəkinməyə də, bağışlamağa da layiq olan ancaq Odur!﴿** Allah onlar üçün hidayət yolunu istəməsə, hidayət tapmazlar. O, itaət olunmağa və möminlərin günahlarını bağışlamağa daha layiqdir.

## əl-Qiyamət surəsi 75

1 **﴾And içirəm qiyamət gününə;﴿** Uca Allahın Qiyamətə and içməsi bu günün nə qədər əzəmətli gün olmasına işarədir. O, məxluqatından istədiyinə and içə bilər.

2 **﴾And içirəm özünü qınayan nəfsə!﴿** Bu nəfs, etdiyi günahlara və qaçırdığı xeyir işlərə görə təəssüflənən mömin nəfsidir. Müqatil adlı alim deyir ki, ayədə dünyada olarkən günahlara batmış və Allahın haqqını verməmiş kafir nəfsindən danışılır. Demək olar ki, uca Allah hər ikisinə də and içir və

كَلَّا بَلْ تُحِبُّونَ الْعَاجِلَةَ ﴿٢٠﴾ وَتَذَرُونَ الْآخِرَةَ ﴿٢١﴾ وُجُوهٌ يَوْمَئِذٍ نَاضِرَةٌ ﴿٢٢﴾
إِلَىٰ رَبِّهَا نَاظِرَةٌ ﴿٢٣﴾ وَوُجُوهٌ يَوْمَئِذٍ بَاسِرَةٌ ﴿٢٤﴾ تَظُنُّ أَنْ يُفْعَلَ بِهَا فَاقِرَةٌ ﴿٢٥﴾
كَلَّا إِذَا بَلَغَتِ التَّرَاقِيَ ﴿٢٦﴾ وَقِيلَ مَنْ ۜ رَاقٍ ﴿٢٧﴾ وَظَنَّ أَنَّهُ الْفِرَاقُ ﴿٢٨﴾ وَالْتَفَّتِ
السَّاقُ بِالسَّاقِ ﴿٢٩﴾ إِلَىٰ رَبِّكَ يَوْمَئِذٍ الْمَسَاقُ ﴿٣٠﴾ فَلَا صَدَّقَ وَلَا صَلَّىٰ
﴿٣١﴾ وَلَٰكِنْ كَذَّبَ وَتَوَلَّىٰ ﴿٣٢﴾ ثُمَّ ذَهَبَ إِلَىٰ أَهْلِهِ يَتَمَطَّىٰ ﴿٣٣﴾ أَوْلَىٰ لَكَ
فَأَوْلَىٰ ﴿٣٤﴾ ثُمَّ أَوْلَىٰ لَكَ فَأَوْلَىٰ ﴿٣٥﴾ أَيَحْسَبُ الْإِنْسَانُ أَنْ يُتْرَكَ سُدًى ﴿٣٦﴾
أَلَمْ يَكُ نُطْفَةً مِنْ مَنِيٍّ يُمْنَىٰ ﴿٣٧﴾ ثُمَّ كَانَ عَلَقَةً فَخَلَقَ فَسَوَّىٰ ﴿٣٨﴾ فَجَعَلَ مِنْهُ
الزَّوْجَيْنِ الذَّكَرَ وَالْأُنْثَىٰ ﴿٣٩﴾ أَلَيْسَ ذَٰلِكَ بِقَادِرٍ عَلَىٰ أَنْ يُحْيِيَ الْمَوْتَىٰ ﴿٤٠﴾

## سُورَةُ الإِنسَانِ

ترتيبها ٧٦ — آياتها ٣١

بِسْمِ اللَّهِ الرَّحْمَٰنِ الرَّحِيمِ

هَلْ أَتَىٰ عَلَى الْإِنْسَانِ حِينٌ مِنَ الدَّهْرِ لَمْ يَكُنْ شَيْئًا مَذْكُورًا ﴿١﴾
إِنَّا خَلَقْنَا الْإِنْسَانَ مِنْ نُطْفَةٍ أَمْشَاجٍ نَبْتَلِيهِ فَجَعَلْنَاهُ سَمِيعًا
بَصِيرًا ﴿٢﴾ إِنَّا هَدَيْنَاهُ السَّبِيلَ إِمَّا شَاكِرًا وَإِمَّا كَفُورًا ﴿٣﴾
إِنَّا أَعْتَدْنَا لِلْكَافِرِينَ سَلَاسِلَ وَأَغْلَالًا وَسَعِيرًا ﴿٤﴾ إِنَّ
الْأَبْرَارَ يَشْرَبُونَ مِنْ كَأْسٍ كَانَ مِزَاجُهَا كَافُورًا ﴿٥﴾

bildirir ki, O hər bir nəfsi mühakimə edəcək və əvəzini verəcəkdir.

(3) **«Məgər insan elə güman edir ki, onun sümüklərini bir yerə yığa bilməyəcəyik?!»** Belə bir düşüncə batildir. Biz, onların çürüyüb torpağa qarışmış sümüklərini yenidən dirildəcəyik.

(4) **«Bəli, Biz onun barmaqlarını da düzəltməyə qadirik!»** Biz, nəinki onun ümumi bədən quruluşunu, hətta barmaq sümükləri kimi xırda sümüklərini də dirildəcəyik. Bəzi alimlər deyirlər ki, bu ayədə uca Allah bildirir ki, hər bir insanın barmağının izi digər insanların barmağının izindən fərqlidir. Əgər O diriltməyin çətinliyini düşünsəydi, barmaq izlərini eyni edərdi.

(5) **«Lakin insan önündəkini danmaq istəyər.»** İnsan qarşıdakı günlərini günah işlərdə keçirmək, ölümü yada salmamaq istəyər. Günahı tez, tövbəni isə gec edər.

(6) **«“Qiyamət günü nə vaxt olacaqdır?” – deyə soruşar.»** Onlar bu sualı istehza ilə verərlər.

(7) **«Göz bərələcəyi;»** Ölüm ayağında can verərkən, yaxud öldükdən sonra dirilərkən gözlər bərələr.

(8) **«Ay tutulacağı;»** Bu gündə ay tutulacaq lakin bir daha dünyadakı kimi işıq saçmayacaqdır.

(9) **«Günəşlə ay birləşəcəyi zaman –»** Hər ikisi öz parlaqlığını itirəcək və işıq saçmayacaqlar. Bir daha gecə gündüzü təqib etməyəcəkdir.

(10) **«Məhz o gün insan: “Qaçıb can qurtarmağa yer haradadır?” – deyəcəkdir.»** Allahdan, Onun haqq-hesabından və əzabından qaçmaq üçün yer varmı?

(11) **«Xeyr, heç bir sığınacaq olmayacaqdır!»** Sığınmaq üçün nə dağ, nə qala, nə də başqa sığınacaq yeri yoxdur.

(12) **«O gün duracaq yer ancaq Rəbbinin hüzurudur!»**

(13) **«O gün insana öncə etdiyi və sonraya qoyduğu nə varsa, xəbər veriləcəkdir!»**

(14) **«Doğrusu, insan özü-özünə şahiddir!»** O gün insan qazandığı imanı və ya küfrü, itaəti və ya asiliyi biləcəkdir. Bəzi təfsirçilər isə deyirlər ki, bu gündə insanın əzaları ona şahidlik edəcəklər.

(15) **«O, hər cür üzrxahlıq etsə də, qəbul olunmaz!»** Əgər etdiklərinə qarşı üzürxahlıq edib, bəhanələr axtarsa, bunun heç bir faydası olan deyil.

(16) **«Onu tələm-tələsik əzbərləmək üçün dilini tərpətmə!»** Peyğəmbərə (Səllallahu aleyhi və səlləm) Quran ayəsi nazil olanda Cəbrail ayəni oxuyub qurtarmamış, o da əzbərləmək üçün dərhal dilini və dodaqlarını tərpədib ayəni oxuyardı. Ayə də bu səbəblə nazil oldu ki, sənə vəhy gəldiyi zaman onu unudacağından qorxaraq, tələm-tələsik oxuma.

(17) **«Çünki onu cəm etmək, oxutmaq Bizə aiddir.»** Bu Quranı sənin sinəndə həkk etmək, dilində oxutmaq bizə aiddir.

(18) **«Biz, onu oxutduğumuz zaman oxunmasını diqqətlə dinlə.»** Cəbrailin dili ilə Quran ayələrini sənə eşitdirdikdə diqqətlə dinlə.

(19) **«Sonra onu bəyan etmək də Bizə aiddir!»** Orada olan halalı və ya haramı, müşkül məsələləri açıqlamaq da bizə aiddir. Bu tövsiyələrdən sonra Peyğəmbər ﷺ Cəbraili dinləyər, o getdikdən sonra Allahın vəd etdiyi kimi oxyardı.

(20) **«Xeyr, xeyr! Siz tez keçib gedəni sevirsiniz.»**

(21) **«Axirəti isə tərk edirsiniz.»**

(22) **«O gün neçə-neçə üzlər sevinib güləcək,»**

(23) **«Öz Rəbbinə baxacaqdır!»** Qiyamət günü əməlisaleh insanların bədrlənmiş aya baxdıqları kimi öz Rəbbinə baxacaqları səhih hədislərlə mütəvatir yolla isbat edilmişdir.

(24) **«O gün neçə-neçə üzlər tutulub qaralacaq,»**

(25) **«Bel sümüklərinin qırılacağını anlayacaqdır!»**

(26) **«Xeyr, can boğaza gəlib yetişəcəyi,»**

(27) **«“onu kim xilas edə bilər?” – deyiləcəyi,»** zaman, kim gəlib ona kömək edəcək.

Çağırın həkimi görək sağalda biləcəkmi?
(28) ﴿ayrılıq dəminin gəlib çatdığını anlayacağı,﴾ Ruh boğaza dirəndikdə insan dünyadan, mal-dövlətdən, arvad-uşaqdan ayrıldığına əmin olar.
(29) ﴿Və qıçı-qıçına dolaşacağı zaman,﴾ Ruhu bədənindən çıxmağa başlayarkən bir müddət öncə rahat gəzdiyi ayaqları və dizləri ölər. İnsanlar onun cəsədini hazırladıqları zaman, mələklər də onun ruhunu hazırlayarlar.
(30) ﴿Aparılacağın yer Rəbbinin hüzuru olacaqdır.﴾ Ruhlar cəsəddən çıxdıqdan sonra Rəbbinin hüzuruna aparılar.
(31) ﴿Beləliklə, o nə təsdiq etdi, nə də namaz qıldı.﴾ Nə peyğəmbərliyi, nə Quranı təsdiq etdi, nə də namaz qıldı. Qəlbi ilə iman gətirib əzaları ilə əməl etmədi.
(32) ﴿Amma yalan saydı, üz döndərdi.﴾ Peyğəmbərliyi təkzib etdi, itaətdən və imandan boyun qaçırdı.
(33) ﴿Sonra da özünü darta-darta ailəsinin yanına getdi.﴾ Etdiyi bu küfr əməllərlə qürur hissi duyaraq yerişini dəyişdi.
(34) ﴿Vay sənin halına, vay!﴾
(35) ﴿Yenə də vay sənin halına, vay!﴾ Allah səni xoşuna gəlməyən bir cəza ilə cəzalandırsın. Qoy bu cəza daim təkrar edilsin.
(36) ﴿Məgər insan elə güman edir ki, o, başlı-başına buraxılacaq?!﴾ Etdiklərinə görə sorğu-sual olunmayacaq, cəza almayacaq?!
(37) ﴿Məgər o tökülən bir qətrə nütfə deyildimi?!﴾ Məgər bu insan ana bətninə axıdılan bir damla sperma deyildimi?
(38) ﴿Sonra laxtalanmış qan oldu və onu yaradıb surət verdi.﴾
(39) ﴿Sonra da ondan biri kişi, biri qadın olmaqla iki cift yaratdı.﴾
(40) ﴿Elə isə, O Allah ölüləri diriltməyə qadir deyildirmi?!﴾ Belə bir xaliq ölüləri dirildib dünyadakı hala salmağa qadir olmazmı? Axı olan bir şeyi düzəltmək yoxdan var etməkdən çox asandır.

## Insan surəsi 76

(1) ﴿İnsanın elə bir dövrü olub keçmişdir ki, o həmin dövrdə xatırlanası bir şey olmasın?!﴾ Adəm ﷺ yaradılmadan qırx il öncə, onun barəsində heç bir məxluqun məlumatı yox idi. Sonra o, torpaqdan və sudan yoğrulub insan şəklinə salınmış, ona ruh verilmişdi.
(2) ﴿Həqiqətən Biz, insanı qarışıq bir nütfədən yaratdıq. Biz onu imtahana çəkəcəyik. Biz onu eşidən, görən yaratdıq.﴾ Qarışıq nütfə kişi və qadının nütfəsidir. Uca Allah insanı xeyir, şər, əmr və qadağalarla sınağa çəkmək üçün yaratmışdır. Bunun öhdəsindən gəlmək və imtahan edilmək üçün ona eşitmə və görmə hissiyatı vermişdir.
(3) ﴿Biz ona haqq yolu göstərdik. İstər minnətdar olsun, istər nankor.﴾ Uca Allah insana hidayət və zalalət, xeyir və şər yolunu tanıtdırmışdır. İnsanın ağlı və təbiəti nəticəsində əldə edəcəyi xeyiri və ziyanı da açıqlamışdır. Nəticədə isə insan şükr və küfr etmiş olur.
(4) ﴿Biz kafirlər üçün zəncirlər, qandallar və alovlu bir atəş hazırlamışıq.﴾ Bunlar əzab vermək üçün görülən tədarükdür.
(5) ﴿Şübhəsiz ki, yaxşı əməl və itaət sahibləri kafur qatılmış qədəhdən içəcəklər.﴾ Qədəhin kafur ətirli olması onda içiləcək şərabın daha tamlı olması üçün nəzərdə tutulur.
(6) ﴿O elə bir çeşmədir ki, Allahın bəndələri ondan içəcək və onu asanlıqla axıdacaqlar.﴾ Onlar bu çeşmədən şərab içəcəklər. Digər ehtimal olunan mənaya görə onlar şərablarını bu çeşmənin suyuna qarışdırıb içəcəklər. Bu çeşmənin suyunu istədikləri istiqamətə yönəldəcəklər.
(7) ﴿Onlar elə kimsələrdirlər ki, nəzirlərini yerinə yetirər və dəhşəti hər yeri bürüyəcək gündən qoxarlar.﴾ Cənnətə layiq görülən bu insanlar şəriətin onlara vacib etmədiyi namaz, oruc, qurban, sədəqə və s. bu kimi bir işi özlərinə vacib edər, yəni nəzir edər və bunu yerinə yetirərlər. Onlar həmçinin qiyamət günündən və onun dəhşətindən qorxarlar. O günün dəhşəti yeri və göyləri bürüyəcəkdir. Göy parçalanacaq, ulduzlar əriyəcək, yer dümdüz olacaq, dağlar toza dönəcək.
(8) ﴿Onlar öz iştahaları çəkdiyi halda yeməyi yoxsula, yetimə və əsirə yedirərlər.﴾ Özlərinin qidası az olduğu və iştahaları çəkdiyi halda onlar Allah sevgisinə əsaslanaraq deyilən bu üç qism insanları yedizdirərlər.
(9) ﴿"Biz sizi ancaq Allah rizasından ötrü yedirdirik. Biz sizdən nə bir mükafat, nə də bir təşəkkür istəyirik.﴾ Onlar bu yaxşılığın müqabilində insanların təşəkkürünü istəmirlər. Uca Allah bunu qəlbdən etdiklərini bildiyi üçün onları tərifləmişdir.
(10) ﴿Həqiqətən biz, Rəbbimizdən, çox sərt və çətin gündən qorxuruq!"﴾
(11) ﴿Allah da onları o günün şərindən qoruyacaq, onlara gözəllik və sevinc bəxş edəcəkdir.﴾ Kafirlərin üzü kədərlə dolu olduğu halda, möminlərin üzü nurla dolacaqdır.
(12) ﴿Və onları etdikləri səbr müqabilində Cənnətlə və ipəklə mükafatlandıracaqdır.﴾
(13) ﴿Onlar orada taxtlara söykənəcək, orada

عَيْنًا يَشْرَبُ بِهَا عِبَادُ ٱللَّهِ يُفَجِّرُونَهَا تَفْجِيرًا ﴿٦﴾ يُوفُونَ بِٱلنَّذْرِ وَيَخَافُونَ
يَوْمًا كَانَ شَرُّهُۥ مُسْتَطِيرًا ﴿٧﴾ وَيُطْعِمُونَ ٱلطَّعَامَ عَلَىٰ حُبِّهِۦ مِسْكِينًا
وَيَتِيمًا وَأَسِيرًا ﴿٨﴾ إِنَّمَا نُطْعِمُكُمْ لِوَجْهِ ٱللَّهِ لَا نُرِيدُ مِنكُمْ جَزَآءً وَلَا شُكُورًا
﴿٩﴾ إِنَّا نَخَافُ مِن رَّبِّنَا يَوْمًا عَبُوسًا قَمْطَرِيرًا ﴿١٠﴾ فَوَقَىٰهُمُ ٱللَّهُ شَرَّ ذَٰلِكَ
ٱلْيَوْمِ وَلَقَّىٰهُمْ نَضْرَةً وَسُرُورًا ﴿١١﴾ وَجَزَىٰهُم بِمَا صَبَرُوا۟ جَنَّةً وَحَرِيرًا
﴿١٢﴾ مُّتَّكِـِٔينَ فِيهَا عَلَى ٱلْأَرَآئِكِ ۖ لَا يَرَوْنَ فِيهَا شَمْسًا وَلَا زَمْهَرِيرًا ﴿١٣﴾
وَدَانِيَةً عَلَيْهِمْ ظِلَـٰلُهَا وَذُلِّلَتْ قُطُوفُهَا تَذْلِيلًا ﴿١٤﴾ وَيُطَافُ عَلَيْهِم بِـَٔانِيَةٍ
مِّن فِضَّةٍ وَأَكْوَابٍ كَانَتْ قَوَارِيرَا۠ ﴿١٥﴾ قَوَارِيرَا۟ مِن فِضَّةٍ قَدَّرُوهَا تَقْدِيرًا ﴿١٦﴾
وَيُسْقَوْنَ فِيهَا كَأْسًا كَانَ مِزَاجُهَا زَنجَبِيلًا ﴿١٧﴾ عَيْنًا فِيهَا تُسَمَّىٰ سَلْسَبِيلًا
﴿١٨﴾ ۞ وَيَطُوفُ عَلَيْهِمْ وِلْدَٰنٌ مُّخَلَّدُونَ إِذَا رَأَيْتَهُمْ حَسِبْتَهُمْ لُؤْلُؤًا مَّنثُورًا
﴿١٩﴾ وَإِذَا رَأَيْتَ ثَمَّ رَأَيْتَ نَعِيمًا وَمُلْكًا كَبِيرًا ﴿٢٠﴾ عَـٰلِيَهُمْ ثِيَابُ سُندُسٍ
خُضْرٌ وَإِسْتَبْرَقٌ ۖ وَحُلُّوٓا۟ أَسَاوِرَ مِن فِضَّةٍ وَسَقَىٰهُمْ رَبُّهُمْ شَرَابًا
طَهُورًا ﴿٢١﴾ إِنَّ هَـٰذَا كَانَ لَكُمْ جَزَآءً وَكَانَ سَعْيُكُم مَّشْكُورًا ﴿٢٢﴾ إِنَّا
نَحْنُ نَزَّلْنَا عَلَيْكَ ٱلْقُرْءَانَ تَنزِيلًا ﴿٢٣﴾ فَٱصْبِرْ لِحُكْمِ رَبِّكَ وَلَا تُطِعْ
مِنْهُمْ ءَاثِمًا أَوْ كَفُورًا ﴿٢٤﴾ وَٱذْكُرِ ٱسْمَ رَبِّكَ بُكْرَةً وَأَصِيلًا ﴿٢٥﴾

**nə qızmar günəş, nə də sərt soyuq görəcəklər.﴿** Onların mükafatı cənnətdə taxt üzərində oturmaq olacaqdır. Nə günəşin qızmar istisini, nə də qışın kəskin soyuğunu görəcəklər.

14 **﴾Ağacların kölgələri üstlərinə düşəcək, meyvələri də onların ixtiyarında olacaqdır.﴿** Cənnət ağaclarının meyvəsi onların ixtiyarında olacaqdır. Ayaq üstə olan, oturan və ya uzanan insan istədiyi zaman ağac öz meyvəsini onlara təqdim edəcəkdir.

15 **﴾Xidmətçilər onların ətrafında gümüş qablar və büllur qədəhlərlə dolanacaqlar.﴿** İstədiklərini onlara təqdim edəcəklər.

16 **﴾Gümüşdən olan elə billur qədəhlərlə ki, onların içmək istədikləri miqdarı təyin etmişlər.﴿** Dünyadakı qədəhlər torpaqdan düzəldilirsə, Uca Allah cənnətdəki qədəhləri gümüş tərkibli şəffaf yaratmışdır. Xidmətçilər nə az, nə çox, sahiblərinin içmək istədikləri miqdarda içki təqdim edəcəklər.

17 **﴾Orada onlara zəncəfil qatılmış badə də içirdiləcəkdir.﴿**

18 **﴾Orada bir çeşmə vardır ki, Səlsəbil adlanır.﴿** Suyu boğazdan çox rahat keçdiyi üçün bu adla adlanmışdır.

19 **﴾Onların dövrəsində həmişəcavan xidmətçi oğlanlar olacaqdır. Onları gördükdə, sanki ətrafa səpilmiş inci olduqlarını zənn edərsən.﴿** Xidmətçilər həmişə cavan, gümrah, dəyişməz olacaq və heç vaxt ölməyəcəklər. Onlar hədsiz gözəl, xoş rəngli və gülər üzlü olduqları üçün bir inciyə, xidmətlərini tez yerinə yetirdikləri üçün səpilmiş inciyə bənzədilmişlər.

20 **﴾Orada hara baxsan, nemət və böyük bir mülk görərsən.﴿**

21 **﴾Əyinlərində nazik və qalın ipəkdən libaslar olacaq, onlara gümüşdən bilərziklər taxılacaqdır. Rəbbi onlara çox pak bir şərab içirdəcəkdir.﴿** Fatir surəsində isə deyilir ki, **﴾Onlara qızıldan bilərziklər taxılacaqdır.﴿**. Hərə özünün istədiyini taxacaqdır. Əbu Qilabə və İbrahim ən-Nəxai deyirlər: "yeməyin sonunda onlara şərab təqdim olunacaqdır. Şərabı içdikdən sonra qarınları az köpər və bədənlərindən müşk qoxulu tər çıxar".

22 **﴾"Bu, sizin mükafatınızdır. Zəhmətiniz məqbuldur!"﴿** Uca Allah onların etdiklərindən razı qalmış, əməllərini qəbul etmişdir.

23 **﴾Həqiqətən Biz, Quranı sənə tədriclə nazil etdik.﴿** Biz, bu Quranı bir dəfəyə nazil etməmişik, nə də müşriklərin iddia etdiyi kimi sən onu özündən uydurmamısan.

24 **﴾Elə isə, Rəbbinin hökmünə səbr et və onlardan günahkar və küfr edənə *(nankor olana)* boyun əymə!﴿**

25 **﴾Səhər-axşam Rəbbinin adını zikr et!﴿** Günün əvvəlində və sonunda namaz qıl. Günün əvvəlində sübh, sonunda isə əsr namazıdır.

26 **﴾Gecənin bir qismində Ona səcdə et və gecə uzunu da Onu təqdis edib, şəninə təriflər de!﴿**

27 **﴾Həqiqətən bunlar, tez keçib gedəni sevər, ağır günə arxa çevirərlər.﴿** Müşriklər, kafirlər və nankorlar bu dünyanı sevər, ağır gündən üz çevirərlər. Ağır gün qiyamət günüdür. Bu günün ağır olması çətin və əzablı olmasına görədir. Onlar bu gün üçün hazırlaşmaz, heç buna əhəmiyyət də verməzlər.

28 **﴾Onları yaradan da, güclü-qüvvətli edən də Bizik. Əgər istəsək, onları özləri kimilərlə əvəz edərik.﴿** Onların oynaqlarını damar və əzələlərlə bərkidib güclü edən bizik. Əgər biz istəsək, onları məhv edib, əvəzində Allaha itaət edən nəsil gətirərik.

29 **﴾Həqiqətən bu, bir öyüd-nəsihətdir. Kim istəsə, Rəbbinə tərəf bir yol tutar.﴿**

30 **﴾Allah istəməsə, siz istəyə bilməzsiniz. Həqiqətən Allah, biləndir, hikmət sahibidir!﴿** Allah istəməsə, siz yol tutub, Ona tərəf gedə bilməzsiniz. Bu işin idarəçiliyi

وَمِنَ ٱلَّيْلِ فَٱسْجُدْ لَهُۥ وَسَبِّحْهُ لَيْلًا طَوِيلًا ﴿٢٦﴾ إِنَّ
هَٰٓؤُلَآءِ يُحِبُّونَ ٱلْعَاجِلَةَ وَيَذَرُونَ وَرَآءَهُمْ يَوْمًا ثَقِيلًا ﴿٢٧﴾ نَّحْنُ
خَلَقْنَٰهُمْ وَشَدَدْنَآ أَسْرَهُمْ ۖ وَإِذَا شِئْنَا بَدَّلْنَآ أَمْثَٰلَهُمْ تَبْدِيلًا
﴿٢٨﴾ إِنَّ هَٰذِهِۦ تَذْكِرَةٌ ۖ فَمَن شَآءَ ٱتَّخَذَ إِلَىٰ رَبِّهِۦ سَبِيلًا ﴿٢٩﴾
وَمَا تَشَآءُونَ إِلَّآ أَن يَشَآءَ ٱللَّهُ ۚ إِنَّ ٱللَّهَ كَانَ عَلِيمًا حَكِيمًا ﴿٣٠﴾
يُدْخِلُ مَن يَشَآءُ فِى رَحْمَتِهِۦ ۚ وَٱلظَّٰلِمِينَ أَعَدَّ لَهُمْ عَذَابًا أَلِيمًۢا ﴿٣١﴾

## سُورَةُ المُرْسَلَاتِ

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

وَٱلْمُرْسَلَٰتِ عُرْفًا ﴿١﴾ فَٱلْعَٰصِفَٰتِ عَصْفًا ﴿٢﴾ وَٱلنَّٰشِرَٰتِ نَشْرًا ﴿٣﴾
فَٱلْفَٰرِقَٰتِ فَرْقًا ﴿٤﴾ فَٱلْمُلْقِيَٰتِ ذِكْرًا ﴿٥﴾ عُذْرًا أَوْ نُذْرًا ﴿٦﴾ إِنَّمَا
تُوعَدُونَ لَوَٰقِعٌ ﴿٧﴾ فَإِذَا ٱلنُّجُومُ طُمِسَتْ ﴿٨﴾ وَإِذَا ٱلسَّمَآءُ فُرِجَتْ
﴿٩﴾ وَإِذَا ٱلْجِبَالُ نُسِفَتْ ﴿١٠﴾ وَإِذَا ٱلرُّسُلُ أُقِّتَتْ ﴿١١﴾ لِأَىِّ يَوْمٍ أُجِّلَتْ
﴿١٢﴾ لِيَوْمِ ٱلْفَصْلِ ﴿١٣﴾ وَمَآ أَدْرَىٰكَ مَا يَوْمُ ٱلْفَصْلِ ﴿١٤﴾ وَيْلٌ يَوْمَئِذٍ
لِّلْمُكَذِّبِينَ ﴿١٥﴾ أَلَمْ نُهْلِكِ ٱلْأَوَّلِينَ ﴿١٦﴾ ثُمَّ نُتْبِعُهُمُ ٱلْـَٔاخِرِينَ
﴿١٧﴾ كَذَٰلِكَ نَفْعَلُ بِٱلْمُجْرِمِينَ ﴿١٨﴾ وَيْلٌ يَوْمَئِذٍ لِّلْمُكَذِّبِينَ ﴿١٩﴾

Allahın əlindədir, siz insanların əlində deyil. Xeyir də, şər də Onun əlindədir. Allahın istəyi olmadan, təkcə bəndənin istəyi nə bir xeyir, nə də bir zərər gətirə bilər.

31 **«Allah istədiyi kimsəni Öz mərhəmətinə qovuşdurar. Zalımlara gəldikdə isə, onlar üçün şiddətli bir əzab hazırlamışdır!»**

# əl-Mursələt surəsi 77

## *(göndərilənlər)*

1 **«And olsun tapşırıqla göndərilənlərə;»** Bu ayədə uca Allah mələklərə and içir.

2 **«And olsun şiddətlə əsənlərə;»** Bu ayənin mənaca iki ehtimalı vardır. Burada mələklər, yaxud küləklər nəzərdə tutulur. Küləyin şiddətlə əsməsi aydındır, mələklərin isə şiddətlə əsməsi, onların Allahın əmrini icra etmək üçün şiddətlə əsən külək kimi dərhal cavab verməsidir.

3 **«And olsun yayanlara;»** Bu ayə də mələklərə və ya küləyə işarədir. Mələklər Allahın əmrlərini yayır, külək isə, lazım olanları yer üzünə yayır.

4 **«And olsun ayıranlara;»** Allahın haqqı batildən ayıran ayələrini nazil edən mələklərə and olsun.

5 **«And olsun vəhyi çatdıranlara-»** Bu ən şərəfli işlə məşğul olan mələklərə aiddir.

6 **«Üzr diləmək və ya qorxutmaq üçün ki,»** qarşıdan gələn gündə onlar üçün heç bir bəhanə yeri qalmasın.

7 **«Sizə vəd edilən mütləq vaqe olacaqdır!»**

8 **«Ulduzlar sönəcəyi;»**

9 **«Göy yarılacağı;»**

10 **«Dağlar parça-parça olub dağılacağı;»**

11 **«Peyğəmbərlərə möhlət veriləcəyi zaman,»** Qiyamət günü hər bir peyğəmbərə haqq-hesab olunması üçün vaxt veriləcəkdir.

12 **«"Hansı günə qədər möhlət verilmişdir?"»** Bu şiddətindən və əzab-əziyyətindən insanları dəhşətə gətirən qiyamət günüdür. Bu gün hər bir peyğəmbər haqqı təbliğ etdiyinə dair ümmətinə şahidlik edəcəkdir.

13 **«"Ayırd ediləcəyi günə qədər!"»** Cənnət əhlinin cəhənnəm əhlindən ayırd ediləcəyi günə qədər.

14 **«Nə bilirsən ki, nədir o ayırd etmə günü?!»** Bu çox dəhşətli bir gündür. Bunu təsəvvürünə gətirə bilməzsən.

15 **«O gün vay halına yalan sayanların!»**

16 **«Məgər Biz, əvvəlkiləri məhv etmədikmi?!»** Onlar peyğəmbərlərini yalançı hesab etdikdə biz onları bu dünyada ikən əzabla həlak etdik.

17 **«Sonra axırda gələnləri də onlara qatacağıq.»** Muhəmmədi (Sallallahu aleyhi və səlləm) təkzib edən Məkkə müşriklərini də bu sıraya qatacağıq.

18 **«Biz, günahkarlarla belə rəftar edirik.»**

19 **«O gün vay halına yalan sayanların!»**

20 **«Məgər sizi bir qatrə zəif sudan *(nütfədən)* yaratmadıqmı?!»**

21 **«Biz, onu möhkəm bir yerdə *(ana bətnində)* saxladıq,»**

22 **«Müəyyən bir vaxta qədər.»** Bu doqquz aylıq hamiləlik vaxtıdır.

23 **«Biz, qadir olduq. Nə gözəl qadir olanlarıq Biz!»** Biz onun əzalarını və zahiri görkəmini tam şəkildə müəyyən etdik. Onun hər bir halı Bizim istədiyimiz kimi olub.

24 **«O gün vay halına yalan sayanların!»**

25 **«Məgər Biz yeri məskən etmədikmi»**

26 **«Həm dirilərə, həm də ölülərə?!»** Sağ olarkən yerin üstündə, öldükdən sonra isə, yerin altında yaşayırsınız.

27 **«Biz orada möhkəm durmuş uca dağlar yaratdıq və sizə şirin su içirtdik.»** Bütün bunlar yenidən dirilməkdən daha böyük əməllərdir.

28 **«O gün vay halına yalan sayanların!»**

29 **«"Girin, yalan hesab etdiyiniz**

**cəhənnəm əzabının içinə!»**
30 **«Girin, üç qola ayrılmış kölgəsinə!"»**
31 **«O, nə kölgəlik olar, nə də alovdan qoruyar.»** Onun kölgəsi dünyadakı kölgə kimi sərinlik verməz, yaxud cəhənnəmin istisini dəf etməz. Bu vəziyyət haqq-hesab başlayana qədər davam edəcəkdir.
32 **«O, bir saray boyda qığılcımlar saçar.»**
33 **«O, sanki qara dəvədir.»**
34 **«O gün vay halına yalan sayanların!»**
35 **«Bu elə bir gündür ki, danışa bilməzlər.»**
36 **«Onlara üzr istəməyə izin də verilməz.»**
37 **«O gün vay halına yalan sayanların!»**
38 **«Bu sizi də, əvvəlkiləri də bir yerə topladığımız ayırd etmə günüdür!»** Bu gün onlara deyiləcəkdir: Bu gün məxluqatın ayırd edildiyi, haqqın batildən seçilən günüdür. Ey qureyşli müşriklər! Baxın, sizi də, əvvəlki ümmətlərdən kafir olanlarla bir yerə toplamışıq.
39 **«Bir hiyləniz varsa, Mənə qarşı qurun görək!»**
40 **«O gün vay halına yalan sayanların!»**
41 **«Həqiqətən müttəqilər, kölgəliklərdə və çeşmələr başında,»**
42 **«İstədikləri meyvə içində olacaqlar!»**
43 **«"Etdiyiniz əməllərə görə nuşcanlıqla yeyin-için!»**
44 **«Biz yaxşı əməl sahiblərini belə mükafatlandırırıq!"»**
45 **«O gün vay halına yalan sayanların!»**
46 **«Yeyin və bir az kef çəkin. Həqiqətən siz, günahkarlarsınız!»** Onların yeyib-içib kef çəkməkləri bu dünyada qalacaqdır.
47 **«O gün vay halına yalan sayanların!»**
48 **«Onlara: "Namaz qılın!" – deyildiyi zaman namaz qılmazlar!»**
49 **«O gün vay halına yalan sayanların!»**
50 **«Ona da inanmayandan sonra daha hansı kəlama inanacaqlar?!»** Əgər onlar bu Qurana iman etmirlərsə, başqa kitaba necə inana bilərlər?!

## ən-Nəbə surəsi 78

*(Xəbər)*

1 **«Bir-birindən nə haqqında soruşurlar?»** Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) peyğəmbərliyə başladıqda müşriklərə tövhid və öldükdən sonra dirilmək haqqında məlumat verdi, onlara Quran ayələrini oxudu. Bunu eşidən müşriklər öz aralarında: *"Muhəmmədə nə olub, o nə dini gətirib?"* – deyə soruşduqda uca Allah bu ayəni nazil etdi.
2 **«Böyük bir xəbər haqqında!»** soruşurlar. Bu böyük şeylərdən xəbər verən Qurandır. Çünki Quran tövhid, Peyğəmbərin təsdiqi, ölümdən sonra dirilmək və haqq-hesaba çəkilmək kimi böyük işlərdən xəbər verir.

أَلَمْ نَخْلُقكُّم مِّن مَّآءٍ مَّهِينٍ ﴿٢٠﴾ فَجَعَلْنَٰهُ فِى قَرَارٍ مَّكِينٍ ﴿٢١﴾ إِلَىٰ قَدَرٍ
مَّعْلُومٍ ﴿٢٢﴾ فَقَدَرْنَا فَنِعْمَ ٱلْقَٰدِرُونَ ﴿٢٣﴾ وَيْلٌ يَوْمَئِذٍ لِّلْمُكَذِّبِينَ ﴿٢٤﴾
أَلَمْ نَجْعَلِ ٱلْأَرْضَ كِفَاتًا ﴿٢٥﴾ أَحْيَآءً وَأَمْوَٰتًا ﴿٢٦﴾ وَجَعَلْنَا فِيهَا رَوَٰسِىَ
شَٰمِخَٰتٍ وَأَسْقَيْنَٰكُم مَّآءً فُرَاتًا ﴿٢٧﴾ وَيْلٌ يَوْمَئِذٍ لِّلْمُكَذِّبِينَ ﴿٢٨﴾
ٱنطَلِقُوٓا۟ إِلَىٰ مَا كُنتُم بِهِۦ تُكَذِّبُونَ ﴿٢٩﴾ ٱنطَلِقُوٓا۟ إِلَىٰ ظِلٍّ ذِى ثَلَٰثِ
شُعَبٍ ﴿٣٠﴾ لَّا ظَلِيلٍ وَلَا يُغْنِى مِنَ ٱللَّهَبِ ﴿٣١﴾ إِنَّهَا تَرْمِى بِشَرَرٍ
كَٱلْقَصْرِ ﴿٣٢﴾ كَأَنَّهُۥ جِمَٰلَتٌ صُفْرٌ ﴿٣٣﴾ وَيْلٌ يَوْمَئِذٍ لِّلْمُكَذِّبِينَ ﴿٣٤﴾
هَٰذَا يَوْمُ لَا يَنطِقُونَ ﴿٣٥﴾ وَلَا يُؤْذَنُ لَهُمْ فَيَعْتَذِرُونَ ﴿٣٦﴾ وَيْلٌ يَوْمَئِذٍ
لِّلْمُكَذِّبِينَ ﴿٣٧﴾ هَٰذَا يَوْمُ ٱلْفَصْلِ جَمَعْنَٰكُمْ وَٱلْأَوَّلِينَ ﴿٣٨﴾ فَإِن كَانَ
لَكُمْ كَيْدٌ فَكِيدُونِ ﴿٣٩﴾ وَيْلٌ يَوْمَئِذٍ لِّلْمُكَذِّبِينَ ﴿٤٠﴾ إِنَّ ٱلْمُتَّقِينَ فِى
ظِلَٰلٍ وَعُيُونٍ ﴿٤١﴾ وَفَوَٰكِهَ مِمَّا يَشْتَهُونَ ﴿٤٢﴾ كُلُوا۟ وَٱشْرَبُوا۟ هَنِيٓـًٔا
بِمَا كُنتُمْ تَعْمَلُونَ ﴿٤٣﴾ إِنَّا كَذَٰلِكَ نَجْزِى ٱلْمُحْسِنِينَ ﴿٤٤﴾ وَيْلٌ يَوْمَئِذٍ
لِّلْمُكَذِّبِينَ ﴿٤٥﴾ كُلُوا۟ وَتَمَتَّعُوا۟ قَلِيلًا إِنَّكُم مُّجْرِمُونَ ﴿٤٦﴾ وَيْلٌ يَوْمَئِذٍ
لِّلْمُكَذِّبِينَ ﴿٤٧﴾ وَإِذَا قِيلَ لَهُمُ ٱرْكَعُوا۟ لَا يَرْكَعُونَ ﴿٤٨﴾ وَيْلٌ
يَوْمَئِذٍ لِّلْمُكَذِّبِينَ ﴿٤٩﴾ فَبِأَىِّ حَدِيثٍۭ بَعْدَهُۥ يُؤْمِنُونَ ﴿٥٠﴾

3 **«Elə bir xəbər ki, onun barəsində ixtilafdadırlar.»** Onlar Quran barəsində ixtilafa düşüb bəziləri onun sehr, digərləri şer, bir başqaları cadu və əvvəlkilərin əfsanələri olduğunu iddia edirdilər.
4 **«Xeyr, onlar mütləq biləcəklər!»** Onlar bu yalanın acı aqibətini biləcəklər.
5 **«Bir də xeyr, onlar mütləq biləcəklər!»** Bu təkrar onları xəbərdar etmək və qorxutmaq üçün deyilmişdir.
6 **«Məgər Biz yeri döşək etmədikmi?!»**
7 **«Dağları da dirək?!»**
8 **«Biz sizləri cüt-cüt yaratdıq.»** Kişi və qadınlardan ibarət yaratdıq.
9 **«Yuxunuzu da istirahət etdik.»**
10 **«Biz gecəni örtük etdik.»** Paltara büründüyünüz kimi, gecəni də elə bürünən libas etdik.
11 **«Gündüzü isə dolanışlıq vaxtı etdik.»** Gündüzü isə işıqlı etdik ki, ruzi dalınca gedib, Allahın sizə qismət etdiyi ruzini əldə edə biləsiniz.
12 **«Üstünüzdə yeddi qat möhkəm göy qurduq.»**
13 **«Sizin üçün çox parlaq və qaynar bir çıxar yaratdıq.»** Bu günəşdir.





## سُورَةُ النَّبَإِ

ترتيبها ٧٨ — آياتها ٤٠

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

عَمَّ يَتَسَآءَلُونَ ١ عَنِ ٱلنَّبَإِ ٱلْعَظِيمِ ٢ ٱلَّذِى هُمْ فِيهِ مُخْتَلِفُونَ ٣
كَلَّا سَيَعْلَمُونَ ٤ ثُمَّ كَلَّا سَيَعْلَمُونَ ٥ أَلَمْ نَجْعَلِ ٱلْأَرْضَ مِهَٰدًا ٦
وَٱلْجِبَالَ أَوْتَادًا ٧ وَخَلَقْنَٰكُمْ أَزْوَٰجًا ٨ وَجَعَلْنَا نَوْمَكُمْ سُبَاتًا
٩ وَجَعَلْنَا ٱلَّيْلَ لِبَاسًا ١٠ وَجَعَلْنَا ٱلنَّهَارَ مَعَاشًا ١١ وَبَنَيْنَا
فَوْقَكُمْ سَبْعًا شِدَادًا ١٢ وَجَعَلْنَا سِرَاجًا وَهَّاجًا ١٣ وَأَنزَلْنَا
مِنَ ٱلْمُعْصِرَٰتِ مَآءً ثَجَّاجًا ١٤ لِّنُخْرِجَ بِهِۦ حَبًّا وَنَبَاتًا ١٥ وَجَنَّٰتٍ
أَلْفَافًا ١٦ إِنَّ يَوْمَ ٱلْفَصْلِ كَانَ مِيقَٰتًا ١٧ يَوْمَ يُنفَخُ فِى ٱلصُّورِ
فَتَأْتُونَ أَفْوَاجًا ١٨ وَفُتِحَتِ ٱلسَّمَآءُ فَكَانَتْ أَبْوَٰبًا ١٩ وَسُيِّرَتِ
ٱلْجِبَالُ فَكَانَتْ سَرَابًا ٢٠ إِنَّ جَهَنَّمَ كَانَتْ مِرْصَادًا ٢١ لِّلطَّٰغِينَ
مَـَٔابًا ٢٢ لَّٰبِثِينَ فِيهَآ أَحْقَابًا ٢٣ لَّا يَذُوقُونَ فِيهَا بَرْدًا وَلَا شَرَابًا
٢٤ إِلَّا حَمِيمًا وَغَسَّاقًا ٢٥ جَزَآءً وِفَاقًا ٢٦ إِنَّهُمْ كَانُوا۟
لَا يَرْجُونَ حِسَابًا ٢٧ وَكَذَّبُوا۟ بِـَٔايَٰتِنَا كِذَّابًا ٢٨ وَكُلَّ شَىْءٍ
أَحْصَيْنَٰهُ كِتَٰبًا ٢٩ فَذُوقُوا۟ فَلَن نَّزِيدَكُمْ إِلَّا عَذَابًا ٣٠

14 **﴾Buludlardan şırıl-şırıl tökülən yağmur endirdik ki,﴿**

15 **﴾Onunla dən və bitki yetişdirək,﴿** Yağış vasitəsi ilə sizin üçün buğda, arpa, çəltik və s. dənli bitkilər, heyvanlar üçün ot və digər bitkiləri yetişdiririk.

16 **﴾Eləcə də sarmaşan bağlar﴿** yetişdirək. Bu bağların ağacları o qədər sıxdır ki, budaqları bir-birinə dolaşmış haldadır.

17 **﴾Həqiqətən, ayırd etmə günü bir vaxtdır!﴿** Qiyamət günü əməllərin əvəzi verilən, savab və cəza təyin olunan vədə günüdür. Bu günün ayırd etmə günü adlandırılması cənnət əhlinin cəhənnəm əhlindən ayırd edilməsinə görədir.

18 **﴾Sur çalınacağı gün dəstə-dəstə gələcəksiniz.﴿** Sur İsrafilin çalacağı buynuza bənzər alətdir. Sura üfürdükdən sonra insanlar dəstə-dəstə məhşər meydanına gələcəklər.

19 **﴾Göy qapı-qapı açılacaqdır.﴿** Mələklərin enməsi üçün səmada qapıya bənzər yarıqlar açılacaqdır.

20 **﴾Dağlar yerindən qopardılıb ilğıma dönəcəkdir.﴿**

21 **﴾Həqiqətən Cəhənnəm, pusqudur!﴿** Cəhənnəm gözətçiləri əzab vermək üçün kafirləri gözləyəcəklər.

22 **﴾O, azğınların məskənidir.﴿**

23 **﴾Onlar orada sonsuz müddət qalacaqlar.﴿**

24 **﴾Onlar orada nə bir sərinlik, nə də içməyə bir şey tapacaqlar;﴿**

25 **﴾Qaynar sudan və irindən başqa!-﴿** heç nə tapmayacaqlar.

26 **﴾Uyğun cəza olaraq.﴿** Bu əzab onların əməllərinə uyğundur. Allaha şərik qoşmaqdan böyük günah, cəhənnəm atəşindən isə böyük əzab yoxdur. Onların dünyada etdikləri əməlləri pis olduğu üçün Allah da onlara pis gün göstərmişdir.

27 **﴾Çünki onlar, haqq-hesab çəkiləcəyinə ümid bəsləmirdilər.﴿** Onlar savab qazanmağa can atmaz, günahdan qorxmazdılar.Çünki onlar, öldükdən sonra, diriləcəklərinə iman gətirmirdilər.

28 **﴾Ayələrimizi də elə hey təkzib edirdilər.﴿**

29 **﴾Biz hər şeyi sayıb yazmışıq.﴿** Hər şeyi Lövhi-Məhfuzda yazmışıq. Bəzi təfsirçilərin fikrinə görə bu ayə mələklərin yazdıqları əməllərə işarədir.

30 **﴾İndi dadın əzabı. Biz, sizə əzabdan başqa, bir şey artırmayacağıq!﴿**

31 **﴾Həqiqətən, müttəqilərin nicat yeri,﴿** cəhənnəmə düşmədən cənnətə girməkdir.

32 **﴾Bağçalar və üzüm bağları,﴿**

33 **﴾Sinələri yenicə qabarmış həmyaşıd qızlar.﴿** Gümrah və qədd-qaməti yerində olan gənc qızlar onların intizarındadır.

34 **﴾Dolu qədəhlər gözləyir!﴿** Şərab ilə dolu qədəhlər öz sahiblərini gözləyir.

35 **﴾Onlar orada nə boş söz, nə də yalan eşidəcəklər.﴿** Orada batil sözlər danışılmaz, bir-birlərini yalançı çıxarmazlar.

36 **﴾Rəbbindən olan mükafat, artıqlaması ilə verilən bəxşişdir -﴿** Uca Allah onlara əmr etdiyi işlərin müqabilində mükafatlarını artıqlaması ilə verər. Hər bir yaxşı işə on, bəzilərinə yeddi yüzə qədər savab vəd etmişdir. Bəzi insanlara isə, sonsuz savab vəd etmişdir.

37 **﴾Göylərin, yerin və onların arasındakıların Rəhman olan Rəbbindən.﴿** verilən mükafatdır. **﴾Onlar Onun hüzurunda heç bir söz deməyə qadir olmazlar!﴿** Onun izni olmadan heç kəs danışa və ya şəfaətçi ola bilməz.

38 **﴾Ruhun və mələklərin səf-səf duracağı gün Rəhmanın izin verdiyi kimsələrdən və haqq sözü deyənlərdən başqa, heç kəs danışmayacaq.﴿** Qiyamət günü mələklər cərgə-cərgə dayanacaqlar. Ayədə deyilən ruh mələklərdən biri, yaxud Cəbrail və ya

Allahın qeyri mələklərdən olan qoşunudur. Onlar yalnız Allahın icazə verdiyi halda danışar və Onun icazə verdiyi insanlara şəfaətçi olub kömək edə bilərlər. Həmin o insan dünyada ikən haqq tövhid etiqadına şahidlik edib onu yaşayan insan olacaqdır.

39 **﴾Bu, haqq olan gündür. İstəyən, Rəbbi yanında özünə sığınacaq edər!﴿** Onların bu halda dayanacaqları gün haqqdır, mütləq olacaqdır. Kim bu mərhəmətə qovuşmaq istəsə, saleh əməllər görməklə Rəbbi yanında özünə sığınacaq edər.

40 **﴾Həqiqətən Biz, sizi yaxın bir əzabla qorxutduq. O gün insan öz əlləri ilə etdiyi əməlləri görəcək, kafir isə: “Kaş torpaq olaydım!” – deyəcəkdir.﴿** İnsan bu dünyada etdiyi hər bir əməlinin şahidi olacaqdır. Kafirlər etdikləri əməllərinin cəzasının nə olacağını bildikdə torpağa dönmək arzusuna düşəcəklər.

## ən-Naziat surəsi 79

### *(ruhları çıxaranlar)*

1 **﴾And olsun kafirlərin canını zorla alanlara;﴿** Uca Allah kafirlərin bədənindən ruhlarını dartılmış yay kimi çıxardan mələklərə and içir. Kafirlərin ruhları çox çətinliklə, yundan qoparılan tikan kimi çıxarılar.

2 **﴾And olsun möminlərin canını rahatlıqla alanlara;﴿** Möminlərin canından isə, çox asanlıqla çıxar.

3 **﴾And olsun sürətlə üzənlərə;﴿** Allahın əmrinə tələsən mələklər səmadan enərkən yaxud səmaya qalxarkən sürətlə üzərək hərəkət edərlər.

4 **﴾And olsun bir-birini ötdükcə ötənlərə;﴿** Mələklər Allahın əmrini icra etmək və möminlərin ruhunu cənnətə çatdırmaq üçün bir-birini ötərlər.

5 **﴾And olsun işə əncam çəkənlərə.﴿** Mələklərin işlərə əncam çəkməsi halalı və haramı insanlara çatdırmaq, yer əhalisini yağış, külək və s. ilə təmin etməkdir.

6 **﴾O gün sarsılan sarsılacaq.﴿** Birinci dəfə Sura üfürüləndə bütün məxluqat öləcəkdir.

7 **﴾Onun ardınca bir sarsıntı da olacaqdır!﴿** Sur ikinci dəfə üfürüləcək və ölənlər diriləcəklər.

8 **﴾O gün ürəklər qorxub titrəyəcək,﴿** Qiyamətin dəhşətini görənlər təlaşa düşəcəklər.

9 **﴾Gözləri zəlilcəsinə yerə dikiləcəkdir.﴿** Bu dəhşətli mənzərələri görən kafirlərin gözlərində məyusluq görünəcəkdir.

10 **﴾Onlar deyirlər: “Doğrudanmı biz, əvvəlki vəziyyətimizə qaytarılacağıq?!﴿** Ölümdən sonra dirilməyi inkar edənlərə "bir gün siz diriləcəksiniz" dedikdə belə cavab

إِنَّ لِلْمُتَّقِينَ مَفَازًا ﴿٣١﴾ حَدَآئِقَ وَأَعْنَٰبًا ﴿٣٢﴾ وَكَوَاعِبَ أَتْرَابًا ﴿٣٣﴾ وَكَأْسًا
دِهَاقًا ﴿٣٤﴾ لَّا يَسْمَعُونَ فِيهَا لَغْوًا وَلَا كِذَّٰبًا ﴿٣٥﴾ جَزَآءً مِّن رَّبِّكَ عَطَآءً
حِسَابًا ﴿٣٦﴾ رَّبِّ ٱلسَّمَٰوَٰتِ وَٱلْأَرْضِ وَمَا بَيْنَهُمَا ٱلرَّحْمَٰنِ لَا يَمْلِكُونَ
مِنْهُ خِطَابًا ﴿٣٧﴾ يَوْمَ يَقُومُ ٱلرُّوحُ وَٱلْمَلَٰٓئِكَةُ صَفًّا لَّا يَتَكَلَّمُونَ
إِلَّا مَنْ أَذِنَ لَهُ ٱلرَّحْمَٰنُ وَقَالَ صَوَابًا ﴿٣٨﴾ ذَٰلِكَ ٱلْيَوْمُ ٱلْحَقُّ فَمَن
شَآءَ ٱتَّخَذَ إِلَىٰ رَبِّهِۦ مَـَٔابًا ﴿٣٩﴾ إِنَّآ أَنذَرْنَٰكُمْ عَذَابًا قَرِيبًا يَوْمَ
يَنظُرُ ٱلْمَرْءُ مَا قَدَّمَتْ يَدَاهُ وَيَقُولُ ٱلْكَافِرُ يَٰلَيْتَنِى كُنتُ تُرَٰبًا ﴿٤٠﴾

ترتيبها ٧٩ — سُورَةُ النَّازِعَاتِ — آياتها ٤٦

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

وَٱلنَّٰزِعَٰتِ غَرْقًا ﴿١﴾ وَٱلنَّٰشِطَٰتِ نَشْطًا ﴿٢﴾ وَٱلسَّٰبِحَٰتِ سَبْحًا
﴿٣﴾ فَٱلسَّٰبِقَٰتِ سَبْقًا ﴿٤﴾ فَٱلْمُدَبِّرَٰتِ أَمْرًا ﴿٥﴾ يَوْمَ تَرْجُفُ ٱلرَّاجِفَةُ
﴿٦﴾ تَتْبَعُهَا ٱلرَّادِفَةُ ﴿٧﴾ قُلُوبٌ يَوْمَئِذٍ وَاجِفَةٌ ﴿٨﴾ أَبْصَٰرُهَا
خَٰشِعَةٌ ﴿٩﴾ يَقُولُونَ أَءِنَّا لَمَرْدُودُونَ فِى ٱلْحَافِرَةِ ﴿١٠﴾ أَءِذَا كُنَّا
عِظَٰمًا نَّخِرَةً ﴿١١﴾ قَالُوا۟ تِلْكَ إِذًا كَرَّةٌ خَاسِرَةٌ ﴿١٢﴾ فَإِنَّمَا هِىَ زَجْرَةٌ
وَٰحِدَةٌ ﴿١٣﴾ فَإِذَا هُم بِٱلسَّاهِرَةِ ﴿١٤﴾ هَلْ أَتَىٰكَ حَدِيثُ مُوسَىٰٓ ﴿١٥﴾

verərlər: Məgər biz əvvəlki halımıza qayıdacaq, öldükdən və qəbir çuxurunda çürüdükdən sonra diriləcəyik?!

11 **﴾Özü də çürümüş sümüklər olduğumuz zamanmı?!”﴿**

12 **﴾Onlar deyirlər: “Elə isə bu, ziyanlı dönüşdür.﴿** Əgər öldükdən sonra dirilsək, o zaman Muhəmmədin dediklərinə qarşı çıxdığımıza görə ziyan çəkmiş olarıq.

13 **﴾Doğrudan da, o, ancaq tək bir dəhşətli səsdir!﴿** İkinci dəfə Sur üfürüləcək və təkcə bu səslə ölülər diriləcəkdir. Ölüləri diriltmək üçün bu yetərlidir.

14 **﴾Onlar dərhal dümdüz bir yerdə olacaqlar!﴿** Qəbirlərindən yer üzünə çıxacaqlar.

15 **﴾Musanın hekayəti sənə gəlib çatdımı?﴿** Musa ilə Firon arasında baş verənlərdən bəhs edən hekayət sənə çatdırılmışdır.

16 **﴾O zaman ki, Rəbbi ona müqəddəs Tuva vadisində belə xitab etdi:﴿** *(Tuva Sina dağında yerləşən vadinin adıdır. Burada Musaya vəhy gəlmişdi.)*

17 **﴾“Fironun yanına get. Çünki o, çox azmışdır.﴿**

18 **﴾Və de: “Təmizlənmək istəyirsənmi?﴿** Sən onun yanına çatdıqda ona "Sən şirkdən,

إِذْ نَادَاهُ رَبُّهُ بِالْوَادِ الْمُقَدَّسِ طُوًى ﴿١٦﴾ اذْهَبْ إِلَىٰ فِرْعَوْنَ إِنَّهُ طَغَىٰ ﴿١٧﴾
فَقُلْ هَل لَّكَ إِلَىٰ أَن تَزَكَّىٰ ﴿١٨﴾ وَأَهْدِيَكَ إِلَىٰ رَبِّكَ فَتَخْشَىٰ ﴿١٩﴾ فَأَرَاهُ
الْآيَةَ الْكُبْرَىٰ ﴿٢٠﴾ فَكَذَّبَ وَعَصَىٰ ﴿٢١﴾ ثُمَّ أَدْبَرَ يَسْعَىٰ ﴿٢٢﴾ فَحَشَرَ
فَنَادَىٰ ﴿٢٣﴾ فَقَالَ أَنَا رَبُّكُمُ الْأَعْلَىٰ ﴿٢٤﴾ فَأَخَذَهُ اللَّهُ نَكَالَ الْآخِرَةِ وَالْأُولَىٰ
﴿٢٥﴾ إِنَّ فِي ذَٰلِكَ لَعِبْرَةً لِّمَن يَخْشَىٰ ﴿٢٦﴾ أَأَنتُمْ أَشَدُّ خَلْقًا أَمِ السَّمَاءُ بَنَاهَا
﴿٢٧﴾ رَفَعَ سَمْكَهَا فَسَوَّاهَا ﴿٢٨﴾ وَأَغْطَشَ لَيْلَهَا وَأَخْرَجَ ضُحَاهَا ﴿٢٩﴾
وَالْأَرْضَ بَعْدَ ذَٰلِكَ دَحَاهَا ﴿٣٠﴾ أَخْرَجَ مِنْهَا مَاءَهَا وَمَرْعَاهَا ﴿٣١﴾
وَالْجِبَالَ أَرْسَاهَا ﴿٣٢﴾ مَتَاعًا لَّكُمْ وَلِأَنْعَامِكُمْ ﴿٣٣﴾ فَإِذَا جَاءَتِ الطَّامَّةُ
الْكُبْرَىٰ ﴿٣٤﴾ يَوْمَ يَتَذَكَّرُ الْإِنسَانُ مَا سَعَىٰ ﴿٣٥﴾ وَبُرِّزَتِ الْجَحِيمُ
لِمَن يَرَىٰ ﴿٣٦﴾ فَأَمَّا مَن طَغَىٰ ﴿٣٧﴾ وَآثَرَ الْحَيَاةَ الدُّنْيَا ﴿٣٨﴾ فَإِنَّ الْجَحِيمَ
هِيَ الْمَأْوَىٰ ﴿٣٩﴾ وَأَمَّا مَنْ خَافَ مَقَامَ رَبِّهِ وَنَهَى النَّفْسَ عَنِ الْهَوَىٰ
﴿٤٠﴾ فَإِنَّ الْجَنَّةَ هِيَ الْمَأْوَىٰ ﴿٤١﴾ يَسْأَلُونَكَ عَنِ السَّاعَةِ أَيَّانَ مُرْسَاهَا
﴿٤٢﴾ فِيمَ أَنتَ مِن ذِكْرَاهَا ﴿٤٣﴾ إِلَىٰ رَبِّكَ مُنتَهَاهَا ﴿٤٤﴾ إِنَّمَا أَنتَ مُنذِرُ
مَن يَخْشَاهَا ﴿٤٥﴾ كَأَنَّهُمْ يَوْمَ يَرَوْنَهَا لَمْ يَلْبَثُوا إِلَّا عَشِيَّةً أَوْ ضُحَاهَا ﴿٤٦﴾

ترتيبها ٨٠ — سُورَةُ عَبَسَ — آياتها ٤٢

günahlardan təmizlənmək istəyirsənmi?" Çünki Musaya onunla mülayim danışmaq əmr olunmuşdu.
19 **«Səni Rəbbinə tərəf gətirimmi ki, qorxasan?"»** Rəbbinə ibadət etmək, Ona şərik qoşmamaq və əzabından qorxmaq üçün sənə yol göstərirəm.
20 **«və ona ən böyük möcüzəni göstərdi.»** Böyük möcüzə onun əsasının ilana dönməsi, yaxud əlinin bir anda ağappaq olmasıdır.
21 **«Lakin təkzib edib asi oldu.»**
22 **«Sonra geri dönüb tələsdi.»** İman gətirməkdən boyun qaçırdıb yer üzündə fəsad törətdi və Musanın dediklərinə qarşı mübarizəyə başladı.
23 **«Və toplayıb belə xitab etdi:»** Ordusunu döyüşə, sehrbazları mübahisəyə, insanları isə əyani şahid olmağa çağırdı.
24 **«"Həqiqətən mən, sizin ən uca Rəbbinizəm!"»** Məndən yüksəkdə heç bir ilah yoxdur.
25 **«Allah da onu axirət və dünya əzabına giriftar etdi.»** Dünya əzabı suda boğulması, axirət əzabı isə şiddətli cəhənnəm atəşidir. Bu ona görə deyilir ki, eşidənlər ibrət alsınlar.
26 **«Şübhəsiz ki, bunda Allahdan qorxan kimsələr üçün ibrət dərsi vardır.»** Fironun başına gələnlər qəlbində Allah qorxusu olanlar üçün bir ibrət dərsidir.
27 **«Sizi yaratmaq çətindir, yoxsa göyü? Allah onu yaratdı;»** Sizə görə sizi öldükdən sonra diriltmək daha çətindir, yoxsa göyü yaratmaq? Bu böyük yaradılış nümunəsi bir möcüzə və açıq-aşkar nümunədir.
28 **«Qübbəsini ucaltdı, düzəldib nizama saldı;»** Uca Allah göyü yerin üzərində ucaldılmış bina kimi etmişdir. Bu yaradılışda heç bir nasazlıq, əyrilik, yarıq və ya dəlik yoxdur.
29 **«Gecəsini qaranlıq, gündüzünü işıqlı etdi?!»**
30 **«Bundan sonra da yeri döşəyib düzəltdi.»** Göyü yaratdıqdan sonra yeri döşəyib düzəltdi.
31 **«Ondan suyunu və otlağını çıxartdı.»** Bulaqları və çayları, canlıların qida mənbəyi olan otları yerdən çıxartdı.
32 **«Dağları yerləşdirdi.»** Orada yaşayanların üzərinə aşmasın deyə dağları yerə basdırılmış dirək kimi etdi.
33 **«Bunlar sizin və heyvanlarınızın istifadəsi üçündür.»**
34 **«O böyük bəla gələndə,»** Hər bir ləzzəti məhv edən qiyamət qopub ikinci dəfə Sur üfürüldükdə, cənnət əhli cənnətə, cəhənnəm əhli isə cəhənnəmə yollanacaq.
35 **«O gün insan nələr etdiyini yadına salacaqdır.»**
36 **«Cəhənnəm də hər görənə görsədiləcəkdir.»** Cəhənnəm odu heç kəsdən gizli qalan deyil.
37 **«Kim azğınlıq etmişsə,»** Küfr və asilikdə həddini aşmışdısa,
38 **«Dünyanı üstün tutmuşsa,»** Bu həyatı axirət həyatından üstün sayaraq, ona heç bir hazırlıq görməmişdisə,
39 **«Şübhəsiz ki, onun məskəni Cəhənnəmdir!»** Onun başqa gedəcəyi yer yoxdur.
40 **«Amma kim Rəbbinin hüzurunda durmaqdan qorxmuş və nəfsinə istəyini qadağan etmişsə,»** Qiyamət günü Rəbbinin hüzurunda dayanacağından qorxaraq asiliklərdən və haram işlərdən əl çəkmişdirsə,
41 **«Həqiqətən onun yurdu Cənnətdir!»**
42 **«Səndən o saatın nə vaxt gələcəyi barəsində soruşarlar.»**
43 **«Sən onu nə bilirsən?!»**
44 **«Onu sonuna qədər bilmək ancaq sənin Rəbbinə məxsusdur.»** Onun nə zaman qopacağını Allahdan başqa heç kəs bilmir.
45 **«Sən ancaq ondan xəbərdar edib çəkindirənsən!»** Sən qiyamətin qopacağından qorxanları xəbərdar edənsən.

(46) **«Onu gördükləri gün yalnız bir axşam, yaxud bir səhər qaldıqlarını sanacaqlar!»** Dünyada ikən qiyaməti görənlər, yaxud qəbirdən dirilib çıxanlar orada bir axşam, yaxud bir səhər qaldıqlarını düşünəcəklər.

# Abəsə surəsi 80

*(qaşqabağını tökdü)*

(1) **«Qaşqabağını töküb üzünü çevirdi.»**
(2) **«Yanına korun gəlməsindən dolayı.»** Bir nəfər kor kişi Peyğəmbərin (Sallallahu aleyhi və səlləm) yanına gəlib söz soruşmaq istədikdə Peyğəmbər (Sallallahu aleyhi və səlləm) üz-gözünü turşudub, ondan üz döndərdi. Qureyş qəbiləsindən bir dəstə əşraf Peyğəmbərin (Sallallahu aleyhi və səlləm) yanına gəlmişdi. Peyğəmbər (Sallallahu aleyhi və səlləm) onların islamı qəbul etmələrini arzu edirdi. Elə bu zaman dəyərli səhabələrdən olan Abdullah ibn Umm Məktum adlı bir nəfər kor kişi onun yanına gəldi. Kor kişi onun (Sallallahu aleyhi və səlləm) sözünü kəsməsin deyə üzünü ondan çevirdi.
(3) **«Nə bilirsən, bəlkə də, o təmizlənəcəkdir!»** Ey Muhəmməd nə bilirsən, bəlkə də, o kor kişi səndən öyrənmək istədiyi yaxşı əməlləri ilə günahdan təmizlənəcəkdi.
(4) **«Yaxud öyüd dinləyəcək və bu öyüd ona fayda verəcəkdir!»** Sənin vəzini dinləyəcək və ibrət alacaqdı.
(5) **«Ehtiyac hiss etməyənə gəldikdə,»**
(6) **«Sən üzünü ona tərəf çevirirsən.»** Sən onun sözünü dinləyirsən. O isə, sənə möhtac olmadığını və sənin təbliğ etdiyin dindən üz döndərdiyini biruzə verir.
(7) **«Onun təmizlənməsindən sənə nə?!»** Onun hidayətə qovuşmamasından, islamı qəbul etməməsindən sənə nə?! Sənin vəzifən haqqı çatdırmaqdır. Bu halda olan kafirlərin işi səni maraqlandırmasın.
(8) **«Yüyürə-yüyürə sənin yanına gələn,»** səndən öyüd-nəsihət istəyən,
(9) **«Və Allahdan qorxan kimsəyə gəldikdə isə,»**
(10) **«Sən ondan üz çevirirsən!»**
(11) **«Xeyr! Həqiqətən bu, bir öyüd-nəsihətdir.»** Bu ayələr, yaxud bu surə bir xatırlatmadır. Sən bu hadisədən ibrət dərsi almalı, səhvini etiraf edib, müvafiq addım atmalısan.
(12) **«Kim istəsə, ondan öyüd alar.»**
(13) **«Çox möhtərəm səhifələrdə -»** Bu öyüd-nəsihətlər elm və hikmət ilə dolu möhtərəm kitabdadır. Çünki bu kitab Lövhi Məhfuzdan enmişdir.
(14) **«Yüksək, tərtəmiz səhifələrdədir.»** Allah yanında bu kitabın çox böyük qədir-qiyməti vardır. Bu kitaba yalnız pak olanlar toxunarlar. Bu kitab şeytanlardan və kafirlərdən qorunan kitabdır.

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ
عَبَسَ وَتَوَلَّىٰٓ ﴿١﴾ أَن جَآءَهُ ٱلْأَعْمَىٰ ﴿٢﴾ وَمَا يُدْرِيكَ لَعَلَّهُۥ يَزَّكَّىٰٓ ﴿٣﴾ أَوْ
يَذَّكَّرُ فَتَنفَعَهُ ٱلذِّكْرَىٰٓ ﴿٤﴾ أَمَّا مَنِ ٱسْتَغْنَىٰ ﴿٥﴾ فَأَنتَ لَهُۥ تَصَدَّىٰ ﴿٦﴾
وَمَا عَلَيْكَ أَلَّا يَزَّكَّىٰ ﴿٧﴾ وَأَمَّا مَن جَآءَكَ يَسْعَىٰ ﴿٨﴾ وَهُوَ يَخْشَىٰ ﴿٩﴾ فَأَنتَ
عَنْهُ تَلَهَّىٰ ﴿١٠﴾ كَلَّآ إِنَّهَا تَذْكِرَةٌ ﴿١١﴾ فَمَن شَآءَ ذَكَرَهُۥ ﴿١٢﴾ فِى صُحُفٍ مُّكَرَّمَةٍ
﴿١٣﴾ مَّرْفُوعَةٍ مُّطَهَّرَةٍۭ ﴿١٤﴾ بِأَيْدِى سَفَرَةٍ ﴿١٥﴾ كِرَامٍۭ بَرَرَةٍ ﴿١٦﴾ قُتِلَ ٱلْإِنسَٰنُ
مَآ أَكْفَرَهُۥ ﴿١٧﴾ مِنْ أَىِّ شَىْءٍ خَلَقَهُۥ ﴿١٨﴾ مِن نُّطْفَةٍ خَلَقَهُۥ فَقَدَّرَهُۥ ﴿١٩﴾ ثُمَّ
ٱلسَّبِيلَ يَسَّرَهُۥ ﴿٢٠﴾ ثُمَّ أَمَاتَهُۥ فَأَقْبَرَهُۥ ﴿٢١﴾ ثُمَّ إِذَا شَآءَ أَنشَرَهُۥ ﴿٢٢﴾ كَلَّا لَمَّا
يَقْضِ مَآ أَمَرَهُۥ ﴿٢٣﴾ فَلْيَنظُرِ ٱلْإِنسَٰنُ إِلَىٰ طَعَامِهِۦٓ ﴿٢٤﴾ أَنَّا صَبَبْنَا ٱلْمَآءَ صَبًّا
﴿٢٥﴾ ثُمَّ شَقَقْنَا ٱلْأَرْضَ شَقًّا ﴿٢٦﴾ فَأَنۢبَتْنَا فِيهَا حَبًّا ﴿٢٧﴾ وَعِنَبًا وَقَضْبًا ﴿٢٨﴾
وَزَيْتُونًا وَنَخْلًا ﴿٢٩﴾ وَحَدَآئِقَ غُلْبًا ﴿٣٠﴾ وَفَٰكِهَةً وَأَبًّا ﴿٣١﴾ مَّتَٰعًا لَّكُمْ
وَلِأَنْعَٰمِكُمْ ﴿٣٢﴾ فَإِذَا جَآءَتِ ٱلصَّآخَّةُ ﴿٣٣﴾ يَوْمَ يَفِرُّ ٱلْمَرْءُ مِنْ أَخِيهِ ﴿٣٤﴾
وَأُمِّهِۦ وَأَبِيهِ ﴿٣٥﴾ وَصَٰحِبَتِهِۦ وَبَنِيهِ ﴿٣٦﴾ لِكُلِّ ٱمْرِئٍ مِّنْهُمْ يَوْمَئِذٍ شَأْنٌ
يُغْنِيهِ ﴿٣٧﴾ وُجُوهٌ يَوْمَئِذٍ مُّسْفِرَةٌ ﴿٣٨﴾ ضَاحِكَةٌ مُّسْتَبْشِرَةٌ ﴿٣٩﴾ وَوُجُوهٌ
يَوْمَئِذٍ عَلَيْهَا غَبَرَةٌ ﴿٤٠﴾ تَرْهَقُهَا قَتَرَةٌ ﴿٤١﴾ أُو۟لَٰٓئِكَ هُمُ ٱلْكَفَرَةُ ٱلْفَجَرَةُ ﴿٤٢﴾

(15) **«Elçi mələklərin əlləri ilə.»** bu kitab Allahdan Peyğəmbərlərinə çatdırılar.
(16) **«Çox möhtərəm, çox mütidirlər.»** Bu mələklərin Allah yanında hörmətləri vardır. Onlar Rəbbinə müti, əmrlərinə sadiqdirlər.
(17) **«Ölsün insan! O nə nankordur!»** Kafir insan necə də küfr edəndir!
(18) **«Onu hansı şeydən yaratdı?»** Bu kafir insanı nədən yaratdı?!
(19) **«Nütfədən yaratdı, ona biçim verdi.»** Onu dəyərsiz sudan yaratmışdır. İdrar yolundan ifraz olunan mayedən yaradıldığı halda nə üçün özünü belə təkəbbürlü hesab edir?! Üstəlik ona sağlam bədən, göz, qulaq, əl, ayaq və digər əzaları vermişdir.
(20) **«Sonra onun üçün yolunu asanlaşdırdı.»** Yaxşı və ya pis iş görmək üçün yolunu açıq etdi.
(21) **«Sonra onu öldürüb qəbrə qoydu.»** Öldükdən sonra qurd-quşa yem olmamaq üçün ona qəbir nəsib etmişdir.
(22) **«Sonra da istədiyi vaxt onu dirildəcəkdir.»** Öldükdən sonra onu istədiyi vaxtda dirildəcəkdir.
(23) **«Xeyr, ona buyurduğunu hələ yerinə yetirməmişdir.»** Bəziləri küfr, bəziləri isə asilik edərək, onlara buyurulanı yerinə





سُورَةُ ٱلتَّكْوِيرِ — آياتها ٢٩ — ترتيبها ٨١

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

إِذَا ٱلشَّمْسُ كُوِّرَتْ ١ وَإِذَا ٱلنُّجُومُ ٱنكَدَرَتْ ٢ وَإِذَا ٱلْجِبَالُ
سُيِّرَتْ ٣ وَإِذَا ٱلْعِشَارُ عُطِّلَتْ ٤ وَإِذَا ٱلْوُحُوشُ حُشِرَتْ
٥ وَإِذَا ٱلْبِحَارُ سُجِّرَتْ ٦ وَإِذَا ٱلنُّفُوسُ زُوِّجَتْ ٧ وَإِذَا
ٱلْمَوْءُۥدَةُ سُئِلَتْ ٨ بِأَيِّ ذَنۢبٍ قُتِلَتْ ٩ وَإِذَا ٱلصُّحُفُ نُشِرَتْ
١٠ وَإِذَا ٱلسَّمَآءُ كُشِطَتْ ١١ وَإِذَا ٱلْجَحِيمُ سُعِّرَتْ ١٢ وَإِذَا ٱلْجَنَّةُ
أُزْلِفَتْ ١٣ عَلِمَتْ نَفْسٌ مَّآ أَحْضَرَتْ ١٤ فَلَآ أُقْسِمُ بِٱلْخُنَّسِ ١٥
ٱلْجَوَارِ ٱلْكُنَّسِ ١٦ وَٱلَّيْلِ إِذَا عَسْعَسَ ١٧ وَٱلصُّبْحِ إِذَا تَنَفَّسَ ١٨
إِنَّهُۥ لَقَوْلُ رَسُولٍ كَرِيمٍ ١٩ ذِى قُوَّةٍ عِندَ ذِى ٱلْعَرْشِ مَكِينٍ ٢٠ مُّطَاعٍ
ثَمَّ أَمِينٍ ٢١ وَمَا صَاحِبُكُم بِمَجْنُونٍ ٢٢ وَلَقَدْ رَءَاهُ بِٱلْأُفُقِ ٱلْمُبِينِ
٢٣ وَمَا هُوَ عَلَى ٱلْغَيْبِ بِضَنِينٍ ٢٤ وَمَا هُوَ بِقَوْلِ شَيْطَٰنٍ رَّجِيمٍ ٢٥
فَأَيْنَ تَذْهَبُونَ ٢٦ إِنْ هُوَ إِلَّا ذِكْرٌ لِّلْعَٰلَمِينَ ٢٧ لِمَن شَآءَ مِنكُمْ أَن
يَسْتَقِيمَ ٢٨ وَمَا تَشَآءُونَ إِلَّآ أَن يَشَآءَ ٱللَّهُ رَبُّ ٱلْعَٰلَمِينَ ٢٩

سُورَةُ ٱلْإِنفِطَارِ — آياتها ١٩ — ترتيبها ٨٢

yetirməyiblər. Allahın əmr etdiklərini çox az insan yerinə yetirmişdir.

26 **﴿İnsan hələ bir yeməyinə baxsın!﴾** Həyatda qalması üçün ən əsas amil olan qidanın Allah tərəfindən necə yaradıldığını düşünsün.

25 **﴿Həqiqətən Biz, yağışı bol yağdırdıq.﴾**

24 **﴿Sonra yeri çatdaq-çatdaq yardıq,﴾** Cücərən kiçik və zəif bitki yeri yarıb üzə çıxar.

27 **﴿Orada dənli bitkilər göyərtdik;﴾** Dənli bitkilər cücərib, yenidən dən tökənə qədər orada bitirlər.

28 **﴿Üzüm və yonca;﴾**

29 **﴿Zeytun və xurma bağları;﴾**

30 **﴿Sarmaşan bağçalar;﴾** Sizin üçün bol məhsul verən nəhəng xurma ağacları yetişdirdik.

31 **﴿Meyvələr və ot yetişdirdik.﴾**

32 **﴿Bunlar sizin və heyvanlarınızın istifadəsi üçündür!﴾**

33 **﴿Nəhayət, qulaqları kar edən gələndə,﴾**

34 **﴿O gün insan qaçacaq öz qardaşından;﴾**

35 **﴿Anasından, atasından;﴾**

36 **﴿Zövcəsindən və oğullarından!﴾** Adı çəkilənlər insanın ən yaxın və əziz qohumlarıdır. Yalnız böyük və dəhşətli bir qorxunun qarşısında onlardan qaçmaq olar.

37 **﴿O gün onlardan hər birinin istənilən qədər işi olacaqdır!﴾** Onun diqqətini qohumlarından və digərlərindən yayındıracaq bir iş olacaqdır. Onların öz haqlarından nə isə istəyəcəyindən, pis halına şahid olacaqlarından qorxub qaçacaqdır.

38 **﴿O gün bir çox üzlər parlayacaq,﴾**

39 **﴿Güləcək, sevinəcəkdir.﴾**

40 **﴿O gün bir çox üzlərə isə toz-torpaq qonacaq,﴾**

41 **﴿Onları zülmət bürüyəcəkdir.﴾**

42 **﴿Onlar kafirlər, pozğunlardır!﴾** Üzləri qara olanlar kafirlər, yalançı fasiqlər olacaqdır.

# ət-Təkvir surəsi 81

*(bükülmək)*

1 **﴿Günəş sarınıb bükülecəyi zaman;﴾** Top kimi bükülüb atılacaqdır.

2 **﴿Ulduzlar səpələnəcəyi zaman;﴾** Ulduzlar əriyəcək, yaxud nuru sönəcəkdir.

3 **﴿Dağlar yerlə-yeksan olacağı zaman;﴾** Dağlar havada toza dönüb yerə töküləcəkdir.

4 **﴿Boğaz dəvələr başlı-başına buraxılacağı zaman;﴾** Məhz boğaz dəvənin qeyd olunmasına səbəb ərəblərin bu dəvələri daha çox əzizləməsidir. O gün görəcəkləri şiddət və dəhşət halında belə dəyərli mal-dövləti başsız qoyacaqlar.

5 **﴿Vəhşi heyvanlar bir yerə toplanacağı zaman;﴾** Heyvanlar bir-birilərindən qisas alacaqlar.

6 **﴿Dənizlər od tutub yanacağı zaman;﴾**

7 **﴿Nəfslər qovuşacağı zaman;﴾** Möminlərin nəfsi hurilərə, kafirlərin nəfsi şeytanlara qovuşacaqdır. Həsən əl-Bəsri deyir: *"hər kəs öz tərəfdarına – yəhudi yəhudiyə, nəsrani nəsraniyə, atəşpərəst atəşpərəstə, münafiq münafiqə, möminlər isə möminlərə - qovuşacaqdır"*.

8 **﴿Diri-diri torpağa gömülən körpə qızdan:﴾**

9 **﴿"Axı o hansı günaha görə öldürüldü?"; soruşulacağı zaman;﴾** Cahiliyyət dövründə qız uşağı doğulan ərəb rüsvayçılıqdan və ya yoxsulluqdan qorxaraq, qız körpələri diri-diri basdırardılar. Bu əməli edənlərə etiraz olaraq **"Axı o hansı günaha görə öldürüldü?"** – deyə soruşacaqlar. Onlar heç bir günahları olmadan qətlə yetirilirdilər.

10 **﴿Əməl dəftərləri açılacağı zaman;﴾** Haqq-hesab vermək üçün əməl dəftərləri açılacaq.

11 **﴿Göy qopardılacağı zaman;﴾** Göy parça-parça olub qoparılacaqdır.

12 **﴿Cəhənnəm alovlandırılacağı zaman;﴾** Cəhənnəmi Allahın qəzəbi və adəm oğullarının günahı alovlayacaqdır.

13 **﴿Və Cənnət yaxınlaşdırılacağı zaman;﴾** Müttəqilərə və möminlərə yaxın olacaqdır.

Deyilən bu on iki haldan altısı surənin əvvəlindən **﴿Dənizlər od tutub yanacağı zaman;﴾** ayəsinə qədəri dünyada, digər altısı isə, **﴿Nəfslər qovuşacağı zaman;﴾** ayəsindən bu ayəyə qədəri axirətdə baş verəcəkdir.

14 **﴿Hər kəs nə hazır etdiyini biləcəkdir!﴾** Hər kəs əməl dəftərində xeyirin və ya şərin çox olduğunu biləcəkdir.

15 **﴿And içirəm yanıb sönən ulduzlara;﴾**

16 **﴿Seyr edib gizlənən səyyarələrə;﴾**

17 **﴿Qaralmaqda olan gecəyə;﴾**

18 **﴿Və sökülməkdə olan dan yerinə ki,﴾**

19 **﴿Bu çox möhtərəm olan bir elçinin gətirdiyi kəlamdır.﴾** Uca Allah bu məxluqlarına and içir ki, gördüyünüz Quran Cəbrailin Muhəmmədə (Sallallahu aleyhi və səlləm) vəhy etdiyi Allah kəlamıdır.

20 **﴿Elə bir elçi ki, çox qüvvətlidir; ərşin sahibi yanında çox hörmətlidir.﴾**

21 **﴿itaət edilləndir, həm də etibarlı müvəkkildir.﴾** Mələklər öz aralarında ona müraciət edər, onu dinləyərlər. O, vəhyi və başqa əmrləri qorumaq üçün etibarlıdır.

22 **﴿Həqiqətən sizin dostunuz, divanə deyildir!﴾** Müşriklər onu ən aqil və ən kamil insan olaraq tanıdıqları üçün o, "dost" olaraq qeyd edilmişdir.

23 **﴿And olsun ki, onu açıq üfüqdə gördü.﴾** Muhəmməd (Sallallahu aleyhi və səlləm) Cəbraili olduğu kimi, altı yüz qanadlı görmüşdü. Mücahid deyir: *"Peyğəmbər (Sallallahu aleyhi və səlləm) onu görəndə o, məkkənin şərq tərəfini əhatə edən "Əcyad" adlı yeri bürümüşdü".*

24 **﴿O, qeyb barəsində xəsis deyildir.﴾** Muhəmməd (Sallallahu aleyhi və səlləm) səmadan gələn xəbərləri sizə çatdırmaqda heç vaxt paxıllıq etməz, təbliğatda qüsura yol verməz. Əksinə, o, Allahın yaratdıqlarına dini və şəriəti öyrədir.

25 **﴿O da məlun Şeytanın sözü deyildir.﴾** Bu Quran oğurluqla səsə qulaq asıb, mərmi ulduzlarla atəşə tutulan şeytanların sözü deyildir.

26 **﴿Elə isə hara gedirsiniz?﴾** Sizə təklif olunan bu pak və nurlu yolu qoyub hara gedirsiniz?!

27 **﴿O, aləmlər üçün ancaq bir öyüd-nəsihətdir.﴾**

28 **﴿Eləcə də sizdən doğru-düz olmaq istəyənlər üçün.﴾** ümumiyyətlə, bütün məxluqat üçün öyüd-nəsihətdir.

29 **﴿Aləmlərin Rəbbi olan Allah istəməsə, siz istəyə bilməzsiniz!﴾** Allahın müvəffəqiyyəti və istəyi olmadan siz heç vaxt bu haqq yola düşə bilməzsiniz.

## əl-İnfitar surəsi 82

*(parçalanma)*

1 **﴿Göy parçalanacağı zaman;﴾** Qiyamət günü mələklərin enişi üçün göy parçalanacaq.

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

إِذَا ٱلسَّمَآءُ ٱنفَطَرَتْ ﴿١﴾ وَإِذَا ٱلْكَوَاكِبُ ٱنتَثَرَتْ ﴿٢﴾ وَإِذَا ٱلْبِحَارُ
فُجِّرَتْ ﴿٣﴾ وَإِذَا ٱلْقُبُورُ بُعْثِرَتْ ﴿٤﴾ عَلِمَتْ نَفْسٌ مَّا قَدَّمَتْ
وَأَخَّرَتْ ﴿٥﴾ يَٰٓأَيُّهَا ٱلْإِنسَٰنُ مَا غَرَّكَ بِرَبِّكَ ٱلْكَرِيمِ ﴿٦﴾ ٱلَّذِى
خَلَقَكَ فَسَوَّىٰكَ فَعَدَلَكَ ﴿٧﴾ فِىٓ أَىِّ صُورَةٍ مَّا شَآءَ رَكَّبَكَ ﴿٨﴾
كَلَّا بَلْ تُكَذِّبُونَ بِٱلدِّينِ ﴿٩﴾ وَإِنَّ عَلَيْكُمْ لَحَٰفِظِينَ ﴿١٠﴾ كِرَامًا
كَٰتِبِينَ ﴿١١﴾ يَعْلَمُونَ مَا تَفْعَلُونَ ﴿١٢﴾ إِنَّ ٱلْأَبْرَارَ لَفِى نَعِيمٍ ﴿١٣﴾ وَإِنَّ
ٱلْفُجَّارَ لَفِى جَحِيمٍ ﴿١٤﴾ يَصْلَوْنَهَا يَوْمَ ٱلدِّينِ ﴿١٥﴾ وَمَا هُمْ عَنْهَا بِغَآئِبِينَ
﴿١٦﴾ وَمَآ أَدْرَىٰكَ مَا يَوْمُ ٱلدِّينِ ﴿١٧﴾ ثُمَّ مَآ أَدْرَىٰكَ مَا يَوْمُ ٱلدِّينِ
﴿١٨﴾ يَوْمَ لَا تَمْلِكُ نَفْسٌ لِّنَفْسٍ شَيْـًٔا ۖ وَٱلْأَمْرُ يَوْمَئِذٍ لِّلَّهِ ﴿١٩﴾

ترتيبها ٨٣ — سُورَةُ المُطَفِّفِينَ — آياتها ٣٦

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

وَيْلٌ لِّلْمُطَفِّفِينَ ﴿١﴾ ٱلَّذِينَ إِذَا ٱكْتَالُوا۟ عَلَى ٱلنَّاسِ يَسْتَوْفُونَ ﴿٢﴾
وَإِذَا كَالُوهُمْ أَو وَّزَنُوهُمْ يُخْسِرُونَ ﴿٣﴾ أَلَا يَظُنُّ أُو۟لَٰٓئِكَ أَنَّهُم
مَّبْعُوثُونَ ﴿٤﴾ لِيَوْمٍ عَظِيمٍ ﴿٥﴾ يَوْمَ يَقُومُ ٱلنَّاسُ لِرَبِّ ٱلْعَٰلَمِينَ ﴿٦﴾

2 **﴿Ulduzlar dağılıb səpələnəcəyi zaman;﴾** Ulduzlar əriyib ətrafa dağılacaq.

3 **﴿Dənizlər qarışacağı zaman;﴾** Dənizlər aşıb-daşacaq, birləşib bir dəniz olacaqdır. Yaxud, vulkan kimi püskürəcəklər. Bu qiyamət qopmadan öncə olacaqdır.

4 **﴿Qəbirlər çevriləcəyi zaman;﴾** Qəbirlərin altı üstünə çevrilib, ölülər oradan çıxarılacaq.

5 **﴿Hər kəs nə etdiyini və nə qoyub getdiyini biləcəkdir!﴾** Əməl dəftəri açılanda etdiyi xeyir və ya şər, yaxud özündən sonra qoyub getdiyi yaxşı və ya pis əməllərini də biləcəkdir.

6 **﴿Ey insan! Səni kərim olan Rəbbinə qarşı aldadan nədir?﴾** Kərim olan Rəbbinə küfr etmək üçün səni aldadan nədir? Bəzi alimlər deyirlər: Onları aldadan Allahın onları və onlardan öncə eyni əməl sahiblərini dünyada cəzalandırmamasıdır.

7 **﴿O Rəbbin ki, səni yaratdı, düzəldib qaydaya saldı.﴾** Halbuki sən heç nə idin, amma O, səni yaratdı, eşidən, görən və bilən insan etdi. Sənə yaraşıq və qədd-qamət verdi.

8 **﴿Sənə Özü istədiyi surətdə biçim verdi.﴾** Öz oxşarlığını sən deyil, O seçmiş və istədiyi bəndəsinə oxşatmışdır.

9 **﴾Xeyr, daha doğrusu, siz haqq-hesab gününü yalan sayırsınız!﴿** Bu ayə Allahın rəhməti ilə özlərini aldadanlar üçün bir xəbərdarlıqdır.

10 **﴾Sizin üstünüzdə gözətçi mələklər –﴿**

11 **﴾Əməllərinizi yazan və çox hörmətli olan mələklər vardır.﴿**

12 **﴾Onlar sizin nə etdiklərinizi bilirlər.﴿** Siz qiyamət gününü inkar edirsiniz, amma mələklər sizdən əl çəkmir əməllərinizi və sözlərinizi yazırlar. Bütün bunlar haqq-hesab günü sizin qarşınıza fakt olaraq qoyulacaqdır.

13 **﴾Həqiqətən yaxşı əməl və itaət sahibləri, Cənnətdə qərar tutacaqlar.﴿**

14 **﴾Pis əməl sahibləri isə Cəhənnəmdə olacaqlar.﴿**

15 **﴾Kafirlər ora haqq-hesab günü daxil olacaqlar.﴿** Onlar inkar etdikləri qiyamət günündə cəhənnəmə daxil olacaqlar.

16 **﴾Onlar əsla oradan çıxan deyillər!﴿** Bir an belə oradan ayrılan deyillər.

17 **﴾Sən nə bilirsən ki, haqq-hesab günü nədir?!﴿**

18 **﴾Bəli, sən nə bilirsən ki, haqq-hesab günü nədir?!﴿** Bu günün əhəmiyyətini və dəhşətini xatırlatmaq üçün iki dəfə təkrar edilmişdir.

19 **﴾O gün heç kəs, heç kəsin karına gələ bilməz. O gün hökm ancaq Allahındır!﴿** Orada Allahdan başqa heç kəs, heç nə edə bilməyəcəkdir. O gün heç kəsə dünyadakı kimi mülkiyyət verilən deyildir. O günün sahibi yalnız Allah olacaqdır.

## əl-Mutəffifin surəsi 83

### (çəkidə və ölçüdə aldadanlar)

İbn Abbas ﷺ deyir: *"Peyğəmbər (Sallallahu aleyhi və səlləm) Mədinəyə hicrət etdikdə Mədinə tacirləri çəkidə və ölçüdə aldadırdılar. Sonra uca Allah bu ayələri nazil etdi: ﴾Vay halına çəkidə və ölçüdə aldadanların!﴿ Bundan sonra onlar çəkidə və ölçüdə ədalətli olmağa başladılar".*

1 **﴾Vay halına çəkidə və ölçüdə aldadanların!﴿** Onlar çəkidə az miqdarda aldadırdılar. Hətta bəziləri aldığı və satdığı mal üçün fərqli ölçüdə qablardan istifadə edərdilər.

2 **﴾O kəslər ki, insanlardan bir şey aldıqda onu tam ölçüb alar,﴿**

3 **﴾Onlar üçün ölçdükdə və ya çəkdikdə isə onu əskildərlər.﴿**

4 **﴾Məgər onlar diriləcəklərini düşünmürlərmi?!﴿** Onlar düşünmürlər ki, bir gün onlar dirildiləcək və etdiklərinin hesabını verəcəklər. Məgər onlar bunu düşünüb belə pis əməldən çəkinə bilməzlər?!

5 **﴾Özü də dəhşətli bir gündə?!﴿**

6 **﴾O gün bütün insanlar aləmlərin Rəbbinin hüzurunda duracaqlar!﴿** Bütün məxluqat ayaq üstə qalxıb Aləmlərin Rəbbinin hökmünü, əmrini, haqq-hesabını gözləyəcəkdir. Bütün bunlar çəkidə və ölçüdə aldatmağın nə qədər böyük günah olmasından xəbər verir. Çünki bu işdə yalan, xəyanət, haqsızlıq vardır.

7 **﴾Xeyr! Şübhəsiz ki, pis əməllərə uyanların əməl dəftəri Siccindədir!﴿** Günahkarların, o cümlədən çəkidə və ölçüdə aldadanların adları cəhənnəmliklər siyahısındadır. Digər mənaya görə onlar sıxıntı içərisində olarlar.

8 **﴾Sən nə bilirsən ki, Siccin nədir?!﴿**

9 **﴾O, yazılı bir kitabdır!﴿** Adları düşmüş bu kitab yazılmış bir kitabdır. Bəzi məlumatlara görə bu söz "qeydiyyat kitabçası" sözündən götürülmüşdür.

10 **﴾O gün vay halına yalan sayanların!﴿**

11 **﴾O kəslər ki, haqq-hesab gününü yalan sayarlar.﴿**

12 **﴾Bunu isə, ancaq həddini aşan, günaha batan yalan sayar.﴿** günah işləmək üçün səbəblər axtarıb, günah edənlər bu günü yalan sayarlar.

13 **﴾Ayələrimiz ona oxunduğu zaman: "Qədimlərin əfsanələridir!" – deyər.﴿** Muhəmməd (Sallallahu aleyhi və səlləm) ona nazil etdiyimiz ayələri oxuduqda "Bunlar qədimlərin əfsanələridir, uydurmalarıdır!" – deyərlər.

14 **﴾Xeyr. Əslində onların qəlblərini qazandıqları qaplamışdır.﴿** Onların günahları və asilikləri çox olduğu üçün qəlblərini bürümüşdür. Əbu Hureyrə ﷺ Peyğəmbərin (Sallallahu aleyhi və səlləm) belə dediyini rəvayət edir: ***"Bəndə bir günah etdikdə qəlbində qara nöqtə iz salar. Tövbə edib, günahdan əl çəkər və bağışlanma diləyərsə, qəlbi təmizlənər. Əgər günahı davamlı edərsə, qara nöqtə çoxalıb qəlbini örtər. Bu, uca Allahın Quranda söylədiyi "qaplama" (ərəb. Ran) dır."***

15 **﴾Xeyr, o gün onlar Rəbbindən məhrum olacaqlar!﴿** Möminlərin Allahı gördükləri kimi görə bilməyəcəklər. Uca Allah bu dünyada onları tövhid inancından məhrum etdiyi kimi, axirətdə də onları Özünü görməkdən məhrum edəcəkdir.

16 **﴾Sonra Cəhənnəmə varid qalacaqlar.﴿**

17 **﴾Sonra da onlara: "Bu sizin yalan saydığınızdır!" – deyiləcəkdir.﴿** Onlar cəhənnəmə daxil olub atəşi dadacaqlar.

18 **﴾Xeyr! Şübhəsiz ki, yaxşı əməl və itaət sahibi olan möminlərin əməl dəftəri İlliyyindadır!﴿** Onlar İlliyyin, yəni cənnət camaatı ilə eyni siyahıdadırlar.

19 **«Sən nə bilirsən ki, İlliyyun nədir?!»** Bu sual İlliyyunu təzim və təşrif etmək xarakteri daşıyır.
20 **«O, yazılı bir kitabdır.»** Orada cənnət əhlinin adları yazılmışdır.
21 **«Onu ancaq yaxın olan mələklər görə bilər!»** Mələklər bu kitabı görür və qiyamət günü bu kitabda yazılanlara şahidlik edəcəklər.
22 **«Həqiqətən yaxşı əməl və itaət sahibi olan möminlər, Nəim cənnətlərində olacaqlar.»**
23 **«Onlar taxtlar üstündə tamaşa edəcəklər.»** Allahın onlar üçün hazırladığı nemətlərə və uca Allahın kərim üzünə baxacaqlar.
24 **«Sən onların üzlərində cənnət sevinci görəcəksən!»** Onlara baxdıqda üzlərindəki nuru, gözəlliyi və sevinci görsən, onların nemət verilmiş olduqlarını anlayarsan.
25 **«Onlara möhürlü şərab *(Rəhiq)* içirdiləcəkdir.»** Rəhiq düzgün üsulla düzəldilmiş təmiz şərab deməkdir. Bu şərabın möhürü itaətkar bəndələr üçün açılana qədər heç kəsin ona əl vurmağa haqqı çatmır.
26 **«Onun son dadı müşk ətirlidir. Qoy yarışanlar onun üçün yarışsınlar!»** Bu şərabın son damlası müşk ətirlidir. Şərab içən sonuncu qurtumu içdikdən sonra şərabın iyinin müşk ətirli olduğunu hiss edər. Bəzi təfsirlərdə şərab qablarının müşk ilə möhürlənməsi mənası deyilir. Yarışmaq istəyən insanlar yaxşı əməlləri ilə bunun üçün çalışsınlar.
27 **«Ona təsnim şərabı qatılmışdır.»** Əvvəldə deyilən müşk ətirli şəraba təsnim şərabı qatılar. Təsnim şərabı cənnətin yüksək mərtəbələrindən süzülən şərabdır. Bu içki cənnətin ən dəyərli içkilərindən hesab olunur.
28 **«O elə bir çeşmədir ki, ondan yalnız yaxın olanlar içər.»**
29 **«Həqiqətən kafirlər, iman gətirmiş kimsələrə gülürdülər.»** Onlara istehza edir, lağa qoyurdular.
30 **«Yanlarından keçərkən bir-birinə qaş-göz edirdilər.»** İslamı yaşayan möminlərə gülür və bunu onlara ayıb edirdilər.
31 **«Ailələrinin yanına qayıtdıqda isə, kefləri kök qayıdırdılar.»** Möminlərə verdikləri əziyyətdən qürur hissi duyar, həzz alardılar.
32 **«Onları gördükdə: "Doğrusu, bunlar azanlardır!" – deyirdilər.»**
33 **«Halbuki kafirlər, möminlərə nəzarətçi göndərilməmişdir.»**
34 **«Bu gün isə, möminlər kafirlərə güləcəklər.»** Düyada olarkən kafirlər möminlərə gülürdülərsə, axirətdə möminlər alçaldılmış və uduzmuş kafirlərə baxıb

كَلَّآ إِنَّ كِتَٰبَ ٱلْفُجَّارِ لَفِى سِجِّينٍ ﴿٧﴾ وَمَآ أَدْرَىٰكَ مَا سِجِّينٌ ﴿٨﴾ كِتَٰبٌ
مَّرْقُومٌ ﴿٩﴾ وَيْلٌ يَوْمَئِذٍ لِّلْمُكَذِّبِينَ ﴿١٠﴾ ٱلَّذِينَ يُكَذِّبُونَ بِيَوْمِ ٱلدِّينِ ﴿١١﴾
وَمَا يُكَذِّبُ بِهِۦٓ إِلَّا كُلُّ مُعْتَدٍ أَثِيمٍ ﴿١٢﴾ إِذَا تُتْلَىٰ عَلَيْهِ ءَايَٰتُنَا قَالَ أَسَٰطِيرُ
ٱلْأَوَّلِينَ ﴿١٣﴾ كَلَّا ۖ بَلْ ۜ رَانَ عَلَىٰ قُلُوبِهِم مَّا كَانُوا۟ يَكْسِبُونَ ﴿١٤﴾ كَلَّآ إِنَّهُمْ
عَن رَّبِّهِمْ يَوْمَئِذٍ لَّمَحْجُوبُونَ ﴿١٥﴾ ثُمَّ إِنَّهُمْ لَصَالُوا۟ ٱلْجَحِيمِ ﴿١٦﴾ ثُمَّ يُقَالُ
هَٰذَا ٱلَّذِى كُنتُم بِهِۦ تُكَذِّبُونَ ﴿١٧﴾ كَلَّآ إِنَّ كِتَٰبَ ٱلْأَبْرَارِ لَفِى عِلِّيِّينَ
﴿١٨﴾ وَمَآ أَدْرَىٰكَ مَا عِلِّيُّونَ ﴿١٩﴾ كِتَٰبٌ مَّرْقُومٌ ﴿٢٠﴾ يَشْهَدُهُ ٱلْمُقَرَّبُونَ
﴿٢١﴾ إِنَّ ٱلْأَبْرَارَ لَفِى نَعِيمٍ ﴿٢٢﴾ عَلَى ٱلْأَرَآئِكِ يَنظُرُونَ ﴿٢٣﴾ تَعْرِفُ فِى
وُجُوهِهِمْ نَضْرَةَ ٱلنَّعِيمِ ﴿٢٤﴾ يُسْقَوْنَ مِن رَّحِيقٍ مَّخْتُومٍ ﴿٢٥﴾
خِتَٰمُهُۥ مِسْكٌ ۚ وَفِى ذَٰلِكَ فَلْيَتَنَافَسِ ٱلْمُتَنَٰفِسُونَ ﴿٢٦﴾ وَمِزَاجُهُۥ
مِن تَسْنِيمٍ ﴿٢٧﴾ عَيْنًا يَشْرَبُ بِهَا ٱلْمُقَرَّبُونَ ﴿٢٨﴾ إِنَّ ٱلَّذِينَ
أَجْرَمُوا۟ كَانُوا۟ مِنَ ٱلَّذِينَ ءَامَنُوا۟ يَضْحَكُونَ ﴿٢٩﴾ وَإِذَا مَرُّوا۟ بِهِمْ
يَتَغَامَزُونَ ﴿٣٠﴾ وَإِذَا ٱنقَلَبُوٓا۟ إِلَىٰٓ أَهْلِهِمُ ٱنقَلَبُوا۟ فَكِهِينَ ﴿٣١﴾
وَإِذَا رَأَوْهُمْ قَالُوٓا۟ إِنَّ هَٰٓؤُلَآءِ لَضَآلُّونَ ﴿٣٢﴾ وَمَآ أُرْسِلُوا۟ عَلَيْهِمْ
حَٰفِظِينَ ﴿٣٣﴾ فَٱلْيَوْمَ ٱلَّذِينَ ءَامَنُوا۟ مِنَ ٱلْكُفَّارِ يَضْحَكُونَ ﴿٣٤﴾

güləcəklər.
35 **«Onlar taxtlar üstündə əyləşib baxacaqlar görək,»** Möminlər nemət içərisində oturub əzab çəkən Allah düşmənlərinə baxacaqlar.
36 **«Kafirlər öz əməllərinin cəzasını aldılarmı?!»** Əlbəttə onlar dünyada möminlərə gülüb, onları ələ saldıqları üçün axirətdə layiqli cəzalarını alacaqlar.

## əl-İnşiqaq surəsi 84

### *(Yarılma)*

1 **«Göy yarılacağı,»** Göyün yarılması qiyamətin əlamətlərindəndir.
2 **«Və Rəbbinin buyuruğunu haqq olaraq eşidib itaət edəcəyi zaman;»** O gün yer Rəbbinə itaət edəcək, əmrlərini dinləyəcəkdir. O itaətə və eşitməyə layiq məxluqdur.
3 **«Yer uzanıb dümdüz olacağı;»** Yer üzərindəki dağlar toza dönüb yerlə bir olacaq və nəticədə yer üzü genişlənəcəkdir.
4 **«Qoynunda olanları bayıra atıb boşaldacağı;»** Özündə olan ölüləri üzə çıxaracaq, onları Allahın hüzuruna təqdim edib, onlardan imtina edəcəkdir.

عَلَى ٱلْأَرَآئِكِ يَنظُرُونَ ﴿٣٥﴾ هَلْ ثُوِّبَ ٱلْكُفَّارُ مَا كَانُوا۟ يَفْعَلُونَ ﴿٣٦﴾

## سُورَةُ الانْشِقَاق

ترتيبها ٨٤ — آياتها ٢٥

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

إِذَا ٱلسَّمَآءُ ٱنشَقَّتْ ﴿١﴾ وَأَذِنَتْ لِرَبِّهَا وَحُقَّتْ ﴿٢﴾ وَإِذَا ٱلْأَرْضُ مُدَّتْ
﴿٣﴾ وَأَلْقَتْ مَا فِيهَا وَتَخَلَّتْ ﴿٤﴾ وَأَذِنَتْ لِرَبِّهَا وَحُقَّتْ ﴿٥﴾ يَٰٓأَيُّهَا
ٱلْإِنسَٰنُ إِنَّكَ كَادِحٌ إِلَىٰ رَبِّكَ كَدْحًا فَمُلَٰقِيهِ ﴿٦﴾ فَأَمَّا مَنْ أُوتِىَ
كِتَٰبَهُۥ بِيَمِينِهِۦ ﴿٧﴾ فَسَوْفَ يُحَاسَبُ حِسَابًا يَسِيرًا ﴿٨﴾ وَيَنقَلِبُ
إِلَىٰٓ أَهْلِهِۦ مَسْرُورًا ﴿٩﴾ وَأَمَّا مَنْ أُوتِىَ كِتَٰبَهُۥ وَرَآءَ ظَهْرِهِۦ ﴿١٠﴾ فَسَوْفَ
يَدْعُوا۟ ثُبُورًا ﴿١١﴾ وَيَصْلَىٰ سَعِيرًا ﴿١٢﴾ إِنَّهُۥ كَانَ فِىٓ أَهْلِهِۦ مَسْرُورًا ﴿١٣﴾
إِنَّهُۥ ظَنَّ أَن لَّن يَحُورَ ﴿١٤﴾ بَلَىٰٓ إِنَّ رَبَّهُۥ كَانَ بِهِۦ بَصِيرًا ﴿١٥﴾ فَلَآ أُقْسِمُ
بِٱلشَّفَقِ ﴿١٦﴾ وَٱلَّيْلِ وَمَا وَسَقَ ﴿١٧﴾ وَٱلْقَمَرِ إِذَا ٱتَّسَقَ ﴿١٨﴾
لَتَرْكَبُنَّ طَبَقًا عَن طَبَقٍ ﴿١٩﴾ فَمَا لَهُمْ لَا يُؤْمِنُونَ ﴿٢٠﴾ وَإِذَا قُرِئَ
عَلَيْهِمُ ٱلْقُرْءَانُ لَا يَسْجُدُونَ ۩ ﴿٢١﴾ بَلِ ٱلَّذِينَ كَفَرُوا۟ يُكَذِّبُونَ
﴿٢٢﴾ وَٱللَّهُ أَعْلَمُ بِمَا يُوعُونَ ﴿٢٣﴾ فَبَشِّرْهُم بِعَذَابٍ أَلِيمٍ ﴿٢٤﴾
إِلَّا ٱلَّذِينَ ءَامَنُوا۟ وَعَمِلُوا۟ ٱلصَّٰلِحَٰتِ لَهُمْ أَجْرٌ غَيْرُ مَمْنُونٍ ﴿٢٥﴾

(5) **«Və Rəbbinin buyurduğunu haqq olaraq eşidib itaət edəcəyi zaman!»**

(6) **«Ey insan! Sən Rəbbinə doğru çalışıb çabalayırsan. Sən Ona qovuşacaqsan!»** Ayədə insan cinsinə, həm möminə, həm də kafirə xitab edilir. İnsan etdiyi əməlləri ilə Allaha tərəf gedir. Bir gün o, öz əməlləri ilə Allahın hüzurunda dayanacaqdır.

(7) **«Kimin əməl dəftəri sağ əlinə verilmişsə,»** Əməl dəftəri sağ əlinə verilmişlər möminlərdir.

(8) **«O yüngül sorğu-sual olunacaq,»** Pis əməlləri ona deyiləcək və sonra hesaba çəkilmədən Allah tərəfindən bağışlanacaqdır. Aişə ﷺ Peyğəmbərin (Sallallahu aleyhi və səlləm) belə dediyini rəvayət edir: **"Kim haqq-hesaba çəkilərsə əzab çəkmiş olar."** Aişə ﷺ Peyğəmbərin (Sallallahu aleyhi və səlləm) bu sözünü eşidəndə deyir: Məgər Allah təala «O yüngül sorğu-sual olunacaq,» - demirmi? Peyğəmbər (Sallallahu aleyhi və səlləm) dedi: **"Bu o haqq-hesabdan deyil. Bu əməllərin ərz olunmasıdır. Qiyamət günü haqq-hesaba çəkilən əzab görmüş kimidir."**

(9) **«Və o, ailəsinin yanına sevinclə qayıdacaqdır!»** Sevincək halda cənnətdəki arvadlarının və hurilərinin yanına gələcəkdir.

(10) **«Kimin əməl dəftəri arxa tərəfdən verilmişsə,»** Kafirlərin və asilərin sağ əli boğazlarına bağlanacaq, sol əli isə arxalarında olacaqdır.

(11) **«O: "Ay öldüm!" – deyə şivən qopardacaq,»** Əməl dəftərini oxuduqda özünə bəd dua edərək həlak olmasını arzulayacaqdır.

(12) **«Və Cəhənnəmə vasil olacaqdır!»**

(13) **«O, öz ailəsi arasında sevinc içində idi.»** Dünyada olarkən nəfsinə və şəhvətinə uyub şər əməllər görmüş, axirəti isə unutmuş, inkar etmişdir.

(14) **«Və elə zənn edirdi ki, qayıtmayacaqdır.»** O düşünürdü ki, sorğu-sual olunmaq üçün dirilməyəcəkdir.

(15) **«Xeyr! Həqiqətən Rəbbi, onu görürdü.»** Amma heç də o düşündüyü kimi deyil. O, Rəbbinin hüzuruna qayıdacaqdır. Allah onun gizli və aşkarda nə etdiklərini görür.

(16) **«And içirəm şəfəqə,»** Uca Allah günəş batdıqdan sonra işa namazının vaxtı başlayana qədər üfüqdə yaranan qızartıya and içir.

(17) **«Gecəyə və qoynuna aldıqlarına,»** Gündüz səpələnmiş və dağılmış hər şey gecə olanda öz yerinə qayıdır.

(18) **«Bədirlənməkdə olan aya,»** qəməri ayın ortasında bütövləşən aya.

(19) **«Siz haldan-hala düşəcəksiniz!»** Ey insanlar, siz qiyamət günü haldan-hala, varlılıqdan kasıblığa, ölümdən diriliyə, cənnətə və ya cəhənnəmə düşəcəksiniz.

(20) **«Onlara nə olub ki, iman gətirmirlər?»** İman gətirmələri üçün hər bir əsas olduğu halda nə üçün bu Qurana iman gətirmirlər.

(21) **«Özlərinə Quran oxunduqda səcdə etmirlər?»** Quran oxuyanda başlarını aşağı salıb dinləməz, səcdə ayələri oxunduğu zaman tilavət səcdəsi etməzlər.

(22) **«Əksinə, kafir olanlar təkzib edirlər.»** Onlar tövhidi, ölümdən sonra dirilməyi və sorğu-sual gününü təsdiq edən kitabı inkar edirlər.

(23) **«Halbuki Allah onların gizlətdiklərini ən gözəl biləndir!»** Allah onların ürəklərində gizlətdikləri təkzibi bilir.

(24) **«Onlara şiddətli bir əzabla müjdə ver!»** Onları alçaltmaq üçün od ilə müjdə veriləcəkdir.

(25) **«İman gətirib, yaxşı əməllər edənlər istisnadır! Onları minnətsiz mükafat gözləyir!»** bu nemətlərə görə heç kəs, onlara minnət qoya bilməz.





# əl-Buruc surəsi 85

## (Bürclər)

(1) ﴾And olsun bürclü göyə;﴿ Bürclər ulduzların mənzilləridir. On iki ulduzun on iki bürcü vardır.

(2) ﴾And olsun vəd olunmuş günə;﴿ Vəd olunan gün qiyamət günüdür.

(3) ﴾And olsun şahid olana və müşahidə edilənə ki,﴿ Uca Allah qiyamət günü şahid olan və şahidlik edənlərə qarşı cinayət işlədən günahkar bəndələrə şahidlik edənlərə and içir. Allah yolunda öldürülənləri buna misal çəkmək olar. Bunun canlı şahidi az sonra izah edəcəyimiz "Xəndək Sahibləri"nin hekayəsidir.

(4) ﴾xəndək sahibləri qətl edildilər.﴿ Onlar lənətə məruz qaldılar. Xəndək sahibləri kafir bir toplumun rəhbərləri idilər. Onlar rəiyyətdən bəzilərinin iman gətirdiyini gördükdə xəndək qazıtdırıb orada tonqal yandırıb, iman edənləri odda yandırmış və özləri də bu mənzərəni müşahidə etmişdilər.

(5) ﴾O xəndəklər ki, çırpı ilə alovlandırılmışdı.﴿

(6) ﴾O zaman onlar xəndəklərin kənarında oturub,﴿

(7) ﴾möminlərin başlarına gətirdiklərinə tamaşa edirdilər.﴿ Bu əməllərinə görə onlara lənət olunmuşdu. Onlar bu işgəncənin şahidləri idilər. Qiyamət günü öz etdiklərinə şahidlik edəcək, daha sonra dilləri, əlləri və ayaqları da şahidlik edəcəkdir.

(8) ﴾Onlardan yalnız yenilməz qüvvət sahibi, şükrə layiq olan Allaha iman gətirdiklərinə görə intiqam alırdılar.﴿ Onlara işgəncə vermək üçün bundan başqa bəhanə tapa bilmirdilər.

(9) ﴾O Allah ki, göylərin və yerin ixtiyarı Onun əlindədir. Allah hər şeyə şahiddir!﴿ Möminlərə verdikləri işgəncənin heç bir detalı Ona gizli deyil. Bu xəndək sahiblərinə əzabla, möminlərə isə, rəhmət ilə dolu bir müjdədir.

(10) ﴾Şübhəsiz ki, mömin kişi və qadınları odla sınağa çəkən, sonra da tövbə etməyən kimsələri cəhənnəm əzabı və yandırıb-yaxan atəş əzabı gözləyir.﴿ Onlar möminləri haqq dindən döndərmək üçün bu yola əl atmış, qarşılarında başqa seçim ixtiyarı qoymamışdılar.

(11) ﴾İman gətirib, yaxşı əməllər edən kimsələri isə, altından çaylar axan cənnətlər gözləyir. Bu, böyük qurtuluşdur!﴿

(12) ﴾Həqiqətən, sənin Rəbbinin intiqamı çox şiddətlidir!﴿ Onun zalımlardan və qəddarlardan alacağı intiqam qat-qat güclüdür.

(13) ﴾Həqiqətən, yoxdan var edən və təkrar dirildən Odur!﴿

سُورَةُ ٱلْبُرُوجِ — ترتيبها ٨٥ — آياتها ٢٢

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ
وَٱلسَّمَآءِ ذَاتِ ٱلۡبُرُوجِ ١ وَٱلۡيَوۡمِ ٱلۡمَوۡعُودِ ٢ وَشَاهِدٖ وَمَشۡهُودٖ
٣ قُتِلَ أَصۡحَٰبُ ٱلۡأُخۡدُودِ ٤ ٱلنَّارِ ذَاتِ ٱلۡوَقُودِ ٥ إِذۡ هُمۡ عَلَيۡهَا
قُعُودٞ ٦ وَهُمۡ عَلَىٰ مَا يَفۡعَلُونَ بِٱلۡمُؤۡمِنِينَ شُهُودٞ ٧ وَمَا نَقَمُواْ
مِنۡهُمۡ إِلَّآ أَن يُؤۡمِنُواْ بِٱللَّهِ ٱلۡعَزِيزِ ٱلۡحَمِيدِ ٨ ٱلَّذِي لَهُۥ مُلۡكُ
ٱلسَّمَٰوَٰتِ وَٱلۡأَرۡضِۚ وَٱللَّهُ عَلَىٰ كُلِّ شَيۡءٖ شَهِيدٌ ٩ إِنَّ ٱلَّذِينَ
فَتَنُواْ ٱلۡمُؤۡمِنِينَ وَٱلۡمُؤۡمِنَٰتِ ثُمَّ لَمۡ يَتُوبُواْ فَلَهُمۡ عَذَابُ جَهَنَّمَ وَلَهُمۡ
عَذَابُ ٱلۡحَرِيقِ ١٠ إِنَّ ٱلَّذِينَ ءَامَنُواْ وَعَمِلُواْ ٱلصَّٰلِحَٰتِ لَهُمۡ
جَنَّٰتٞ تَجۡرِي مِن تَحۡتِهَا ٱلۡأَنۡهَٰرُۚ ذَٰلِكَ ٱلۡفَوۡزُ ٱلۡكَبِيرُ ١١ إِنَّ بَطۡشَ
رَبِّكَ لَشَدِيدٌ ١٢ إِنَّهُۥ هُوَ يُبۡدِئُ وَيُعِيدُ ١٣ وَهُوَ ٱلۡغَفُورُ ٱلۡوَدُودُ ١٤
ذُو ٱلۡعَرۡشِ ٱلۡمَجِيدُ ١٥ فَعَّالٞ لِّمَا يُرِيدُ ١٦ هَلۡ أَتَىٰكَ حَدِيثُ ٱلۡجُنُودِ
١٧ فِرۡعَوۡنَ وَثَمُودَ ١٨ بَلِ ٱلَّذِينَ كَفَرُواْ فِي تَكۡذِيبٖ ١٩ وَٱللَّهُ مِن
وَرَآئِهِم مُّحِيطُۢ ٢٠ بَلۡ هُوَ قُرۡءَانٞ مَّجِيدٞ ٢١ فِي لَوۡحٖ مَّحۡفُوظِۭ ٢٢

سُورَةُ ٱلطَّارِقِ — ترتيبها ٨٦ — آياتها ١٧

(14) ﴾Bağışlayan, sevən Odur.﴿ Mömin bəndələrini çox bağışlayan və onları biabır etməyən, itaətkar övliya bəndələrini çox sevən Odur..

(15) ﴾Ərşin sahibi də, şanlı-şərəfli olan da Odur!﴿

(16) ﴾O, istədiyini edəndir.﴿

(17) ﴾Orduların xəbəri gəlib sənə çatdımı?-﴿

(18) ﴾Firon və Səmud ordularının?﴿ Ey Muhəmməd! Peyğəmbərlərini yalançı sayan bu orduların xəbəri artıq sənə gəlib çatmışdır.

(19) ﴾Xeyr, kafir olanlar elə hey təkzib etməkdədirlər.﴿ Müşrik ərəblər daim səni və sənin təbliğ etdiyin şəriəti təkzib etməkdə davam edir, heç özlərindən əvvəl yaşayıb həlak olmuş kafirlərin acı aqibətindən nəticə çıxarmırlar.

(20) ﴾Onların bütün ixtiyarı Allahın əlindədir!﴿ O, istədiyi vaxt əvvəlkilərə verdiyi əzabdan bunlara da daddırar.

(21) ﴾Xeyr, o şanlı-şərəfli Qurandır!﴿ Müşriklərin dediyi kimi, sehr, şer və ya cadu deyil.

(22) ﴾O, lövhi-məhfuzdadır!﴿ Bu kitab ana kitab olan Lövhi Məhfuzda yazılmış, Allah dərgahında şeytanların çata bilməyəcəyi yerdə saxlanılan kitabdır.





بِسْمِ اللَّهِ الرَّحْمَٰنِ الرَّحِيمِ

وَالسَّمَاءِ وَالطَّارِقِ ﴿١﴾ وَمَا أَدْرَاكَ مَا الطَّارِقُ ﴿٢﴾ النَّجْمُ الثَّاقِبُ ﴿٣﴾ إِن كُلُّ
نَفْسٍ لَّمَّا عَلَيْهَا حَافِظٌ ﴿٤﴾ فَلْيَنظُرِ الْإِنسَانُ مِمَّ خُلِقَ ﴿٥﴾ خُلِقَ مِن مَّاءٍ
دَافِقٍ ﴿٦﴾ يَخْرُجُ مِن بَيْنِ الصُّلْبِ وَالتَّرَائِبِ ﴿٧﴾ إِنَّهُ عَلَىٰ رَجْعِهِ لَقَادِرٌ ﴿٨﴾
يَوْمَ تُبْلَى السَّرَائِرُ ﴿٩﴾ فَمَا لَهُ مِن قُوَّةٍ وَلَا نَاصِرٍ ﴿١٠﴾ وَالسَّمَاءِ ذَاتِ الرَّجْعِ ﴿١١﴾
وَالْأَرْضِ ذَاتِ الصَّدْعِ ﴿١٢﴾ إِنَّهُ لَقَوْلٌ فَصْلٌ ﴿١٣﴾ وَمَا هُوَ بِالْهَزْلِ ﴿١٤﴾ إِنَّهُمْ
يَكِيدُونَ كَيْدًا ﴿١٥﴾ وَأَكِيدُ كَيْدًا ﴿١٦﴾ فَمَهِّلِ الْكَافِرِينَ أَمْهِلْهُمْ رُوَيْدًا ﴿١٧﴾

ترتيبها ٨٧ — سُورَةُ الأَعْلَى — آياتها ١٩

بِسْمِ اللَّهِ الرَّحْمَٰنِ الرَّحِيمِ

سَبِّحِ اسْمَ رَبِّكَ الْأَعْلَى ﴿١﴾ الَّذِي خَلَقَ فَسَوَّىٰ ﴿٢﴾ وَالَّذِي قَدَّرَ فَهَدَىٰ
﴿٣﴾ وَالَّذِي أَخْرَجَ الْمَرْعَىٰ ﴿٤﴾ فَجَعَلَهُ غُثَاءً أَحْوَىٰ ﴿٥﴾ سَنُقْرِئُكَ
فَلَا تَنسَىٰ ﴿٦﴾ إِلَّا مَا شَاءَ اللَّهُ إِنَّهُ يَعْلَمُ الْجَهْرَ وَمَا يَخْفَىٰ ﴿٧﴾ وَنُيَسِّرُكَ
لِلْيُسْرَىٰ ﴿٨﴾ فَذَكِّرْ إِن نَّفَعَتِ الذِّكْرَىٰ ﴿٩﴾ سَيَذَّكَّرُ مَن يَخْشَىٰ ﴿١٠﴾
وَيَتَجَنَّبُهَا الْأَشْقَى ﴿١١﴾ الَّذِي يَصْلَى النَّارَ الْكُبْرَىٰ ﴿١٢﴾ ثُمَّ لَا يَمُوتُ
فِيهَا وَلَا يَحْيَىٰ ﴿١٣﴾ قَدْ أَفْلَحَ مَن تَزَكَّىٰ ﴿١٤﴾ وَذَكَرَ اسْمَ رَبِّهِ فَصَلَّىٰ ﴿١٥﴾

## ət-Tariq surəsi 86

*(gecə çıxan ulduz)*

1 **﴾And olsun göyə və gecə çıxan ulduza!﴿** Uca Allah bu ayədə səmaya və gecə peyda olan ulduza and içir. Ərəb dilində buna "Tariq" deyilir. Mənası, gecə peyda olub gündüzlər yoxa çıxan deməkdir.

2 **﴾Sən nə bilirsən ki, gecə çıxan ulduz nədir?!﴿**

3 **﴾O, parlaq ulduzdur!﴿** Gecənin zülmətində sanki yanırmış kimi parıldayır.

4 **﴾Elə bir kimsə yoxdur ki, onun üstündə bir gözətçi olmasın!﴿** Bu cümlə andın cavabıdır. Ayədə deyilən gözətçilər bəndələrin yaxşı və pis əməllərini yazan mələklərdir.

5 **﴾Elə isə, insan nədən yaradıldığına bir baxsın!﴿**

6 **﴾O, axıb tökülən bir sudan yaradılmışdır.﴿** İnsan kişi və qadının qarışmış suyundan uşaqlığa axıdılan bir damladan yaradılmışdır. İnsanın bu iki sudan yaranmasına baxmayaraq, ayədə bir su qeyd olunur. Çünki qarışmış su bir hesab olunur.

7 **﴾Bel sümüyündən, köks sümüyündən çıxar!﴿** İnsanın yaradıldığı bu maye kişilərin bel, qadınların isə köks sümüklərinin arasından çıxan sudur. Bəzi təfsirçilərin açıqlamasına görə bu su insanın bütün bədənindən ifraz olunur.

8 **﴾Həqiqətən Allah, insanı yenidən diriltməyə qadirdir! –﴿** Öldükdən sonra diriltməyə qadirdir.

9 **﴾Bütün sirlərin aşkar olacağı o qiyamət günü;﴿** O gün, imtahan zamanı bütün sirlər açılacaqdır.

10 **﴾İnsanın nə bir qüvvəsi, nə də bir köməkçisi olar!﴿** O gün, insanın əzabdan qurtulması üçün nə qüvvəsi, nə də köməkçisi olacaqdır.

11 **﴾And olsun qayıdışlı göyə;﴿** Göyün qayıdışlı olması yağışın yağması və kəsilməsidir.

12 **﴾And olsun yarılan yerə ki,﴿** Bitkilərin və ağacların bitməsi yerin yarılmasıdır.

13 **﴾Bu ayırd edən kəlamdır!﴿** Quran haqq ilə batili bir-birindən ayırd edən kitabdır.

14 **﴾O, oyun-oyuncaq deyildir!﴿**

15 **﴾Həqiqətən onlar, hiylə qurdular.﴿** Kafirlər Peyğəmbərin (Sallallahu aleyhi və səlləm) gətirdiyi haqq dini boğmaq üçün hiylə qururlar.

16 **﴾Mən də onlara hiylə qururam.﴿** Onları özlərinin də bilmədiyi halda tədriclə əzaba aparır, qurduqları hiylədən daha çətinini onlara qururam.

17 **﴾Elə isə, kafirlərə möhlət ver! Onlara azacıq möhlət verirəm!﴿** Mən, onlara yaxın və ya azacıq möhlət verir, sonra onları cəzalandırıram.

## əl-Əla surəsi 87

*(ən-Uca)*

1 **﴾Ən uca olan Rəbbinin adını pak tutub şəninə tariflər de!﴿** "Sübhanə rəbbiyəl alə" – Uca Rəbbim nöqsanlardan pakdır deməklə Onu nalayiq vəsflərdən münəzzəh tut.

2 **﴾O Rəbbin ki, xəlq etdi və nizama saldı.﴿** O, insana boy-buxun, dil-dodaq və s. əzalar verib onu lazımi şəkildə yaratmış və onu mükəlləflikə yararlı etmişdir.

3 **﴾O Rəbbin ki, əzəldən müəyyən etdi və yol göstərdi.﴿** O, hər şeyin keyfiyyətini, növünü, xüsusiyyətini, felini, sözünü, davam müddətini müəyyən etmiş və hər kəsi etmək istədiyi əmələ müvəffəq etmiş, bütün bunları qəza-qədərə yazmışdır.

4 **﴾O Rəbbin ki, otlar çıxartdı.﴿**

5 **﴾Sonra da onu qara çör-çöpə döndərdi.﴿** Yam-yaşıl otları qup-quru çöpə döndərdi.

6 **﴾Biz sənə oxudacağıq və sən unutmayacaqsan;﴿** Cəbrail ﷺ Peyğəmbərə (Sallallahu aleyhi və səlləm) vəhy gətirdikdə Cəbrail ayənin sonunu oxuyub bitirməmiş Peyğəmbər (Sallallahu aleyhi və səlləm) unudacağından qorxub ayənin əvvəlini təkrar oxuyardı. Sonra bu ayə nazil oldu ki,

*"Ey Muhəmməd, sənə Quranı oxudacağıq* və sən, *onu unudan deyilsən"*. Beləliklə, uca Allah onu Quranı unutmayacağı barədə arxayın etdi.
7 **«Yalnız Allahın dilədiyindən başqa! Şübhəsiz ki, O, aşkarı da, gizlini də bilir!»** Yalnız Allahın istədiyi ayələri unudacaqsan.
8 **«Biz sənə ən asan olanı müyəssər edərik.»** Cənnətə aparan yolu sənin üçün asan edərik.
9 **«Əgər nəsihət etmək fayda versə, öyüd-nəsihət ver!»** Ey Muhəmməd ﷺ, sənə vəhy etdiklərimizi insanlara çatdırmaqla öyüd-nəsihət ver, onları xeyirxahlıq yoluna çağır, şəriət hökmlərinə dəvət et. Dəvət və irşad fayda verdikcə bu işi et. Əgər bir insana həqiqət olduğu kimi açıq-aşkar şəkildə çatdırılar və bundan sonra o yenə də öz asiliyinə davam edərsə, beləsini bir daha təkrar dəvət etmə.
10 **«Qorxan kimsə mütləq öyüd-nəsihət qəbul edəcəkdir!»** Allahdan qorxan kimsə, bu öyüd-nəsihətdən təsirlənib, Allahdan daha çox qorxar, əməlisaleh olar.
11 **«Bədbəxt isə, ondan qaçar.»** Bədbəxt kafirlər öyüd-nəsihətdən üz döndərərlər.
12 **«O kəs ki, ən böyük oda girəcəkdir.»** Kiçik od dünydakı, böyük od isə, cəhənnəmdəki oddur.
13 **«Orada nə öləcək, nə də yaşayacaqdır!»** Orada nə ölüb canını əzabdan qurtara biləcək, nə də faydalı bir həyat yaşaya biləcəkdir.
14 **«Təmizlənən kimsə isə, nicat tapacaqdır.»** Şirkdən təmizlənib Allaha iman gətirərək, yalnız Ona ibadət edib dinini yaşayan kimsələr qurtulacaqlar.
15 **«O kimsə ki, Rəbbinin adını zikr edib namaz qılar!»** Dili ilə Allahı zikr edib, gündəlik beş vaxt namazları qılanlar nicat taparlar.
16 **«Lakin siz dünyanı üstün tutursunuz!»**
17 **«Halbuki axirət daha xeyirli və daha baqidir.»**
18 **«Həqiqətən, bu deyilənlər əvvəlki kitablarda mövcuddur»** Şirkdən təmizlənib nicat tapmaq və deyilən digər sözlər əvvəlki kitablarda da mövcud idi.
19 **«İbrahimin və Musanın kitablarında!»** Uca Allahın bütün kitabları axirətin dünyadan daha xeyirli və baqi olduğunu bildirir.

# əl-Ğaşiyə surəsi 88

## *(Dəhşətlə bürüyən)*

1 **«Bürüyəcək qiyamətin xəbəri sənə gəlib çatdımı?»** Ey Muhəmməd (Sallallahu aleyhi və səlləm) qiyamət barəsində sənə xəbər verilmişdir. Qiyamət gününün "Əl-Ğaşiyə" adlandırılması, o gündə insanları öz dəhşəti ilə bürüməsinə görədir.
2 **«O gün bir çox üzlər zəlil görkəm alacaq;»** Qiyamət günü insanlar iki qrupda olacaqlar; Birinci: Üzləri zəlil görkəmli.

بَلْ تُؤْثِرُونَ ٱلْحَيَوٰةَ ٱلدُّنْيَا ﴿١٦﴾ وَٱلْـَٔاخِرَةُ خَيْرٌ وَأَبْقَىٰٓ ﴿١٧﴾ إِنَّ
هَـٰذَا لَفِى ٱلصُّحُفِ ٱلْأُولَىٰ ﴿١٨﴾ صُحُفِ إِبْرَٰهِيمَ وَمُوسَىٰ ﴿١٩﴾

سُورَةُ الغَاشِيَةِ — آياتها ٢٦ — ترتيبها ٨٨

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَـٰنِ ٱلرَّحِيمِ

هَلْ أَتَىٰكَ حَدِيثُ ٱلْغَـٰشِيَةِ ﴿١﴾ وُجُوهٌ يَوْمَئِذٍ خَـٰشِعَةٌ ﴿٢﴾
عَامِلَةٌ نَّاصِبَةٌ ﴿٣﴾ تَصْلَىٰ نَارًا حَامِيَةً ﴿٤﴾ تُسْقَىٰ مِنْ عَيْنٍ ءَانِيَةٍ ﴿٥﴾
لَّيْسَ لَهُمْ طَعَامٌ إِلَّا مِن ضَرِيعٍ ﴿٦﴾ لَّا يُسْمِنُ وَلَا يُغْنِى مِن جُوعٍ ﴿٧﴾
وُجُوهٌ يَوْمَئِذٍ نَّاعِمَةٌ ﴿٨﴾ لِّسَعْيِهَا رَاضِيَةٌ ﴿٩﴾ فِى جَنَّةٍ عَالِيَةٍ ﴿١٠﴾
لَّا تَسْمَعُ فِيهَا لَـٰغِيَةً ﴿١١﴾ فِيهَا عَيْنٌ جَارِيَةٌ ﴿١٢﴾ فِيهَا سُرُرٌ مَّرْفُوعَةٌ ﴿١٣﴾
وَأَكْوَابٌ مَّوْضُوعَةٌ ﴿١٤﴾ وَنَمَارِقُ مَصْفُوفَةٌ ﴿١٥﴾ وَزَرَابِىُّ مَبْثُوثَةٌ ﴿١٦﴾
أَفَلَا يَنظُرُونَ إِلَى ٱلْإِبِلِ كَيْفَ خُلِقَتْ ﴿١٧﴾ وَإِلَى ٱلسَّمَآءِ كَيْفَ
رُفِعَتْ ﴿١٨﴾ وَإِلَى ٱلْجِبَالِ كَيْفَ نُصِبَتْ ﴿١٩﴾ وَإِلَى ٱلْأَرْضِ كَيْفَ
سُطِحَتْ ﴿٢٠﴾ فَذَكِّرْ إِنَّمَآ أَنتَ مُذَكِّرٌ ﴿٢١﴾ لَّسْتَ عَلَيْهِم
بِمُصَيْطِرٍ ﴿٢٢﴾ إِلَّا مَن تَوَلَّىٰ وَكَفَرَ ﴿٢٣﴾ فَيُعَذِّبُهُ ٱللَّهُ ٱلْعَذَابَ
ٱلْأَكْبَرَ ﴿٢٤﴾ إِنَّ إِلَيْنَآ إِيَابَهُمْ ﴿٢٥﴾ ثُمَّ إِنَّ عَلَيْنَا حِسَابَهُم ﴿٢٦﴾

3 **«Zəhmət çəkib yorulacaq;»** Onlar ibadət etməklə özlərini yoran, amma getdikləri küfr və zəlalət yoluna görə qarşılığında heç bir savab qazanmayan kimsələrdir.
4 **«Yanar oda girəcəkdir;»**
5 **«Və onlara qaynar bulaqdan su içirdiləcəkdir.»**
6 **«Onların yeməyi dari`dən başqa bir şey olmayacaqdır.»** Dari` tikanlı bitki növüdür. Qureyş ləhcəsində bu bitkinin yaşına "əş-Şəbrəq", qurusuna isə "əd-Dari`" deyilir.
7 **«O yemək onlara nə qüvvət verər, nə də aclıqdan qurtarar.»**
8 **«O gün bir çox üzlər sevinəcək;»** Bu üzlər ikinci qrupun üzləridir.
9 **«Onlar zəhmətindən razı qalacaq;»** Onlar dünyadakı əməllərinin layiqli qarşılığını aldıqları üçün etdiklərindən razı olacaqlar.
10 **«Yüksək Cənətdə olacaq,»**
11 **«Və orada heç bir boş söz eşitməyəcəkdir.»**
12 **«Orada axar bulaq;»**
13 **«Orada uca taxtlar;»**
14 **«düzülmüş piyalələr;»**
15 **«Bir-birinin yanına düzülmüş balışlar;»**
16 **«Və döşənmiş xalılar vardır!»**
17 **«Məgər dəvəyə baxmırlar ki, necə yaradılmışdır?»** Onlar dəvənin böyük





سُورَةُ الفَجْرِ — ترتيبها ٨٩ — آياتها ٣٠

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

وَٱلْفَجْرِ ﴿١﴾ وَلَيَالٍ عَشْرٍ ﴿٢﴾ وَٱلشَّفْعِ وَٱلْوَتْرِ ﴿٣﴾ وَٱلَّيْلِ إِذَا يَسْرِ
﴿٤﴾ هَلْ فِى ذَٰلِكَ قَسَمٌ لِّذِى حِجْرٍ ﴿٥﴾ أَلَمْ تَرَ كَيْفَ فَعَلَ رَبُّكَ بِعَادٍ
﴿٦﴾ إِرَمَ ذَاتِ ٱلْعِمَادِ ﴿٧﴾ ٱلَّتِى لَمْ يُخْلَقْ مِثْلُهَا فِى ٱلْبِلَٰدِ ﴿٨﴾
وَثَمُودَ ٱلَّذِينَ جَابُوا۟ ٱلصَّخْرَ بِٱلْوَادِ ﴿٩﴾ وَفِرْعَوْنَ ذِى ٱلْأَوْتَادِ ﴿١٠﴾
ٱلَّذِينَ طَغَوْا۟ فِى ٱلْبِلَٰدِ ﴿١١﴾ فَأَكْثَرُوا۟ فِيهَا ٱلْفَسَادَ ﴿١٢﴾ فَصَبَّ
عَلَيْهِمْ رَبُّكَ سَوْطَ عَذَابٍ ﴿١٣﴾ إِنَّ رَبَّكَ لَبِٱلْمِرْصَادِ ﴿١٤﴾ فَأَمَّا
ٱلْإِنسَٰنُ إِذَا مَا ٱبْتَلَىٰهُ رَبُّهُۥ فَأَكْرَمَهُۥ وَنَعَّمَهُۥ فَيَقُولُ رَبِّىٓ أَكْرَمَنِ
﴿١٥﴾ وَأَمَّآ إِذَا مَا ٱبْتَلَىٰهُ فَقَدَرَ عَلَيْهِ رِزْقَهُۥ فَيَقُولُ رَبِّىٓ أَهَٰنَنِ ﴿١٦﴾
كَلَّا ۖ بَل لَّا تُكْرِمُونَ ٱلْيَتِيمَ ﴿١٧﴾ وَلَا تَحَٰٓضُّونَ عَلَىٰ طَعَامِ
ٱلْمِسْكِينِ ﴿١٨﴾ وَتَأْكُلُونَ ٱلتُّرَاثَ أَكْلًا لَّمًّا ﴿١٩﴾
وَتُحِبُّونَ ٱلْمَالَ حُبًّا جَمًّا ﴿٢٠﴾ كَلَّآ إِذَا دُكَّتِ ٱلْأَرْضُ دَكًّا
دَكًّا ﴿٢١﴾ وَجَآءَ رَبُّكَ وَٱلْمَلَكُ صَفًّا صَفًّا ﴿٢٢﴾ وَجِا۟ىٓءَ يَوْمَئِذٍۭ
بِجَهَنَّمَ ۚ يَوْمَئِذٍ يَتَذَكَّرُ ٱلْإِنسَٰنُ وَأَنَّىٰ لَهُ ٱلذِّكْرَىٰ ﴿٢٣﴾

cəsədli, qüvvətli və ecazkar yaradılışını görüb ibrət almırlarmı?!

(18) **«Göyə baxmırlar ki, necə ucaldılmışdır?»** Görmürlərmi ki, biz göyü heç bir ağılın və dərrakənin anlaya bilməyəcəyi qədər dirəksiz yaratmışıq.

(19) **«Dağlara baxmırlar ki, necə dikəldilmişdir?»** Nə sağa, nə də sola əyilmir, dimdik dururlar.

(20) **«Və yerə baxmırlar ki, necə döşədilmişdir?»**

(21) **«Öyüd-nəsihət ver. Sən, ancaq öyüd-nəsihət verənsən!»** Ey Muhəmməd (*Səllallahu aleyhi və səlləm*), sən, onlara öyüd-nəsihət ver, Allahın əzabı ilə qorxut. Çünki sənin işin bundan ibarətdir.

(22) **«Sən onların üzərində hakim deyilsən!»** Onları iman gətirməyə məcbur etmək sənin səlahiyyətində deyil.

(23) **«Lakin kim üz döndərib küfr etsə,»**

(24) **«Allah onu ən böyük əzaba düçar edər!»**

(25) **«Şübhəsiz ki, onların axır dönüşü Bizədir!»** Öldükdən sonra bizim hüzurumuza gələcəklər.

(26) **«Onlarla haqq-hesab çəkmək də Bizə aiddir!»** Dirlib Allahın hüzuruna gəldikdən sonra Allah da onların əməllərinə qiymət verəcəkdir.

# əl-Fəcr surəsi 89

## *(Sübh çağı)*

(1) **«And olsun dan yerinə;»** Uca Allah gecə qaranlığının gündüzdən ayrıldığı sübh çağına and içir. Mücahid deyir ki, bu ayədə qurban bayramı gününün sübhü nəzərdə tutulur.

(2) **«And olsun on gecəyə;»** Zülhiccə ayının birinci on gecəsinə.

(3) **«And olsun cütə və təkə;»** Cüt və tək olan hər şeyə. Bəzi təfsirçilər deyirlər ki, cüt birinci və ikinci təşriq (zülhiccənin 11 və 12-ci) günləridir. Tək isə üçüncü təşriq (zülhiccənin 13-cü) günüdür.

(4) **«And olsun keçib getməkdə olan gecəyə;»**

(5) **«Məgər bunlarda ağıl sahibi üçün and yoxmudur?!»** Ağıl sahibi olan kimsə uca Allahın and içdiyi məxluqatın bu anda layiq olduğunu dərk edər.

(6) **«Məgər görmədinmi ki, Rəbbin nələr etdi Ada?!»**

(7) **«Sütunlar sahibi İrəmə?!»** İrəm Ad tayfasının digər adıdır. Bəzi məlumatlara görə İrəm onların babası olmuşdur. Bir başqaları isə deyirlər ki, İrəm onların yaşadıqları yerin adıdır. Bu, hündür dirəkli Dəməşq şəhəri və ya Əhqafda başqa şəhər adıdır.

(8) **«Məmləkətlər arasında onun kimisi yaradılmamışdı.»** Bu elə bir şəhərdir ki, onun kimi çətin tikililəri olan ikinci bir şəhər yoxdur.

(9) **«Vadidə qayaları yolan Səmuda?!»** Onlar dağları oyur və orada özlərinə evlər düzəldirdilər. Onların vadisi Mədinə ən-Nəbəviyyə və Şam yolunun üstündəki əl-Hicr və ya əl-Qura vadisi idi.

(10) **«Eləcə də dirəklər sahibi Firona?!»** Burada fironların özləri üçün qəbir olaraq inşa etdirdikləri ehramlar nəzərdə tutulur. Bəzi təfsirçilər deyirlər ki, ayədə saysız-hesabsız çadır qurmaq üçün dirəklər basdıran qoşun nəzərdə tutulur.

(11) **«O kəslər ki, məmləkətlərdə tüğyan edir,»** Ad, Səmud və Firon hərəsi öz məmləkətində tüğyan edirdilər.

(12) **«Oralarda çoxlu fitnə-fəsad törədirlər.»** Allaha küfr və asilik, bəndələrə isə zülm edirdilər.

(13) **«Nəhayət, Rəbbin onlara əzab qamçısı endirdi.»** Onları əzaba düçar etdi.

(14) **«Şübhəsiz ki, Rəbbin baxıb görür.»** Hər bir insanın əməlini görür və xeyirə xeyirlə, şərə şərlə qarşılıq verir. Həsən əl-Bəsri deyir: İnsanların yolu Onun qarşısından keçir və heç kəs Onun nəzərindən yayına bilməz.

(15) **«İnsana gəldikdə, nə zaman Rəbbi onu imtahana çəkib ehtiram etsə, ona bir nemət versə, o: "Rəbbim mənə ehtiram göstərdi!"– deyər.»** Allah insanın ruzisini genişləndirib,

يَقُولُ يَٰلَيۡتَنِي قَدَّمۡتُ لِحَيَاتِي ٢٤ فَيَوۡمَئِذٖ لَّا يُعَذِّبُ عَذَابَهُۥٓ أَحَدٞ ٢٥
وَلَا يُوثِقُ وَثَاقَهُۥٓ أَحَدٞ ٢٦ يَٰٓأَيَّتُهَا ٱلنَّفۡسُ ٱلۡمُطۡمَئِنَّةُ ٢٧ ٱرۡجِعِيٓ
إِلَىٰ رَبِّكِ رَاضِيَةٗ مَّرۡضِيَّةٗ ٢٨ فَٱدۡخُلِي فِي عِبَٰدِي ٢٩ وَٱدۡخُلِي جَنَّتِي ٣٠

ترتيبها ٩٠ سُورَةُ ٱلۡبَلَدِ آياتها ٢٠

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

لَآ أُقۡسِمُ بِهَٰذَا ٱلۡبَلَدِ ١ وَأَنتَ حِلُّۢ بِهَٰذَا ٱلۡبَلَدِ ٢ وَوَالِدٖ وَمَا وَلَدَ
٣ لَقَدۡ خَلَقۡنَا ٱلۡإِنسَٰنَ فِي كَبَدٍ ٤ أَيَحۡسَبُ أَن لَّن يَقۡدِرَ عَلَيۡهِ
أَحَدٞ ٥ يَقُولُ أَهۡلَكۡتُ مَالٗا لُّبَدًا ٦ أَيَحۡسَبُ أَن لَّمۡ يَرَهُۥٓ أَحَدٌ
٧ أَلَمۡ نَجۡعَل لَّهُۥ عَيۡنَيۡنِ ٨ وَلِسَانٗا وَشَفَتَيۡنِ ٩ وَهَدَيۡنَٰهُ
ٱلنَّجۡدَيۡنِ ١٠ فَلَا ٱقۡتَحَمَ ٱلۡعَقَبَةَ ١١ وَمَآ أَدۡرَىٰكَ مَا ٱلۡعَقَبَةُ ١٢
فَكُّ رَقَبَةٍ ١٣ أَوۡ إِطۡعَٰمٞ فِي يَوۡمٖ ذِي مَسۡغَبَةٖ ١٤ يَتِيمٗا ذَا مَقۡرَبَةٍ
١٥ أَوۡ مِسۡكِينٗا ذَا مَتۡرَبَةٖ ١٦ ثُمَّ كَانَ مِنَ ٱلَّذِينَ ءَامَنُواْ وَتَوَاصَوۡاْ
بِٱلصَّبۡرِ وَتَوَاصَوۡاْ بِٱلۡمَرۡحَمَةِ ١٧ أُوْلَٰٓئِكَ أَصۡحَٰبُ ٱلۡمَيۡمَنَةِ ١٨ وَٱلَّذِينَ
كَفَرُواْ بِـَٔايَٰتِنَا هُمۡ أَصۡحَٰبُ ٱلۡمَشۡـَٔمَةِ ١٩ عَلَيۡهِمۡ نَارٞ مُّؤۡصَدَةُۢ ٢٠

ترتيبها ٩١ سُورَةُ ٱلشَّمۡسِ آياتها ١٥

bol mal-dövlət verərsə, əldə etdiyi bu neməti özünə hörmət kimi qəbul edər.

16 **﴾Amma nə zaman onu imtahana çəkib ruzisini əskiltsə: "Rəbbim məni alçaltdı!" – söyləyər.﴿** Bu kafir insanın xüsusiyyətidir. Mömin üçün ehtiram Allahın onu itaətə və axirət əməlinə müvəffəq etməsidir. Mömin üçün hörmətsizlik itaətdən və cənnət əhlinin əməlindən məhrum edilməkdir.

17 **﴾Xeyr! Doğrusu, siz özünüz yetimə hörmət etmirsiniz.﴿** Əvvəl iki ayədəki ifadələri deyən insana xəbərdarlıq edilir ki, Allahın sizə verdiyi bol ruzinin qarşılığında heç bir yetimə əl tutmursunuz. Əgər sizə verilən mal-dövlətdən yetimlərə də yedizdirsəydiniz, bu, sizin üçün Allah yanında ehtiram olardı.

18 **﴾Bir-birinizi yoxsulu yedirtməyə rəğbətləndirmirsiniz.﴿** Özünüzü, yaxud bir-birinizi bu işə təşviq etmirsiniz. Aranızda olan yoxsullar köməksiz və tənha qalırlar.

19 **﴾Mirası acgözlüklə yeyirsiniz.﴿** Yetimlərin, qadınların və zəiflərin miras payını mənimsəyirsiniz.

20 **﴾Mal-dövləti isə, lap çox sevirsiniz.﴿**

21 **﴾Xeyr! Yer dağılıb parça-parça olacağı;﴿** Xeyr, bu sizə yaraşmayan əməldir. Bir gün yer sirkələnib, dağları yerlə bir olacaq. O zaman sizin işiniz necə olacaq?!

22 **﴾Rəbbinin əmri gəlib mələklər səf-səf duracağı;﴿** Rəbbin bəndələrini haqq-hesab etmək üçün gələcəyi gün əzəmətli və qüvvətli mələklər cərgə-cərgə duracaqlar.

23 **﴾Və Cəhənnəmin gətiriləcəyi gün – məhz o gün insan xatırlayacaqdır. Lakin bu xatırlamağın ona nə faydası?!﴿** Mələklər cilovlanmış cəhənnəmi məhşər meydanına gətirəcəklər.

24 **﴾O: "Kaş ki, mən əvvəlcədən axirət həyatım üçün yaxşı əməl edəydim!" – deyəcəkdir.﴿**

25 **﴾O gün Allahın etdiyi əzabı heç kəs edə bilməz!﴿**

26 **﴾Heç kəs Onun kimi zəncirləyə bilməz!﴿** Heç kəs uca Allahın kafirləri qandalladığı və zəncirlədiyi kimi edə bilməz.

27 **﴾Ey arxayın nəfs!﴿** Qəlbi Allaha iman və tövhidlə dolu, şəkk-şübhə etməyən bəndə.

28 **﴾Dön Rəbbinə, sən Ondan razı olaraq, O da səndən!﴿** Sənə bəxş etdiyi savab əməllərlə Rəbbindən razı halda Onun hüzuruna dön. Bil ki, O da səndən razıdır.

29 **﴾Bəndələrimin zümrəsinə daxil ol!﴿** Əməlisaleh bəndələrimin toplumuna daxil ol və sən də onlarla birlikdə qal.

30 **﴾Cənnətimə varid ol!"﴿** Onlarla birlikdə cənnətimə daxil ol. Bu əvəzolunmaz ehtiramdır.

# əl-Bələd surəsi 90

## (Şəhər)

1 **﴾And içirəm bu şəhərə –﴿** əl-Hərəm şəhərinə, yəni Məkkəyə and içirəm. Bu and Məkkənin Allah yanında olan qədir-qiymətini və şərəfini göstərir. Çünki bu şəhərdə Allahın əl-Həram evi vardır. Bu şəhər İsmailin və Muhəmmədin vətənidir. Bu şəhər həcc mərasiminin keçirildiyi bir şəhərdir.

2 **﴾Sənin yaşadığın şəhərə;﴿** Səni şərəfləndirərək və hörmətini artıraraq yaşadığın bu şəhərə and içirəm. Çünki sənin mövcudluğun bu şəhəri şərəfləndirmişdir.

3 **﴾And içirəm ataya və onun övladına ki,﴿** Bu Adəm və onun nəsli, hər bir canlının ata və övladına şamildir. Bu and diqqəti uca Allahın nəsil artırmaq üçün qurduğu möcüzəvi üsula yönəldir. Bu, Allahın qüdrətinə, hikmətinə və elminə dəlalət edir.

4 **﴾Biz, insanı məşəqqətdə yaratdıq!﴿** O, ölənə qədər dünyanın əzab-əziyyətinə qatlanacaqdır. Öldükdən sonra qəbirdə





بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

وَٱلشَّمۡسِ وَضُحَىٰهَا ١ وَٱلۡقَمَرِ إِذَا تَلَىٰهَا ٢ وَٱلنَّهَارِ إِذَا جَلَّىٰهَا ٣
وَٱلَّيۡلِ إِذَا يَغۡشَىٰهَا ٤ وَٱلسَّمَآءِ وَمَا بَنَىٰهَا ٥ وَٱلۡأَرۡضِ وَمَا طَحَىٰهَا
٦ وَنَفۡسٖ وَمَا سَوَّىٰهَا ٧ فَأَلۡهَمَهَا فُجُورَهَا وَتَقۡوَىٰهَا ٨ قَدۡ
أَفۡلَحَ مَن زَكَّىٰهَا ٩ وَقَدۡ خَابَ مَن دَسَّىٰهَا ١٠ كَذَّبَتۡ ثَمُودُ
بِطَغۡوَىٰهَآ ١١ إِذِ ٱنۢبَعَثَ أَشۡقَىٰهَا ١٢ فَقَالَ لَهُمۡ رَسُولُ ٱللَّهِ
نَاقَةَ ٱللَّهِ وَسُقۡيَٰهَا ١٣ فَكَذَّبُوهُ فَعَقَرُوهَا فَدَمۡدَمَ
عَلَيۡهِمۡ رَبُّهُم بِذَنۢبِهِمۡ فَسَوَّىٰهَا ١٤ وَلَا يَخَافُ عُقۡبَٰهَا ١٥

## سُورَةُ ٱللَّيۡلِ

آياتها ٢١ — ترتيبها ٩٢

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

وَٱلَّيۡلِ إِذَا يَغۡشَىٰ ١ وَٱلنَّهَارِ إِذَا تَجَلَّىٰ ٢ وَمَا خَلَقَ ٱلذَّكَرَ وَٱلۡأُنثَىٰٓ ٣
إِنَّ سَعۡيَكُمۡ لَشَتَّىٰ ٤ فَأَمَّا مَنۡ أَعۡطَىٰ وَٱتَّقَىٰ ٥ وَصَدَّقَ بِٱلۡحُسۡنَىٰ ٦
فَسَنُيَسِّرُهُۥ لِلۡيُسۡرَىٰ ٧ وَأَمَّا مَنۢ بَخِلَ وَٱسۡتَغۡنَىٰ ٨ وَكَذَّبَ بِٱلۡحُسۡنَىٰ
٩ فَسَنُيَسِّرُهُۥ لِلۡعُسۡرَىٰ ١٠ وَمَا يُغۡنِي عَنۡهُ مَالُهُۥٓ إِذَا تَرَدَّىٰٓ ١١ إِنَّ عَلَيۡنَا
لَلۡهُدَىٰ ١٢ وَإِنَّ لَنَا لَلۡأٓخِرَةَ وَٱلۡأُولَىٰ ١٣ فَأَنذَرۡتُكُمۡ نَارٗا تَلَظَّىٰ ١٤

bərzəx dünyasının əziyyətinə, daha sonra isə, axirət əzab-əziyyətinə düçar olacaqdır.

(5) **﴾Məgər insan heç kəsin ona gücü çatmayacağını zənn edir?﴿** Məgər elə hesab edir ki, nə qədər günah işlətsə, yenə də ondan heç kəs, hətta onun Rəbbi də intiqam ala bilməyəcək?!

(6) **﴾Mən xeyli mal-dövlət sərf etmişəm!" – deyir.﴿**

(7) **﴾Məgər o heç kəsin onu görmədiyini güman edir?!﴿** Məgər o elə düşünür ki, uca Allah onu görmür, bir gün malını haradan qazandığını və hara xərclədiyini soruşmayacaq?!

(8) **﴾Məgər Biz, ona iki göz vermədikmi?!﴿**

(9) **﴾Eləcə də, bir dil və qoşa dodaq vermədikmi?!﴿**

(10) **﴾Biz ona, iki yol göstərmədikmi?!﴿** Məgər Biz, ona xeyir və şər yollarını açıq-aşkar nişanələrlə göstərmədikmi?

(11) **﴾Lakin o, aşırımı keçə bilmədi.﴿** Məgər o, bir az cəhd edib, Allaha itaət etməyə mane olan nəfsi istəklər, şeytan və s. bu kimi aşırımları aşa bilməzdimi?

(12) **﴾Sən nə bilirsən ki, aşırım nədir?!﴿**

(13) **﴾O, bir kölə azad etməkdir;﴿**

(14) **﴾Yaxud aclıq günü yemək verməkdir –﴿**

(15) **﴾Qohumluq əlaqəsi çatan bir yetimə.﴿** yemək vermək, onu dolandırmaqdır.

(16) **﴾Və ya torpağa sərilmiş bir miskinə!﴿** Bu aşırım yoxsulluqdan torpağa yapışmış insanı doyurmaqdır. Mücahid deyir: *"Ayəda aynina geyinməyə paltar tapa bilməyən yoxsul kimsə nəzərdə tutulur".*

(17) **﴾Sonra da iman gətirən və bir-birinə səbr tövsiyə edən, mərhəmət tövsiyə edən kimsələrdən olmaqdır!﴿** Sadalanan bu ibadətlər iman gətirdikdən sonra əməlini Allah üçün edənlərə fayda verər. O kəslər ki, Allaha itaətdə, asilik etməməkdə, başlarına gələn müsibətlərdə səbirli olarlar. Həmçinin Allahın bəndələrinə qarşı mərhəmətli olmağı bir-birinə tövsiyə edərlər.

(18) **﴾Onlar sağ tərəf sahibləridir!﴿**

(19) **﴾Ayələrimizi inkar edənlər isə, sol tərəf sahibləridir!﴿**

(20) **﴾Onları hər tərəfi qapalı Cəhənnəm gözləyir!﴿** Həm qapalı, həm də təbəqəli cəhənnəm.

## əş-Şəms surəsi 91

*(Günəş)*

(1) **﴾And olsun günəşə və onun saçdığı şöləyə;﴿**

(2) **﴾And olsun ardınca çıxan aya;﴿** Günəş batandan sonra çıxan aya.

(3) **﴾And olsun onu parlaq edən gündüzə;﴿** Günün ortasında günəş daha çox parlaq və şöləli olar.

(4) **﴾And olsun onu örtən gecəyə;﴿**

(5) **﴾And olsun göyə və onu yaradana;﴿**

(6) **﴾And olsun yerə və onu döşəyənə;﴿** Yeri hərtərəfli rahat edənə.

(7) **﴾And olsun nəfsə və onu yaradana;﴿** İnsanı yaradan, ona sağlam əza, ruh, böyük iradə və pak düşüncə *(fitrət)* verənə and olsun. Peyğəmbər (Səllallahu aleyhi və səlləm) deyir: **"Doğulan hər bir uşaq fitrətli *(sağlam, islami düşüncəli)* doğulur. Sonradan ata anası onu yəhudi, nəsrani və ya atəşpərəst edir".**

(8) **﴾Sonra da ona günahlarını və pis əməllərdən çəkinməsini öyrədənə!﴿** Yaxşı və ya pis cəhətlərini öyrədənə.

(9) **﴾Nəfsini təmizləyən mütləq nicat tapacaqdır!﴿** Nəfsini iman və Allah qorxusu ilə yetişdirən, təmizləyən nicat tapacaqdır.

(10) **﴾Onu batıran isə, əlbəttə, ziyana uğrayacaqdır.﴿** Nəfsini pis yola aparan, Allahdan uzaq salan, ibadət və yaxşı işlərdən məhrum edən kimsə xəsarət çəkər.

(11) **﴾Səmud azğınlığı üzündən təkzib etmişdi.﴿** Günahlara hədsiz dərəcədə aludə olub, azğınlıq etmək onları təkzib etməyə vadar etdi.

(12) **﴾Onların ən rəzili qalxdığı zaman.﴿** Səmud qəbiləsinin, yaxud məxluqatın ən

rəzil adamı Qədar ibn Salif qalxıb dəvəni öldürdüyü zaman.

13 **﴾Allahın peyğəmbəri onlara belə demişdi: "Allahın bu dişi dəvəsinə toxunmayın, onun su içməsinə mane olmayın.﴿** Saleh Peyğəmbər dəvəni sərbəst buraxmaq və su içdikdə ona mena olmamaq barədə onlara xəbərdarlıq etmişdi.

14 **﴾Lakin onlar yalançı saydılar və onu tutub kəsdilər. Rəbbi də bu günahlarına görə onların kökünü kəsib, yerlə yeksan etdi.﴿** Allah onları həlak etdi, yerin altına gömdü və onları əzaba layiq bildi.

15 **﴾Allah bu işin aqibətindən qorxmaz!﴿** Uca Allah onlara verdiyi bu əzabdan dolayı, heç kəsdən qorxmaz, çəkinməz.

## əl-Leyl surəsi 92

### *(Gecə)*

1 **﴾And olsun bürüməkdə olan gecəyə;﴿**
2 **﴾And olsun işıqlanmaqda olan gündüzə;﴿**
3 **﴾And olsun erkəyi və dişini yaradana ki,﴿**
4 **﴾Sizin zəhmətiniz cürbəcürdür!﴿** Bəziniz Cənnət üçün, bəziniz isə Cəhənnəm üçün çalışırsınız. Kimisi nəfsini əsir edir, kimisi də nəfsini azadlığa doğru aparır.

5 **﴾Kim xərcləsə və qorunsa,﴿** Malını xeyirli işlərə sərf etsə və Allahın qadağan etdiyi haramlardan qorunsa,

6 **﴾Və ən gözəl olanı təsdiq etsə,﴿** Malını xeyirli işlərə xərcləyərək əməli ilə Allahın ona vəd etdiyi ən gözəl vədi təsdiqləyərsə,

7 **﴾Biz ona ən asan olanı müyəssər edəcəyik!﴿** Malını xeyirli işlərdə xərcləmək və Allaha itaət etmək üçün müvəffəq edəcəyik. Bu ayələr Əbu Bəkr ﷺ haqqında nazil olmuşdur. O Məkkə müşriklərinin əlində olan və əzaba düçar qalan altı nəfər mömin köləni almış və azad etmişdi.

8 **﴾Amma kim xəsislik etsə, möhtac olmadığını sansa,﴿** Xəsislik edər və Allahın verəcəyi savaba möhtac olmadığını sanarsa,

9 **﴾Və ən gözəl olanı yalan saysa,﴿** Allahın ona vəd etdiyi ən gözəl vədi inkar edərsə,

10 **﴾Biz ona ən çətin olanı müyəssər edəcəyik!﴿** Onu çətin işlərə hazırlayacaq və çətinliyə düşməsini rahat edəcəyik ki, xeyirxahlıq qapılarından məhrum olsun, nəticədə cəhənnəmi qazansın.

11 **﴾Cəhənnəmə düşəcəyi zaman mal-dövləti ona heç bir fayda verməz.﴿** Paxıllıq edib xərcləmədiyi mal-dövləti də onu bu əzabdan xilas edə bilməz.

12 **﴾Bizim öhdəmizə düşən yalnız doğru yolu göstərməkdir!﴿** Doğru yolu azğınlıq yolundan fərqləndirmək bizim borcumuzdur.

لَا يَصْلَىٰهَآ إِلَّا ٱلْأَشْقَى ﴿١٥﴾ ٱلَّذِى كَذَّبَ وَتَوَلَّىٰ ﴿١٦﴾ وَسَيُجَنَّبُهَا
ٱلْأَتْقَى ﴿١٧﴾ ٱلَّذِى يُؤْتِى مَالَهُۥ يَتَزَكَّىٰ ﴿١٨﴾ وَمَا لِأَحَدٍ عِندَهُۥ مِن
نِّعْمَةٍ تُجْزَىٰٓ ﴿١٩﴾ إِلَّا ٱبْتِغَآءَ وَجْهِ رَبِّهِ ٱلْأَعْلَىٰ ﴿٢٠﴾ وَلَسَوْفَ يَرْضَىٰ ﴿٢١﴾

ترتيبها ٩٣ — سُورَةُ الضُّحَىٰ — آياتها ١١

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

وَٱلضُّحَىٰ ﴿١﴾ وَٱلَّيْلِ إِذَا سَجَىٰ ﴿٢﴾ مَا وَدَّعَكَ رَبُّكَ وَمَا قَلَىٰ ﴿٣﴾
وَلَلْءَاخِرَةُ خَيْرٌ لَّكَ مِنَ ٱلْأُولَىٰ ﴿٤﴾ وَلَسَوْفَ يُعْطِيكَ رَبُّكَ
فَتَرْضَىٰٓ ﴿٥﴾ أَلَمْ يَجِدْكَ يَتِيمًا فَـَٔاوَىٰ ﴿٦﴾ وَوَجَدَكَ ضَآلًّا
فَهَدَىٰ ﴿٧﴾ وَوَجَدَكَ عَآئِلًا فَأَغْنَىٰ ﴿٨﴾ فَأَمَّا ٱلْيَتِيمَ فَلَا تَقْهَرْ
﴿٩﴾ وَأَمَّا ٱلسَّآئِلَ فَلَا تَنْهَرْ ﴿١٠﴾ وَأَمَّا بِنِعْمَةِ رَبِّكَ فَحَدِّثْ ﴿١١﴾

ترتيبها ٩٤ — سُورَةُ الشَّرْحِ — آياتها ٨

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

أَلَمْ نَشْرَحْ لَكَ صَدْرَكَ ﴿١﴾ وَوَضَعْنَا عَنكَ وِزْرَكَ ﴿٢﴾ ٱلَّذِىٓ
أَنقَضَ ظَهْرَكَ ﴿٣﴾ وَرَفَعْنَا لَكَ ذِكْرَكَ ﴿٤﴾ فَإِنَّ مَعَ ٱلْعُسْرِ يُسْرًا ﴿٥﴾ إِنَّ
مَعَ ٱلْعُسْرِ يُسْرًا ﴿٦﴾ فَإِذَا فَرَغْتَ فَٱنصَبْ ﴿٧﴾ وَإِلَىٰ رَبِّكَ فَٱرْغَب ﴿٨﴾

əl-Fərra adlı alim deyir: *"Kim hidayət yolunu tutarsa, Allaha doğru gedər. Kim Allahın yanına getmək istəyirsə Allah onu yolunda qarşılar. Kim Onu istəyərsə, Ona tərəf yönələr".*

13 **﴾Axirət də Bizim, dünya da Bizimdir!﴿** Axirətdə və dünyada nə varsa, hamısı bizə məxsusdur. Biz onları istədiyimiz kimi istifadə edirik.

14 **﴾Mən sizi alovlanan bir atəşlə qorxutdum.﴿**
15 **﴾Ora ancaq azğın daxil olar.﴿** Bu azğınlar kafirlərdir.

16 **﴾O kimsə ki, yalan sayar, üz döndərər!﴿** O kimsələr Peyğəmbərlərin təbliğ etdikləri haqqı yalan sayıb, itaətdən və imandan üz döndərənlərdir.

17 **﴾Allahdan qorxub pis əməllərdən çəkinən isə, ondan uzaqlaşdırılar.﴿** Küfrdən çəkinən kimsəni küfrə düşməkdən Allah qoruyar. əl-Vahidi adlı alim deyir: *"Təfsir alimlərinin yekdil rəyinə əsasən ayədə deyilən "Allahdan qorxub pis əməllərdən çəkinən" kimsə Əbu Bəkrdir ﷺ. Ayə Əbu Bəkr ﷺ haqqında nazil olub, amma onun hökmü hər kəsə aid ola bilər. Daha doğrusunu Allah bilir".*

18 **﴾O kimsə ki, malını verib təmizlənər,﴿** Malını xeyir işlərə sərf edər və bu əməli ilə

günahlardan pak olmağa çalışar.

19 **﴾O şəxsin boynunda heç kəsin bir minnəti yoxdur ki, onun əvəzi verilsin.﴿** O, verdiyi sədəqə müqabilində heç kəsdən qarşılıq gözləməz.

20 **﴾O ancaq ən uca olan Rəbbinin rizasını qazanmaq üçün belə edər.﴿**

21 **﴾And olsun ki, o, razı olacaqdır!﴿** Tallah[1] o, ona verəcəyimiz mükafatdan razı qalacaqdır.

## əd-Duha surəsi 93

### (gündüz)

Bir dəfə Peyğəmbər (Sallallahu aleyhi və səlləm) xəstələnmiş və iki, yaxud üç gecə idi ki, gecə namazına durmurdu. Bir qadın onun yanına gəlib dedi: "Ey Muhəmməd! Görürəm ki, şeytanın səni tənha qoyub. İki, üç gecədir sənə bir xəbər vermir." Sonra uca Allah bu surəni nazil etdi.

1 **﴾And olsun gündüzə;﴿**

2 **﴾And olsun getdikcə zülməti artan gecəyə ki,﴿** əl-Əsmai adlı alim deyir: *"Bir insan paltarla örtüldüyü kimi, gecə də gündüzü örtür"*.

3 **﴾Rəbbin səni nə tərk etdi, nə də sənə acığı tutdu.﴿** Rəbbin səninlə vidalaşmayıb, vəhyi kəsməyib, sənə qəzəbi tutmayıb.

4 **﴾Şübhəsiz ki, axirət sənin üçün dünyadan daha xeyirlidir!﴿** Sənin üçün cənnət bu dünyadan daha xeyirlidir. Peyğəmbərliklə şərəfləndirilmiş insan üçün cənnətin dünyadan daha xeyirli olması deyilirsə, görəsən bizim üçün nə qədər xeyirli olar?!

5 **﴾Həqiqətən, Rəbbin sənə bəxş edəcək və sən razı qalacaqsan!﴿** Rəbbin sənə bu dünyada dini yayıb zəfər çalmağı, axirətdə isə savabını, hovuzu və ümmətin üçün şəfaəti sənə bəxş edəcəkdir. Sən də bundan tam razı qalacaqsan.

6 **﴾Məgər sən yetim ikən O sənə sığınacaq vermədimi?!﴿** Sən, uşaq ikən atan yox idi. O, sənə sığınacaq verdi.

7 **﴾Sən, şaşqın vəziyyətdə ikən sənə yol göstərmədimi?!﴿** Sən, Quranın və ya şəriətin nə olduğunu bilmirdin. Allah səni bu yola yönəltdi.

8 **﴾Sən, yoxsul ikən səni dövlətli etmədimi?!﴿**

9 **﴾Elə isə, yetimə zülm etmə!﴿** Onun zəif olmasından istifadə edib ona zülm etmə. Öz yetimlyini yadına sal və onun haqqını özünə ver.

10 **﴾Dilənçini də qovma!﴿** Dilənçi səndən nə isə istədikdə onu qovma. Bir zamanlar sən də yoxsul idin. İndi sən ona bir şey ver, ya da onu gözəl şəkildə yola ver.

11 **﴾Və Rəbbinin sənə olan nemətindən söhbət aç!﴿** Uca Allah Peyğəmbərinə ona verilən nemətləri dilə gətirməyi və biruzə verməyi əmr edir. Allahın verdiyi nemətlərdən danışmaq nemət şükrüdür. Bəzi alimlər deyirlər ki, ayədəki nemət Qurandır. O, Quranı oxumağı və onu danışmağı əmr edir.

## əl-İnşirah surəsi 94

### (Genişlənmə)

1 **﴾Məgər Biz, sənin köksünü açıb genişlətmədikmi?!﴿** Ey Muhəmməd, Biz sənin köksünü Peyğəmbərliyi qəbul etsin deyə genişlətdik. Elə buna görə o dəvətə başlayıb bütün çətinliklərə sinə gələrək dözdü və vəhyi əzbərlədi.

2 **﴾Ağır yükünü səndən götürmədikmi?!﴿** Cahiliyyət dövründə etdiyin əməlləri bağışladıq.

3 **﴾Sənin belini bükürdü.﴿** Əgər bu yükü daşıyası olsaydın, ağırlığından belin bükülərdi.

4 **﴾Sənin ad-sanını ucaltmadıqmı?!﴿** Bir çox amillərlə dünya və axirətdə sənin şərəfini artırdıq. *"Əşhadu allə iləhə illəllah"* deyən möminlərə *"əşhadu ənnə Muhəmmədən rəsulullah"* – deməyi də vacib etdi. Azanda onun adını qeyd etdi, ona salavat və salam deməyi əmr etdi.

5 **﴾Şübhəsiz ki, hər çətinlikdən sonra bir asanlıq gələr!﴿**

6 **﴾Həqiqətən, hər çətinlikdən sonra bir asanlıq gələr!﴿** Əvvəldə deyilən çətinlikdən sonra bir asanlıq vardır. Bunların hər ikisi Allah tərəfindəndir.

7 **﴾Elə ki, azad oldun, qalx!﴿** Namazı, dəvəti, yaxud döyüşü bitirdikdən sonra çoxlu dua et və Allahdan ehtiyac duyduğun nə varsa, onu da istə. Qalx, ibadətini də et.

8 **﴾Və ancaq Rəbbinə yalvar!﴿** Cəhənnəmdən qorxaraq, cənnətə rəgbət bəsləyərək, rəbbinə müti ol.

## ət-Tin surəsi 95

### (Əncir)

1 **﴾And olsun əncirə və zeytuna;﴿** Uca Allah insanların yediyi əncirə, yağını çəkdikləri zeytuna and içir. Bu iki meyvə Fələstin torpaqlarıdan kinayədir. Çünki bu torpaqlar əncir və zeytunun vətənidir.

2 **﴾And olsun Tur dağına;﴿** Bu dağ uca Allahın orada Musanı danışdırdığı "Turi Sina" dağıdır.

3 **﴾And olsun bu təhlükəsiz şəhərə!﴿** Yəni Məkkəyə. Bu şəhər əmin-amanlıq şəhəri olduğu üçün onu əmin adlandırmışdır. Uca

---

1 Allaha and içmək üçün üç ifadə işlədilir: Vallahi, billəhi və tallahi.

Allah bu üç yerə and içir. Çünki bu yerlərdə Musaya, İsaya və Muhəmmədə vəhy və üç səmavi kitab nazil olmuş, bəşəriyyət də bu yerlərdən hidayət nuru ilə nurlanmışdır.

(4) **﴾Biz, insanı ən gözəl biçimdə yaratdıq!﴿** Ona boy-buxun verdik və o, əlini uzadıb istədiyi qidanı qəbul edir. Ona elm, danışıq və düşüncə qabiliyyəti də verdik. Bu imkanlar insanın yer üzündə Allahın xəlifəsi olması üçün verilmişdir.

(5) **﴾Sonra da onu qaytarıb, rəzillərin rəzili edərik!﴿** Biz onu cavanlıq və gümrahlıq dönəmindən sonra ömrünün ən rəzil çağlarına, yaşa dolub əldən düşmüş çağlarına qaytararıq. Bəzi təfsirçilər ayəni belə açıqlayırlar: Allahın ən gözəl biçimdə yaratdığı insan kafir kimi ölüb dirildikdən sonra heyvandan da pis halda olacaqdır. O, cəhənnəmin ən dərin qatında olacaqdır.

(6) **﴾Yalnız iman gətirib yaxşı əməllər edənlərdən başqa! Onları minnətsiz mükafat gözləyir.﴿** Onlar rəzilliyə deyil, yüksək cənnətlərə düşəcəklər. Onların mükafatı əbədi olacaqdır.

(7) **﴾Səni dini yalan saymağa vadar edən nədir?!﴿** Ey insan! Allahın səni ən gözəl biçimdə yaratdığını və kafir kimi öləcəyin təqdirdə, ən rəzil səviyyəyə düşəcəyini bildikdən sonra səni ölümdən sonrakı həyatı təkzib etməyə vadar edən nədir?!

(8) **﴾Məgər Allah hakimlərin hakimi deyilmi?!﴿** Məgər O, hakimlərin ən ədalətlisi deyilmi?! O, insanı ən gözəl biçimdə yaradıb. Küfr edəni cəhənnəmə, iman gətirəni isə, yüksək məqamlara qovuşdurmuşdur.

## əl-Ələq surəsi 96

### *(Laxtalanmış qan)*

Bu, Quranın ən birinci vəhy olunan surəsidir.

(1) **﴾Yoxdan yaradan Rəbbinin adı ilə oxu!﴿** Ey Muhəmməd! Rəbbinin adı ilə oxumağa başla! Yaxud rəbbinin adının köməkliyi ilə oxu!

(2) **﴾O, insanı laxtalanmış qandan yaratdı.﴿** O rəbbin ki, insanın yaradılışını nütfədən başlayıb, sonra onu laxtalanmış qana çevirir.

(3) **﴾Oxu! Sənin Rəbbin ən böyük kərəm sahibidir!﴿** Sən yazıb-oxumaq bilməyən savadsızsan. Amma Rəbbin Öz kəraməti ilə sənə oxumağı ilham edəcəkdir.

(4) **﴾O Rəbbin ki, qələmlə öyrətdi.﴿** Uca Rəbbin insana qələm ilə yazmağı öyrətdi. Uca Allah islam dəvətini yazıb-oxumağa çağırışla başlayır. Çünki oxumağın hədsiz faydası vardır.

(5) **﴾İnsana bilmədiklərini öyrətdi.﴿** Uca rəbbin qələm, elm vasitəsi ilə insana bilmədiklərini öyrətdi.




(6) **﴾Xeyr, insan azğınlıq edər,﴿**

(7) **﴾Özünün dövlətli olduğunu gördüyü üçün!﴿** Malı və gücü sayəsində özünün möhtac olmadığını düşündükdə azğınlığa tərəf gedər.

(8) **﴾Axı sənin axır dönüşün Rəbbinədir!﴿**

(9) **﴾Gördünmü o kimsəni ki, mane olur,﴿**

(10) **﴾Bir bəndəyə namaz qıldığı vaxt?﴿** Namaz qılmağa mane olan Əbu Cəhldir. Namaz qılan bəndə isə, Muhəmməd Peyğəmbərdir (Sallallahu aleyhi və səlləm).

(11) **﴾Bir də görək, əgər o doğru yoldadırsa,﴿** Muhəmməd (Sallallahu aleyhi və səlləm) doğru yolda olub, başqalarına da bu haqq yola dəvət edirsə,

(12) **﴾Yaxud xalqa Allahdan qorxmağı əmr edirsə?!﴿** İnsanlara ixlası, tövhidi, saleh əməlləri əmr edirsə, bunun nəyi pisdir?! Nə üçün sən onun namaz qılmasına mane olursan?!

(13) **﴾Bir də görək, yalan sayır və üz döndərirsə,﴿** Əgər Əbu Cəhl sənin gətirdiyin kitabı və şəriəti təkzib edir, imandan üz döndərirsə,

(14) **﴾Məgər bilmir ki, Allah görür?!﴿** Bir gün etdiklərinin cəzasını verəcəkdir.

(15) **﴾Yox, yox! Əgər əməllərinə son qoymasa, and olsun ki, Biz onu kəkilindən yapışıb sürükləyəcəyik – ﴿** Bu bir





سُورَةُ القَدْرِ

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

إِنَّآ أَنزَلْنَٰهُ فِى لَيْلَةِ ٱلْقَدْرِ ١ وَمَآ أَدْرَىٰكَ مَا لَيْلَةُ ٱلْقَدْرِ ٢
لَيْلَةُ ٱلْقَدْرِ خَيْرٌ مِّنْ أَلْفِ شَهْرٍ ٣ تَنَزَّلُ ٱلْمَلَٰٓئِكَةُ وَٱلرُّوحُ
فِيهَا بِإِذْنِ رَبِّهِم مِّن كُلِّ أَمْرٍ ٤ سَلَٰمٌ هِىَ حَتَّىٰ مَطْلَعِ ٱلْفَجْرِ ٥

سُورَةُ البَيِّنَةِ

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

لَمْ يَكُنِ ٱلَّذِينَ كَفَرُوا۟ مِنْ أَهْلِ ٱلْكِتَٰبِ وَٱلْمُشْرِكِينَ مُنفَكِّينَ
حَتَّىٰ تَأْتِيَهُمُ ٱلْبَيِّنَةُ ١ رَسُولٌ مِّنَ ٱللَّهِ يَتْلُوا۟ صُحُفًا مُّطَهَّرَةً ٢
فِيهَا كُتُبٌ قَيِّمَةٌ ٣ وَمَا تَفَرَّقَ ٱلَّذِينَ أُوتُوا۟ ٱلْكِتَٰبَ إِلَّا مِنۢ
بَعْدِ مَا جَآءَتْهُمُ ٱلْبَيِّنَةُ ٤ وَمَآ أُمِرُوٓا۟ إِلَّا لِيَعْبُدُوا۟ ٱللَّهَ مُخْلِصِينَ
لَهُ ٱلدِّينَ حُنَفَآءَ وَيُقِيمُوا۟ ٱلصَّلَوٰةَ وَيُؤْتُوا۟ ٱلزَّكَوٰةَ ۚ وَذَٰلِكَ دِينُ
ٱلْقَيِّمَةِ ٥ إِنَّ ٱلَّذِينَ كَفَرُوا۟ مِنْ أَهْلِ ٱلْكِتَٰبِ وَٱلْمُشْرِكِينَ
فِى نَارِ جَهَنَّمَ خَٰلِدِينَ فِيهَآ ۚ أُو۟لَٰٓئِكَ هُمْ شَرُّ ٱلْبَرِيَّةِ ٦ إِنَّ
ٱلَّذِينَ ءَامَنُوا۟ وَعَمِلُوا۟ ٱلصَّٰلِحَٰتِ أُو۟لَٰٓئِكَ هُمْ خَيْرُ ٱلْبَرِيَّةِ ٧

xəbərdarlıqdır. Əgər o, bu çirkin əməllərini tərk etməsə, biz onun kəkilindən tutub cəhənnəmə sürükləyəcək və orada ona şiddətli əzab daddıracağıq. Kəkil, başın ön tərəfində bitən tükləridir.

16 **﴾Özü də yalançı, günahkar kəkilindən!﴿** Bu kəkil sahibi günahkardır, haqqı təkzib edəndir.

17 **﴾Qoy o, özünün bütün tərəfdarlarını çağırsın!﴿** Rəvayətə görə bir dəfə Əbu Cəhl Peyğəmbərə (Sallallahu aleyhi və səlləm): Məkkədə mənim tərəfdarım çox olduğu halda sən məni təhdid edirsənmi? – demiş və sonra bu ayə nazil olmuşdu.

18 **﴾Biz də zəbaniləri çağıracağıq!﴿** Zəbanilər cəhənnəmə nəzarət edən kobud rəftarlı və qəzəbli mələklərdir. Biz onları çağırıb səni cəhənnəm atəşinə atmağı əmr edəcəyik.

19 **﴾Yox, yox! Sən ona uyma! Sən ancaq Rəbbinə səcdə et və Ona yaxınlaş!﴿** Onun namazı tərk etmək çağırışlarına uyma. Ümidini kəsmədən və ondan çəkinmədən Rəbbinə ibadət et. İtaət və ibadətlə Rəbbinə yaxın ol.

# əl-Qədr surəsi 97

## *(Qədr gecəsi)*

1 **﴾Həqiqətən Biz, onu Qədr gecəsi nazil etdik!﴿** Qədr gecəsində Qurani-Kərim Lövhi-Məhfuzdan bütöv şəkildə dünya səmasına endirilmişdi. Sonra iyirmi üç il ərzində oradan müvafiq məqamlarda ayələr nazil olurdu. Qədr gecəsi Ramazan ayının son on günündə bir gecədir. Bu on günün içərisində qədr gecəsinin təyin edilməsi haqqında rəvayətlər müxtəlifdir.

2 **﴾Sən nə bilirsən ki, Qədr gecəsi nədir?!﴿** Bu gecənin qədr gecəsi adı ilə adlandırılmasına səbəb uca Allahın bu gündə bir ilin qədərini təyin etməsidir. Bəzi rəylərə görə bu gün öz şərəf və dəyərinə görə bu adla adlandırılmışdır.

3 **﴾Qədr gecəsi min aydan daha xeyirlidir!﴿** Bu bir gecədə edilən yaxşı əməl, min ayda edilən yaxşı əməldən daha çox savabdır.

4 **﴾O gecə mələklər və ruh Rəbbinin izni ilə hər bir işdən dolayı yerə enərlər.﴿** Onlar özlərinə verilən bütün əmrləri icra etmək üçün göylərdən yerə enərlər. Ruh, Cəbraildir.

5 **﴾O gecə dan yeri sökülənə kimi salamatlıqdır!﴿** Qədr gecəsi bütünlüklə xeyir-bərəkətdən ibarətdir, bu gecədə şər yoxdur. O gecə şeytan heç bir pis iş görə bilməz. Bu hal, mələklərin enməsi və xeyir-bərəkətin davamı sübh vaxtına qədər davam edir.

# əl-Bəyyinə surəsi 98

## *(Açıq-aydın dəlil)*

1 **﴾Kitab əhlindən kafir olanlar və müşriklər özlərinə açıq-aşkar bir dəlil gəlməyənə qədər ayrılan deyildilər.﴿** Kitab əhli yəhudilər və xaçpərəstlərdir. Kitab əhli və müşrik ərəblər açıq-aşkar bir dəlil, yəni Muhəmmədi (Sallallahu aleyhi və səlləm) və onun gətirdiyi şəriəti görməyənə qədər küfrdən və bütlərə ibadətdən əl çəkən deyildilər. Peyğəmbər (Sallallahu aleyhi və səlləm) onlara səhv yolda olduqlarını çatdırdı və onları imana dəvət etdi.

2 **﴾Pak səhifələri onlara oxuyan, Allah tərəfindən göndərilmiş peyğəmbərdir.﴿** Muhəmməd peyğəmbər (Sallallahu aleyhi və səlləm) sizə təhrif və təbdildən qorunan bir kitabı, Qurani-Kərimi oxuyur. O, həqiqətən Allahın kəlamıdır.

3 **﴾O səhifələrdə doğru-dürüst hökmlər vardır.﴿** Bu kitabın hökmləri ədalət və haqq prinsipləri əsasında köklənmişdir. Orada olan bütün məlumatlar insanları islah edən, onlara doğru yolu göstərən hikmətli kəlamlardır. Uca Allah buyurur: ﴾Kitabı Öz quluna nazil edən və onda heç bir nöqsana

yol verməyən Allaha həmd olsun! Allah, Öz tərəfindən gələcək şiddətli bir əzabla günahkarları qorxutmaq, yaxşı işlər görən möminləri gözəl mükafata nail olacaqları ilə müjdələmək üçün bu Kitabı dopdoğru şəkildə nazil etdi.﴿ Kim bu kitaba itaət edərsə, Allahın doğru yolunda olar.

4 ﴾**Kitab əhli yalnız özlərinə açıq-aydın dəlil gəldikdən sonra ayrılığa düşdülər.**﴿ Onlar haqqın mütəşabih olmasına görə yollarını azmamışdılar. Əksinə, haqq onlara gün kimi aydın olduqdan sonra özləri yollarını azdılar. Uca Allah Muhəmmədi peyğəmbər göndərdikdə bəziləri ona iman gətirdi, bəziləri isə inkar etdilər. Halbuki onlar, Allahın dinini və Peyğəmbərini təsdiq edən vahid yolu tutmalı idilər.

5 ﴾**Halbuki onlara əmr edilmişdi ki, Allaha – dini yalnız Ona məxsus edərək, batildən haqqa dönərək – ibadət etsinlər, namaz qılıb zəkat versinlər. Doğru-düzgün din budur!**﴿ Bu, Quranda və ondan əvvəlki kitablara deyilən əmrdir. Bütün səmavi kitablar insanı vahid Allaha ibadət etməyə və Ona şərik qoşmamağa, batil inancları tərk edib, İslam dininə[1] itaət etməyə çağırır.

6 ﴾**Həqiqətən, kitab əhlindən kafir olanların və müşriklərin yeri cəhənnəm odudur. Onlar orada əbədi qalacaqlar. Onlar yaradılmışların ən pisidirlər.**﴿ Onlar haqqı həsəd və inadkarlıqla rədd etdikləri üçün yaradılmışların ən şəri hesab olunurlar. Elə bu səbəblə onların cəzası şər, yəni cəhənnəm olacaqdır.

7 ﴾**İman gətirib yaxşı əməllər edənlər isə, yaradılmışların ən yaxşılarıdır.**﴿

8 ﴾**Onların öz Rəbbi yanındakı mükafatı altından çaylar axan Ədn cənnətləridir. Onlar orada əbədi qalacaqlar. Allah onlardan razıdır, onlar da Allahdan. Bu mükafat Rəbbindən qorxanlar üçündür!**﴿ Etdikləri saleh əməllərin və imanın mükafatı əbədi qalacaqlar naim cənnətləridir.

## əz-Zəlzələ surəsi 99

### *(Zəlzələ)*

1 ﴾**Yer özünə məxsus bir şiddətlə lərzəyə gəlib titrəyəcəyi zaman;**﴿ Yer böyük təkanla titrədikdə üzərində olanları darmadağın edər.

2 ﴾**Yer öz yükünü çıxardıb atacağı**

جَزَآؤُهُمۡ عِندَ رَبِّهِمۡ جَنَّٰتُ عَدۡنٖ تَجۡرِي مِن تَحۡتِهَا ٱلۡأَنۡهَٰرُ خَٰلِدِينَ
فِيهَآ أَبَدٗاۖ رَّضِيَ ٱللَّهُ عَنۡهُمۡ وَرَضُواْ عَنۡهُۚ ذَٰلِكَ لِمَنۡ خَشِيَ رَبَّهُۥ ٨

سُورَةُ الزَّلۡزَلَةِ — آياتها ٨ — ترتيبها ٩٩

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

إِذَا زُلۡزِلَتِ ٱلۡأَرۡضُ زِلۡزَالَهَا ١ وَأَخۡرَجَتِ ٱلۡأَرۡضُ أَثۡقَالَهَا
٢ وَقَالَ ٱلۡإِنسَٰنُ مَا لَهَا ٣ يَوۡمَئِذٖ تُحَدِّثُ أَخۡبَارَهَا ٤
بِأَنَّ رَبَّكَ أَوۡحَىٰ لَهَا ٥ يَوۡمَئِذٖ يَصۡدُرُ ٱلنَّاسُ أَشۡتَاتٗا
لِّيُرَوۡاْ أَعۡمَٰلَهُمۡ ٦ فَمَن يَعۡمَلۡ مِثۡقَالَ ذَرَّةٍ خَيۡرٗا
يَرَهُۥ ٧ وَمَن يَعۡمَلۡ مِثۡقَالَ ذَرَّةٖ شَرّٗا يَرَهُۥ ٨

سُورَةُ العَادِيَاتِ — آياتها ١١ — ترتيبها ١٠٠

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

وَٱلۡعَٰدِيَٰتِ ضَبۡحٗا ١ فَٱلۡمُورِيَٰتِ قَدۡحٗا ٢ فَٱلۡمُغِيرَٰتِ صُبۡحٗا
٣ فَأَثَرۡنَ بِهِۦ نَقۡعٗا ٤ فَوَسَطۡنَ بِهِۦ جَمۡعًا ٥ إِنَّ ٱلۡإِنسَٰنَ
لِرَبِّهِۦ لَكَنُودٞ ٦ وَإِنَّهُۥ عَلَىٰ ذَٰلِكَ لَشَهِيدٞ ٧ وَإِنَّهُۥ لِحُبِّ
ٱلۡخَيۡرِ لَشَدِيدٌ ٨ ۞ أَفَلَا يَعۡلَمُ إِذَا بُعۡثِرَ مَا فِي ٱلۡقُبُورِ ٩

**zaman;**﴿ İkinci dəfə Sura üfürüldükdə yer daxilində olan ölüləri çıxardacaqdır.

3 ﴾**İnsan: "Buna nə olub?" – deyəcəyi zaman –**﴿ Yerin bu davranışından təəccüblənən insan: *"nə üçün yer titrəyib öz yükünü kənara atır?"* – deyə sual verəcəkdir.

4 ﴾**Məhz o gün yer öz hekayətini söyləyəcəkdir –**﴿ O gün yer onun üzərində baş verən xeyir və şər haqqında məlumat verəcəkdir. Uca Allah yeri dindirib bəndələrinə şahid edəcək.

5 ﴾**Çünki ona sənin Rəbbin vəhy etmişdir!**﴿ ki, öz şahidliyini etsin, danışsın.

6 ﴾**O gün insanlar əməllərinin özlərinə göstərilməsi üçün dəstə-dəstə çıxacaqlar!**﴿ Qəbirlərindən çıxıb dəstə-dəstə məhşər meydanına doğru gedəcəklər. Bəziləri sağ tərəfə, bəziləri isə, sol tərəfə yönələcəklər. Onlar öz əməllərinin şahidi olmaq üçün məhşər meydanına toplaşacaqlar.

7 ﴾**Kim zərrə qədər yaxşı iş görmüşdürsə, onu görəcəkdir.**﴿ Dünyada etdiyi bu yaxşı əməlini kitabında və ya əyani şəkildə gözü ilə görüb sevinəcəkdir.

8 ﴾**Kim də zərrə qədər pis iş görmüşdürsə, onu görəcəkdir.**﴿Etdiyi pis əməlin müqabilini

---

[1] İslam sözünün mənası təslim olmaq deməkdir. Bütün səmavi kitablar Allaha təslim olmağa çağırmış və tövhidi təbliğ etmişdir. Bu baxımdan bütün səmavi dinləri təhrif olunmadan öncə islam adlandırmaq olar. *(tərc.)*



alacaqdır. Zərrə, qaranlıq yerdə günəş şüaları altında görsənən xırda dənəciklərdir.

## əl-Adiyat surəsi 100

### (Qaçan atlar)

1 **«And olsun tövşüyə-tövşüyə qaçan atlara;»** Bu atlar mücahidləri döyüş meydanında Allaha və rəsuluna qarşı müharibə edən düşmənin üzərinə aparan atlardır.
2 **«And olsun qığılcım qoparan atlara;»** Sürətlə qaçan atın nalı daşlara dəydikdə qığılcım çıxardan atlara and olsun.
3 **«And olsun sübh çağı hücum edən atlara;»**
4 **«And olsun o vaxt toz-duman qopardan atlara;»** Döyüş zamanı düşməni toza boğan atlara and olsun.
5 **«Sonra da onunla dəstəyə təpinən atlara ki,»**
6 **«İnsan öz Rəbbinə qarşı çox nankordur.»**
7 **«Və o özü də buna şahiddir.»** İnsan özündə biruzə verən əlamətlərlə özünün nankorluğuna və küfrünə şahidlik edir.
8 **«Həqiqətən insan, var-dövlətə çox hərisdir!»** Bu yolda özünü ölümə də atar.
9 **«Məgər o bilmirmi ki, qəbirlərdə olanlar çıxardılacağı;»**
10 **«Ürəklərdə olanlar aşkar ediləcəyi zaman.»** Ürəklərdə olan xeyir və şər aşkara çıxacaq.
11 **«Həmin gün Rəbbi onları xəbərdar edəcəkdir!»** İnsan bilməlidir ki, onları diriltdəcək Allah onların nə etdiklərindən xəbərdardır. Onların etdikləri əməllərin heç biri Ondan gizli qalan deyil və hər kəs öz əməlinin müqabilini alacaqdır. Onlar bunu dərk etdikdən sonra mal-dövlət sevgisi onları Rəbbinə şükür etməkdən, ibadətdən və yaxşı əməllərdən yayındırmamalıdır.

## əl-Qariə surəsi 101

### (Ürəkləri dəhşətə salan qiyamət)

1 **«Ürəkləri dəhşətə salan qiyamət!»** Ürəkləri dəhşətə salan, yaxud Allahın düşmənlərini qorxudan mənasını verən "əl-Qariə" sözü qiyamətin adlarından biridir.
2 **«Nədir qiyamət?!»**
3 **«Sən nə bilirsən ki, nədir qiyamət?!»**
4 **«O gün insanlar kəpənək kimi ətrafa səpələnəcək;»** O günün dəhşətindən hara getdiklərini bilməyib, həşərat kimi ətrafda dolaşacaq və sonra məhşər meydanına gələcəklər.
5 **«Dağlar isə, didilmiş yun kimi olacaqdır!»**
6 **«Tərəzisi ağır gələn kimsə,»** Uca Allah insanların sorğu-sualdan sonrakı vəziyyətini vəsf edir. O gün insanlar iki qrupa bölünəcəklər. Yaxşı əməlləri pis əməllərini üstələyib tərəzisi ağır gələn
7 **«Xoş güzəran içində olacaq!»** Ona razı qalacağı həyat, cənnət veriləcəkdir.
8 **«Tərəzisi yüngül gələn kimsənin isə,»**
9 **«Məskəni *(anası)* Haviyə olacaqdır!»** Onun məskəni cəhənnəm olacaqdır. Uca Allah bu ayədə cəhənnəmi ana olaraq vəsf etmişdir. Uşaq anasının yanına qayıtdığı kimi, o da cəhənnəmə qayıdacaqdır. Cəhənnəm dərin və qayıdış yeri olduğu üçün haviyə adlandırılmışdır.
10 **«Sən nə bilirsən ki, o *Haviyə* nədir?!»** Çünki bu qeyri adidir.
11 **«O çox qızmar bir atəşdir!»** Ondan qızmar atəş yoxdur.

## ət-Təkasur surəsi 102

### (Çoxluqla öyünmə)

1 **«Çoxluq ilə öyünmək sizi o qədər şirnikləndirdi ki,»** Mal-dövlət, oğul-uşaq artırmaq və bu çoxluqla öyünmək sizi Allaha itaətdən və axirət əməlindən yayındırdı.
2 **«Hətta qəbirləri ziyarət etdiniz.»** Ölüm sizi haqladı, siz isə, hələ də bu kökdəsiniz.
3 **«Xeyr! Siz mütləq biləcəksiniz!»**

4 **﴾Xeyr, xeyr! Siz mütləq biləcəksiniz!﴿** Uca Allah bəlalərini mal-dövlət toplamaqdan çəkindirir və bildirir ki, onlar qiyamət günü bu əməllərinin aqibətini biləcəklər.
5 **﴾Xeyr, əgər tam yəqinliklə bilsəydiniz!﴿** Əgər siz dünya malını yəqinliklə topladığınız kimi hara getdiyinizi də tam yəqinliklə bilsəydiniz, mal-dövlət hərisliyindən və təkəbbürlülükdən uzaq olardınız. Bunlar sizi Allaha ibadətdən yayındırmazdı.
6 **﴾Siz, o Cəhənnəmi mütləq görəcəksiniz!﴿**
7 **﴾Bəli, siz onu mütləq öz gözünüzlə görəcəksiniz!﴿** Yəqinlik hasil edən baxışla o cəhənnəmi görəcək, müşahidə edəcəksiniz.
8 **﴾Sonra da həmin gün nemətlər barəsində mütləq sorğu-sual olunacaqsınız!﴿** Sizi axirət üçün hazırlıq görməkdən yayındıran dünya nemətləri barəsində soruşulacaqsınız. O gün yaşadığınız əminamanlıq, səhhət, boş vaxt, dadlı qidalar, içkilər, susuzluq anında içdiyiniz sərin su, kölgəsində dincəldiyiniz kölgəliklər və başqa nemətlər barəsində soruşulacaqsınız.

## əl-Əsr surəsi 103

### *(Zəmanə)*

1 **﴾And olsun əsrə!﴿** Uca Allah əsrə and içir. Əsr zəmanə deməkdir. Zəmanəyə and içməyin hikməti onu yaradanın qüdrətinin və tövhidə layiq olmasının əhəmiyyətinə görədir. Ötüb keçən gecə və gündüz, qaranlıq gecə və işıqlı gün, canlıların varlığı, sağ olanların işi-gücü və başqa bu kimi açıq-aşkar sübutlar buna dəlalət edir. Müqatil adlı alim isə deyir ki, ayədə əsr namazının vaxtına and içilir.
2 **﴾İnsan ziyan içindədir?﴿** İflasa uğrayır.
3 **﴾Yalnız iman gətirib yaxşı əməllər edən, bir-birinə haqqı tövsiyə edən və səbri tövsiyə edən kimsələrdən başqa!﴿** Onlar itaətə layiq olan haqqı bir-birinə tövsiyə edərlər. Bu haqq Allaha iman, tövhid etiqadı, Allahın əmr etdiklərinin icrası, qadağalarının tərk edilməsidir. Həmçinin onlar günahlara qarşı səbirli olmağı, fərz ibadətləri yerinə yetirməyi və Onun acılı qəza-qədərinə səbr etməyi bir-birinə tövsiyə edərlər.

## əl-Huməzə surəsi 104

### *(Qeybətçi)*

1 **﴾Üzə tənə vuran və qeybət edən hər kəsin vay halına!﴿**
2 **﴾O kimsə ki, mal yığıb onu dönə-dönə sayar.﴿** Onun tənə və qeybət etməsinin səbəbi topladığı mal-dövlətlə öyünməsi, özünü üstün hesab edib başqalarını alçaltmasıdır.




3 **﴾Və elə zənn edər ki, mal-dövləti onu əbədi yaşadacaqdır.﴿** Mal-dövlətə o qədər hərisdir ki, elə bil mal-dövləti ona əbədi həyat verəcəkdir. Heç ölümünün sonrasını fikirləşmir.
4 **﴾Xeyr! O mütləq *Hütəməyə* atılacaqdır!﴿** Amma heç də onun düşündüyü kimi deyil. O və topladığı mal-dövlət alovlu cəhənnəmə atılacaqdır.
5 **﴾Sən nə bilirsən *Hütəmə* nədir?!﴿**
6 **﴾O, Allahın yanar odudur.﴿**
7 **﴾Elə bir od ki, ürəkləri yandırıb-yaxar.﴿** Onun istisi qəlbləri bürüyər, məhv edər. Çünki qəlb xəbis və məkirli niyyətlərin, təkəbbürlük, alçaqlıq kimi pis əxlaqın toplandığı yerdir.
8 **﴾O, bələlərinin üzünə qapanıb kilidlənəcəkdir.﴿** Onlar heç vaxt oradan çıxa bilməyəcəklər.
9 **﴾Onlar hündür sütunlara bağlanmış olacaqlar!﴿** Müqatil deyir: *"Cəhənnəmin qapıları üzlərinə bağlanacaq və dəmir məftillərlə bərkidiləcəkdir. Bu qapılar bir daha nə açılacaq, nə də onların yanına kimsə girəcək".*

آياتها ٤ — سُورَةُ قُرَيْشٍ — ترتيبها ١٠٦

بِسْمِ اللَّهِ الرَّحْمَٰنِ الرَّحِيمِ

لِإِيلَٰفِ قُرَيْشٍ ﴿١﴾ إِۦلَٰفِهِمْ رِحْلَةَ ٱلشِّتَآءِ وَٱلصَّيْفِ
﴿٢﴾ فَلْيَعْبُدُوا۟ رَبَّ هَٰذَا ٱلْبَيْتِ ﴿٣﴾ ٱلَّذِىٓ أَطْعَمَهُم
مِّن جُوعٍ وَءَامَنَهُم مِّنْ خَوْفٍۭ ﴿٤﴾

آياتها ٧ — سُورَةُ المَاعُونِ — ترتيبها ١٠٧

بِسْمِ اللَّهِ الرَّحْمَٰنِ الرَّحِيمِ

أَرَءَيْتَ ٱلَّذِى يُكَذِّبُ بِٱلدِّينِ ﴿١﴾ فَذَٰلِكَ ٱلَّذِى
يَدُعُّ ٱلْيَتِيمَ ﴿٢﴾ وَلَا يَحُضُّ عَلَىٰ طَعَامِ ٱلْمِسْكِينِ ﴿٣﴾
فَوَيْلٌ لِّلْمُصَلِّينَ ﴿٤﴾ ٱلَّذِينَ هُمْ عَن صَلَاتِهِمْ سَاهُونَ
﴿٥﴾ ٱلَّذِينَ هُمْ يُرَآءُونَ ﴿٦﴾ وَيَمْنَعُونَ ٱلْمَاعُونَ ﴿٧﴾

آياتها ٣ — سُورَةُ الكَوْثَرِ — ترتيبها ١٠٨

بِسْمِ اللَّهِ الرَّحْمَٰنِ الرَّحِيمِ

إِنَّآ أَعْطَيْنَٰكَ ٱلْكَوْثَرَ ﴿١﴾ فَصَلِّ لِرَبِّكَ وَٱنْحَرْ ﴿٢﴾
إِنَّ شَانِئَكَ هُوَ ٱلْأَبْتَرُ ﴿٣﴾

## əl-Fil surəsi 105

*(Fil)*

1 **﴾Məgər Rəbbinin fil sahiblərinə nələr etdiyini görmədinmi?!﴿** Fil sahibləri həbəşi xaçpərəstlərdən ibarət bir tayfa idi. Onlar Yəmən torpaqlarına hakimlik edirdilər. Onlar Kəbəni yıxmaq fikrinə düşüb, Məkkəyə yollandılar. Məkkəyə yaxınlaşanda uca Allah surədə deyilən quşları göndərib onları məhv etdi. Bu bir möcüzə idi. Bu hadisə Peyğəmbərin (Səllallahu aleyhi və səlləm) peyğəmbərliyindən qırx il öncə olmuşdu. Peyğəmbərlik veriləndə həmin hadisənin bəzi şahidləri hələ sağ idilər.

2 **﴾Məgər onların hiyləsini boşa çıxartmadımı?!﴿** Uca Allah onların Kəbəni dağıtmaq niyyətini özlərini həlaka aparan bir hiylə etdi.

3 **﴾Onların üstünə qatar-qatar quşlar göndərdi.﴿** Bu qara rəngli quşlar dəniz tərəfdən qatar-qatar gəlirdilər. Hər bir quş özü ilə üç ədəd daş: ikisini ayağında, birini isə dimdiyində - gətirirdi. Daş dəydiyi hər şeyi məhv edirdi.

4 **﴾Onlara bişmiş gildən düzəlmiş daşlar atırdı.﴿** Təfsirçilər deyirlər ki, bu cəhənnəm odunda bişmiş palçıq daşlar idi. Daşların üzərində qoşunda olanların adı yazılmışdı. Daş kimə dəysəydi, o adam çiçək xəstəliyinə tutulurdu. Daşlar mərciməkdən böyük, noxud kimi idi.

5 **﴾Onları yeyilmiş əkin yarpağına döndərdi!﴿** Heyvanların yeyib ayaq altına saldıqları, yaxud heyvanların yaxşısını yeyib, çör-çöpünü saxladıqları əkinə bənzəyirdilər.

## əl-Qureyş surəsi 106

Bu surə əl-İylaf surəsi də adlanır.

1 **﴾Qüreyşin ülfəti xatirinə﴿.**

2 **﴾Onlara qış və yay səfərini müyəssər edilməsi xatirinə﴿.** Qureyşlilər iki istiqamətdə ticarətə yola düşərdilər. Qışda isti ölkə olan Yəmənə, yayda isə, soyuq ölkə olan Şama gedərdilər. Qureyşin dolanışığı ticarətdən idi. Əgər bu iki ticarət yolu olmasaydı, onların işi çox çətin olardı. Həmçinin Kəbənin xidmətində durmaqla özlərinə himayə qazanmasaydılar, onların bu işləri idarə etməsi imkansız olardı. Ayənin mənası budur: bir halda ki, Allah təalə onların ticarət yollarını asanlaşdırıb, onda onlar da ibadəti yalnız Allaha sərf etsinlər.

3 **﴾Bu evin Rəbbinə ibadət etsinlər!﴿** Uca Allah bildirir ki, əl-Hərəm evinin sahibi Odur. Çünki onların ibadət etdikləri bütlər var idi. Uca Allah isə, Özünü bu bütlərdən pak tutub, onlara xitab etdi. Axı onlar Allahın bu evi ilə digər ərəblərdən daha şərəfli idilər.

4 **﴾O Allah ki, onları aclıqdan qurtarıb yemək verdi və onlara qorxudan sonra əmin-amanlıq bəxş etdi.﴿** İki ticarət yolunu açmaqla onları məruz qaldıqları amansız aclıqdan xilas etdi. Onlar Allahın evi Kəbənin hörmətinə görə bir-birinə düşmən kəsilib, təcavüz edən ərəblərin təhlükəsindən kənar idilər. Vaxtilə Kəbəyə fillərlə hücum edən Həbəşilərin təhlükəsindən də onları qorumuşdu.

## əl-Məun surəsi 107

*(xırda-xuruş)*

1 **﴾Dini yalan hesab edəni gördünmü?﴿** Haqq-hesab gününü yalan hesab edəni gördünmü?

2 **﴾O elə adamdır ki, yetimi itələyib qovar.﴿** Əgər sən ona fikir versən, görərsən ki, o, amansızcasına yetimlərin haqqını




əllərindən alar. Cahiliyyət dövrünün ərəbləri qadınlara və uşaqlara miras payı ayırmazdılar.
3 **«Və yoxsulu yedirtməyə rəğbətləndirməz.»** Paxıllığı üzündən nə özünü, nə ailəsini, nə də başqalarını yoxsulları yedizdirməyə rəğbətləndirməz.
4 **«Vay halına o namaz qılanların ki,»**
5 **«Onlar öz namazlarından qafildirlər;»** Namazlarına diqqət yetirməz, qıldıqları namaza görə savab ummaz, onu tərk etdikdə cəzalanacaqlarından qorxmazlar. Namazın vaxtı çıxana qədər ondan qafil olarlar.
6 **«Onlar riyakarlıq edər,»** Qıldıqları namazla başqaları önündə riyakarlıq edərlər. Yaxud kənardan təriflənsinlər deyə, bütün yaxşı işləri ilə insanlar önündə riyakarlıq edərlər.
7 **«Və qadağan edilməsi gərəkməyən şeyləri qadağan edərlər.»** Ərəb dilindəki "əl-Məun" sözü insanların gündəlik istifadə etdikləri qazan, vedrə, və s. kimi əşyalar, yaxud duz, su və s. bu kimi qida məhsullarının adıdır. Bəzi təfsirlərdə isə, bu sözün mənası zəkatı qadağan edənlər mənasında açıqlanır.

## əl-Kövsər surəsi 108

*(bol xeyir)*

1 **«Həqiqətən, Biz sənə Kövsər bəxş etdik!»** Kövsər cənnətdə axan çayın adıdır. Bu çay uca Allahın Peyğəmbərinə və ümmətinə verdiyi nemətdir.
2 **«Ona görə də Rəbbin üçün namaz qıl və qurban kəs!»** Qılınması əmr olunan namazlar fərz namazlardır. İnsanlar Allahdan başqası üçün namaz qılır, qurban kəsirdilər. Allah Peyğəmbərinə əmr edir ki, onun namazı və qurbanı sırf Allah üçün olmalıdır. Qatədə, Əta və İkrimə kimi təfsir alimləri deyirlər: *"Ayədə bayram namazı və qurbanlıqda kəsilən qurbanlar nəzərdə tutulur"*.
3 **«Sənin düşməninin özü sonsuzdur!»** Sənə nifrət edən və düşmən kəsilən o kimsə öldükdən sonra, heç yerdə adı çəkilən deyil. Peyğəmbərin oğlan övladlarından biri vəfat etdikdə müşriklərdən kimsə "Muhəmməd sonsuzdur" – demişdi. Surə də bu səbəblə nazil olmuşdu.

## əl-Kəfirun surəsi 109

*(Kafirlər)*

1 **«De: Ey kafirlər!»** Bu surənin nazil olma səbəbi budur: Kafirlər Peyğəmbərə dedilər ki, sən bir il bizim ilahlarımıza ibadət et. Biz də sənin ilahına bir il ibadət edək. Uca Allah isə, ona belə deməyi əmr etdi:
2 **«Mən sizin ibadət etdiklərinizə ibadət etmərəm!»** Yəni mən, sizin bütlərə ibadət etmək təklifinizi qəbul edə bilmərəm. Sizin ilahlarınıza ibadət etmərəm.
3 **«Siz də mənim ibadət etdiyimə ibadət etməzsiniz!»** Siz də şirk və küfr içərisində batdığınız halda mənim ibadət etdiyim Allaha ibadət edən deyilsiniz.
4 **«Mən sizin ibadət etdiklərinizə ibadət edən deyiləm!»** Heç gələcək günlərdə də mən, sizin ibadət etdiklərinizə ibadət etməyəcəm.
5 **«Siz də mənim ibadət etdiyimə ibadət edən deyilsiniz!»** Nə vaxta qədər ki, küfr və şirk edir, bütlərə tapınırsınız, bundan sonra da mənim rəbbimə ibadət edə bilməyəcəksiniz. Çünki müşrikin və kafirin Allaha etdiyi ibadəti rədd olunar. Bəzi təfsirçilər deyirlər ki, ayələrin təkrar edilməsi təkid xarakteri daşıyır. Bununla kafirlərin istəklərinin üzərindən xətt çəkilir ki, Peyğəmbər sizin bu təklifinizi qəbul edən deyil.
6 **«Sizin öz dininiz var, mənim də öz dinim!»** Əgər siz öz dinizdən razısınızsa, mən də öz dinimdən razıyam. Sizin şirk dolu dininiz özünüzə qalsın, onun mənə dəxli yoxdur. Mənim tövhid prinsipli dinim isə mənə yetərlidir. Onun bir nöqsanı yoxdur ki, mən sizin dininizə üz tutum.

## ən-Nəsr surəsi 110

*(Zəfər)*

Bu surə vidalaşma adı ilə də adlandırılır. İbn Abbas deyir ki, **«Allahın köməyi və zəfər gəldiyi zaman;»** ayəsi nazil olanda Peyğəmbər dedi: "**Artıq ölüm xəbərim gəldi!**"
1 **«Allahın köməyi və zəfər gəldiyi zaman;»** Ey Muhəmməd, sənə düşmən olan Qureyşə qarşı Allahın köməyi gəldikdə və Məkkə şəhəri fəth edildikdə,
2 **«İnsanların dəstə-dəstə Allahın dininə daxil olduqlarını gördüyün zaman,»** Bu hadisədən sonra qəbilələr bir-birinin ardınca islamı qəbul edirdilər. Peyğəmbər Məkkəni fəth etdikdə ərəblər belə deyirdilər: *"Əgər Muhəmməd bir zamanlar Allahın dəstəyi ilə fillərdən qorunmuş əl-Hərəm əhalisinə qalib gəlibsə, demək o, haqq yoldadır. Bundan sonra siz ona qalib gələ bilməyəcəksiniz"*. Əgər əvvəl tək-tək islamı qəbul edirdilərsə, bundan sonra dəstə-dəstə islama daxil olurdular. Hətta bir qəbilə bütünlüklə islama daxil olurdu.







(3) ﴾Rəbbini həmd-səna ilə təqdis et və Ondan bağışlanmağını dilə. Həqiqətən O, tövbələri qəbul edəndir!﴿ Allah sənə ağlına gəlməyən bir neməti verdikdə təəccübündən Allahı nöqsanlardan və eyiblərdən pak tut, sənə verilən zəfər və dəstə-dəstə insanlara görə Allaha həmd et. Allaha təvazökarlıq göstərib, öz əməlini az görüb, bağışlanmağını dilə. Allah isə, Ona tövbə edənləri bağışlayan, tövbələrini qəbul edəndir. Buxari və digər hədis alimləri İbn Abbasın bu surə haqqında belə dediyini rəvayət edirlər: *"bu surə Peyğəmbərin əcəlini bildirən surədir. Allah ona əcəlinin çatmasını xəbər etmişdir"*. Əcəlinin çatmasını bildirən ayə budur: ﴾Allahın köməyi və zəfər gəldiyi zaman;﴿ ﴾Rəbbini həmd-səna ilə təqdis et və Ondan bağışlanmağını dilə. Həqiqətən O, tövbələri qəbul edəndir!﴿

## əl-Məsəd surəsi 111

*(xurma lifi)*

(1) ﴾Əbu Ləhəbin əlləri qurusun, qurudu da!﴿ Onun əlləri məhv olsun. Bu dua həyata keçdi və onun əlləri qurudu. Əbu Ləhəb Peyğəmbərin (Səllallahu aleyhi və səlləm) əmisi idi. Onun adı Əbdül Üzzə idi.

(2) ﴾Ona nə mal-dövləti fayda verəcək, nə də qazandığı.﴿ Yığdığı mal-dövlət, qazandığı şan-şöhrət ona üz verən müsibəti və Allahın əzabını dəf edə bilmədi.

(3) ﴾O, alovlu atəşə girəcəkdir.﴿ O, odlu-alovlu cəhənnəmə düşəcək, dərisi yanacaqdır. Axı bu cəhənnəm odudur.

(4) ﴾Onun odun daşıyan övrəti də həmçinin!﴿ Arvadı da odlu-alovlu cəhənnəm atəşinə düşəcək. Arvadı Ummu Cəmil bint Hərb idi. O, Əbu Sufyanın bacısı idi. Bu qadın Peyğəmbərə (Səllallahu aleyhi və səlləm) əziyyət vermək üçün onun keçdiyi yola gecə vaxtı tikan səpərdi.

(5) ﴾Onun boğazında xurma lifindən hörülmüş ip olacaqdır!﴿ Onun ləl-cəvahiratdan boyunbağısı var idi. O deyirdi ki, Lat və Üzzəya and olsun bunu Muhəmmədə qarşı mübarizə aparmağa xərcləyəcəm. Qiyamət günü boyunbağı əvəzinə boynuna ip taxılması onun layiqli cəzasıdır.

## əl-İxlas surəsi 112

*(Yalnız Allaha məxsus olan sifətlər)*

(1) ﴾De: O Allah birdir;﴿ Müşriklər, "Ey Muhəmməd, rəbbinin nəsil-nəcabətini söylə" – dedikdə bu surə nazil oldu. Surənin mənası budur: Əgər siz, Allahın nəsil-nəcabətini bilmək istəyirsinizsə, O Allah birdir, təkdir, şəriki yoxdur.

(2) ﴾Allah möhtac deyildir!﴿ Ayədə deyilən "əs-Saməd" sifəti ehtiyaclar ünvanlanan mənasındadır. Yəni möhtacların ehtiyaclarını ödəməyə qadir olduğu üçün Ona üz tuturlar.İbn Abbas ﷺ deyir: **"əs-Saməd ağalığı kamil olan ağa, əzəmətində kamil olan sahib, mülayimlikdə kamil olan həlim, varlılıqda kamil olan ğaniyy, gücündə kamil olan cabbar, elmində kamil olan alim, hikmətində kamil olan həkimdir. Bu, Allaha xas olan sifətlərdir və heç kəsin bunda haqqı yoxdur."**

(3) ﴾O, nə doğmuş, nə də doğulmuşdur!﴿ Onun övladı olmamış, nə də Özü kimdənsə

olmamışdır. Çünki ona bərabər olacaq heç nə yoxdur. Həmçinin Ona yoxluğu nisbət etmək mümkün deyil. Doğulan isə, doğulmadan öncə yox idi. Yəni Allahın atası yoxdur ki, ona da nisbət olunsun. Qatədə deyir: *"Müşrik ərəblər deyirdilər ki, mələklər Allahın qızlarıdır. Yəhudilər isə deyirdilər ki, Üzeyir Allahın oğludur. Xaçpərəstlər isə deyirdilər ki, İsa Məsih Allahın oğludur. Uca Allah* **﴾O, nə doğmuş, nə də doğulmuşdur!﴿** *ayəsi ilə bütün bu iddiaları yalanladı".*

4 **﴾Onun heç bir tayı-bərabəri də yoxdur!"﴿** Heç kəs Ona bərabər və ya oxşar ola bilməz. Heç kəs onun kamillik sifətlərinə şərik çıxa bilməz.

## əl-Fələq surəsi 113

### *(Sübh)*

1 **﴾De: "Pənah aparıram sübhün Rəbbinə!﴿** Ayənin məğzi budur ki, əgər Allah təalə bütün dünyanı gecənin zülmət qaranlığından işığa qovuşdurmağa qadirdirsə, demək, ona pənah aparan və sığınan insanı qorxduğu şər və fitnədən qorumağa da qadirdir.

2 **﴾Yaratdıqlarının şərindən;﴿** Allahın yaratdığı hər bir məxluqun şərindən Ona sığınıram.

3 **﴾Zülmətə bürünməkdə olan gecənin şərindən;﴿** Gecə düşəndə yırtıcı heyvanlar və həşəratlar yuvasından çıxır. Şər məxluqatlar fəsad və şər törətməyə tələsir.

4 **﴾Düyünlərə üfürən qadınların şərindən;﴿** Sehrbaz, cadugər qadınların şərindən Allaha sığınıram. Çünki adətən bu işlə qadınlar məşğul olur, cadu edərkən düyün bağlayıb ona üfürürlər.

5 **﴾Və bir də, həsəd aparan zaman həsəd çəkənin şərindən!"﴿** Həsəd Allahın qarşı tərəfə verdiyi nemətin onun əlindən çıxmasını arzulamaqdır.

## ən-Nas surəsi 114

### *(İnsanlar)*

1 **﴾De: "Pənah aparıram insanların Rəbbinə;﴿** İnsanların rəbbi, onları yaradan, işlərini idarə edən və yaşamlarını islah edəndir.

2 **﴾İnsanların ixtiyar sahibinə;﴿** Kamil mülk və güclü hakimiyyət Ona məxsusdur.

3 **﴾İnsanların tanrısına;﴿** İlah məbuddur. Mülk sahibi ilah ola və ya olmaya bilər. Bu ayədə isə, uca Allah bildirir ki, əl-İlah adı Ona məxsusdur. Heç kəsin bu ada şərik olmağa haqqı yoxdur.

4 **﴾Vəsvəsə verən, qaçıb gizlənən Şeytanın şərindən-﴿** Allahın adı zikr



olunanda şeytan qaçıb gizlənər, kiçilər. Allahın adı zikr olunmadıqda isə böyüyər, vəsvəsəsi artar.

5 **﴾O Şeytan ki, insanların ürəklərinə vəsvəsə salır,﴿** Vəsvəsə şeytanın özünə itaətə çağırdığı insanın qəlbinə ötürdüyü səsi eşidilməyən gizli dəvətidir. Sonra uca Allah vəsvəsə verənlərin iki qrupa ayrıldıqlarını bildirir. Bir qrup insanlardan, digəri isə, cinlərdən ola bilər.

6 **﴾Cinlərdən də olur, insanlardan da!﴿** Cinlərdən olan şeytan insanların qəlbinə vəsvəsə verir. İnsanlardan olan şeytan da qəlbə vəsvəsə verir. Amma özünü nəsihətçi, canıyanan cildinə salır. Beləliklə o, nəsihət kimi göstərdiyi sözlərini şeytanın vəsvəsəsi kimi insanın ürəyinə salır. Bəzi təfsirlərdə isə deyilir ki, İblis insanların ürəklərinə vəsvəsə verir. İbn Abbas ﷺ deyir: **"Doğulan hər bir uşağın qəlbində vəsvəsə olar. Əgər o, Allahı zikr edərsə, vəsvəsə boğular, zikrdən qafil olarsa, vəsvəsə işə düşər".** Şeytanın vəsvəsəsindən Allaha sığınırıq.





# Müsəlmanın həyatında əhəmiyyət kəsb edən mühüm suallar

**1 Müsəlman öz etiqadını haradan öyrənməlidir?** Müsəlman öz etiqadını Allahın kitabından və boş-boşuna danışmayan Peyğəmbərinin (*Sallallahu aleyhi və səlləm*) səhih hədislərindən öyrənməlidir. ﴿*O, havadan danışmır.*﴾ (Nəcm: 3) Bütün bunlar səhabələrin və saleh sələflərin anlayışına uyğun olmalıdır.

**2 Aramızda ixtilaf baş verərsə, nəyə müraciət etməliyik?** Bu halda pak şəriətə müraciət etməliyik. Məsələnin həlli Allahın kitabı və Peyğəmbərinin (*Sallallahu aleyhi və səlləm*) sünnəsidir (*hədisləridir*). Uca Allah buyurur: ﴿*Əgər bir iş barəsində mübahisə etsəniz, Allaha və qiyamət gününə inanırsınızsa, onu Allaha və Peyğəmbərə həvalə edin!*﴾ ən-Nisa: 59. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: "*Mən sizə iki şeyi: Allahın kitabını və Peyğəmbərinin sünnəsini – qoyub gedirəm. Siz onlardan tutunduqca yolunuzu azmazsınız.*" Əhməd.

**3 Qiyamət günü nicat tapacaq firqə hansıdır?** Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: "*Ümmətim yetmiş üç firqəyə bölünəcəkdir. Birindən başqa, hamısı cəhənnəmə daxil olacaqdır*". Orada olanlar: "Ey Allahın elçisi onlar kimlərdir?" – deyə soruşdular. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) dedi: "*Onlar, mənim və səhabələrimin tutduqları yolu tutanlardır.*" Əhməd və Tirmizi. Haqq yol Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) və səhabələrinin getdikləri yoldur. Əziz qardaşım, əgər nicat tapmaq və əməllərinin qəbul olmasını istəyirsənsə, sən də bu yola itaət edənlərdən ol. Dinə yenilik gətirənlərdən olma.

**4 Saleh əməllərin qəbul olunması üçün hansı şərtlər vardır?**
**Şərtlər bunlardır:** 1. Allaha iman gətirmək və Onu tək tutmaq. Belə ki, müşrikin əməli qəbul olunmur. 2. İxlas. Edilən əməldə Allahın rizasını güdmək. 3. Əməli Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) dediyinə uyğun etmək. Allaha yalnız onun şəriəti ilə ibadət etmək. Əgər bu şərtlərdən biri olmazsa, əməl də rədd olunar. Uca Allah buyurur: ﴿*Onların etdikləri hər hansı bir (yaxşı) əməli Biz qəsdən (havadan uçan) dağınıq zərrələrə (toz dənələrinə) döndərərik!*﴾ əl-Furqan: 23.

**5 İslam dininin neçə mərhələsi var?** Dinin üç mərhələsi var: İslam, iman və ihsan.

**6 İslam nədir və neçə əsası vardır?** İslam, tövhid ilə Allaha təslim olmaq, itaət ilə Ona baş əymək, şirkdən və şirk edənlərdən uzaq olmaq. İslam özü beş əsas üzərində qurulmuşdur. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: "*İslam beş əsas üzərində qurulmuşdur: Lə iləhə illəllah və Muhəmmədən rəsuləllah kəlməsinə (Allahdan başqa ibadətə layiq haqq məbudun olmadığına və Muhəmmədin Allahın elçisi olduğuna) şahadət gətirmək, namaz qılmaq, zəkat vermək, həcc etmək və oruc tutmaq*" Buxari və Müslim.

**7 İman nədir və neçə əsası var?** İman, qəlbi ilə etiqad etmək, dil ilə tələffüz etmək, əzalar ilə yerinə yetirməkdir. İman itaətlə çoxalır, asiliklə azalır. Uca Allah buyurur: ﴿*Möminlərin imanı üstünə iman artırmaq üçün onların ürəklərinə arxayınlıq göndərən Odur...*﴾ (əl-Fəth: 4). Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: "*İman yetmiş və bir neçə dərəcədən ibarətdir. Ən üstün dərəcəsi "Lə iləhə illəllah" kəlməsini deməkdir. Ən aşağı dərəcəsi isə, insanlara əziyyət verən bir şeyi yoldan götürməkdir. Həya isə, imanın dərəcələrindən biridir*". Müslim. Xeyir mövsimlərində

itaətinin çoxalmasını, günah etdikdə isə, ibadətinin zəifləməsini görən hər bir müsəlman buna şahiddir. Uca Allah buyurur: *﴿Həqiqətən yaxşı əməllər pis işləri yuyub aparar...﴾* (Hud: 114). İmanın altı əsası vardır: Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) hədisində deyir: *"İman Allaha, mələklərinə, kitablarına, peyğəmbərlərinə, axirət gününə və qədərin xeyir-şərinə iman gətirməkdir"*. Buxari və Müslim.

**8** **"Lə iləhə illəllah" kəlməsinin mənası nədir?** Bu kəlmənin mənası ibadətin Allahdan başqasına aid olmasını inkar etmək, ibadətin yalnız Allaha məxsus olmasını təsdiqləməkdir.

**9** **Allah bizimlədirmi?** Bəli, uca və nöqsansız Allah Öz elmi, eşitməyi, görməyi, qorumağı, əhatəyə almağı, qüdrəti və istəyi ilə bizimlədir. Onun zatı isə, məxluqatın özlərinə qarışmır və heç bir məxluq da Onu əhatə etmir.

**10** **Allahı göz ilə görmək mümkündürmü?** Qiblə əhli yekdil olaraq demişlər ki, Allahı dünyada heç kəs görən deyil. Möminlər isə, qiyamət günü Məhşər meydanında və Cənnətdə Allahı görəcəklər. Uca Allah buyurur: *﴿O gün neçə-neçə üzlər sevinib güləcək, Öz Rəbbinə baxacaqdır!﴾* (əl-Qiyamə: 22-23).

**11** **Allahın ad və sifətlərini bilməyin nə faydası var?** Allahın Öz məxluqatına əmr etdiyi ilk vacib Onu tanımalarıdır. Əgər insanlar Onu tanısalar, Ona layiqincə ibadət edərlər. Uca Allah buyurur: *﴿Bil ki, Allahdan başqa ibadətə layiq heç bir tanrı yoxdur.﴾* (Muhəmməd: 19). Allahı geniş mərhəmət ilə xatırlamaq insana ümid verir. Onu şiddətli intiqam ilə yada salmaq adama qorxu hissi verir. Onun yeganə nemət verən olduğunu dərk etmək insanı şükr etməyə vadar edir. Allahın ad və sifətləri ilə Ona ibadət etməyin mənası, bu haqda dəqiq elmə yiyələnib mənasını bilmək və müvafiq əməl etməkdir. Allahın ad və sifətlərindən elələri vardır ki, onlarla vəsf olunan insan təqdir edilər. Məsələn elm, mərhəmət, ədalət və s. Elələri də vardır ki, onlarla vəsf olunan bəndə məzəmmət olunar. Məsələn ilahlıq, təkəbbürlülük və s. Həmçinin bəndəyə yaraşan və təqdir edilən elə sifətlər vardır ki, onların Allaha aid edilməsi qadağandır. Məsələn, qulluq, ehtiyac, təvazökarlıq, dua etmək və s. Allah üçün ən sevimli məxluq Onun sevdiyi sifətlərə yiyələnən kimsədir. Ən iyrənc məxluq isə, Onun sevmədiyi səfətlərə sahib olan kimsədir.

**12** **Allahın gözəl adları hansılardır?** Uca Allah buyurur: *﴿Ən gözəl adlar (əsmayi-hüsna) Allahındır. Onu bu adlarla çağırıb dua edin...﴾* (Əraf: 180). Səhih hədisdə Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) belə dediyi rəvayət olunur: *"Allahın doxsan doqquz adı vardır. Kim onları sadalayarsa cənnətə daxil olar"*. Bu adları "sadalamaq" dedikdə, bunlar nəzərdə tutulur: **1.** Onları bir-bir oxumaq. **2.** Mənalarını anlamaq və buna iman gətirmək. Məsələn "əl-Həkim" (*Hikmətli*) adını deyən insan bütün işlərində Allaha təslim olmalıdır. Çünki nə baş verirsə hamısı Onun hikməti ilə olur. "əl-Quddus" dedikdə Allahın hər bir nöqsandan pak olmasını düşünmək lazımdır. **3.** Bu adlarla Allaha dua etmək.

**Dua isə iki növ ola bilər:** **A.** Tərif və ibadət duası. **B.** İstək və yalvarış duası.

**Qurana və səhih hədislərə nəzər salan insan bu adları toplaya bilər. Həmin adlar aşağıdakılardır:**

| Ad | Mənası |
|---|---|
| أَللَّهُ Allah | Bütün məxluqatına ilahlıq və ağalıq edən. O ibadət və itaət olunan İlahdır. Səcdə, rüku və bütün ibadətlər Ona aid edilir. |
| الرحمن Ər-Rəhman | Bütün məxluqatına şamil edilən sonsuz rəhmət sahibi. Bu ad Allaha məxsus adlardandır və onu başqasına aid etmək olmaz. |
| الرحيم Ər-Rəhim | Dünyada və axirətdə möminlərə rəhmət göstərən. Dünyada onları hidayət yoluna yönəltmiş, axirətdə isə cənnətini onlara bəxş edəcəkdir. |
| العفو Əl-Afuvv | Günahına görə cəzaya layiq görülmüş bəndənin günahını silib bağışlayan, cəzalandırmayan. |
| الغفور Əl-Ğafur | Günahkarın günahını örtüb bağışlayan və onu ifşa etməyən. |
| الغفار Əl-Ğaffar | Günah edib tövbə edən bəndəsinə çox mərhəmət bəsləyən. |
| الرءوف Ər-Rauf | Dünyadakı bütün məxluqata, axirətdə isə müəyyən məxluqata: mömin dostlarına – yazığı gələn. |
| الحليم Əl-Həlim | Bəndələrini cəzalandırmaq qüdrətində ola-ola onların cəzasını gecikdirən. Onlar bağışlanma dilədikdə onları bağışlayan. |
| التواب Ət-Təvvab | Bəndələrindən istədiyini tövbə etməyə müvəffəq edib, tövbəsini qəbul edən. |
| الستير Əs-Sittir | Bəndələrinin eyiblərini gizli saxlayıb digər məxluqat arasında ifşa etməyən. Özünün və başqasının eyiblərini, öz ayıb yerlərini qoruyan bəndəsini sevən. |
| الغني Əl-Ğaniyy | Mütləq kamilliyə və kamil sifətlərə sahib olduğu üçün heç bir məxluqa ehtiyacı olmayan. Əksinə bütün bəndələr ona möhtacdır, onun qarşısında fağırdır. Çünki onlara nemət verən və kömək edən odur. |
| الكريم Əl-Kərim | Çox xeyir bəxş edən. Bəndə istəsə də, istəməsə də O, istədiyi şeyi istədiyi bəndəsinə bəxş edir. Günahları bağışlayıb eyibləri örtür. |
| الأكرم Əl-Əkram | Xeyir bəxş etməkdə misilsiz olan. Bütün xeyirləri O bəxş edir. Möminləri Öz lütfü ilə mükafatlandırır, inadkarlara isə Öz ədaləti ilə möhlət verib haqq hesaba çəkir. |
| الوهاب Əl-Vahhab | Qarşılıq gözləmədən nemət bəxş edir, istənilmədən nemət əta edir. |
| الجواد Əl-Cavad | Bəndələrinə çox nemətlər bəxş edən və lütfkar olan. Onun lütf və comərdliyindən möminlərin böyük payı vardır. |
| الودود Əl-Vadud | Dostlarını sevir və onlara mərhəmət etməklə mülayim davranır. Onlardan razı qalıb əməllərini qəbul edir. Onları dünyada da sevdirir. |
| المعطي Əl-Mu`ti | Öz xəzinəsindən istədiyi şeyi istədiyi bəndəsinə əta edir. Onun dostlarının bu işdə böyük payı vardır. Hər bir şeyin yaradanı və surət vərəni Odur. |
| الواسع Əl-Vasi | Onun vəsfləri çoxdur və heç kəs Onu bütün sifətləri ilə tərifləyə bilməz. Onun mülkü və hakimliyi, lütfü və yaxşılığı hədsiz-hüdudsuzdur. |
| المحسن Əl-Muhsin | Zatında, adlarında, sifətlərində və əməllərində ən kamil gözəllik sahibi olan. Hər şeyi ən yaxşı biçimdə yaradan və məxluqatla xoş davranan. |
| الرازق Ər-Raziq | Bütün məxluqata ruzi verən və bəşəriyyəti yaratmadan öncə onların ruzisini qədərə yazıb vaxtı çatanda ruzilərini onlara verən. |
| الرزاق Ər-Rəzzaq | Məxluqatına çox ruzi verdiyini bildirən addır. Məxluqat ruzi istəmədən öncə, hətta Ona qarşı asilik etsələr də onlara ruzi verir. |

| | |
|---|---|
| اللطيف<br>Əl-Latif | Məxfi işlərdən xəbəri var və Ona heç nə gizli qalmır. Bəndələrinə gizli yollarla gözləmədikləri xeyiri və mənfəəti çatdıran. |
| الخبير<br>Əl-Xabir | Elmi ilə aşkar işlərdən xəbəri olduğu kimi, gizli və məxfi işlərdən də agah Olan. |
| الفتاح<br>Əl-Fəttah | Öz hikməti və elmi ilə mülkünün, rəhmətinin və ruzisinin xəzinəsindən istədiyinin üzünə qapı açar. |
| العليم<br>Əl-Alim | Elmi ilə aşkarı və gizlini, keçmişi və gələcəyi bilən. Heç nə Ondan gizli qalmaz. |
| البر<br>Əl-Bərr | Məxluqatına etdiyi yaxşılıq sonsuzdur. Onun verdiyi nemətləri heç kəs sayıb qurtara bilməz. O, bəndəsini bağışlamaqla, qorumaqla və ona kömək etməklə Öz vədinə sadiq çıxandır. Bəndəsinin az əməlini qəbul edib çox əvəz verəndir. |
| الحكيم<br>Əl-Həkim | Hər işi münasib yerinə qoyandır. Onun qərarlarında boşluq və ya rəzillik olmaz. |
| الحكم<br>Əl-Hakəm | Məxluqatı arasında ədalətlə hökm edib, heç kəsə zülm etməyən. İnsanlar arasında hakim olmaq üçün kitab nazil edən də Odur. |
| الشاكر<br>Əş-Şakir | Nemət verdiklərini tərifləyər. Əməl az da olanda onun mükafatını verər. Nemətlərə edilən şükrün əvəzini dünyada o nemətləri artırmaqla, axirətdə isə savabla verər. |
| الشكور<br>Əş-Şəkur | Bəndələrin cüzi əməlləri Onun dərgahında çoxalar və mükafatlarını qat-qat artıq edər. Allahın bəndəyə şükrü, onun savabını artırmaq, ibadətini qəbul etməkdir. |
| الجميل<br>Əl-Cəmil | Öz zatında, adlarında, sifətlərində və əməllərində mütləq gözəllik sahibidir. Məxluqatda olan gözəlliklərin hamısı Ondandır. |
| المجيد<br>Əl-Məcid | Göylərdə və yerdə fəxr, lütf, izzət və şərəf sahibi olmaq Ona məxsusdur. |
| الولي<br>Əl-Valiyy | Məxluqatının əməllərinə nəzarət edən və mülkünü ram edən. Dostlarına kömək edən və onları üstün tutan. |
| الحميد<br>Əl-Həmid | Adlarına, sifətlərinə və əməllərinə görə həmd olunan Odur. Xoş və kədərli, rahat və çətin anlarda həmd olunan Odur. Mütləq həmd-sənaya layiq olan Odur. Çünki bütün kamilliklərlə vəsf olunan Odur. |
| المولى<br>Əl-Movlə | Dostlarına kömək edən və yardımçı olan Rəbb, Mülk sahibi, ağa və köməkçi odur. |
| النصير<br>Ən-Nasiir | Köməyi ilə istədiyinə dayaq olan Odur. Onun kömək etdiyini məğlub, məğlub etdiyinə isə kömək edən olmaz. |
| السميع<br>Əs-Səmii | Gizli və aşkar bütün danışıqları eşidəndir. Dua edənlərin duasını qəbul edəndir. |
| البصير<br>Əl-Basir | Yaradılış baxımından kiçik və ya böyük olmasından asılı olmayaraq, görsənən və görsənməyən nə varsa hamısını görür. |
| الشهيد<br>Əş-Şəhid | Məxluqatını izləyəndir. Özünün tək və ədalətli olmasına şahidlik etmişdir. Təkcə Ona ibadət edən möminlərin, peyğəmbərlərin və mələklərin sadiqliyinə şahidlik edəndir. |
| الرقيب<br>Ər-Raqib | Məxluqatından agah olan və onların əməllərini tam dəqiqliyi ilə hesaba alan. Nə bir göz qırpımı, nə də ürəyə gələn fikir Ondan gizli qalmaz. |
| الرفيق<br>Ər-Rafiq | Əməllərində çox mülayimdir. Öz məxluqatına davranışda və əmr etməkdə mərhələli davranır. Bəndələrinə mülayim və xoş davranır. Bacarmadıqları işləri onlara əmr etmir. O mülayim xasiyyətli bəndələrini sevir. |
| القريب<br>Əl-Qarib | Elmi və qüdrəti ilə hər məxluquna yaxındır. Lütf və köməyi ilə möminlərə yaxındır. Bununla yanaşı O Ərşinin üzərindədir və Onun |

| | |
|---|---|
| | zatı məxluqatına qarışmır. |
| المجيب<br>Əl-Mucib | Öz hikməti və elmi əsasında dua edənlərin duasını və istəyənlərin istəyini qəbul edəndir. |
| المقيت<br>Əl-Muqit | Qidaları və ruziləri yaradan və onları məxluqata çatdıran Odur. O həm bu işləri, həm də məxluqatın əməllərini heç bir nöqsana yol vermədən nəzarətdə saxlayır. |
| الحسيب<br>Əl-Həsib | Din və dünya işlərinin hər birində bəndələrinə nə lazımdırsa onu əta edən Odur. Möminlərin bu köməkdə böyük payı vardır. Allah bəndələrin dünyada etdiklərini haqq hesab edəcəkdir. |
| المؤمن<br>Əl-Mumin | Peyğəmbərlərin və onların davamçılarının sadiq olduqlarını təsdiq edən. Sadiqliklərini isbat edən möcüzələr verən. Dünya və axirətdə əldə olunan hər bir əmin-amanlıq onun əvəzsiz bəxşidir. Ona iman gətirənlərə əzab verməyəcəyinə, zülm etməyəcəyinə və qiyamət günü onlara qorxu göstərməyəcəyinə dair aman verən. |
| المنان<br>Əl-Mənnan | Çox əta edən, böyük nemət verən və məxluqatına qarşı hədsiz yaxşılıq edən. |
| الطيب<br>Ət-Tayyib | Hər bir eyib və nöqsandan pak olan. Mütləq gözəllik və kamillik sahibi. Bəndələrinə çox xeyirxah davranan. Bəndələrinin yalnız xalis halal əməllərini və sədəqələrini qəbul edən. |
| الشافي<br>Əş-Şəafi | Qəlb və bədən xəstəliklərinə şəfa verən. Bəndələr yalnız onun müyəssər etdiyi dəva-dərmandan istifadə edirlər, şəfa vermək isə Ona məxsusdur. |
| الحفيظ<br>Əl-Həfiz | Öz lütfü ilə mömin bəndələrini və onların əməllərini qoruyur, qüdrəti ilə bütün məxluqatı idarə və mühafizə edir. |
| الوكيل<br>Əl-Vakil | Bəşəriyyəti yaradıb idarə etmək işlərinə hakim olan. Məxluqatı yaradıb yardım edən. İş görməyə başlamadan öncə işlərini Ona həvalə edən, ruzi qazananda Ona arxalanan möminlərin vəkilidir. |
| الخلاق<br>Əl-Xalləq | Allahın çox yaradan olmasını bildirir. Uca Allah daim yaradır və bu əzəmətli vəsflə daim vəsf olunur. |
| الخالق<br>Əl-Xaliq | Bəşəriyyəti yoxdan var edən. |
| البارئ<br>Əl-Bəri`i | Qədərində olan məxluqatı yaradıb ərsəyə gətirən. |
| المصور<br>Əl-Musavvir | Öz hikməti, elmi və rəhmətinə əsasən məxluqatına müəyyən surət verib yaradan. |
| الرب<br>Ər-Rəbb | Nemətləri ilə bəndələrini yaşadan, addım-addım irəli aparan. Dostlarının qəlblərini islah edən işlərə onları müvəffəq edən. |
| العظيم<br>Əl-Əzim | Zatında, adlarında və sifətlərində mütləq əzəmət sahibi olan. Məxluqatın Onu əzəmətli tutması, əmr və qadağalarına dəyər verməsi vacibdir. |
| القاهر<br>Əl-Qahir | Bəndələrini zəlil və kölə edən, onlardan üstün olan. Bütün başlar Onun qarşısında boyun əyər. |
| القهار<br>Əl-Qahhar | |
| المهيمن<br>Əl-Muhəymin | Bir şeyi idarə edən, qoruyan, şahid olan və əhatə edən. |
| العزيز<br>Əl-Əziz | İzzət mənasını əhatə edən mənaların hamısını ehtiva edir. Heç kəs Ona qalib gələ bilməz, çünki qüvvətində izzətlidir. O heç kəsə möhtac deyil, çünki möhtacsızlıqda izzətlidir. Heç bir şey Onun izni olmadan hərəkət edə bilməz. Çünki O, hər şeyə hakimdir. |

| | |
|---|---|
| الجبار<br>Əl-Cəbbar | İstədiyini edər və bütün məxluqat Ona boyun əyər, əzəməti qarşısında diz çökər, hökmünə tabe olar. O zəifə kömək edər, kasıbı varlandırar, çətini asanlaşdırar və xəstəyə şəfa verər. |
| المتكبر<br>Əl-Mutəkəbbir | Bütün nöqsanlardan və pis işlərdən pak olar. Bəndələrinə zülm etməz, inadkar məxluqlara qarşı sərt olar. Təkəbbür sifəti Ona məxsusdur. Kim bu sifətində Ona ortaq olmaq istəyərsə əzaba düçar olar. |
| الكبير<br>Əl-Kəbir | Zatında, sifətlərində və əməllərində əzəmətli olan. Ondan böyük yoxdur. Hər şey Onun izzət və cəlalı qarşısında kiçikdir. |
| الحيي<br>Əl-Həyiyy | Əzəmətli hökmünə, üzünə və cah-cəlalına xas olan həya sahibidir. Allahın həyası lütfkarlıq, yaxşılıq və izzət həyasıdır. |
| الحي<br>Əl-Həyy | Daimi kamil həyat, əvvəli və sonu olmayan baqilik Ona məxsusdur. Həyatda nə varsa hamısı Ondandır. |
| القيوم<br>Əl-Qəyyum | Özü-Özünə sahib Olan, məxluqatına möhtacı olmayan. Göylərdə və yerdə olanların hamısını yaşadan Odur, hamı Ona möhtacdır. |
| الوارث<br>Əl-Varis | Məxluqat həlak olduqdan sonra Baqi olan Odur. Sahibləri həlak olan nə varsa hamısı Ona qayıdar. Əlimizdə olanların hamısı bir əmanətdir və bir gün onlar öz sahibinə qayıdacaqdır. |
| الديان<br>Əd-Dəyyan | Məxluqatın itaət etdiyi və baş əydiyi yaradan. Hər kəsə etdiyi əməllərinə görə mükafat və ya cəza verən. Xeyirli işlərin savabını artırar, şər işlərin cəzasını verər və ya bağışlayar. |
| الملك<br>Əl-Məlik | Qalibiyyət, əmr və qadağa Ona məxsusdur. Öz əmr və işləri ilə məxluqatı idarə edir. Mülkünün və idarəçiliyinin heç bir məxluqdan asılacağı yoxdur. |
| المالك<br>Əl-Malik | Mülk sahibliyi Onun əzəli haqqıdır. Bəşəriyyəti yaradanda mülk Ona məxsus idi, o zaman Özündən başqa heç kəs yox idi. Bəşəriyyət məhv olanda da mülk Ona qalacaqdır. |
| المليك<br>Əl-Məliik | Mütləq mülk sahibi olmasına dəlalət edir. Əl-Məlik adından daha əhatəlidir. |
| السبوح<br>Əs-Subbuh | Hər eyib və nöqsandan pak olan. Kamillik və gözəllik sifətləri ilə vəsf olunan Odur. |
| القدوس<br>Əl-Quddus | Hər eyib və nöqsandan uzaqdır. Çünki mütləq kamil sifətlər Ona məxsusdur və Onun üçün məsəl çəkilməz. |
| السلام<br>Əs-Səlam | Zatında, sifətlərində, adlarında və əməllərində bütün eyib və nöqsanlardan salamat olan. Dünya və axirətdə mövcud olan bütün salamatlılıq Ondandır. |
| الحق<br>Əl-Həqq | Özü, sifətləri, adları və ilahlığı barədə heç bir şübhə və tərəddüd olmayan. İbadət olunası haqq ilah Odur, Ondan başqa haqq ilah yoxdur. |
| المبين<br>Əl-Mubin | Təkliyində, hikmətində və rəhmətində əmri aşkar olan. Bəndələri Ona itaət etsinlər deyə haqq yolu və özlərini qorusunlar deyə azğınlıq yollarını onlara göstərən Odur. |
| القوي<br>Əl-Qaviyy | Mütləq qüdrət və kamil istək sahibi Odur. |
| المتين<br>Əl-Mətin | Qüdrət və qüvvətində şiddətli olan. İşlərində heç bir çətinlik, ağırlıq və yorğunluq olmaz. |
| القادر<br>Əl-Qadir | Hər şeyə qadir olan Odur. Nə yerdə, nə də göydə heç nə Onu aciz qoymaz. Hər şeyin qədərini yazan Odur. |
| القدير<br>Əl-Qədiir | Bu Əl-Qadir adı mənasındadır amma bu Allahın mədhi üçün daha əhatəli mənada işlədilir. |
| المقتدر<br>Əl-Muqtədir | Allah qədəri həyata keçirmək və əzəli elmində qədərə yazdıqlarını yaratmaq qüdrətindədir. |

| | |
|---|---|
| العلي<br>Əl-Əliyy<br>الأعلى<br>Əl-Ə`lə | Şəni, gücü və zatı yüksəkdir. Hər şey Onun səltənəti və hökmü altında alçaqdır. Heç vaxt Ondan böyüyü ola bilməz. |
| المتعال<br>Əl-Mutəal | Ucalığı qarşısında hər şey alçalar, Onun üzərində heç kəs ola bilməz. Hər şey ondan aşağıda, mülkü və səltənəti içərisindədir. |
| المقدم<br>Əl-Muqəddim | Öz istəyi və hikməti ilə hər şeyi yerinə qoyan. Elmi və lütfü ilə bəndələrindən istədiyini bir-birindən üstün edən. |
| المؤخر<br>Əl-Muəxxir | Hər şeyi öz dərəcəsinə endirən Odur. Öz istəyi və hikməti ilə hər şeyi önə, yaxud geriyə çəkər. Bəndələri tövbə edib haqq yoluna qayıtsınlar deyə onların əzabını gecikdirər. |
| المسعر<br>Əl-Musəiir | Hər şeyin qiymətini, məqamını və təsirini artırar və ya azaldar. Hər şey Onun elmi və hikməti ilə ucuz və dəyərli olar. |
| القابض<br>Əl-Qabid | Ruhları çıxaran, Öz hikməti və qüdrəti ilə istədiyinin ruzisini kəsən və onları imtahana çəkən Odur. |
| الباسط<br>Əl-Basit | Öz rəhməti və lütfü ilə bəndələrinin ruzisini artıran odur. Öz hikmətinə görə onları sınayar. Pislik edənin tövbə edib qayıtması üçün iki əlini açar. |
| الأول<br>Əl-Əvval | Ondan öncə heç nə olmayıb. Bütün məxluqat Onun yaratması ilə olmuşdur. Allahının var olmasının əvvəli yoxdur. |
| الآخر<br>Əl-Axir | Ondan sonra heç nə yoxdur. Baqi Odur. Yer üzündə kim varsa hamısı fanidir və qayıdışları Onadır. Onun varlığının sonu yoxdur. |
| الظاهر<br>Əz-Zahir | Hər şeydən ucadır, Ondan uca yoxdur. Hər şeyi əhatəyə alan və hər şeyə hakim olan Odur. |
| الباطن<br>Əl-Batin | O, dünyada bəndələrinə görsənmədən onlara çox yaxındır. |
| الوتر<br>Əl-Vitr | Şəriki olmayan vahiddir, oxşarı olmayan təkdir. |
| السيد<br>Əs-Səyyid | Bəndələri üzərində mütləq ağalıq Ona məxsusdur, onların Rəbbi və sultanı Odur. Onlar isə onun xəlqi və qullarıdır. |
| الصمد<br>Əs-Saməd | Ağalığı kamil olan. Bəndələr Ona o qədər möhtacdırlar ki, ehtiyacları üzündən Ona üz tutarlar. |
| الواحد<br>Əl-Vahid<br>الأحد<br>Əl-Əhəd | Bütün mütləq kamilliklərdə vahid olan Odur. Heç kəs bu işdə Ona şərik deyil. Onun bənzəri yoxdur. Bu isə Onun ibadətdə tək tutulmasını, şərik qoşulmamasını zəruri edir. |
| الإله<br>Əl-İlah | Haqq məbud Odur. İbadətə layiq haqq məbub yalnız Odur. |

**13 Allahın ad və sifətləri arasında nə fərq vardır?** Allahın ad və sifətlərinə and içmək və sığınmaq olar. Bu baxımından onlar müştərək sayılırlar. Lakin bunlar arasında fərqlər var və ən önəmli fərqlər aşağıdakılardır. **Birinci:** Allahın adları ilə dua etmək və bu adların əvvəlinə "Abd" sözünü əlavə edib, insana ad qoymaq icazəlidir. Amma sifətlər ilə bunu etmək olmaz. Məsələn, "əl-Kərim" adından "Əbdül-Kərim" adı qoymaq olar, amma "əl-Kərəm" sifətindən "Əbdül-Kərəm" adı düzəltmək olmaz. Həmçinin "əl-Kərim" adını "Ey Kərim olan Allah" deyərək, dua etmək olar. Amma "əl-Kərəm" sifətini "Ey Allahın kərəmi" deyib, dua etmək olmaz. **İkinci:** Allahın adlarından sifət düzəltmək olar. Məsələn "ər-Rəhman" adından rəhmət sifəti düzəltmək olar. Lakin Allahın sifətlərindən şəriətin

demədiyi adları düzəltmək olmaz. Məsələn, istiva sifətindən "əl-Mustəvi" adı düzəltmək olmaz. Üçüncü: Allahın etdiklərindən şəriətin demədiyi adları düzəltmək olmaz. Allahın etdiklərindən biri qəzəblənmək felidir. Amma bu feldən "əl-Ğadib", yəni qəzəblənən adı düzəltmək olmaz. Allahın sifətlərini isə, fellərindən düzəltmək olar. Qəzəblənmək sifətini Allaha nisbət edirik. Çünki qəzəblənmək Onun əməllərindən biridir.

**14 Mələklərə iman gətirmək nə deməkdir?** Mələklərə iman gətirmək onların mövcudluğunu, Allahın onları Özünə ibadət etmələri və əmrlərini icra etmələri üçün yaratdığını qəti olaraq təsdiq etmək. ﴾*(Mələklər) möhtərəm qullardır. Ondan qabaq söz danışmaz, yalnız Onun əmri ilə iş görərlər*﴿ əl-Ənbiya: 26-27.

**Mələklərə iman gətirmək bir neçə məsələyə şamil olunur:** 1. Onların varlığına iman gətirmək. 2. Adlarını bildiyimiz mələklərə iman gətirmək. Məsələn, Cəbrail. 3.Bizə bəlli olan sifətrlərinə iman gətirmək. Məsələn, onların əzəmətli yaradılışlarına. 4. Onlara xas olan bildiyimiz vəzifələrinə iman gətirmək. Məsələn, ölüm mələyi kimi.

**15 Quran nədir?** Quran oxunması ibadət sayılan Allah kəlamıdır. Bu kəlam ondan başlamış, Ona da qayıdacaqdır. O, bu kəlamı həqiqi olaraq hərflər və səslə danışmış, Cəbrail Ondan eşitmiş, sonra gəlib Peyğəmbərimiz Muhammədə (*Sallallahu aleyhi və səlləm*) çatdırmışdır. Eləcə də səmavi kitabların hamısı Allahın kəlamıdır.

**16 Təkcə Quranla kifayətlənib, Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) hədislərinə ehtiyac duymamaq olarmı?** Belə etmək olmaz. Uca Allah bu ayədə Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) hədislərinə əməl etməyi əmr edərək buyurur: ﴾*...Peyğəmbər sizə nə verirsə, onu götürün; nəyi qadağan edirsə, ondan əl çəkin...*﴿ Hədislər Quranın mənasını açıqlamaq üçün nazil olmuşdur. Hədislərsiz dini tam təfsilatı ilə bilmək mümkün deyildir. Məsələn, namaz məsələləri kimi. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: ***"Həqiqətən mənə Quran və onun misli** (hədislər) **verilmişdir. Yaxın zamanlarda qarnı tox kimsə mütəkkəyə dirsəklənib** (hədisləri inkar edərək)**, belə deyəcəkdir: Siz, yalnız bu Quranla kifayətlənin. Yalnız orada deyilən halalı halal, haramı isə, haram kimi qəbul edin"*** Əhməd və Əbu Davud.

**17 Peyğəmbərlərə iman gətirmək nə deməkdir?** Peyğəmbərlərə iman gətirmək Allah tərəfindən hər ümmətə yalnız Ona ibadət etməyə çağıran, Ondan başqa ibadət olunanlara küfr etməyə səsləyən Peyğəmbərlər göndərdiyinə iman gətirməkdir. Həmçinin onların sözlərində düz olan, təsdiqlənən, doğru yol tutan, hörmətli, günahsız, təqvalı, əmin-aman, düzgün, haqq yolun yolçusu olub, öz şəriətlərini tam olaraq təbliğ edən, məxluqatın ən üstünü və doğulduqları gündən ölənə qədər Allaha şərik qoşmaqdan qorunan peyğəmbərlər olduqlarını qəti təsdiqləməkdir.

**18 Qiyamət günü hansı növ şəfaət olacaqdır?** Bunun bir neçə növü var və ən önəmlisi budur: 1. **Böyük şəfaət:** Qiyamət günü insanlar haqq-hesabın başlanmasını əlli min il gözlədikdən sonra Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) Rəbbinin hüzurunda insanların haqq-hesabının başladılmasına dair şəfaətçi olacaqdır. Bu, Peyğəmbərimiz Muhəmmədə (*Sallallahu aleyhi və səlləm*) xas olan şəfaətdir. Bu, ona vəd edilən "həmd olunan məqam"dır (*Məqamul Məhmud*). 2. **Cənnətin qapılarının açılması üçün şəfaətçi olmaq:** Qapıların açılmasını tələb edən birinci insan Peyğəmbərimiz Muhəmməd (*Sallallahu aleyhi və səlləm*), oraya daxil olan birinci ümmət isə, onun ümməti

olacaqdır. **3.Cəhənnəmə düşmələri hökm olunan bir qrup insanların oraya düşməməsi üçün şəfaətçi olmaq. 4. Böyük günah** edib, cəhənnəmə **düşən tövhid əhlinin oradan çıxardılmaları üçün şəfaətçi olmaq. 5. Cənnət əhlindən bəzi insanların dərəcələrinin yüksəldilməsi üçün şəfaətçi olmaq.** Axırıncı üç növ şəfaət Peyğəmbərimizə (*Sallallahu aleyhi və səlləm*) xas deyil, amma bu işlərdə o, birinci olacaqdır. Ondan sonra digər peyğəmbərlər, mələklər, salehlər və şəhidlər olacaqlar. **6. Bir dəstə insanın haqq-hesabsız cənnətə daxil olmaları üçün şəfaətçi olmaq. 7. Bəzi kafirlərin əzabının yüngülləşdirilməsi üçün şəfaətçi olmaq.** Bu, Peyğəmbərimizin (*Sallallahu aleyhi və səlləm*) əmisi Əbu Talibin əzabının yüngülləşdirilməsi üçün etdiyi xüsusi şəfaətdir. Bu şəfaətlərdən əlavə, uca Allah öz rəhməti ilə heç kəsin şəfaəti olmadan tövhid etiqadı ilə ölmüş sayını yalnız Özünün bildiyi qədər insanları cəhənnəmdən çıxarıb, rəhməti ilə cənnətə salacaqdır.

**19 Dirilərdən kömək diləmək və ya şəfaət istəmək olarmı?** Bəli, olar. Şəriət başqalarına kömək etməyə rəğbətləndirmişdir. Uca Allah buyurur: ﴾***Yaxşılıq etməkdə əlbir olun...***﴿. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) buyurur: ***“Bir bəndə öz qardaşının köməyində olduqca Allah da onun köməyində olar.”*** **Müslim.** Şəfaət etməyin isə böyük savabı var. **Bu vasitəçi** olmaq mənasına da gəlir. Uca Allah buyurur: ﴾**Yaxşı işə vasitəçi olana *(onun savabından)*, bir pay düşür...**﴿ **ən-Nisa: 85.** Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: ***“Şəfaətçi (vasitəçi) olub savab qazanın.”*** **Buxari. Bütün bunlar aşağıdakı şərtlər əsasında olmalıdır: 1. Bu müraciət sağ adama ünvanlanmalıdır.** Axı, ölü özünə fayda verə bilmədiyi halda, başqasına necə xeyir verə bilər! **2. Kömək istənilən kimsə, danışılanı başa düşməlidir. 3. Kömək istədiyi kimsə yanında olmalıdır. 4. İstənilən kömək onun iqtidarında olmalıdır. 5. İstək və kömək dünyəvi işlərdə olmalıdır. 6. Bu, zərəri olmayan icazəli iş üçün olmalıdır.**

**20 Təvəssülün neçə növü var?** Təvəssül iki növdür; **Birinci: İcazəli.** Bunun üç növü var: **1.** Allahın ad və sifətləri ilə Ona təvəssül etmək. **2.** Bəzi yaxşı əməllərlə Allaha təvəssül etmək. Mağaraya düşmüş üç nəfərin hadisəsi buna misaldır. **3.**Duasının qəbul olunması ehtimal olunan yanındakı əməlisaleh sağ müsəlmanın duası ilə təvəssül etmək. **İkinci: Haram.** Bunun da iki növü var: **1.** Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) və ya övliyanın hörməti ilə Allahdan istəmək. Məsələn, Allahım Peyğəmbərinin, yaxud İmam Hüseynin xətrinə Səndən istəyirəm. Düzdür, Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) və əməlisaleh bəndələrin Allah yanında xətirləri böyükdür. Amma xeyirli işlərə bizdən daha çox həris olan səhabələr quraqlıq baş verdikdə Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) qəbri onlara yaxın olduğu halda, yenə də onun xətri ilə təvəssül etmədilər. Onlar Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) əmisi Abbasın ﵁ duası ilə təvəssül etdilər. **2.**Peyğəmbərə, yaxud övliyaya and içərək bəndənin Rəbbindən istəməsi. Məsələn, Allahım Sənin övliyan filankəsə, yaxud filan peyğəmbərinin haqqını Sənə and verərək, filan şeyi istəyirəm. Çünki məxluqu məxluqa and vermək qadağandır. Məxluqu Allaha and vermək isə, daha pisdir. Bəndə Allaha itaət etməklə Onun üzərində haqq qazanmır.

**21 Axirət gününə iman gətirmək nə deməkdir?** Axirət gününə iman gətirmək bu günün mütləq baş verəcəyini qəti təsdiq etməkdir. Bu növ imana ölüm, ölümdən sonra gələn qəbr imtahanına, əzabına və rahatlığına iman gətirmək daxildir.

Həmçinin Sura üfürüləcəyinə, insanların Allahın hüzuruna qalxacaqlarına, əməl dəftərlərinin sərgilənəcəyinə, tərəzinin qoyulacağına, Sırat körpüsünün qurulacağına, hovuza, şəfaətə, sonda isə, insanın cənnətə və ya cəhənnəmə düşəcəyinə iman gətirməkdir.

**22 Qiyamətin böyük əlamətləri hansılardır?** Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: *"Qiyamətdən öncə on əlamət baş verməyincə, qiyamət qopmayacaqdır. Sonra Peyğəmbər (Sallallahu aleyhi və səlləm) bunları sadaladı: Tüstü, Dəccal, heyvan, günəşin qərbdən (batdığı yerdən) çıxması, Məryəm oğlu İsanın nazil olması, Yəcuc və Məcuc və üç dağıntı olacaqdır. Dağıntıların biri şərqdə, biri qərbdə, biri isə Ərəbistan yarımadasında olacaqdır. Ən son əlamət isə, Yəmən tərəfdən od püskürüb, insanları məhşər meydanına toplamasıdır."* Müslim.

**23 İnsanların qarşılaşacaqları ən böyük fitnə nədir?** Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: *"Adəmin yaradılmasından qiyamətə qədər olan vaxtda Dəccalın fitnəsindən böyük fitnə yoxdur"* Müslim. Demək, Dəccal adəm övladından olub, axır zamanda gələcəkdir. Alnında hər bir mömünin *(kafir sözü kimi)* oxuya biləcəyi (k f r) hərfləri yazılacaqdır. Onun sağ gözü kor olacaq və çürümüş üzüm dənəsinə bənzəyəcək. Zühur etdiyi ilk vaxtlarda islah etmək, sonra peyğəmbərlik, sonra isə ilahlıq iddiasında olacaqdır. O, bir tayfanın yanına gəlib, dəvət edəcək və dəvəti rədd olunub, yalançı adlandırılacaq. Üzünü çevirib oradan getdikdə onların mal-dövləti də onun ardınca gedəcək. Hətta iş o yerə gəlib çatacaq ki, əllərində bir şey qalmayacaq. Sonra bir tayfanın yanına gəlib, dəvət edəcək, onlar da *(digər tayfanın gününə düşməkdən qorxub)* onun dəvətini qəbul edib, təsdiqləyəcəklər. O da səmaya yağış yağdırmağı əmr edəcək, yağacaq, yerə isə, bitirməyi əmr edəcək, bitəcək. İnsanların qarşısına gəlib, özü ilə su və od gətirəcək. Əslində onun odu soyuq su, suyu isə, od olacaq. Ona görə hər bir mömin namazın sonunda onun fitnəsindən Allaha sığınmalıdır. Əgər həmin vaxtda yaşasa Kəhf surəsinin ilk ayələrini oxumalı, fitnəyə düşmək təhlükəsindən uzaq olmaq üçün onunla üz-üzə gəlməkdən çəkinməlidir. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: *"Kim Dəccal haqqında eşidərsə, ondan uzaq dursun. Allaha and olsun, özünü mömin hesab edən insan onun yanına gələcək və onun şübhələrinin qarşısında aciz qalıb, ona itaət edəcəkdir"* Əhməd və Əbu Davud. O, yer üzündə qırx gün qalacaqdır. Onun bir günü bir il, digəri bir ay, başqa günü bir həftə kimi, digər günləri isə, adi günlər kimi olacaqdır. Məkkə və Mədinə şəhərlərindən başqa, gəzib dolaşmadığı bir el-oba qalmayacaqdır. Sonra İsa ﷺ nazil olub onu öldürəcəkdir.

**24 Cənnət və Cəhənnəm hal-hazırda mövcuddurmu?** Bəli. Uca Allah onları insanlardan öncə yaratmışdır. Onlar heç vaxt yox olmurlar. Allah Öz lütfü ilə cənnət, ədaləti ilə cəhənnəm əhalisi yaratmışdır. Hər bir məxluq isə, yaradıldığı qayə üçün müyəssər edilmişdir.

**25 Qədərə iman gətirmək nə deməkdir?** Bu, baş verən xeyir və şərin Allahın qəza və qədəri ilə olduğunu qəti olaraq təsdiqləmək, Allahın istədiyini etdiyinə tam yəqin olmaqdır. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: *"Əgər Allah göylərinin və yerinin əhalisinə əzab versə, onlara zülm etmiş sayılmaz. Əgər onlara rəhm etsə, Onun rəhməti onlar üçün öz əməllərindən daha xeyirli olar. Qədərə, başına gələcək*

*işin səndən yan keçməyəcəyinə, yan keçən işin isə, başına gəlməyəcəyinə iman gətirmədikcə Allah yolunda Uhud dağı ağırlığında qızıl sədəqə etsən belə, səndən qəbul olunmaz. Bundan qeyri etiqad üzərində ölsən, cəhənnəmə daxil olacaqsan."* Əhməd və Əbu Davud. **Qədərə iman gətirmək dörd məsələni əhatə edir: 1.** Uca Allahın hər şeyi təfsilatlı və təfsilatsız bildiyinə iman gətirmək. **2.** Uca Allahın bütün bunları"Lövhü-Məhfuzda" *(qorunan kitabda)* yazdığına iman gətirmək. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: ***"Allah məxluqatı yaratmamışdan əlli min il öncə onların qədərini yazmışdır."*** Müslim. **3.** Allahın həyata keçən və heç bir şeyin mane ola bilmədiyi istəyinə, heç nəyin qarşısında aciz olmayan qüdrətinə iman gətirmək. O nə istəyirsə, olur, nəyi istəmirsə, o da olmur. **4.** Allahın hər şeyin yaradanı olduğuna, Ondan başqa nə varsa, hamısının yaradılmış olduğuna iman gətirmək.

**26 Yaradılmışların həqiqi qüdrəti, istəyi və iradəsi varmı?** Bəli, insanın istəyi, iradəsi və seçimi vardır. Lakin bununla belə, Allahın istəyindən kənara çıxmır. Uca Allah buyurur: ***﴾Allah istəməsə, siz istəyə bilməzsiniz!﴿*** Təkvir: 29. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: ***"Siz əməl edin. Hər kəs yaradıldığını etməyə müyəssər edilmişdir."*** Buxari və Müslim. Allah bizə doğru ilə səhvi ayırd etmək üçün ağıl, eşitmə və görmə qabiliyyəti vermişdir. Heç ağıllı insan da oğurluq edib sonra: "bunu Allah mənim qədərimə yazıb" – deyərmi?! Əgər o belə desə, insanlar yenə də onu üzürlü hesab etməz, əksinə, cəzalandırılar və deyilər ki, elə bu cəzanı da Allah sənin qədərinə yazmışdır. Qədəri dəlil götürmək, yaxud onunla üzrxahlıq etmək olmaz. Bu bir uydurmadır. Uca Allah buyurur: **﴾Müşriklər belə deyəcəklər: "Əgər Allah istəsəydi, nə biz, nə də atalarımız müşrik olar və nə də biz bir şeyi haram edə bilərdik. Onlardan əvvəlkilər də** *(öz peyğəmbərlərini)* **belə təkzib etmişdilər...﴿** əl-Ənam: 148.

**27 İhsan nədir?** Peyğəmbər(*Sallallahu aleyhi və səlləm*)bu haqda soruşan kimsəyə belə cavab vermişdir: ***"İhsan, Allaha Onu görürmüş kimi ibadət etməkdir. Sən Onu görməsən də, O səni görür."*** Buxari və Müslim. Mətn Müslimindir. İhsan, dinin üç mərhələsinin ən yüksəyidir.

**28 Tövhidin neçə qismi var?** Tövhidin üç qismi var: **1. Rübubiyyə tövhidi;** Mənası, Allahı yaratmaq, ruzi vermək, diriltmək və sairə bu kimi felləri ilə tək tutmaq. Peyğəmbərimiz (*Sallallahu aleyhi və səlləm*) göndərilmədən öncə kafirlər bu qism tövhidi qəbul edirdilər. **2. Uluhiyyə tövhidi;** Mənası, Allahı namaz, nəzir, sədəqə və sairə bu kimi ibadətlərlə tək tutmaq deməkdir. Allahı ibadətdə tək tutmaqdan ötrü peyğəmbərlər göndərilmiş, kitablar nazil olmuşdur. **3. Ad və sifətlər tövhidi;** Mənası, Allah və rəsulunun isbat etdikləri gözəl adları və uca sifətləri heç bir təhrifə, inkara, keyfiyyətə və oxşatmaya varmadan olduğu kimi Allaha aid etməkdir.

**29 Övliya *(dost)* kimdir?** Övliya, əməlisaleh və təqva sahibi olan mömin bəndədir. Uca Allah buyurur: ***﴾Bilin ki, Allahın dostlarının heç bir qorxusu yoxdur və onlar qəm-qüssə görməzlər. O kəslər ki, iman gətirmiş və pis əməllərdən çəkinmişlər﴿*** Yunus: 62 – 63. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: *"Həqiqətən mənim dostum Allah və əməlisaleh möminlərdir."* Buxari və Müslim.

**30 Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) səhabələrinə münasibətimiz necə olmalıdır?** Biz, onları sevməli, onlar üçün Allahdan razılıq diləməli, onlara qarşı qəlbimizi və dilimizi salamat tutmalı, onların məziyyətlərini yaymalı, etdikləri mənfi işlərə və aralarında baş verən söz-söhbətə qarışmamalıyıq. Onlar günahlardan

sığortalanmayıblar *(məsum deyillər)*. Onlar ictihad ediblər. Düzgün qərar verənlər iki, səhv qərar verənlər isə, ictihadlarına görə bir savab qazanıblar. Onların etdikləri səhv bağışlanandır. Əgər onlar hər hansı pis iş görüblərsə, əldə etdikləri məziyyətlər bunu örtür, təmizləyir. Səhabələr dərəcə baxımından bir-birilərindən üstündürlər. Ən üstün səhabələr cənnətlə müjdələnən on nəfərdir: Əbu Bəkr, Ömər, Osman, Əli, Talha, Zubeyr, AbdurRahmən ibn Ovf, Səd ibn Əbu Vaqqas, Səid ibn Zeyd və Əbu Ubeydə ibn əl-Cərrah. Sonra mühacirlərin çoxu, sonra Bədr döyüşündə iştirak edən mühacir və ənsarlar, sonra yerdə qalan ənsarlar, sonra isə digər səhabələr. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: *"Mənim səhabələrimi söyməyin. Nəfsim əlində olana and olsun, əgər sizlərdən biriniz Uhud dağı qədər qızıl sədəqə edərsə, bu, onların xərclədikləri bir və ya yarım ovuca çatmaz."* Buxari və Müslim.

Digər hədisdə Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) belə dediyi rəvayət olunur: *"Kim mənim səhabələrimi söyərsə, ona Allahın, mələklərin və bütün insanların lənəti olsun!"* Təbərani rəvayət etmişdir. Allah bütün səhabələrdən razı olsun.

**31 Peyğəmbəri ﷺ Allahın bəxş etdiyi məqamdan uca tutaraq onu tərifləməkdə mübaliğə etmək olarmı?** Heç şübhə yoxdur ki, Peyğəmbərimiz Muhəmməd (*Sallallahu aleyhi və səlləm*) Allahın yaratdıqları arasında ən şərəfli və ən ləyaqətli olanıdır. Nəsranilər Məryəm oğlu İsanı ﷺ tərifləməkdə ifrata vardıqları kimi, biz də, onu tərifləməkdə ifrata varmamalıyıq. Çünki Peyğəmbərimiz ﷺ bunu qadağan edərək demişdir: *"Nəsranilər Məryəm oğlunu mədh etdikləri kimi, məni mədh etməyin. Mən, sadəcə olaraq, Onun quluyam. Siz də mənə Allahın qulu və elçisi deyin."* Buxari.

**32 Kitab əhli mömin sayılırlarmı?** Kim Muhəmməd Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) gəlişindən sonra öz dinini tərk edib İslamı qəbul etməzsə ﴾*(o din)*, **heç vaxt ondan qəbul olunmaz və o şəxs axirətdə zərər çəkənlərdən olar!**﴿ Ali-İmran: 85. Bununla razılaşmayan müsəlman Allahın və rəsulunun onların küfr etmələri barədə verdiyi hökmə xilaf çıxmış olur. Uca Allah buyurur: ﴾*(Ya Rəsulum!)* **Quranı inkar edən zümrənin** *(bütün müşriklərin və kafirlərin)* **vəd olunduğu yer Cəhənnəmdir...**﴿ Hud: 17. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: *"Nəfsim əlində olana and olsun, bu ümmətdən olan hər bir yəhudi və xaçpərəst mənim gəlişimi eşidib mənə iman gətirməzsə, mütləq cəhənnəmə daxil olar."* Müslim.

**33 Kafirlərə zülm etmək olarmı?** Uca Allahın bu sözünə görə zülm etmək haramdır. Qüdsi hədisdə uca Allah buyurur: *"Mən zülm etməyi Özümə haram etmişəm. Sizə də zülm etməyi haram etmişəm. Bir-birinizə zülm etməyin!"* Müslim. Qiyamət günü hər bir məzlum ona zülm edən zalımdan qisasını alacaqdır. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: *"Heç bilirsiniz müflis kimdir? Camaat dedi: Bizə görə müflis pulu və heç bir şeyi olmayan adamdır. Peyğəmbər* (*Sallallahu aleyhi və səlləm*) *dedi: "Ümmətimin həqiqi müflisi qiyamət günü namaz, oruc, zəkat kimi əməllərlə gəlib, digər tərəfdən isə bunu söyüb, ona böhtan atıb, o birisinin malını mənimsəyib, bu birisinin qanını axıdıb və ya başqasını vurub. Belə adamın savablarından ona-buna veriləcək. Etdiklərinin əvəzi qurtarmamış savabları qurtararsa onların günahlarından götürülüb ona yüklənər, sonra isə cəhənnəmə atılar."* Muslim. Qiyamət günü hətta heyvanlar arasında da qisas olacaqdır.

**34 Bidət nədir?** İbn Rəcəb ﷺ deyir: *"Bidət, sonradan dinə əlavə olunmuş yeniliklərdir. Hansı ki, şəriətdə əsaslandırılması üçün ona işarə edən heç bir dəlil yoxdur. Əsaslandırılması üçün işarə olarsa, buna lüğəti mənada bidət deyilər, amma istilahi mənada bidət deyilməz".*

**35 Dində gözəl və pis bidət anlayışı varmı?** Bir çox ayə və hədislər şəriət məfhumunda tanınan bidəti məzəmət etmişdir. Şəriət məfhumunda bidət, dində əsası olmayıb, dinə əlavə olunan yeniliklərdir. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: *"Kim bizim əmrimiz olmayan bir işi edərsə, etdiyi rədd olunar."* Buxari və Müslim. Digər hədisdə demişdir: *"Həqiqətən hər bir yenilik bidətdir. Hər bidət isə zəlalətdir."* Müslim. İmam Malik ﷺ bidətin şərii mənası barədə demişdir: **"Kim dində bir bidət (*yenilik*) edib onu gözəl bidət hesab edərsə, Muhəmmədin (*Sallallahu aleyhi və səlləm*) peyğəmbərlik işinə xəyanət etdiyini iddia etmiş sayılır. Çünki uca Allah buyurur: ﴾*Bu gün dininizi sizin üçün kamil etdim, sizə olan nemətimi tamamladım...*﴿".** Bəzi hədislərdə bidət kəlməsi lüğəti mənada mədh edilmişdir. Bu, şəriətdən olub, sonradan insanlar tərəfindən unudulan məsələlər barədə deyilmişdir. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) unudulmuş sünnələri insanlara xatırlatmağa təşviq etmiş və demişdir: *"Kim islamda gözəl sünnə edərsə, onun və ondan sonra ona əməl edənlərin savablarında heç bir naqislik olmadan onlar kimi savab qazanar."* Müslim. Bu mənada Ömərin ﷺ təravih namazı haqqında dediyi bir sözü də var: *"Bu nə gözəl bidətdir"*. Bu namaz şəriətdə buyrulmuş və Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) də ona təşviq etmişdi. Özü bu namazı üç gün camaat ilə qılmış sonra fərz buyurulmasından ehtiyat edib tərk etmişdi. Ömər ﷺ özü bu namazı qılıb, onun camaat ilə qılınmasını da əmr etmişdi.

**36 İkiüzlülüyün (*nifaqın*) neçə növü var?** İkiüzlülüyün iki növü var: **1. Etiqadda ikiüzlülük.** Bu, imanı izhar edib, küfrü gizlətməkdir və bu böyük ikiüzlülük sayılır. Belə ikiüzlülük insanı dindən çıxardır. Əgər insan bu etiqadla ölərsə, kafir kimi ölmüş sayılır. Uca Allah buyurur: ﴾*Əlbəttə, münafiqlərin yeri Cəhənnəmin ən aşağı təbəqəsindədir...*﴿ ən-Nisa: 145. Onların sifətlərindən bunları demək olar: Onlar Allaha və iman gətirənlərə xəyanət edər, möminləri ələ salar, müsəlmanlara qarşı kafirlərə kömək edər, savab əməllər görməklə dünyəvi məqsəd güdərlər. **2.Əməldə olan ikiüzlülük.** Bu, kiçik ikiüzlülük sayılır. Belə ikiüzlülük insanı islamdan çıxarmır. Amma belə insan tövbə etməsə, bu əməlinin böyük ikiüzlülüyə yol açma təhlükəsi vardır. Belə insanların sifətlərindən bunları demək olar: Danışarkən yalan danışar, vəd verdikdə vədinə xilaf çıxar, mübahisə etdikdə (*söyüş söyüb*) günaha batar, əhd bağladıqda əhdini pozar və tapşırılan əmanətə xəyanət edər. Ey qardaşım, daima öz nəfsini mühakimə et və bu sifətlərdən uzaq ol. Hətta səhabələr ﷺ də əməldə ikiüzlülük etməkdən daim ehtiyat edərdilər. İbn Əbu Məlikə ﷺ deyir: **"Mən Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) otuza yaxın səhabəsini görmüşəm. Hamısı özlərinin ikiüzlülüyə düşməsindən ehtiyat edirdilər".** İbrahim ət-Teymi ﷺ deyir: **"Sözlərim ilə əməllərimi müqayisə etdikdə (*sözüm ilə əməlimin bir-birinə düz gəlməməsinə görə*) özümün yalançı olduğumdan ehtiyat edirəm".** Həsən əl-Bəsri ﷺ deyir: **"Yalnız mömin ikiüzlülükdən qorxar, münafiq isə arxayın olar".** Ömər ﷺ Huzeyfəyə ﷺ demişdir: *"Səni Allaha and verdirirəm,*

*Peyğəmbər (Sallallahu aleyhi və səlləm) məni (mənim adımı) münafiqlərin arasında saymayıb ki?"* Huzeyfə dedi: *"Xeyr. Səndən başqa, heç kəsə zamin duran deyiləm".*

**37 Allah qatında ən böyük günah nədir?** Ən böyük günah Allaha şərik qoşmaqdır. Uca Allah buyurur: ***Doğrudan da, Allaha şərik qoşmaq böyük zülmdür!*** Loğman: 13. Peyğəmbərdən (Sallallahu aleyhi və səlləm) hansı günahın daha böyük olması haqqında soruşduqda belə demişdir: ***"Allah səni yaratdığı halda başqasını Ona şərik tutmaq."*** Buxari və Müslim.

**38 Şirkin neçə növü var?** Şirkin iki növü var: **1. Böyük şirk.** Bu növ şirk insanı islamdan çıxardır və Allah belə insanı bağışlamır. Uca Allah buyurur: ***Şübhə yoxdur ki, Allah Özünə şərik qoşanları əvf etməz, amma istədiyi şəxsin bundan başqa olan günahlarını bağışlar...*** Nisa: 48. Böyük şirk dörd qismdir: A. Dua və diləkdə şirk. B. Niyətdə şirk. C. İtaətdə şirk. Buraya Allahın halal etdiyini haram, haram etdiyini halal edən alimlərə itaət etmək daxildir. D. Sevgidə şirk. Yəni başqasını Allahı sevən kimi sevmək. **2. Kiçik şirk.** Belə şirk insanı islamdan çıxarmır. Bu iki növdür: **A. Aşkar bilinən.** Bu, Allahdan başqasına and içməkdə, yaxud Allah və sən istəsən ifadəsində, əgər Allah və filankən olmasaydı kimi sözlərdə ola bilər. Bu həmçinin əməllərdə də görsənə bilər. Misal olaraq müsibətlərin qarşısını almaq məqsədi ilə qola dəmir halqa və ya ip taxmağı, gözdən qorunmaq üçün amulet asmağı, yaxud quşun uçmasından, eşitdiyi sözlərdən və ya olduğu yerdən bədbinlik güdməyi qeyd etmək olar. **B. Gizlidə olan.** Bu niyyətdə, məqsəddə və ya istəkdə olan şirkdir. Misal olaraq cüzi riyakarlığı misal çəkmək olar.

**39 Böyük və kiçik şirk arasında nə fərq vardır?** Böyük şirk edən insanın bu dünyadakı hökmü islamdan çıxmaq, axirətdə isə, əbədi cəhənnəmə düşməkdir. Kiçik şirk edənə bu dünyada küfr hökmü verilmir, axirətdə də əbədi cəhənnəmdə qalmır. Böyük şirk bütün əməlləri puç edir, kiçik şirk isə, hansı əməldə olarsa, yalnız onu puç edər. Bu barədə yalnız bir məsələdə fikir ayrılığı mövcuddur. Kiçik şirkin bağışlanması üçün böyük şirkdəki kimi tövbə etmək lazımdır, yoxsa digər böyük günahlar kimi onun da bağışlanması Allahın istəyindən asılıdır? Hərçənd, hər iki hal təhlükəlidir.

**40 Kiçik şirk baş verməsin deyə ondan qorunmaq olarmı? Əgər baş verərsə, kəffarəsi nədir?** Riyakarlıqdan qorunmaq üçün əməli sırf Allah rizasına etmək lazımdır. Az riyakarlıqdan qorunmaq üçün dua etmək lazımdır. Peyğəmbər (Sallallahu aleyhi və səlləm) demişdir: ***"Ey insanlar, bu şirkdən ehtiyat edin. Doğrudan da bu şirk qarışqanın addımlarından gizlidir".*** Orada olanlar dedilər: *"Ey Allahın elçisi, bir halda ki, bu şirk qarışqanın addımlarından da gizlidir biz bundan necə qorunaq?"* Peyğəmbər (Sallallahu aleyhi və səlləm) dedi: ***"O zaman belə deyin: Allahummə innə nəuzu bikə ən nuşrikə bikə şey`ən nələmuhu və nəstəğfirukə limə lə nələmuhu.*** *(Ey Allahım, biz bildiyimiz bir şeyi Sənə şərik qoşmaqdan Sənə sığınır, bilməyib etdiyimizə görə Səndən bağışlanma diləyirik)"* Əhməd. **Allahdan başqasına and içməyin kəffarəsi** haqqında Peyğəmbər (Sallallahu aleyhi və səlləm) demişdir: ***"Kim Lat və Üzzaya and içərsə: Lə iləhə illəllah*** *(Allahdan başqa ibadətə layiq haqq məbud yoxdur)* ***– desin".*** Buxari və Müslim. **Bədbinliyin kəffarəsi** haqqında isə Peyğəmbər (Sallallahu aleyhi və səlləm) belə demişdir: ***"Kim bədbinliyə***

***qapanıb işindən qalarsa artıq şirk etmişdir"***. Orada olanlar dedilər: *"Bəs bunun kəffarəsi nədir?"* Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) dedi: ***"Kəffarəsi bunu deməkdir: Allahummə lə xeyrə illə xeyrukə və lə tayrə illə tayrukə və lə iləhə ğeyrukə"*** *(Allahım Sənin bəxş etdiyin xeyirdən başqa xeyir, Sənin istəyindən başqa ümidim, Səndən başqa ilah yoxdur)* Əhməd.

**41 Küfrün neçə növü var?** Küfrün iki növü var: **1. İnsanı İslamdan çıxardan böyük küfr.** Bu növ küfr beş qismə bölünür: A. Yalanlama küfrü. B. Haqqı etiraf edib, təkəbbürlülükdən qəbul etməmək. C. Şəkk etmək küfrü. D. Üz döndərmək küfrü. E. İkiüzlülük küfrü. **2. Kiçik küfr.** Buna nemətə küfr etmək də deyilir. Bu növ küfr asilik sayılır və insanı dindən çıxartmır. Məsələn, müsəlmanı haqsız yerə öldürmək.

**42 Nəzir etməyin hökmü nədir?** Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) nəzir etməyi bəyənməyib demişdir: ***"Nəzir xeyir gətirmir."*** Müslim. Bu, sırf olaraq Allah üçün deyilən nəzirə aiddir. Əgər nəzir Allahdan başqası üçün məsələn, qəbir və ya övliya üçün – deyilərsə, bu haram sayılır. Belə nəziri yerinə yetirmək olmaz.

**43 Sehrbazın və ya falçının yanına getməyin hökmü nədir?** Bu, haramdır. Xeyir güdmək məqsədi ilə onların yanına gedib, dediklərini təsdiq etməzsə, belə insanın qırx günlük namazı qəbul olunmaz. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: ***"Kim falçının yanına gəlib, nə isə haqqında soruşarsa, onun qırx günlük namazı qəbul olunmaz."*** Müslim. Əgər falçının yanına gedib, qeybdən iddia etdiklərini təsdiqləyərsə, Muhəmmədin (*Sallallahu aleyhi və səlləm*) dininə küfr etmiş olar. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: ***"Kim falçının və ya sehrbazın yanına gedib, dediklərini təsdiqləyərsə, Muhəmmədə nazil olana küfr etmiş olar."*** Əbu Davud.

**44 Ulduzlardan yağış diləmək nə zaman böyük, nə zaman isə kiçik şirk olur?** Allahın istəyi olmadan ulduzların birbaşa təsiri ilə yağışın yağmasını etiqad etmək və yağışı yaratmaq mənasında ulduzlara nisbət etmək böyük şirkdir. Amma kim ulduzların Allahın istəyi ilə yağışın yağmasına təsir etdiyini, Allah tərəfindən qoyulmuş bir səbəb olduğunu, hansısa ulduzun görsənməsi ilə yağışın yağmasını bir qayda etdiyini etiqad edərsə, bu haramdır, kiçik şirkdir. Çünki bu halda o, ulduzların təsirini heç bir şərii, hissi və ya əqli baxımdan məqbul dəlillə əsaslandıra bilmir. Amma ulduzları ilin fəsillərinin dəyişməsi və yağış yağma ehtimalı üçün dəlil gətirmək icazəlidir.

**45 Müsəlman rəhbər qarşısında müsəlmanın boynuna düşən vacib nədir?** Xoşladığın və xoşlamadığın işlərdə eşidib itaət etmək vacibdir. Zülm etsələr də, onlara qarşı üsyan qaldırmaq, bəd dua etmək, itaətsizlik göstərmək olmaz. Əksinə, onların islah olunması, sağlam və əzmkar olmaları üçün dua etmək lazımdır. Günah işlər xaric olmaqla onlara itaət etməyin Allaha itaət olduğunu etiqad edirik. Müsəlmana günah iş görmək əmr olunduqda günah işi etməməli, amma yaxşı işlərdə eşidib itaət etməlidir. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: ***"Rəhbəri eşit və ona itaət et. Əgər belinə vurulub, malın əlindən alınsa, eşit və itaət et"*** Müslim.

**46 Əmr və qadağalarda olan ilahi hikmət barədə soruşmaq olarmı?** Bəli, olar. Lakin bir şərtlə ki, imanını və ya əməlini hikməti bilib, qane olmaqdan asılı etməsin. Hikməti bilmək mömin üçün haqq üzərində sabitqədəm olmağa əlavə

kömək olmalıdır. Amma əmr və qadağalarda hikmət axtarmadan dərhal qane olub, soruşmadan əməl etmək kamil mütiliyi, Allaha və Onun hikmətinə imanı əks etdirir. Necə ki, səhabələr də belə edərdilər. Allah onlardan razı olsun!

**47 Uca Allahın bu ayəsinin mənası nədir?** ﴾*Sənə yetişən hər bir yaxşılıq Allahdandır, sənə üz verən hər bir pislik isə özündəndir...*﴿ Nisa: 79. Ayədə deyilən "yaxşılıq" nemət, "pislik" isə, bəla mənasındadır. Bütün bunlar Allah tərəfindən qədərlə təyin olunmuşdur. Yaxşılığı Allah bəxş edir deyə, Ona da nisbət olunur. Pisliyi isə, müəyyən məqsəd *(hikmət)* üçün yaratmışdır. Baş verən pislik yaradılma məqsədi baxımından Allahın yaxşılığıdır. Çünki Allah, əsla pislik etməz, Onun etdiyinin hamısı yaxşıdır. Peyğəmbər (Sallallahu aleyhi və səlləm) demişdir: *"Bütün xeyir Sənin əlindədir, şər isə Sənə nisbət deyil."* Müslim. Bəndələrin əməlləri Allahın yaratdıqlarından sayılırlar. Eyni zamanda, bu bəndələrin qazancı da hesab olunur. Uca Allah buyurur: ﴾**Kim** *(malını Allah yolunda)* **versə,** *(Allahdan)* **qorxsa, Və ən gözəl sözü** *(la ilahə illallah kəlməsini)* **təsdiq etsə, Biz ona ən asan olanı** *(Cənnəti)* **müyəssər edəcəyik! Amma kim** *(malını Allah yolunda xərcləməyə)* **xəsislik etsə,** *(mal-dövlətinə güvənib Allaha)* **möhtac olmadığını sansa, Və ən gözəl sözü** *(la ilahə illallah kəlməsini)* **yalan saysa, Biz ona ən çətin olanı** *(Cəhənnəmi)* **müyəssər edəcəyik** *(onu Cəhənnəm üçün hazırlayacağıq!)*﴿ Leyl: 5-10.

**48 Demək olarmı ki, "Filankəs şəhid olub"?** Müəyyən bir insanın şəhid olmasını qətiyyətlə söyləmək onun cənnətlik olmasını hökm etməkdir. Əhli Sünnənin fikrinə əsasən, müəyyən bir müsəlmanın cənnətlik və ya cəhənnəmlik olmasını demək olmaz. Yalnız Peyğəmbər (Sallallahu aleyhi və səlləm) deyənlər haqqında belə hökm vermək olar. Çünki burada həqiqət, aşkar deyil və insanın necə ölməsi də bizə bəlli deyil. İnsan etdiyi son əməlinə görə qiymətləndiriləcəkdir. Niyyətləri isə, Allah bilir. Amma biz yaxşı insan üçün savab arzulayır, pis insan üçün əzabdan qorxuruq.

**49 Müəyyən bir müsəlmana küfr hökmünü aid etmək olarmı?** Buna dəlalət edən heç bir zahiri amil yoxdursa və maneələr tam götürülməyibsə, müəyyən bir müsəlmana küfr, şirk və ya münafiqlik hökmü aid edə bilmərik. Biz, onun aqibətini Allaha həvalə edə bilərik.

**50 Kəbədən başqa bir yeri təvaf etmək olarmı?** Yer üzərində Kəbədən başqa təvaf olunası heç bir yer yoxdur. Digər yerlərin nə dərəcədə şərəfli olmasına baxmayaraq, onları Kəbəyə bənzətmək olmaz. Kim başqa yeri təzim etmək üçün oranı təvaf edərsə, Allaha qarşı günah işlətmiş olar.





# QƏLBİ ƏMƏLLƏR

Uca Allah qəlbi yaradıb və onu padşah, digər əzaları isə onun ordusu etmişdir. Əgər padşah rahat olarsa, ordusu da rahat olar. Peyğəmbər (*Sallallahu aleyhi və salləm*) demişdir: *"İnsanın bədənində bir ət parçası vardır. O islah olunarsa bütün cəsəd islah olunar. Əgər o korlanarsa bütün cəsəd də korlanar. Həmin ət parçası qəlbdir."* Buxari və Muslim.

Qəlb ya iman və təqva, ya da küfr, nifaq və şirk məkanı ola bilər. Peyğəmbər (*Sallallahu aleyhi və salləm*) sinəsinə üç dəfə işarə edərək demişdir: *"Təqva buradadır?"* Muslim.

• **İman etiqad, söz və əməldən ibarətdir.** Qəlbin etiqadı, dilin isə sözü olmalıdır. Qəlbin və əzaların əməli olmalıdır. Qəlb iman gətirir və təsdiq edir. Nəticədə dildə şəhadət kəlməsi hasil olur. Sonra qəlb özünə aid sevgi, qorxu və ümid kimi işləri görür. Dil isə zikr edir, Quran oxuyur. Əzalar səcdə və rüku etməklə hərəkət edir, Allaha yaxınlaşdıran başqa yaxşı işlər görür. Əzalar qəlbə tabedir. Qəlbdə nə yer tutursa, o mütləq hər hansı vasitə ilə əzalarda görsənir.

• **Qəlbi əməllər dedikdə,** yeri qəlb olan və ona bağlı qalan əməllər nəzərdə tutulur. Bu əməllərin ən möhtəşəmi yeri qəlb olan Allaha iman gətirməkdir. Təsdiqdən irəli gələn əməl də bura aiddir. Həmçinin bəndənin qəlbində Rəbbinə qarşı olan sevgi, qorxu, ümid, bağlılıq, təvəkkül, səbir, yəqinlik, mütilik və sair əməllər bura daxildir.

• **Qəlbi əməllərin əksini təşkil edən hər bir əməl qəlb xəstəliklərindən hesab olunur.** İxlasın *(səmimiliyin)* əksi riya, yəqinliyin əksi şübhə, sevginin əksi isə nifrətdir. Bütün əməllər belədir. Əgər biz qəlbimizi islah etməyi unutsaq günahlar onu bürüyüb həlak edər. Peyğəmbər (*Sallallahu aleyhi və salləm*) demişdir: *"Bəndə bir günah etdikdə qəlbində qara nöqtə iz salar. Tövbə edib, günahdan əl çəkər və bağışlanma diləyərsə, qəlbi təmizlənər. Əgər günahı davamlı edərsə, qara nöqtə çoxalıb qəlbini örtər. Bu, uca Allahın Quranda söylədiyi "qaplama" (ərəb. Ran) dır."* Tirmizi.
Digər hədisdə Peyğəmbər (*Sallallahu aleyhi və salləm*) belə deyir: *"Fitnələr qəlblərə həsir toxumaları kimi dənə-dənə gələcəkdir. Bu fitnəni qəbul edən qəlbə bir qara nöqtə vurular. Kim qəbul etməzsə qəlbinə bir ağ nöqtə vurular. Beləliklə iki qəlb hasil olar. Biri ağappaq hamar daş kimi olar. Göylər və yer durduqca ona heç bir fitnə zərər verə bilməz. Digəri isə qapqara, baş-ayaq dayanmış qab kimi olar. Nə yaxşını yaxşı kimi, nə də pisi pis kimi tanıyar. Nəfsi nəyi istəyərsə onu sevər."* Muslim.

• **Qəlbi ibadətlər haqqında bilmək, əza ibadətlərini bilməkdən daha önəmli, daha vacibdir.** Çünki qəlbi əməllər əsas, əza əməlləri isə onun şaxəsi, tamamı və bəhrəsidir. Peyğəmbər (*Sallallahu aleyhi və salləm*) demişdir: *"Allah sizin simanıza və mal-dövlətinizə baxmaz, qəlbinizə və əməllərinizə baxar."* Muslim. Qəlb elm, düşüncə və dərrakə mənbəyidir. Ona görə insanlar Allah yanında qəlblərində qərar tutan imana, yəqinliyə, ixlasa *(səmimiyyətə)* və sairə bu kimi əməllərə görə fərqlənirlər. Həsən əl-Bəsri deyir: Allaha and olsun ki, Əbu Bəkr namazı və orucu ilə onlardan üstün olmamışdı. O qəlbində qərar tutan imana görə üstün olmuşdu.

• **Qəlb əməlləri bir çox cəhətlərinə görə əza əməllərindən üstündür: 1.** Qəlbin ibadəti səhv olarsa əzaların ibadətini heç edər. Buna əza əməli ilə bərabər riyakarlıq etməyi misal çəkmək olar. **2.** Qəlb əməlləri əsasdır. Qəlbin məqsədi

olmadan deyilən və ya edilən işə görə günah yazılmır. 3. Qəlb əməlləri cənnətin yüksək mərtəbələrini qazanmaq üçün səbəbdir. Buna zahidliyi[1] misal çəkmək olar. 4. Qəlb əməlləri əzalarla edilən əməllərdən qat-qat çətindir. İbn əl-Munkədir ﷺ deyir: Qırx il öz nəfsimlə mübarizə apardıqdan sonra mənə tabe oldu. 5. Onun təəssüratları çox xoşdur. Məsələn Allahı sevmək kimi. 6. Onun savabı daha çoxdur. Əbu Dərda ﷺ deyir: Bir saat düşünmək gecəni namaz qılmaqdan daha xeyirlidir. 7. O əzaları hərəkətə gətirir. 8. O əzaların ibadətinin savabını ya çoxaldır, ya azaldır, ya da heç edir. Buna namazda xuşulu *(müti)* olmağı misal çəkmək olar. 9. Bəzən əzaların əməlini də əvəz edir. Misal olaraq mal-dövləti olmadığı halda sədəqə vermək niyyətində olmaq. 10. Qəlb əməllərinin savabına məhdudiyyət yoxdur. Səbri misal çəkmək olar. 11. Əzalar dayandıqda və ya aciz olduqda onun savabı davam edir. 12. O əzaların əməllərindən öncə, yaxud onlarla eyni zamanda olur.

Əzalar bir əməli icra etmədən öncə qəlb bir neçə mərhələdən keçir. 1. Mücərrəd fikir. 2. Qəlbdə özünə yer edən düşüncə. 3. Öz-özünlə danışmaq. Yəni bir işi edib-etməmək barədə öz qəlbində danışmaq. 4. Əməli etməyə dair qərar vermək. 5.Əzmkarlıq. Yəni niyyətini qətiləşdirmək və əməl etməyə qəti qərar vermək. Birinci üç halda nə yaxşı işlərə görə savab, nə də asiliklərə görə günah yoxdur. Dördüncüdə isə yaxşı işə görə bir savab yazılır, asiliyə görə isə günah yazılmır. Əbu bu qərar əzmkarlığa çevrilərsə yaxşı işlərə görə savab, asiliklərə görə, icra etməsə belə günah qazanar. Çünki istək və bacarıq varsa işin həyata keçməsi mümkündür. Uca Allah buyurur: ***❬Möminlər arasında pis söz yaymaq istəyənləri dünyada və axirətdə şiddətli bir əzab gözləyir...❭*** (Nur surəsi). Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) deyir: ***"İki müsəlman qılınclarını çəkib üz-üzə gələrlərsə öldürən də, ölən də cəhənnəmlik olar"***. Orada olanlar dedilər: ***"Ey Allahın elçisi! Öldürənin cəzası aydındır. Bəs ölənin nə təqsiri var?"*** Peyğəmbər ﷺ dedi: ***"O da öz yoldaşını öldürmək istəyirdi."*** Buxari.

Günahı etməyə əzmkarlıq göstərdikdən sonra ondan əl çəkməyə qərar verən insanlar dörd qismdir: 1. Günahı Allah qoxusundan tərk edən. Bu savab qazanır. 2. Günahı insanlardan qorxub tərk edən. Belə insan günah qazanır. Günahı tərk etmək ibadət sayıldığı üçün onu sırf Allah üçün etmək lazımdır. 3. Günaha aparan səbəbləri etmədən öncə acizlik səbəbi ilə ondan əl çəkmək. Belə insan da qəti niyyətinə görə günah qazanır. 4. Günaha aparan səbəbləri etdikdən sonra acizlik səbəbi ilə ondan əl çəkmək, yəni istədiyinə nail ola bilməmək. Belə insan tam günah qazanır. Çünki qəti istəklə yanaşı əzaların da köməyinin olması, günahı tam icra etmək kimidir. Ötən hədis buna sübutdur. İstənilən əməl ilə yanaşı ondan öncə və ya sonra istək olarsa buna görə insan cəzalanır. Bir dəfə haram iş görüb imkanı olanda yenidən həmin işi görmək istəyində olan insan günah etmətə israr etmiş sayılır. O haram işi görməsə də niyyətinə görə günah qazanır.

---

[1] Burada zahidlik dedikdə çirkin geyinib, illərlə çimməmək və s. bu kimi səhv düşüncələr nəzərdə tutulmur. Əsl zahidlik özündə olanla kifayətlənib başqalarına ümid etməmək, ağız açmamaqdır. *(tərc.)*

# Qəlbi əməllərdən bunları qeyd etmək olar:

**Niyyət:** Bu məqsəd və məram mənasındadır. Niyyətsiz əməl doğru və məqbul sayılmaz. Peyğəmbər (Sallallahu aleyhi və səlləm) demişdir: *"Əməllər niyyətlərə görədir. Hər kəs etdiyi niyyətin savabına nail olacaqdır..."* Buxari və muslim.

İbn əl-Mubarək ﷺ deyir: Niyyət balaca əməli çox, böyük əməli isə kiçik edə bilər. Fudeyl ibn İyad ﷺ deyir: Allah sənin niyyətini və məqsədini istəyir. Əgər əməlin Allah üçün olarsa, bu ixlas adlanar. İxlas, əməli sırf Allah üçün etmək və Ondan başqa heç kəsə pay ayırmamaqdır. Əgər əməl Allahdan başqası üçün edilərsə, riya və ya münafiqlik *(ikiüzlülük)*, ya da başqa bir şey olar.

**Faydalı məlumat:** Elmlilərdən başqa bütün insanlar fəlakət içindədirlər. Bildiyinə əməl edənlərdən başqa hər bir elmli insan təhlükədədir. Əməlini ixlasla edənlərdən başqa bütün əməl edənlər fəlakətdədir. Allaha itaət etmək istəyən hər bir bəndənin birinci vəzifəsi niyyəti öyrənməkdir. Sadiqliyin və ixlasın həqiqətini dərk edəndən sonra niyyətini öz əməlləri ilə düzəltməlidir. Niyyətsiz əməl çətinlik, ixlassız niyyət riyakarlıq, imansız ixlas isə puçdur.

**Əməllər üç qismə bölünür: 1. Asiliklər:** Yaxşı niyyətlə edilən asilik, gözəl niyyətlə edilən itaətə çevrilmir. Əgər asiliyə pis niyyət də əlavə olunarsa o zaman günahı da bir o qədər böyük olar. **2. İcazəli əməllər:** Belə əməllərlə yanaşı niyyət də olarsa onu ibadətə çevirər. *(Əgər ibadət etmək üçün taqət toplamağa görə yemək yeyirsə bu ibadətdən sayıla bilər. (tərc.))* **3. İbadətlər:** Bu kimi əməllərin doğru olması və savabının çoxalması niyyətə bağlıdır.[1] Əgər o bu əməlləri edərkən riyakarlığa yol verərsə, bu asilik və kiçik şirk olar. Böyük şirk də ola bilər. Ümumiyyətlə ibadətlər üç hala düşə bilər: *1) İbadəti əvvəlcədən özünü insanlara göstərmək məqsədi ilə etmək.* Bu şirkdir və ibadəti də batil edir. *2) İbadəti əvvəlcədən Allah üçün edib sonradan riyakarlıq niyyətini qarışdırmaq.* Bu halda edilən əməlin axırı əvvəlinə bağlı deyilsə, o zaman onun əvvəli *(riyasız hissəsi)* doğru, axırı isə batildir. Sədəqəni misal çəkmək olar. Əgər əməlin əvvəli axırına bağlıdırsa, – məsələn

---

[1] Peyğəmbər (Sallallahu aleyhi və səlləm) demişdir: *"Kim yaxşı bir iş görmək qərarına gəlib, amma onu etməsə, Allah təalə bunu onun üçün tam savab yazar. Əgər qərara gəlib yaxşı işini görərsə, Allah təalə onun üçün on savabdan yeddi yüz və daha artıq qədərdə savab yazar. Kim bir pis iş etmək qərarına gələr, amma onu etməzsə, Allah təalə bunu onun üçün tam bir savab yazar. Əgər o, qərara gəlib pis işi görərsə, Allah təalə buna görə ona bir günah yazar."* Buxari və Muslim.

**Başqa hədisdə isə belə deyir:** *"Bu ümmət dörd nəfərin timsalındadır: Allah bir nəfərə elm və mal-dövlət verir. Bu adam da elminə əməl edib malını lazımi yerlərə xərcləyir. Başqa birinə isə elm verib amma mal-dövlət verməyib. Bu da deyir ki, əgər mənim də filankəs kimi mal-dövlətim olsaydı, onun kimi yaxşı işlər görərdim. Peyğəmbər (Sallallahu aleyhi və səlləm) dedi: Bunların savabı eynidir. Digər bir nəfərə isə mal-dövlət verib, amma elm verməyib. Bu da malını lazımsız yerlərə xərcləyir. Bir nəfərə isə nə mal-dövlət, nə də elm verib. Bu da deyir ki, əgər buna verilən mənə verilsəydi, mən də onun kimi edərdim. Peyğəmbər (Sallallahu aleyhi və səlləm) dedi: Bunların günahı eynidir".* Tirmizi. Hədisdə haqqında danışılan ikinci və dördüncü adam bacardığını, yəni arzu ilə bərabər niyyət də etmiş və bunu: *"əgər mənim də filankəs kimi mal-dövlətim olsaydı, onun kimi yaxşı işlər görərdim."* – sözləri ilə ifadə etmişdir. Savab və günah baxımından hər biri öz oxşarına qovuşmuşdur. İbn Rəcəb ﷺ deyir: Peyğəmbərin (Sallallahu aleyhi və səlləm) hədisdə dediyi: *"Bunların savabı eynidir."* – sözü onların əməlin əsl savabında eyni olduqlarını bildirir. Əmələ görə savabın qat-qat çoxalması isə niyyət edib əməli etməyənə deyil, məhz niyyət edib əməli edənə aiddir. Əgər onların hər ikisi savab qazanmaqda eyni olsaydılar, o zaman yaxşı iş görmək niyyətində olub əməl etməyənə də on savab verilərdi. Bu isə bütün şəriət dəlillərinə ziddir.

namaz kimi – bunun iki halı ola bilər: A) Riyakarlığı dəf edərsə əmələ təsiri olmaz. B) Riyakarlıqdan xoşlanarsa bütün əməl batil olar. 3) Riyakarlıq əməldən sonra olarsa vəsvəsədir, nə əmələ, nə də əməli edənə heç bir mənfi təsiri yoxdur. Riyakarlığın gizli növləri vardır. Hər kəs bunları bilməli və özünü qorumalıdır. Əgər onun yaxşı əməl etməkdə məqsədi dünya mənfəəti əldə etməkdirsə, onun savabı və günahı niyyəti miqdarında olar. Bu da üç halda baş verə bilər: 1. **Yaxşı əməli sırf dünya mənfəəti üçün etmək.** Maaş almaq məqsədi ilə insanlara namazda imamlıq edəni misal çəkmək olar. Bu halda o günah qazanır. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: *"Kim Allah rizasına öyrənilən bir elmi sırf dünya məqsədləri üçün öyrənərsə, qiyamət günü cənnətin iyini hiss edən deyil."* Əbu Davud. 2. **Yaxşı əməlini həm Allah, həm də dünya mənfəəti üçün etmək.** Belə insanın imanı və ixlası naqisdir. Həcci həm həcc, həm də ticarət məqsədi ilə etməyi misal çəkmək olar. Bu halda ixlası miqdarında savab qazanar. 3. **Əməlini sırf Allah üçün edib, işini davam etdirə bilmək üçün ehtiyacı olan miqdarda zəhmət haqqı götürmək.** Beləsinin savabı tamdır və aldığı maaşa görə savabı azalmır. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: *"Allahın kitabına görə aldığınız zəhmət haqqı daha layiqlidir."* Buxari.

**Bil ki, əməllərini ixlasla edənlər dərəcələrə bölünürlər:**

**1. Aşağı dərəcə:** İbadətini savab qazanmaq, yaxud cəzadan qorxmaq üçün etmək. **2. Orta dərəcə:** İbadətini Allaha şükr etmək və onun əmrinə cavab vermək məqsədi ilə etmək. **3. Yüksək dərəcə:** İbadətini Allahı sevərək, təzim edərək, yüksək tutaraq və Ondan qorxaraq etmək. Bu siddiqlərin dərəcəsidir.[1]

**Tövbə:** Daimi olaraq tövbə etmək vacibdir. Çünki günah etmək insanın xasiyyətidir. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: *"Hər bir Adəm övladı günah edəndir. Günahkarların isə ən xeyirlisi tövbə edənlərdir."* Tirmizi. Başqa hədisdə isə belə deyilir: *"Əgər siz günah etməsəydiniz Allah sizi məhv edər və əvəzinizdə bir tayfa yaradardı. Onlar günah edib Allahdan bağışlanma diləyər, Allah da onları bağışlayardı."* Muslim. Günahlarda israr etmək və tövbəni gecikdirmək səhvdir. Şeytan insanın qarşısına maneələr qoymaqla ona qalib gəlməyə çalışır. Bir maneəni qura bilmədikdə digərinə keçir. Həmin maneələri aşağıdakı kimi sıralamaq olar: Şirk və küfr maneəsi. Əgər bu maneəni qura bilməsə, etiqadda bidətə düşürməyə, Peyğəmbərin ﷺ və səhabələrin yolundan azdırmağa çalışar. Bunu da bacarmadıqda böyük günahlara sövq edər. Bu da alınmadıqda kiçik günahları etməyə həvəsləndirər. Bunu da bacarmazsa, mübah işlərini artırmağa təşviq edər. Əgər bunda da aciz olsa, o zaman az savabı olan ibadətlərlə daha üstün və çox savabı olan ibadətlərdən yayındırmağa çalışar. Bütün bunları bacarmadıqda cinlərdən və insanlardan olan şeytanların hiyləsinə salmaqla təsir edər.

---

[1] Uca Allah buyurur: ❬*Ey Rəbbim! Məndən razı qalasan deyə, hüzuruna tələsdim!*❭ (Taha: 84). Musa ﷺ təkcə Allahın əmri olduğuna görə yox, həm də Allah ondan razı qalsın deyə Allahın hüzuruna gəlməyə tələsdi. Valideynlərə qarşı yaxşı davranmaq da belədir. Bu əməlin *aşağı dərəcəsi* valideynlərin üzünə ağ olmaqdan qorxduğuna və yaxşılığın savabına nail olmağa görə onlara yaxşı davranmaqdır. *Orta dərəcəsi* isə Allaha itaət etmək və onların uşaqlıqda sənə etdikləri yaxşılıqlarına, sənin dünyaya gəlməyinə səbəb olduqlarına gözəl qarşılıq vermək üçün onlara yaxşılıq etməkdir. *Yüksək dərəcə* isə Allahın valideynlərə yaxşılıq etmək əmrini təzim edərək və Allahı sevərək bu işi görməkdir.

**Günahlar bir neçə qismdir: 1. Böyük günahlar:** Buraya dünyada cəzaya məhkum edilən və ya axirətdə əzab, qəzəb, lənət və ya imanın yoxluğu vəd olunan əməllər daxildir. **2. Kiçik günahlar:** Digər bütün günahlar bu qismə daxildir. Kiçik günahları böyük günaha çevirən səbəblər vardır və ən önəmli səbəblər bunlardır: Kiçik günahlarda israrlı olmaq, təkrarlamaq, yaxud əhəmiyyət verməmək, onları etməklə fəxr etmək və ya aşkar şəkildə etmək.

Hər bir günaha görə tövbə etmək keçərlidir. Günəş batdığı yerdən çıxana, yaxud ölüm ayağında ruh boğaza dirənənə qədər tövbə qapısı açıqdır. Tövbəsində sadiq olanın savabı, günahlarının, hətta çoxluğundan göyün üzünü bürüsə də bu günahlarının yaxşılıqla əvəz edilməsidir.

**Tövbənin qəbul edilməsi üçün şərtlər vardır: 1.** Günahdan əl çəkmək. **2.**Etdiyinə peşiman olmaq. **3.** Gələcəkdə bir daha bu günahı etməyəcəyinə dair qəti qərarda olmaq. Günah məxluqatın haqqı ilə bağlıdırsa, haqqı tapdalananın haqqını geri verməki[1].

**İnsanlar tövbə məsələsində dörd qrupa ayrılırlar: 1.** Ömrünün sonuna qədər tövbəsində sadiq olub, həmin günaha qayıtmaq fikrində olmayanlar. İnsanın ixtiyarı olmadan ağlına gələn fikirləri istisna olunur. Tövbəsində sadiq olmaq budur. Yaxşı işlərdə başqalarını ötüb irəli keçən insan budur. "ən-Nəsuh" *(səmimi-qəlbdən, bir daha günaha qayıtmamaq şərtilə edilən)* tövbə budur. (*Allaha iman gətirib zikr etməkdə) arxayın olan nəfs budur*. **2.** Əsas ibadətlərdə tövbəsinə sadiq olub, amma qarşılaşdığı günahlardan yan keçə bilməyən tövbəli insan. O bu günahları qəsdən etmir, qarşısında aciz qalır. Hər dəfə günah edəndə öz nəfsini qınayır, peşiman olur, bu günahlara aparan səbəblərdən uzaqlaşmağa çalışır. *Bu özünü qınayan nəfsdir*. **3.** Tövbə edib bir müddət tövbəsində sadiq olur, sonra şəhvəti onu üstələyib bəzi günahları edir. Bununla yanaşı ibadətlərini də yerinə yetirir. Günahları etmək imkanı ola-ola və şəhvəti günah etmək istəyə-istəyə, o bir çox günahları etmir. Sadəcə olaraq onu bir-iki şəhvətli məsələ yoldan çıxarır. Hər dəfə bu günahları etdikdən sonra peşiman olur və bu günahdan tövbə edəcəyinə dair özünə söz verir. *Bu məsuliyyət daşıyan nəfsdir*. Tövbəsini gecikdirdiyi üçün nəticəsi təhlükəlidir. Çünki tövbə etməmiş ölə bilər. İnsan da sonuncu etdiyi əməllərinə görə tanınacaqdır. **4.** Tövbə edib bir müddət tövbəsində sadiq qaldıqdan sonra, tövbə etmək niyyəti olmadan günahlara qurşanan və etdiklərinə peşiman olmayan. *Pis işlər görməyi, şəhvətə uymağı əmr edən nəfs budur*. Belə insanın həyatının pis işlərlə bitmək təhlükəsi vardır.

**Sadiqlik:** Bu qəlb əməllərinin əsasını təşkil edən əməldir. Sadiqlik sözü altı mənada işlədilir: **1.** Danışanda sadiq olmaq. **2.** İstək və məqsəddə sadiq olmaq

---

[1] Peyğəmbərin (Sallallahu aleyhi və salləm) belə dediyi rəvayət olunur: *"Allah dərgahında əməl dəftərnə yazılan əməllər üç cürdür: Allahın əhəmiyyət vermədiyi əməllər, müzakirəsiz buraxılmayan və Allahın bağışlamadığı əməllər. Allahın bağışlamadığı əməl Allaha şərik qoşmaqdır. Uca Allah buyurur: ﴾...Allaha şərik qoşana Allah, şübhəsiz ki, Cənnəti haram edər. Onun düşəcəyi yer Cəhənnəmdir. ...﴿* (əl-Maidə: 72). *Allahın əhəmiyyət vermədiyi əməl bəndənin özü ilə Rəbbi arasında olan işlərdə özünə zülm etməsidir. Uca Allah istəsə belə əməlləri bağışlayacaqdır. Müzakirəsiz bağışlanmayan əməllər isə bəndələrin bir-birlərinə qarşı etdikləri haqsızlıqdır. Bu halda qisas qaçılmazdır."* Əhməd rəvayət etmişdir. Hədisdə bir az zəiflik vardır.

*(buna ixlas deyilir)*. **3.** Əzmkarlıqda sadiq olmaq. **4.** Əzmkarlığına vəfalı çıxıb sadiq olmaq. **5.** Əməldə sadiq olmaq. Yəni zahir ilə daxilin uyğun gəlməsi. Məsələn namazı müti şəkildə *(xuşu ilə)* qılmaq. **6.** Dinin bütün məqamlarını həyata keçirməkdə sadiq olmaq. Ən yüksək, ən ali və ən şərəfli dərəcə elə budur. Qorxuda, ümiddə, təzimdə, zahidlikdə, razılıqda, təvəkküldə, sevgidə və digər qəlbi əməllərdə sadiq olmaq bu qismə aiddir. Kim deyilənlərin hamısında sadiq olarsa o siddiq hesab olunur. Çünki o sadiqliyə çox əhəmiyyət verir. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: ***"Sadiq olun. Sadiqlik insanı yaxşılığa, yaxşılıq isə cənnətə aparar. Bir insan sadiqlik edə-edə yenə də sadiq olmağa çalışarsa, Allah yanında siddiqlərdən yazılar..."*** Buxari və Muslim.

Sadiqliyin əksi isə yalançılıqdır. Nəfsdən irəli gələn yalan ilk olaraq dilə sirayət edib onu korlayır. Sonra əzalara keçib onların əməllərini pozur. Dilin danışığını korladıqda, onun sözlərini, əməllərini və əhvalını yalan bürüyər, fitnə-fəsad ona hakim olar.

**Sevgi:** Allahı, Peyğəmbərini və möminləri sevməklə imanın şirinliyi əldə olunar. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: ***"Kimdə bu üç xüsusiyyət olasa, onlarla imanın şirinliyini dada bilər: Allah və rəsulu ona hər kəsdən sevimli olarsa, bir insanı yalnız Allah üçün sevərsə və Allah onu küfrdən xilas etdikdən sonra atəşə düşmək istəmədiyi kimi bir daha küfrə qayıtmamağı arzu edərsə."*** Buxari və Muslim.

Əgər sevgi ağacı qəlbdə əkilər, ixlas suyu və Peyğəmbərə (*Sallallahu aleyhi və səlləm*) itaət ilə suvarılarsa, Rəbbinin izni ilə cürbəcür meyvələr yetişdirər və hər fəsildə bəhrə verər. Sevgi dörd növdür: **1. Allahı sevmək.** Bu imanın əsasıdır. **2. Allah xətrinə sevmək və Allah xətrinə nifrət etmək**[1]. Bu vacibdir. **3. Allah ilə bərabər başqasını semək**. Vacib məhəbbətdə Allahdan başqasını ortaq tutmaq buna aiddir. Misal olaraq müşriklərin öz ilahlarını necə sevdiklərini göstərmək olar. Bu isə şirkin əsasıdır. **4.Təbii sevgi.** Valideyn, övlad, yemək və sairə bu növə aiddir. Bu icazəlidir. Allahı sevdiyinə görə dünyaya qarşı zahid ol! Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: ***"Dünyaya qarşı zahid olsan, Allah səni sevər."*** İbn Macə.

---

[1] Sevgi və nifrət *(əl-vəla vəl bəra)* baxımından insanlar üç qismə bölünürlər: **A. Heç bir nifrət olmadan sırf sevgiyə layiq görülənlər.** Bu növ sevgiyə peyğəmbərlər, siddiqlər kimi xalis möminlər daxildir. Bu sevginin başında duranlar isə Peyğəmbərimiz Muhəmməd (*Sallallahu aleyhi və səlləm*), onun zövcələri, qızları və əshabələridir. **B. Birmənalı olaraq nifrət edilənlər.** Bura kafirlər, müşriklər və münafiqlər daxildir. **C. Bir cəhətdən sevilən, digər cəhətdən nifrət olunanlar.** Asilik edən möminlər bu növə aiddir. Onlarda olan imanı sevir, asiliklərə isə nifrət edir. Kafirləri sevmək və dost tutmaq iki növdür: **1)** İnsanı islamdan çıxaran və mürtəd edən sevgi. Onların dinini sevmək bu növə aiddir. **2)** Haram olub insanı dindən çıxartmayan sevgi. Onları dünya işlərinə görə sevmək. **Müharibə etməyən kafirlərlə xoş davranmaq məsələsi ilə onlara nifrət etmək mövzusunda bəzən səhvə yol verilir.** Amma bu iki məsələni bir-birindən fərqləndirmək lazımdır. Onları daxilən sevmədən, onlarla ədalətli və xoş davranmaq mümkündür. Xoş rəftara misal olaraq onların zəiflərinə qarşı mülayim davranmaq, mərhəmət və gözəl davranış göstərmək üçün xoş sözlər demək icazəlidir. Uca Allah buyurur: ❮***Allah din yolunda sizinlə vuruşmayan və sizi yurdunuzdan çıxartmayan kimsələrə yaxşılıq etməyi və onlarla ədalətlə rəftar etməyi sizə qadağan etməz. Allah ədalətli olanları sevər!***❯ *(əl-Mumtəhinə)*. Onlara nifrət etmək və düşmənçilik göstərmək isə tamam fərqlidir. Uca Allah əmr edərək buyurur: ❮**Ey iman gətirənlər! Nə mənim düşmənimi, nə də özünüzün düşmənini dost *(vəli)* tutmayın! Onlar *(kafirlər)* sizə gələn haqqı inkar etdikləri halda, siz onlarla dostluq edirsiniz.**❯ (əl-Mumtəhinə). Onların dinini sevməməklə yanaşı, onlarla ədalətli davranmaq mümkündür. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) Mədinə şəhərinin yəhudiləri ilə belə davranırdı.

**Təvəkkül:** Bu, istədiyini əldə etmək üçün qəlbini Allaha tapşırmaq və Ona arxayın olmaqdır. Həmçinin Allaha olan etimada əsaslanıb və icazəli səbəblər götürüb pis işlərdən uzaqlaşmaqdır. Qəlbi Allaha tapşırmamaq tovhid etiqadında boşluqdur. Səbəbləri tərk etmək isə acizlik və ağılsızlıqdır. Təvəkkül əməldən öncə edilməlidir. O yəqinliyin səmərəsidir. **Onun üç növü vardır: 1. Vacib:** Allahdan başqasının qadir olmadığı işlərdə Ona təvəkkül etmək. Xəstələrin şəfa tapmasını misal çəkmək olar. **2. Haram:** Bunun iki növü var: **A. Böyük şirk:** Bu bütünlüklə səbəblərə bağlanmaq, onların müstəqil şəkildə xeyir gətirdiyini və ya zərərin qarşısını aldığını etiqad etməkdir[1]. **B. Kiçik şirk:** Ruzi qazanmaq üçün müəyyən insana, onun müstəqil şəkildə təsir göstərmədiyini düşünərək arxalanmaq. Onu sadəcə səbəb kimi deyil, bir qədər artıq qəbul etmək. **C. İcazəli:** Bir insanın başqasına bir iş tapşırıb ona arxayın olmasıdır. Bu onun bacardığı işlərdə olmalıdır. Almaq, satmaq və s. Amma *"mən birinci Allaha sonra isə sənə təvəkkül edirəm"* – demək olmaz. Bu işi sənə tapşırdım, vəkalət verdim demək olar.

**Şükr:** Bəndənin qəlbində iman, dilində həmd-səna, əzalarında isə ibadət ilə təzahür edən İlahi nemətlər şükrdür. Şükr bəndənin özünə lazımdır, səbr isə digər işlərə vəsilədir. Şükr qəlb, dil və əzalarla olur. Şükr, Allahın sənə verdiyi nemətləri Onun razı qaldığı işlərə sərf etməyindir.

**Səbir:** Başına gələn müsibətlərə görə Allahdan başqasına deyil, məhz Allaha şikayətlənməkdir. Uca Allah buyurur: ❮*Yalnız səbr edənlərə saysız-hesabsız mükafat veriləcəkdir!*❯ (əz-Zumər: 10). Peyğəmbər (*Səllallahu aleyhi və səlləm*) demişdir: ***"Kim çətinliklərə dözərsə, Allah da ona səbir verər. Heç kəsə səbirdən xeyirli və geniş bir nemət bəxş edilməmişdir."*** Buxari və Muslim. Ömər ﷺ deyir: *Başıma gələn hər müsibətdə Allahın dörd neməti vardır: Müsibətin dinimdə olmaması, onun artmaması, onunla Allahın razılığından məhrum qalmamağım və onun əvəzində savab diləməyim.*

**Səbir etməyin dərəcələri vardır: Aşağı dərəcə:** Başına gələn müsibətdən narazı

---

[1] **Səbəblərdən istifadə etmək təvəkkülə ziddirmi? Bu məsələyə bir neçə üsul ilə yanaşmaq olar: 1. İtirilmiş mənfəəti əldə etmək;** Bunun üç növü vardır: **A. Real səbəb.** Məsələn uşağı olsun deyə evlənmək. Bu səbəbi tərk etmək dəlilikdir, təvəkkülə heç bir aidiyyatı yoxdur. **B.** Adətən onlarsız məqsədə çatmaq mümkün olmayan **qeyri real** səbəblər. Məsələn azuqəsiz halda səhraya yola düşmək. Belə etmək təvəkküldən sayılmır və bu halda azuqə götürmək əmr olunur. Peyğəmbər (*Səllallahu aleyhi və səlləm*) səfərə çıxanda azuqəsini götürüb bir nəfər iztanıyanı da özü ilə aparmışdı. **C. Heç bir zahiri inam olmadan işin axarına buraxılan səbəblər.** Qazanc əldə etmək üçün çox dəqiq səbəblər axtarmağı misal çəkmək olar. Bu təvəkküldən kənara çıxmır. Əksinə qazanc əldə etməyi tərk etmək təvəkküldən sayılmır. Ömər ﷺ deyir: ***"Əsl təvəkkül edən kimsə, dəni torpağa səpib Allaha təvəkkül edən kimsədir".*** **2. Mövcud olanı qorumaq;** Halal ruzisini saxlayıb çətin gün üçün tədarük görmək təvəkküldən kənara çıxmır. Əlelxüsus ailə üzvləri çoxdursa belə etmək olar. ***"Peyğəmbər (Səllallahu aleyhi və səlləm) Bənu Nəzir qəbiləsinin xurmalarını satarkən ailəsinin bir illik qidasını tədarük görərdi."*** Buxari və Muslim. **3. Mövcud olmayan zərərin qarşısını almaq;** Zərərin qarşısını alan səbəblərdən imtina etmək təvəkkülün doğru olması üçün şərt deyil. Zirehli paltar geyinməyi və dəvəni bağlamağı misal çəkmək olar. Bütün bu kimi işlərdə səbəblərə deyil, Allaha təvəkkül etməli, Allahın onun üçün seçdiyi sonluqdan razı qalmalıdır. **4. Mövcud zərəri aradan qaldırmaq;** Bu üç növdür: **A. Mütləq səbəblər:** Məsələn susuzluğu aparan suyun istifadəsi. Su içməkdən imtina etmək təvəkküldən deyil. **B. Ehtimal olunan səbəblər:** Qan aldırmağı misal çəkmək olar. Qan aldırmaq təvəkkülə zidd deyil. Peyğəmbər (*Səllallahu aleyhi və səlləm*) müalicə olunmuş və müalicə almağı əmr etmişdir. **C. Əsassız səbəblər:** Sağlam olduğu halda xəstələnməsin deyə çıldaq etməyi misal çəkmək olar. Bu, təvəkkülün kamilliyinə ziddir.

olub şikayətlənməmək. **Orta dərəcə:** Müsibətdən razı qalıb şikayətlənməmək. **Yüksək dərəcə:** Müsibətə görə Allaha həmd-səna etmək. Kim özünə zülm edənə qarşı dua edərsə öz haqqını almış sayılır, amma səbir etmiş sayılmır.

**Səbir iki növdür:** 1. Bədənin səbri. Biz bu haqda danışmırıq. 2. İnsan təbiətinin istədiyi və nəfsinin meyl etdiyi işlərdə səbir etmək[1].

**Bəndənin dünyada qarşılaşdığı işlər iki növdən kənara çıxmır:**

**A. Nəfsi istəklərə uyğun gələn işlər.** Belə işlərdə bəndə Allahın haqqını ödəmək: şükr etmək və bunu Allaha asilik olan işlərə sərf etməmək – üçün səbir etməlidir.

**B. Nəfsi istəklərə zidd olan işlər. Bunun üç növü vardır: 1. Allaha itaət etməkdə səbir etmək:** Bu səbrin vacib forması fərz əməlləri, müstəhəb *(qeyri vacib)* forması isə nafilə ibadətləri etməkdir. **2. Allaha asi olmamaqda səbir etmək:** Bu növ səbrin vacib forması haramdan imtina etmək, qeyri vacib forması isə məkruh *(bəyənilməyən)* işləri tərk etməkdir. **3. Allahın qədərinə səbr etmək:** Bu növ səbirin vacib forması dili şikayətlənməkdən, qəlbi Allahın qədərindən narazı olmaqdan, əzaları isə Allahın razı qalmadığı işləri etməkdən qorumaqdır. Əzalar ilə edilən pis işə, meyit üçün vay-şivən qopartmaq, üst-başını cırmaq və baş-gözünü yolmaq kimi əməlləri misal çəkmək olar. Bu növ səbirin müstəhəb forması qəlbin Allahın qədərindən razı qalmasıdır.

**Allaha şükr edən varlı üstündür, yoxsa səbirli kasıb?** Əgər varlı insan malını Allaha itaət üçün sərf edir, yaxud bu məqsədlə mal-dövlət toplayırsa, o kasıbdan üstündür. Yox əgər malını adi icazəli işlərə sərf edərsə, kasıb ondan üstündür. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: *"Başqalarını yedizdirib şükr edən bəndə, oruc tutan və səbir edən bəndənin dərəcəsindədir."* Əhməd.

**Razılıq:** Bu, bir şey ilə qane olub kifayətlənməkdir və əməldən sonra baş verir. Allahın qədərini razılıqla qarşılamaq ən yüksək məqamlardandır. Bu, sevgi və təvəkkülün səmərəsidir. Xoşlamadığın bir işin özündən uzaqlaşdırılması üçün dua etmək, qədər ilə razılaşmamaq anlamına gəlmir.

**Xuşu:** Bu, təzim və özünü aşağı tutmaqdır. Huzeyfə ﷺ: *"İkiüzlülük xuşusu etməkdən çəkinin!"* – deyib ətrafındakılara müraciət etdi. Onlar: *"İkiüzlülük xuşusu nədir?"* – deyə soruşdular. Huzeyfə ﷺ: *"Bədənin xuşulu olub qəlbin xuşusuz olmasıdır. Dininizdə itirəcəyiniz ilk şey elə xuşu olacaqdır."* – deyə cavab verdi.

Xuşu ilə edilməsi şərt qoyulan hər bir ibadətin savabı xuşunun dərəcəsindən asılıdır. Məsələn namaz kimi. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) namaz qılan insan haqqında demişdir: Elə namaz qılan vardır ki, namazının yarısını, dörtdə birini, beşdə birini ... onda birini əldə edir. Hətta namazından heç bir pay götürməyə bilər. Səbəb isə ümumiyyətlə xuşunun olmamasıdır.

**Ümid:** Bu, Allahın geniş mərhəmətinə bel bağlamaqdır. Bunun əksi ümidsizlikdir. Ümid ilə edilən əməl, qorxudan edilən əməldən üstündür. Çünki ümid ilə edilən

---

[1] Bu növ səbir yeməyə və ya şəhvətli işlərə aid edilərsə, iffət adlanar. Döyüşə aid edilərsə, şücaət adlanar. Əgər qəzəbi boğmağa aid edilərsə, mülayimlik adlanar. Əgər bir işi gizli saxlamağa aid edilərsə, sirr saxlamaq adlanar. Əgər dəbdəbəli yaşayışdan imtina etməyə aid edilərsə, zahidlik adlanar. Əgər dünya nemətlərindən az miqdarda istifadə etməyə aid edilərsə, məmnunluq adlanar.

əməl Allah haqqında yaxşı zəndə olmağa səbəb olur. Uca Allah qüdsi hədisdə buyurur: *"Bəndəm Mənim haqqımda necə düşünürsə, Mən də onun üçün elə olaram."* Muslim. **Bunun iki dərəcəsi vardır; Yüksək:** Yaxşı iş görüb Allahdan savab diləmək. Aişə Peyğəmbərdən (*Sallallahu aleyhi və səlləm*) ❮ ***Rəbbinə qayıdacaqlar deyə yerinə yetirməli olduqlarını qəlbi qorxa-qorxa yerinə yetirənlər*** ❯ (60 əl-Muminun) – ayəsi haqqında soruşub dedi: Ey Allahın elçisi, Allahdan qorxa-qorxa oğurluq edən, zina edən və içki içən də buna aiddir? Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) dedi: *"Xeyr, ey siddiqin qızı! Bu, namaz qılıb, oruc tutub, sədəqə verib əməllərinin qəbul olunmayacağından qorxanlara aiddir.* ❮*Məhz onlar yaxşı işlər görməyə tələsərlər...*❯*"* Tirmizi.

**Aşağı dərəcəsi:** Günah etdikdən sonra tövbə edib Allahın mərhəmətinə ümid edən. Asilik etməkdə israr edib tövbə etməyən, eyni zamanda Allahın mərhəmətinə bel bağlayan insan təmənna edir, ümid etmir. Təmənna etmək pis, ümid etmək isə yaxşı işdir. Mömində həm yaxşılıq, həm də qorxu olar. Münafiqdə isə pislik və arxayınlıq olar.

**Qorxu:** Bu pis işlərin olacağına dair insanın ürəyinə gələn müəmmalı fikirdir. Əgər pis işin olacağına dair yəqin fikir olarsa bu xuşu sayılır. Qorxunun əksi arxayınlıqdır. Qorxu ümidə zidd deyil. O çəkindirmək, ümid isə təşviq yoludur. İnsanda həm sevgi, həm qorxu, həm də ümid olmalıdır. İbn əl-Qəyyim deyir: *Qəlb Allaha doğru getməkdə bur quşa bənzəyir; sevgi onun başı, qorxu və ümid qanadlarıdır. Əgər qorxu qəlbdə məskunlaşarsa, qəlbdəki şəhvətləri yandırar, oradan dünyanı qovar.* **Vacib qorxu:** İnsanı vacib işlərə aparıb, haram işlərdən çəkindirəndir. **Müstəhəb qorxu:** İnsanı müstəhəb işlərə aparıb, bəyənilməyən işlərdən uzaqlaşdırandır. Qorxunun növlər var: **1. Sirr və ilahlıq qorxusu:** Bu növ qurxu yalnız Allaha olmalıdır. Belə qorxunu Allahdan başqasına aid etmək böyük şirkdir. Məsələn, müşriklərin ilahlarının xeyir və ya zərər verəcəyindən qorxmaq. **2. Haram qorxu:** Məsələn, insanlardan qorxub vacibi tərk etmək, yaxud haram iş görmək. **3. İcazəli qorxu:** Canavardan və sairə bu kimi şeylərdən təbii halda qorxmaq.

**Zahidlik:** Bu, insan meylinin bir şeydən çəkilib daha xeyirli işə yönəlməsidir. Dünyada zahid olmaq insanın bədənini və qəlbini rahat edir. Dünyaya can atmaq isə insanın qəmini və kədərini çoxaldır. Hər səhvin başında dünyanı sevmək dayanır. Dünyanı sevməmək isə insanı ibadətə yönəldir. Dünyada zahid olmaq onu qəlbindən çıxartmaqdır. Qəlbin dünyaya bağlı ola-ola onu əlindən çıxartmaq əsl zahidlik sayılmır. Bu cahillərin zahidliyidir. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: *"Əməlisaleh insanın əldə etdiyi halal mal-dövlət necə də gözəldir."* Əhməd.

**Kasıb insanın mal-dövlətə beş cür münasibəti ola bilər: 1.** Mal-dövlətə nifrət etdiyinə görə və onun şərrindən uzaq olmaq üçün onu götürməkdən imtina edən. *Bu insan zahid adlanır.* **2.** Mal-dövlətin hasil olmasına görə nə sevinir, nə də ondan nifrət edir. *Bu halda o razı sayılır.* **3.** Mal-dövlətin olmasını, olmamağından üstün hesab edir. Çünki ona ehtiyac duyur. Amma bu istəklə yanaşı ona hərsilik etmir. Əgər qismətində olarsa onu götürər və sevinər. Amma onu qazanmaq üçün əziyyət çəkmək lazım olarsa, bunu etməz. *Bu hal sahibi məmnun hesab olunur.* **4.**Əslində istəyir, amma aciz olduğu üçün mal-dövlətdən imtina edir. Əgər onu əldə etmək üçün çətin səbəblərin olduğunu bilərsə, bu çətinliyə qatılar. *Belə insan mal-dövlətə həris adlanır.* **5.** Qarşısındakı mal-dövlətə möhtac olan. Məsələn ac, əynində paltarı olmayan insan kimi. *Bu növ insan məcbur hesab olunur.*

# İbrətli dialoq

**Abdullah** *(Allahın qulu)* adlı bir kişi **Əbdünnəbi** *(Peyğəmbərin qulu)* adlı bir nəfərlə qarşılaşdı. Abdullah öz-özlüyündə bu addan təəccübləndi və fikirləşdi: *"Bir insan Allahdan başqasının qulu necə ola bilər?"* Sonra üzünü Əbdünnəbiyə tutub təəccüblə dedi: *"Sən, Allahdan başqasınamı ibadət edirsən?!"*

**Əbdünnəbi:** Xeyr, mən Allahdan başqasına ibadət etmirəm. Mən müsəlmanam və tək Allaha ibadət edirəm.

**Abdullah:** Bəs bu ad nədir? Axı bu ad xaçpərəstlərin Abdulməsih *(İsa Məsihin qulu)* adına bənzəyir. Onlar İsaya ibadət etdikləri üçün bu, heç də qəribə sayılmır. Sənin bu adını eşidən insan həmin anda sənin də Peyğəmbərə *(Sallallahu aleyhi və səlləm)* ibadət etdiyini düşünür. Amma bu heç də müsəlmanın Peyğəmbər *(Sallallahu aleyhi və səlləm)* barəsindəki etiqadı deyildir. Müsəlmanın doğru etiqadı Peyğəmbəri *(Sallallahu aleyhi və səlləm)* Allahın qulu və elçisi olaraq qəbul etməsidir.

**Əbdünnəbi:** Muhəmməd Peyğəmbər *(Sallallahu aleyhi və səlləm)* bəşəriyyətin ən xeyirlisi, elçilərin ağasıdır. Biz də özümüzü bu ad ilə adlandırıb, Peyğəmbərin *(Sallallahu aleyhi və səlləm)* hörməti və məqamı ilə Allahdan bərəkət umur, Ona yaxınlaşırıq. Bu işdə onu özümüzə himayəçi tuturuq. Amma sən, heç də təəccüblənmə, qardaşımın adı da Əbdülhüseyndir *(Hüseynin quludur)*. Atamın da adı Əbdürrəsul idi. Bu adlarla adlandırma insanların köhnə adətidir və çox geniş yayılıb. Biz, ata-babamızın belə etdiklərini görmüşük. Məsələyə radikal yanaşmağa dəymir. Çünki, məsələ yüngül, din isə asanlıqdır.

**Abdullah:** Allahdan başqa heç kəsin qadir olmadığı bir şeyi qeyrisindən istəmək, belə ad qoymaqdan daha böyük qəbahətdir. Allahdan başqa kömək istədiyin kimsə istər Peyğəmbərin *(Sallallahu aleyhi və səlləm)* özü, istərsə Hüseyn ﷺ kimi digər əməlisaleh bəndə olsun, fərq etməz. Bütün bunlar bizə əmr olunan tövhid inancına və *"Lə iləhə illəllah"* kəlməsinin mənasına ziddir.

Məsələnin nə qədər təhlükəli olmasını, özünü bu və oxşar adlarla adlandırmağın acı aqibətini çatdırmaq üçün sənə bir neçə sual verəcəyəm. Mənim məqsədim yalnız haqqı tanıyıb itaət etmək, batili aşkar edib, ondan uzaq durmaq, yaxşı işləri əmr edib, pis işlərdən çəkindirməkdir. Kömək yalnız Allahdandır. Biz yalnız Ona bel bağlayırıq *(təvəkkül edirik)*. Güc və əzmkarlıq yalnız uca və əzəmətli Allahdandır. Lakin ilk öncə uca Allahın bu ayəsini sənə xatırladıram: **"Aralarında hökm vermək üçün Allahın *(Allahın kitabının)* və Peyğəmbərinin yanına çağırıldıqları zaman möminlərin sözü ancaq: "Eşitdik və itaət etdik!" – deməkdən ibarətdir."** (Nur: 51). Xatırlatmaq istədiyim digər ayədə isə belə buyurulur: **"Əgər bir iş barəsində mübahisə etsəniz, Allaha və qiyamət gününə inanırsınızsa, onu Allaha və Peyğəmbərə həvalə edin!..."** Nisa: 59.

**Abdullah:** Sən tövhid etiqadlı olduğunu *(vahid Allaha ibadət etdiyini)* və "*Lə iləhə illəllah*" kəlməsinə şəhadət verdiyini deyirsən. Bu kəlmənin mənasını açıqlaya bilərsənmi?

**Əbdünnəbi:** Vahid Allaha ibadət (tövhid) Allahın varlığına, göyləri və yeri yaratdığına, dirildib öldürənin O olduğuna, kainatı idarə etdiyinə, ruzi verən, bilən və qadir olan olduğuna iman gətirməkdir.

**Abdullah:** Əgər tövhid etiqadı təkcə bundan ibarət olsaydı, o zaman Firon və tayfası, Əbu Cəhl və onun kimiləri tövhid etiqadlı olardılar. Çünki onlar da, əksər

müşriklər kimi bu məsələdə qafil deyildilər. Rəbb olduğunu iddia edən Firon öz-özlüyündə Allahın varlığına və kainatı idarə etdiyinə tam yəqinliklə inanırdı. Buna dəlil uca Allahın bu ayəsidir: **"*(Möcüzələrimizin)* həqiqiliyinə daxilən möhkəm əmin olduqları halda, haqsız yerə və təkəbbür üzündən onları inkar etdilər."** Fironun bu etirafı suda boğulduğu anda daha aşkar görsəndi.
Lakin səbəbi ilə peyğəmbərlər göndərilən, kitablar nazil olan, ondan ötrü Qureyş qəbiləsi ilə döyüş edilən həqiqi tövhid etiqadı, ibadətdə Allahı tək tutmaqdır. İbadət, Allahın sevib razı qaldığı, hər bir zahiri və batini söz və əməlləri özündə ehtiva edən isimdir. "***Lə iləhə illəllah***" kəlməsindəki "ilah" sözünün mənası, Özündən başqa ibadətə layiq olmayan məbud deməkdir.
**Abdullah:** Heç bilirsən, başda Nuh ﷺ olmaqla peyğəmbərlər yer üzünə nə üçün göndəriliblər?
**Əbdünnəbi:** Müşrikləri tək Allahın ibadətinə dəvət edib, Ona ortaq edilən bütün ilahları tərk etmək üçün göndəriliblər.
**Abdullah:** Nuhun tayfasının şirk etmələrinə səbəb nə idi?
**Əbdünnəbi:** Bilmirəm...
**Abdullah:** Nuhun qövmü Vədd, Suva, Yəğus, Yəuq və Nəsr adlı əməlisaleh insanlar barəsində ifrata vardıqda Allah Nuhu peyğəmbər olaraq göndərdi.
**Əbdünnəbi:** Demək istəyirsən ki, Vədd, Suva və digərləri həddini aşmış kafirlərin deyil, əməlisaleh insanların adlarıdır?
**Abdullah:** Bəli, bunlar əməlisaleh insanların adlarıdır. Nuhun tayfası onları ilahlaşdırmış, ərəblər də onları təqlid etmişdir. Bu barədə sübut İbn Abbasın ﷺ sözüdür: **"Nuh qövmində olan bütlər sonradan ərəblərə keçdi. Vədd adlı büt Dovmət əl-Cəndəldə yaşayan əl-Kəlb qəbiləsinin, Suva Huzeyl qəbiləsinin, Yəğus birinci dəfə Murad qəbiləsinin sonra isə Səbanın yaxınlığında əl-Covfdə yaşayan Bənu Ğuteyf qəbiləsinin, Yəuq Həmdan qəbiləsinin, Nəsr isə Himyər qəbiləsinin Zül-Kila ailəsinin bütü idi. Adı çəkilən bütlər Nuh tayfasından olan əməlisaleh insanların adlarıdır. Onlar vəfat etdikdə şeytan qəbilə adamlarına onların oturduqları yerlərdə xatirə heykəlləri qurmağı və onları eyni adlar ilə adlandırmağı təlqin etdi. İnsanlar da bu deyiləni etdilər. Amma həmin anda bütlərə ibadət olunmadı. Heykəlləri qoyan nəsil öldükdə və elmsizlik baş qaldırdıqda həmin bütlərə ibadət olundu" (Buxari).**
**Əbdünnəbi:** Sənin danışdıqların çox qəribədir.
**Abdullah:** Sənə bundan da təəcüblü olanını deyimmi? Bil ki, uca Allah peyğəmbərlərin sonuncusu Muhəmmədi (*Sallallahu aleyhi və səlləm*) bağışlanma diləyən, ibadət edən, *(kəbə ətrafında)* təvaf, *(səfa-mərva dağları arasında)* səy, həcc edib sədəqə verən bir qövmə peyğəmbər olaraq göndərmişdi. Amma onlar mələkləri, İsa peyğəmbəri və digər əməlisaleh məxluqları özləri ilə Allah arasında vasitəçi tutur və deyirdilər: *"biz, onlarla Allaha yaxınlaşmaq istəyirik, Allah yanında bizim üçün hamilik (şəfaət) etmələrini istəyirik"*. Allah da Muhəmməd Peyğəmbəri (*Sallallahu aleyhi və səlləm*) göndərdi ki, onlar üçün ataları İbrahimin dinini yeniləsin. Onlara çatdırsın ki, bu yaxınlıq və etiqad yalnız Allaha məxsusdur. Bu haqqı Ondan başqasına sərf etmək olmaz. O, şəriki olmayan vahid yaradandır. Ondan başqa ruzi verən yoxdur. Yeddi qat göy və orada olanlar,

yeddi qat yer və orada olanlar hamısı Allahın hökmü altında olan qullarıdır. Hətta ibadət etdikləri ilahların da Allahın hökmü altında olduğunu bilməlidirlər.

**Əbdünnəbi:** Bu, çox təhlükəli və qəribə söhbətdir. Bunu sübut edən əsas varmı?

**Abdullah:** Əsaslar çoxdur. Məsələn, uca Allah buyurur: **"De: "Sizə göydən və yerdən kim ruzi verir? Qulaqlara və gözlərə sahib olan kimdir? Ölüdən diri, diridən ölü çıxardan kimdir? Hər işi düzüb qoşan kimdir? Onlar: "Allahdır!" – deyəcəklər. De: "Bəs onda Allahdan qorxmursunuz?"** (Yunus: 31). "*(Ya Rəsulum! Bu müşriklərə)* **de: "Əgər bilirsinizsə,** *(bir deyin görək)* **bu yer və yer üzündə olanlar** *(bütün məxluqat)* **kimindir?" Onlar mütləq: "Allahındlr!" – deyə cavab verəcəklər. Sən də de: "Bəs elə isə** *(məxluqatı yaratmağa qadir olan kəsin öləndən sonra onları yenidən dirildə biləcəyini)* **düşünmürsünüz?" De: "Yeddi** *(qat)* **göyün Rəbbi, o** *(böyük)* **əzəmətli ərşin Rəbbi kimdir?"** *(Müşriklər)* **mütləq: "***(Bunlar)* **Allahındır!" – deyə cavab verəcəklər. Onda sən də de: "Bəs elə isə** *(Allahın əzabından)* **qorxmursunuz?" De: "Əgər bilirsinizsə,** *(bir deyin görək)* **hər şeyin hökmü əlində olan,** *(istədiyini)* **himayə edən, amma Özünün himayəyə ehtiyacı olmayan kimdir?" Onlar mütləq: "***(Bu qüdrət, bu vəsflər yalnız)* **Allahındır!" – deyə cavab verəcəklər. Sən də de: "Bəs elə isə** *(Şeytana aldanıb haqqa boyun qoymaqdan, Allahın ayələrinə inanmaqdan və yalnız Ona ibadət etməkdən)* **nə cür** *(aldanılıb)* **döndərilirsiniz?"** (əl-Muminun: 84-89). Müşriklər həcc zamanı dua edər və deyərdilər: *"Ey Allah, mən Sənin hüzurundayam. Sənin hüzurundayam, Sənin heç bir şərikin yoxdur. Yalnız Özünün seçdiyin şərikin var. Onun və onun mülkündə olan hər şeyin sahibi də Sənsən"*. Qureyşli müşriklərin Allahın kainatı idarə etdiyini, necə deyərlər rübubiyyə tövhidini etiraf etmələri onları müsəlman etmədi. Onlar mələklərə, peyğəmbərlərə və ya övliyalara dua edib, onlardan Allah yanında hamilik *(şəfaət)* və yaxınlıq istədikləri üçün qanları və malları halal olmuşdu. Ona görə duanı, nəzirini, qurbanını, imdadını və bütün növ ibadətlərini Allaha etməlisən.

**Əbdünnəbi:** Əgər tövhid təkcə Allahın varlığına və kainatı idarə etdiyinə inanmaq deyilsə bəs nədir?

**Abdullah:** Səbəbi ilə peyğəmbərlər göndərilən və müşriklərin inkar etdikləri tövhid, ibadətdə Allahı tək tutmaqdır. Tövhid inancına görə heç bir ibadəti: duanı, nəziri, qurbanı, kömək diləməyi və digər ibadətləri Allahdan başqasına etmək olmaz. Bu tövhid sənin dediyin "*Lə iləhə illəllah*" kəlməsinin mənasıdır. Qureyş müşriklərinə görə ilah, yuxarıda deyilən ibadətlərin yönəldiyi kimsədir. Bu mələk, peyğəmbər, övliya, ağac, qəbir, cin və s. ola bilər. Onların düşüncəsinə görə ilah kəlməsi yaradan, ruzi verən, kainatı idarə edən mənasını vermirdi. Onlar bilirdilər ki, bunlar yalnız Allaha məxsusdur. Peyğəmbər *(Sallallahu aleyhi və səlləm)* də onları tövhid kəlməsinə, "*Lə iləhə illəllah*"a dəvət edirdi. O, bu kəlməni yalnız dildə deməyə deyil, əməldə də göstərməyə çağırırdı.

**Əbdünnəbi:** Sanki demək istəyirsən ki, Qureyşli müşriklər "lə iləhə illəlah"ın mənasını bu günki müsəlmanlardan daha yaxşı bilirdilər.

**Abdullah:** Bəli. Bu acı reallıqdır. Cahil kafirlər bilirlər ki, Peyğəmbərin *(Sallallahu aleyhi və səlləm)* bu kəlməni deməkdə məqsədi Allahı ibadətdə tək tutmaq, Allahdan başqa ibadət olunanlara küfr edib onlardan uzaq durmaqdır. Peyğəmbər *(Sallallahu aleyhi və səlləm)* onlara:

*"Lə iləhə illəllah"* kəlməsini deyin – dedikdə, belə cavab verdilər: **﴾Əcaba, o,** ***(Allahdan başqa heç bir haqq tanrı yoxdur deməklə)*** **tanrıların hamısını bir tanrımı edir? Bu, doğrudan da, çox təəccüblü bir şeydir.﴿** (Sad: 5). Bununla yanaşı, onlar Allahın kainatı idarə etdiyini də etiraf edirdilər. Əgər cahil kafirlər bunu bilirlərsə, müsəlman olduğunu iddia edib, bu kəlmənin mənasını kafirlərin bildikləri qədər bilmirsə, bu doğrudan da təəccüblü haldır. Elələri vardır ki, onlara görə bu kəlmənin heç bir mənasını qəlbən etiraf etmədən yalnız dil ilə tələffüz etmək də yetərli sayılır. Bir qədər ağıllılar isə elə düşünürlər ki, bu kəlmənin mənası Allahdan başqa yaradan, ruzi verən və kainatı idarə edən yoxdur anlamına gəlir. Qureyşin cahil kafirləri "Lə iləhə illəllah" kəlməsinin mənasını özlərini müsəlman adlandıranlardan daha yaxşı bildikcə belə insanlardan xeyir gəlməz.

**Əbdünnəbi:** Amma mən, Allaha şərik qoşmuram. Mən, şəhadət verirəm ki, Allahdan başqa yaradan, ruzi verən yoxdur, xeyir də ziyan da Onun əlindədir, O, təkdir və heç bir şəriki yoxdur. Həmçinin şəhadət verirəm ki, Muhəmməd *(Sallallahu aleyhi və səlləm)* özünə heç bir fayda və ya zərər verə bilməz. O ki qaldı Əli, Hüseyn, Əbdülqadir və başqaları. Mən günahkar bəndəyəm, əməlisaleh insanların isə, Allah yanında hörmətləri var. Mən də onlardan istəyirəm ki, Allah yanında olan hörmətləri ilə mənim üçün havadar olsunlar.

**Abdullah:** Mən, ötən sözlərlə sənə cavab verirəm. Peyğəmbərin *(Sallallahu aleyhi və səlləm)* döyüşdüyü insanlar da sənin dediyin kimi deyir və öz bütlərinin heç bir şeyə qadir olmadıqlarını etiraf edirdilərmi? Onlar bu bütlərin hörmətinə üz tutur və onların havadarlığını istəyirdilər. Elə deyilmi? Biz, bu haqda Qurandan sübutlar da gətirmişdik.

**Əbdünnəbi:** Lakin bu ayələr bütlərə ibadət edənlər barəsində nazil olub. Peyğəmbərləri və əməlisaleh insanları bütlərlə necə bərabər tuta bilərsiniz?

**Abdullah:** Biz, axı razılaşmışdıq ki, bu bütlərin bəziləri – Nuhun ﷺ vaxtındakı kimi əmlisaleh insanların adları ilə adlandırılmışdı. Kafirlər də bu bütlərdən öz hörmətləri xatirinə Allah yanında onlar üçün havadar olmalarını istəyirdilər. Uca Allah buyurur: **﴾Allahı qoyub** *(bütləri)* **özlərinə dost tutanlar: "Biz onlara yalnız bizi Allaha yaxınlaşdırmaq üçün ibadət edirik!"** *(deyirlər)*...**﴿** (əz-Zümər: 3). Sənin, "Peyğəmbərləri və əməlisaleh insanları bütlərlə necə bərabər tuta bilərsiniz?" – sözünə gəlincə, deyə bilərəm ki, Peyğəmbərin *(Sallallahu aleyhi və səlləm)* göndərildiyi kafirlərdən bəziləri övliyalara dua edirdi. Uca Allah onlar haqqında belə buyurur: **﴾Onların tapındıqları tanrıların özlərindən hər hansı biri** *(Allah dərgahına)* **daha yaxın olsun deyə, Rəbbinə vəsilə axtarır, Onun rəhmətini umur, əzabından qorxur. Həqiqətən, Rəbbinin əzabı qorxuludur!﴿** (əl-İsra: 57). Elə kafirlər də var idi ki, onlar İsaya ﷺ və anasına dua edirdilər. Bu haqda isə uca Allah belə deyir: **﴾Allah belə buyuracaq: "Ya Məryəm oğlu İsa! Sənmi insanlara: "Allahla yanaşı, məni və anamı da özünüzə tanrı bilin!" – demişdin?﴿** (əl-Maidə: 116). Elələri də vardır ki, onlar Mələklərə ibadət edirdilər. Uca Allah deyir: **﴾O gün** *(qiyamət günü Allah)* **onları** *(müşrikləri, kafirləri)* **bir yerə yığacaq, sonra da mələklərə belə deyəcək: "Bunlar sizəmi ibadət edirdilər?"﴿** (Səba: 40). Bu ayələrə fikir verdikdə görürsən ki, uca Allah bütlərə, peyğəmbərlərə, mələklərə və övliyalara dua edənləri aralarında heç bir fərq qoymadan kafir hesab edir. Peyğəmbər *(Sallallahu aleyhi və səlləm)* də belə müşriklərə qarşı döyüşmüş və onların Allahdan başqa kimə ibadət etdiklərində fərq görməmişdir.

**Əbdünnəbi:** Fərq ondadır ki, kafirlər onlardan xeyir istəyir, mən isə şəhadət verirəm ki, xeyir bəxş edən, zərəri yetirən, kainatı idarə edən də Allahdır. Mən, yalnız Ona dua edirəm. Əməlisaleh insanların isə bu işdə heç bir payları olmadığını etiqad edirəm. Mən sadəcə olaraq üzümü onlara tutub Allah yanında mənim üçün hamilik *(şəfaət)* etmələrinə ümid edirəm.

**Abdullah:** Sənin bu sözün kafirlərin sözü ilə eynidir. Uca Allah buyurur: ﴾**Onlar Allahı qoyub özlərinə nə bir xeyir, nə də bir zərər verə bilən bütlərə ibadət edir və: "Bunlar Allah yanında bizdən ötrü şəfaət edənlərdir!" – deyirlər...**﴿ (Yunus: 18).

**Əbdünnəbi:** Lakin mən yalnız Allaha ibadət edirəm. Əməlisalehlərə üz tutmaq və dua etmək ibadət sayılmır!

**Abdullah:** Sənə bir sual verəcəm: Sən inanırsan ki, Allah ibadəti yalnız ona məxsus etməyi əmr edib və bu Allahın sənin üzərindəki haqqıdır? Necə ki, bu ayədə deyilir: ﴾**Halbuki onlara əmr edilmişdir ki, "Allaha – dini yalnız Ona məxsus edərək, batildən haqqa** *(islama)* **dönərək – ibadət etsinlər"**﴿ (əl-Bəyyinə: 5).

**Əbdünnəbi:** Bəli, Allah bunu mənə vacib etmişdir.

**Abdullah:** Mən istəyirəm ki, Allahın sənə vacib etdiyi bu əmri, yəni ibadəti yalnız Allaha məxsus etmək məsələsini açıqlayasan.

**Əbdünnəbi:** Bu sualınla nəyi nəzərdə tutduğunu anlamadım. Zəhmət olmazsa sualı açıqla.

**Abdullah:** Məni dinlə ki, sənin üçün açıqlama verim. Uca Allah buyurur: ﴾**Rəbbinizə yalvara-yalvara, həm də gizlicə dua edin. Şübhəsiz ki, O, həddi aşanları sevməz!**﴿ (əl-Əraf: 55) Dua, Allah üçün edilən ibadətdir, yoxsa yox?

**Əbdünnəbi:** Bəli. Hədisdə deyildiyi kimi bu ibadətin əsasıdır. Peyğəmbər *(Sallallahu aleyhi və səlləm)* demişdir: **"Dua ibadətdir".** *(Əhməd və Əbu Davud).*

**Abdullah:** Madam ki, duanın ibadət olduğunu etiraf edir, sonra hər hansı iş üçün gecə gündüz, yalvara-yalvara, gizlicə Allaha dua edir, sonra eyni iş üçün peyğəmbərə, yaxud mələyə və ya əməlisaleh bəndəyə dua edirsənsə, bu ibadətində şərik qoşmuş olursanmı?

**Əbdünnəbi:** Bəli, şərik qoşmuş oluram. Bu, doğru və aydın söhbətdir.

**Abdullah:** İndi isə başqa bir misala nəzər salaq. Əgər sən, uca Allahın ﴾**Rəbbin üçün namaz qıl və qurban kəs!**﴿ ayəsini oxuyub Allahın bu əmrinə itaət edərək Onun üçün qurban kəssən sənin bu əməlin Allaha ibadət etmək sayılarmı?

**Əbdünnəbi:** Bəli, ibadət sayılar.

**Abdullah:** Əgər sən, Allahla yanaşı, istənilən məxluq üçün, məsələn peyğəmbər, cin və ya başqası üçün qurban kəssən, sən, bu ibadətində Allahdan başqasına ibadət etmiş olursanmı?

**Əbdünnəbi:** Bəli, heç şübhəsiz ki, bu şirkdir.

**Abdullah:** Mən, sənin üçün dua və qurbanı misal çəkdim. Çünki dua söz ilə, qurban isə fel ilə edilən ən qərarlı ibadətlərdir. Amma ibadət bu iki növü deyil, daha çox növləri əhatə edir. Buraya nəzir etmək, and içmək, sığınmaq, kömək diləmək və s. daxildir. Barələrində Quran ayələri nazil olan müşriklər mələklərə, əməlisaleh bəndələrə, yaxud Lat adlı bütə və başqalarına ibadət edirdilərmi?

**Əbdünnəbi:** Bəli, onlara ibadət edirdilər.

**Abdullah:** Onların ibadətləri də dua etmək, qurban kəsmək, sığınmaq, kömək diləmək və üz tutmaq idi. Onlar da özlərini Allahın qulları hesab edir, Onun hökmü altında olduqlarını düşünür, kainatın Allah tərəfindən idarə olunduğunu bilirdilər. Amma onlar şəfaət əldə etmək üçün bütlərə dua edir, onlara üz tuturdular. Bu, açıq-aşkar görsənən bir məsələdir.

**Əbdünnəbi:** Ey Abdullah, sən Peyğəmbərin (*Səllallahu aleyhi və səlləm*) şəfaətini inkar edir və danırsanmı?

**Abdullah:** Xeyr, mən şəfaəti inkar etmir və danmıram. Peyğəmbərin (*Səllallahu aleyhi və səlləm*) şəfaət edən olduğunu düşünürəm. Mən, onun şəfaətini arzulayıram. Amma bütün şəfaətlər Allaha məxsusdur. Uca Allah buyurur: **﴾De: "Bütün şəfaət yalnız Allaha məxsusdur...﴿** (əz-Zümər: 44). Şəfaət verənlərin şəfaəti Allahın icazəsindən sonra olacaqdır. Uca Allah buyurur: **﴾Allahın izni olmadan** *(qiyamətdə)* **Onun yanında** *(hüzurunda)* **kim şəfaət** *(bu və ya digər şəxsin günahlarının bağışlanmasını xahiş)* **edə bilər?﴿** (əl-Bəqərə: 255). Uca Allahın izni olmadan heç kəs üçün şəfaət oluna bilməz. Uca Allah buyurur: **﴾Onlar yalnız** *(Allahın)* **razı olduğu** *(izin verdiyi)* **kəslərdən ötrü şəfaət edə bilərlər...﴿** (əl-Ənbiya: 28). Allah isə, tövhiddən başqa, heç nədən razı qalmaz. Ayədə deyilir: **﴾Kim islamdan başqa bir din ardınca gedərsə,** *(o din)* **heç vaxt ondan qəbul olunmaz və o şəxs axirətdə zərər çəkənlərdən olar!﴿** (Ali İmran: 85). Əgər bütün şəfaət Allaha məxsusdursa və bu iş Allahın izni olmadan baş verməyəcəksə, o zaman nə Peyğəmbər (*Səllallahu aleyhi və səlləm*), nə də digəri Allahın izni olmadan heç kəsə şəfaətçi ola bilməyəcəkdir. Allah yalnız tövhid əhlinə şəfaət etmək üçün izn verəcəkdir. Bir halda ki, bütün şəfaət Allaha məxsusdur, mən də ondan istəyib bu və buna bənzər məzmunda dua edirəm: *"Ey Allahım, məni Peyğəmbərin* (*Səllallahu aleyhi və səlləm*) *şəfaətindən məhrum etmə. Ey Allahım, onu mənim üçün şəfaətçi et".*

**Əbdünnəbi:** Biz razılaşmışdıq ki, heç kəsdən sahib olmadığı bir şeyi istəmək olmaz. Amma uca Allah Peyğəmbərə ﷺ şəfaəti vermiş və o da verilən şeyin sahibi olmuşdur. Ona görə mən, onun sahib olduğunu ondan istəyə bilərəm və bu heç də şirk deyil.

**Abdullah:** Bəli, əgər Allah bunu qadağan etməsəydi, dediyin düzgün fikir kimi qəbul olunardı. Uca Allah buyurur: ***﴾Allahdan başqa heç kəsə dua etməyin!﴿*** (əl-Cinn: 18). Şəfaət istəmək də dua etməkdir. Peyğəmbərə (*Səllallahu aleyhi və səlləm*) şəfaəti bəxş edən Allahdır. O da istədiyin kimsənin kimliyindən asılı olmayaraq, bunu başqasından istəməyini qadağan edib. Həmçinin Peyğəmbərdən (*Səllallahu aleyhi və səlləm*) başqasına da şəfaət verilib. Doğru görüşə görə mələklər, həddi büluğa çatmadan ölən uşaqlar və övliyalar da şəfaətçi olacaqlar. O zaman elə çıxır ki, əgər Allah bunlara da şəfaət etmək ixtiyarı veribsə, demək, onlardan da şəfaət istəmək olar? Əgər cavab *"bəli"* olarsa, o zaman əməlisalehlərə ibadət etməli olacaqsan. Halbuki bu, Quranda qadağan olunmuşdur. Əgər cavab *"xeyr"* olarsa, o zaman sənin *"Allah ona şəfaəti verib, mən də ondan istəyirəm"* sözün heç olur.

**Əbdünnəbi:** Lakin mən, Allaha heç bir şərik qoşmuram. Əməlisaleh bəndələrə üz tutmaq şirk deyil.

**Abdullah:** Sən etiraf edir və inanırsanmı ki, Allah şirki zinadan daha qətiyyətlə qadağan etmiş və onu bağışlamayacağını vəd etmişdir?

**Əbdünnəbi:** Bəli, bunu etiraf edirəm. Bu, Allahın kəlamında açıq-aşkar deyilmişdir.
**Abdullah:** Sən, özünün Allahın haram etdiyi şirkdən uzaq olduğunu qeyd etdin. Səni Allaha and verdirirəm mənim üçün açıqla görək, sənin etmədiyin və özünü ondan uzaq tutduğun şirk hansıdır?
**Əbdünnəbi:** Şirk, bütlərə ibadət etmək, onlara üz tutmaq, dua etmək və onlardan qorxmaqdır.
**Abdullah:** Bütlərə ibadət etmək nə deməkdir? Sən elə zənn edirsən ki, Qureyş kafirləri etiqad edirdilər ki, həmin ağaclar, daşlar onlara dua edənləri yaratmağa, ruzi verməyə və işlərini sahmana salmağa malikdirlər?! Az öncə dediyim kimi, onlar bunu etiqad etmirdilər.
**Əbdünnəbi:** Mən də bunu etiqad etmirəm. Fikrimcə, kim ağaca, daşa, qəbir üzərində tikilmiş qübbəyə və ya bu kimi digər nəyəsə üz tutar, dua edib qurban kəsərək: "bu bizi Allaha yaxınlaşdırır", "bunun bərəkəti ilə Allah bizi qoruyur" – deyərsə, bütlərə ibadət etmiş olar. Mənim demək istədiyim budur.
**Abdullah:** Doğrudur. Lakin bu, sizin ağaclar, qübbələr, qəbirlər qarşısında etdiyiniz əməl budur. Həmçinin sən deyirsən ki, şirk bütlərə ibadət etməkdir. Sən bununla demək istəyirsən ki, şirk yalnız bütə ibadət edənlərə aiddir? Əməlisaleh insanlara üz tutmaq və dua etmək şirk məfhumuna daxil deyil?
**Əbdünnəbi:** Bəli, belə demək istəyirəm.
**Abdullah:** Əgər bu doğrudan da belədirsə, bəs uca Allahın peyğəmbərlərə, əməlisalehlərə, mələklərə və digərlərinə bağlanmağın haramlığına və bunu edənlərin kafir adlandırılmasına nə deyirsən? Mən bunu əvvəldə qeyd edib dəlillərini də göstərmişdim.
**Əbdünnəbi:** Lakin mələklərə və peyğəmbərlərə dua edənlər bu səbəblə kafir olmayıblar. Onlar "mələklər Allahın qızlarıdır", "İsa Allahın oğludur" – dediklərinə görə kafir olublar. Biz demirik ki, Əbdülqadir Allahın oğlu, yaxud Zeynəb Allahın qızıdır.
**Abdullah:** Allaha övlad nisbət etməyin özü ayrı bir növ küfrdür. Uca Allah buyurur: ❴*(Ya Peyğəmbər! Allahın zatı və sifətləri haqqında səndən soruşan müşriklərə)* **de: "***(Mənim Rəbbim olan)* **O Allah birdir** *(heç bir şəriki yoxdur)*; **Allah** *(heç kəsə, heç nəyə)* **möhtac deyildir!** *(Hamı Ona möhtacdır; O, əzəlidir, əbədidir!)* **O, nə doğmuş, nə də doğulmuşdur!** *(Allah Özünə heç bir övlad götürməmişdir!)*❵ (əl-İxlas: 1-3). Kim bunu inkar edərsə, surənin sonuncu ayəsini inkar etməsə də kafir olar. Uca Allah buyurur: ❴**Allah heç bir övlad götürməmişdir. Onunla yanaşı, ibadətə layiq olan heç bir haqq tanrı yoxdur. Əgər belə olsaydı, onda hər bir tanrı əlahiddə öz yaratdıqları ilə gedər,** *(öz məxluqatını ayırıb aparar)* **və onların bir qismi** *(dünyadakı padşahlar kimi)* **digərinə üstün olmağa çalışardı...**❵ (əl-Muminun: 91). Bu ayədə uca Allah iki növü bir-birindən fərqləndirir. Digər sübut isə odur ki, Lat adlı bütə dua etməklə kafir olanlar Latı Allahın oğlu kimi deyil, əməlisaleh insan kimi qəbul edirdilər. Həmçinin cinlərə ibadət edənlər də belə düşünürdülər. Dörd məzhəb alimləri "Mürtədlərin hökmü" fəslində qeyd edirlər ki, kim Allahın övladı olduğunu deyərsə, mürtəd olar. Eləcə də kim Allaha şərik qoşarsa, mürtəd olar. Beləliklə, bütün elm adamları bu iki növü bir-birindən fərqləndirirlər.

**Əbdünnəbi:** Axı uca Allah belə buyurur: ﴾***Bilin ki, Allahın dostlarının heç bir qorxusu yoxdur və onlar qəm-qüssə görməzlər.***﴿ (Yunus: 62).
**Abdullah:** Biz, bunun həqiqət olduğuna iman gətirir və eyni fikri deyirik. Amma onlara ibadət etmək olmaz. Biz yalnız onların Allah ilə bərabər ibadət olunmalarını, Ona şərik edilmələrini inkar edirik. Digər hallarda isə biz, onları sevməli, onların yolunu getməli, onların kəramətlərini təsdiqləməliyik. Övliyaların kəramətini yalnız bidət əhli inkar edə bilər. Allahın haqq dini iki tərəf arasında orta mövqe seçmək, iki zülmət arasında işıqlı hidayət yolu getmək və iki batil inanc arasında haqqı tutmaqdır.
**Əbdünnəbi:** Barələrində Quran nazil olan müşriklər "***Lə iləhə illəllah***" kəlməsinə şəhadət gətirmir, Peyğəmbəri (*Sallallahu aleyhi və səlləm*) yalançı hesab edir, öldükdən sonra dirilməyi inkar edir, Quranı yalan sayır və onu sehr adlandırırdılar. Biz isə "***Lə iləhə illəllah Muhəmmədən rəsulullah***" kəlməsinə şəhadət verir, Quranı təsdiqləyir, öldükdən sonra dirilməyə inanır, namaz qılır və oruc tuturuq. Necə olur ki, bizi onlarla eyni tutursunuz?
**Abdullah:** Alimlərin yekdil rəyinə əsasən, əgər bir insan bəzi məsələlər barəsində Peyğəmbəri (*Sallallahu aleyhi və səlləm*) təsdiq edib, digərlərində təkzib edərsə, belə insan hələ islama daxil olmuş sayılmır. Həmçinin Quranın bəzi hissəsinə inanıb, digərini inkar etmək də belədir. Məsələn tövhidi təsdiq edib, namazı inkar etmək və ya tövhidi və namazı qəsdiqləyib, zəkatın vacibliyini inkar etmək. Yaxud bütün bunları təsdiqləyib, orucun və həccin vacibliyini inkar etmək. Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) vaxtında bir qrup insan həcc etmək əmrindən boyun qaçırdıqda uca Allah onlar haqqında bu ayəni nazil etdi. ﴾**Onun yoluna gücü çatan hər bir kəsin həccə gedib, o evi ziyarət etməsi insanların Allah qarşısında borcudur. Kim bunu** *(bu borcu)* **inkar edərsə, bilsin ki, Allah aləmlərə** *(heç kəsə)* **möhtac deyildir!**﴿ (Ali İmran: 97). Alimlərin yekdil rəyinə əsasən əgər bir insan öldükdən sonra dirilməyi inkar edərsə, artıq kafir olur. Elə buna görə uca Allah, Öz kitabında açıq şəkildə bildirir ki, kim kitabın bəzisinə iman gətirib, qalanını inkar edərsə, o, əsl kafirdir. Allah, İslamı bütöv şəkildə qəbul etməyi əmr edir. Kim bəzisini götürüb, bəzisini də inkar edərsə, küfr edər. Sən də bunu təsdiqləyirsənmi?
**Əbdünnəbi:** Bəli, təsdiq edirəm. Bu, Qurani Kərimdə açıq-aşkar deyilən bir hökmdür.
**Abdullah:** Bəzi işlərdə Peyğəmbəri (*Sallallahu aleyhi və səlləm*) təsdiqləyib, amma namazın vacibliyini, yaxud öldükdən sonra dirilməyi inkar edən kimsənin kafir olub, bütün məzhəblərə görə qanının və malının halal olmasını təsdiq edirsənsə, onu da bil ki, tövhid Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) gətirdiyi ən əzəmətli vacibdir. Tövhid namazdan, zəkatdan və həccdən daha önəmlidir. Belə olan təqdirdə necə ola bilər ki, Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) bütün dediklərinə inanıb, sadəcə bu əmrlərdən birini inkar edən insan kafir olur. Amma bütün peyğəmbərlərin dini olan tövhidi inkar etdikdə kafir olmur. Ey Allahım, bu nə qəribə cəhalətdir!
Həmçinin Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) səhabələrinə diqqət yetirsən, görərsən ki, onlar Yəmamədə "***Lə iləhə illəllah Muhəmmədən rəsuləllah***" kəlməsinə şəhadət verib, namaz qılan və azan verən Bənu Hənifə qəbiləsinə qarşı döyüşmüşdülər.

**Əbdünnəbi:** Axı onlar Museyləmə adlı bir nəfərin peyğəmbər olduğunu qəbul edirdilər. Biz isə Muhəmməddən (*Sallallahu aleyhi və səlləm*) sonra peyğəmbər olmadığına şahidlik edirik.

**Abdullah:** Nə olsun, siz də Əli ﷺ, Əbdülqadir əl-Ceylani və ya hər hansı Peyğəmbər və ya mələk barəsində ifrata varıb, onları göylərin və yerin sahibi Allahın səviyyəsinə yüksəldirsiniz. Əgər kimsə bir insanı Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) səviyyəsinə qaldırmaqla kafir olur, malı və qanı halal sayılır, nə şəhadət kəlməsi, nə də namaz ona fayda vermirsə, bir insanı Allah səviyyəsinə qaldıran kimsə bu hökmə daha layiqdir. Elə vaxtilə Əlinin (*Sallallahu aleyhi və səlləm*) odda yandırdığı insanların hamısı müsəlman olduqlarını iddia edirdilər. Halbuki onlar Əlinin (*Sallallahu aleyhi və səlləm*) ətrafında olan yoldaşları idilər və səhabələrdən də elm almışdılar. Siz Əbdülqadir Ceylani və başqaları barəsində necə etiqad edirsinizsə, onlar da Əli (*Sallallahu aleyhi və səlləm*) barəsində eyni etiqadı edirdilər. Əgər bununla insan kafir olmurdusa, hansı əsasla səhabələr onların kafir olmaları və onlara qarşı döyüşmək üçün yekdil qərara gəlmişdilər? Sən elə düşünürsən ki, səhabələr müsəlmanlara kafir hökmü verirdilər?! Yaxud elə düşünürsən ki, Əbdülqadir Ceylani və başqaları barəsində belə düşünmək insana zərər verməz və Əli ﷺ barəsində bu cür düşünmək insanı kafir etməz?

Həmçinin uca Allah Ona təslim olub, elm və yaxşı əməl sahibi olan İsrail övladları haqqında deyir ki, bir vaxtlar onlar Musaya ﷺ belə demişdilər: ﴾***Ya Musa! Bizə onların sitayiş etdikləri bütlər kimi bir büt düzəlt!...***﴿ (əl-Əraf: 138). Bir dəfə Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) öz əshabı ilə sitayiş olunan bir ağacın yanından keçərkən səhabələr ona dedilər: *"Bizim üçün də Zətu Ənvat düzəlt"*. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) and içib dedi: "**And olsun ki, sizin bu sözünüz İsrail oğullarının bu sözünə bənzəyir:** ﴾*Ya Musa! Bizə onların sitayiş etdikləri bütlər kimi bir büt düzəlt!...*﴿".

**Əbdünnəbi:** Amma buna baxmayaraq, İsrail oğulları və Peyğəmbərdən (*Sallallahu aleyhi və səlləm*) Zətu Ənvat düzəltməsini tələb edən səhabələr bununla kafir olmadılar.

**Abdullah:** İsrail oğulları və Peyğəmbərdən (*Sallallahu aleyhi və səlləm*) bunu istəyən səhabələr bu əməli etmədilər. Əgər buna əməl etsəydilər, o zaman kafir olardılar. Həmçinin Peyğəmbərdən (*Sallallahu aleyhi və səlləm*) zətu ənvat düzəltməyi istəyənlər onun qadağasına məhəl qoymayıb, itaətsizlik göstərərək, zətu ənvatı ibadət yeri götürsəydilər, o zaman kafir olardılar.

**Əbdünnəbi:** Mənim üçün qaranlıq qalan bir məqam var. Bu, Usamə ibn Zeydin ﷺ hadisəsi ilə bağlıdır. O, döyüş zamanı *"Lə iləhə illəllah"* kəlməsini deyən adamı öldürmüş və Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) onun bu hərəkətinə irad tutmuş və demişdi: **"Ey Usamə, o, *"Lə iləhə illəllah"* kəlməsini dedikdən sonra onu öldürdünmü"**?! Həmçinin Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: **"İnsanlar "Lə iləhə illəllah" kəlməsini deyənə qədər onlarla döyüşmək mənə əmr olunmuşdur".** Sənin dediyin sözlərlə bu iki hədisi necə uyğunlaşdıraq? Allah köməyin olsun, bu məsələdə açıqlama ver.

**Abdullah:** Bildiyimiz kimi Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) *"lə iləhə illəllah"* kəlməsini deyən yəhudilərə qarşı döyüşmüş və əsir götürmüşdü. Həmçinin səhabələri də *"lə iləhə illəllah Muhəmmədən rəsuləllah"* kəlməsinə şəhadət verən və namaz qılan

Bənu Hənifə qəbiləsinə qarşı döyüşmüşdülər. Əli ﷺ də bir qrup insanları yandırmaqla cəzalandırmışdı. Sən özün də etiqad edirsən ki, əgər bir insan *"Lə iləhə illəllah Muhəmmədən rəsuləllah"* kəlməsini deyib, sonra öldükdən sonra dirilməyi inkar edərsə, kafir olar və onun qətli də halal sayılar. Həmçinin şəhadət kəlməsini deyib sonra islamın əsaslarından birini inkar edərsə kafir olar və öldürülər. Əgər islamın ikinci dərəcəli əməllərini inkar edən insana şəhadət kəlməsi fayda vermirsə, bəs Peyğəmbərlərin gətirdikləri dinin əsası və canı olan tövhidi inkar edən insana bu kəlmə necə fayda verə bilər? Yəqin ki, sən bu hədislərin mənasını anlamamısan.

Usamənin ﷺ hədisinə gəlincə, o müsəlman olduğunu iddia edən insanı öldürmüşdü. Çünki o elə düşünürdü ki, həmin adam şəhadət kəlməsini ölməkdən və malını itirməkdən qorxub deyirdi. Zahiri şəkildə müsəlman olduğunu bildirən insan, əslən müsəlmanlıqdan uzaq olması bilinənə qədər toxunulmaz qalmalıdır. Uca Allah buyurur: ﴾**Ey iman gətirənlər! Allah yolunda** *(cihad etmək üçün)* **səfərə çıxdığınız zaman diqqətli olun!...**﴿ (Nisa: 94). Diqqətli olmaq, kimə qarşı döyüşdüyünü dəqiqləşdirmək mənasındadır. Ayəyə görə, döyüş zamanında kimliyi bilinməyən insan tanınana qədər toxunulmaz qalmalıdır. Əgər qeyri müsəlman olduğu təyin olunarsa, ona qarşı döyüşmək olar. Bu, ayədəki "diqqətli olun" sözünün mənasıdır. Əgər şəhadət kəlməsini deməklə öldürülməyəcəkdisə, o zaman dəqiqləşdirmək əmrinin faydası olmazdı.

Digər hədis də deyilən mənadadır. Zahirən müsəlman olduğunu bildirən insanın, qeyri müsəlman olması tam əminliklə bilinənə qədər toxunulmaz qalmalıdır. **"Ey Usamə, o, *"Lə iləhə illəllah"* kəlməsini dedikdən sonra onu öldürdünmü"?!** – sözlərini deyən Peyğəmbər *(Sallallahu aleyhi və səlləm)* digər hədisində isə belə demişdir: **"İnsanlar "Lə iləhə illəllah" kəlməsini deyənə qədər onlarla döyüşmək mənə əmr olunmuşdur"**. Peyğəmbər *(Sallallahu aleyhi və səlləm)* başqa bir hədisdə xəvariclər haqqında belə demişdir: **"Onlarla harada rastlaşsanız, onları öldürün"**. Xəvariclər çox ibadət və zikr edən bir toplum idi. Səhabələr öz ibadətlərini onların ibadəti yanında kiçik görürdülər. Onlar elmi də səhabələrdən öyrənmişdilər. Bütün bunlara baxmayaraq, şəriətə zidd hərəkət edən xəvariclərə *"lə iləhə illəllah"* kəlməsi, ibadətin çoxluğu və ya müsəlman olmaq iddiası heç bir kömək etmədi.

**Əbdünnəbi:** Bəs Peyğəmbərin *(Sallallahu aleyhi və səlləm)* qiyamət günü insanların Adəmdən, Nuhdan, İbrahimdən, Musadan və İsadan kömək istəyib, üzrxahlıq etdiklərini gördükdə isə Muhəmmədin *(Sallallahu aleyhi və səlləm)* yanına gələcəkləri haqqında olan səhih hədisinə nə deyirsən? Bu hədis göstərir ki, Allahdan başqasından kömək istəmək şirk deyil.

**Abdullah:** Məsələnin həqiqəti barədə səhv düşüncənə görə, belə deyirsən. Biz sağ və yanında olduğun kimsədən onun iqtidarında olan iş barəsində kömək istəməyi inkar etmirik. Bir insan döyüş meydanında və ya hər hansı məqamda öz yoldaşlarından onların iqtidarında olan köməyi istədiyi kimi kömək istəmək olar. Uca Allah buyurur: ﴾*(Musanın)* **adamlarından olan kəs düşməninə qarşı ondan imdad istədi...**﴿ (əl-Qəsəs: 15). Bizim məqbul hesab etmədiyimiz imdad, övliyaların qəbirləri önündə və ya yanınızda olmadıqları halda onlardan Allahdan başqa heç kəsin qadir olmadığı işlərdə istədiyiniz köməyə aiddir. Qiyamət günü cənnət əhli

məhşər meydanında dayanmaq üzüntüsündən qurtulmaq üçün peyğəmbərlərdən xahiş edəcəklər ki, haqq-hesabın başladılması üçün Allaha dua etsinlər. Sənin oturub-durduğun və səsini eşitdiyin əməlisaleh bir adama özün üçün dua etməsini istəməyin həm bu dünyada, həm də axirətdə icazəlidir. Necə ki, Peyğəmbərin (*Səllallahu aleyhi və səlləm*) səhabələri də onun sağlığında ondan belə xahiş edərdilər. Amma o öləndən sonra əsla belə etmədilər. Hətta qəbrinin yanında olduqları halda, yenə də ondan istəmədilər. Sələflərimiz isə qəbirin yanında dayanıb, Allaha dua etməyi pisləmişlər.

**Əbdünnəbi:** Bəs İbrahim peyğəmbərin (ə) hadisəsi haqqında nə deyirsən? Onu oda atan zaman Cəbrail (ə) havada onun yanına gəlir və hansı köməyə ehtiyacı olduğunu soruşur. İbrahim (ə) isə deyir: *"Sənin köməyinə ehtiyacım yoxdur"*. Əgər Cəbraildən (ə) kömək istəmək şirk olsaydı, o zaman o, İbrahimə (ə) belə təklif etməzdi.

**Abdullah:** Bu şübhə də əvvəlki şübhə ilə həmcinsdir. Bu haqda olan rəvayət mötəbər deyil. Hətta rəvayətin mötəbər olduğunu fərz etsək, yenə də burada Cəbrail (ə) ona özünün qadir olduğu köməyi təklif etmişdi. Cəbrail (ə) uca Allahın bu ayəsində vəsf olunduğu kimi güclü idi. ﴾**Onu *çox qüvvətli olan* öyrətdi.**﴿ Əgər uca Allah ona İbrahimin (ə) atıldığı odu, ətrafındakı torpağı və dağları götürüb şərqə və ya qərbə tullamağı əmr etsəydi, Cəbrail (ə) bu işdə aciz qalmazdı. Bu, varlı insanın kasıba ehtiyaclarını ödəməsi üçün borc təklif etməsi, kasıbın isə bundan imtina edib, səbr nümayiş etdirərək, heç kəsin minnəti olmadan Allah tərəfindən göndəriləcək ruzisini gözləməsi kimidir. Deyilən bu məsələ hara, günümüzdə ibadət olaraq istənilən kömək və şirk hara?!

**Ey qardaşım, bil ki, Peyğəmbərimiz Muhəmməd (s) göndərilən insanların şirki, bizim vaxtımızda yaşayan insanların etdikləri şirkdən üç əsasa görə daha yüngül idi.**

**Birincisi:** Əvvəlki insanlar yalnız rahatlıq anlarında Allaha şərik qoşur, çətinlikdə isə yalnız Allaha ibadət edirdilər. Uca Allah buyurur: ﴾*(Müşriklər)* **gəmiyə mindikləri zaman** *(dəryada batacaqlarından qorxub)* **dini** *(ibadəti)* **yalnız Ona məxsus edərək,** *(ixlasla)* **Allaha dua edərlər. Allah onları sağ-salamat quruya çıxaran kimi, yenə də** *(Ona)* **şərik qoşarlar**﴿ (əl-Ənkəbut: 65). ﴾*(Kafirləri)* **ətrafına kölgə salan uca dağlar** *(yaxud qara buludlar)* **kimi dalğalar bürüdüyü zaman onlar dini** *(ibadəti)* **Allaha məxsus edərək yalnız Ona dua edərlər. Allah onları sağ-salamat quruya çıxartdıqda içərilərindən bəziləri** *(küfrlə iman arasında)* **orta mövqe tutar.** *(Bəziləri isə öz küfründə qalar)*. **Bizim ayələrimizi yalnız çox xain, nankor olanlar danarlar!**﴿ (Loğman: 32). Peyğəmbərin (*Səllallahu aleyhi və səlləm*) mübarizə apardığı müşriklər rahat günlərində Allaha və Onunla yanaşı, digərlərinə dua edər, çətin günlərində isə, Allahdan başqasına dua etməz, ağalarını unudardılar. Günümüzün müşrikləri isə, çətin və rahat günlərində Allaha və başqalarına dua edirlər. Biri çətinliyə düşdükdə *"Ya rəsuləllah"*, *"Ya Hüseyn"* və s. bu kimi sözlərlə dua edirlər. Di gəl bunu başa düşən hanı?

**İkincisi:** Əvvəlkilər Allahla yanaşı, Ona yaxın olanlara: ya peyğəmbərə, ya övliyaya, ya mələyə, yaxud ən pis halda Allahın əmrinə boyun əyib, asilik etməyən daşa və ağaca dua edərdilər. Günümüzdəki insanlar isə, Allahla yanaşı,

ən günahkar *(fasiq)* insanlara dua edirlər. Əməlisalehlərə, yaxud asilik etməyən ağaca və daşa ibadət edənlər, günahkarlığı aşkar görsənənlərə ibadət edənlərdən bir qədər üstündürlər.

**Üçüncüsü:** Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) vaxtında yaşayan müşriklərin əksəriyyəti yaradılış *(rübubiyyə)* tövhidində deyil, ibadət *(uluhiyyə)* tövhidində Allaha şərik qoşardılar. İndiki vaxtda isə ibadətdə edilən şirklə yanaşı, rübubiyyətdə də çox şirk olunur. Məsələn, indikilər kainatın idarəçiliyni, yaratmağı, öldürməyi və s. təbiətə aid edirlər.

Söhbəti çox önəmli bir məsələ ilə yekunlaşdırmaq istəyirəm. Bu məsələ deyilənləri insana dərk elətdirir. **Tövhid qəlb ilə etiqad etmək, dil ilə demək və səbəblər götürüb əzalarla əməl etməkdir.** Bu barədə heç bir fikir ayrılığı yoxdur. Əgər bunların biri olmazsa, insan müsəlman hesab olunmur. Əgər bir insan tövhidi bilib ona əməl etmirsə, o, Firon və İblis kimi inadkar kafir sayılır.

Əksər insanlar bu məsələdə səhvə yol verərək deyir: *"Deyilənlər doğrudur, amma biz bunu edə bilmirik. Camaat arasında, yaxud tayfamız yanında bunu edə bilmərik. Biz onlardan qorxaraq, onlara müvafiq hərəkət etməli, üzlərinə gülməliyik"*. Amma bunu deyən fağır bilmir ki, küfr başçılarının əksəriyyəti haqqı bilirdilər, lakin müəyyən üzürlərə görə onu tərk etmişdilər. Necə ki, uca Allah buyurur: **﴾Onlar Allahın ayələrini ucuz qiymətə satdılar, sonra da** *(insanları)* **Onun yolundan döndərdilər. Həqiqətən, onların gördükləri iş necə də pisdir!﴿** (Tövbə: 9). Kim tövhidi başa düşmədən və qəlbən etiqad etmədən zahirdə ona əməl edərsə, münafiq olar. Beləsi xalis kafirdən də pisdir. Uca Allah buyurur: **﴾***(Ya Rəsulum!)* **Əlbəttə, münafiqlərin yeri Cəhənnəmin ən aşağı təbəqəsindədir. Sən heç vaxt onlara yardım edən tapmazsan!﴿** (ən-Nisa: 145). Əgər insanların danışıqlarına fikir versən, bu məsələ sənin üçün daha da aydın olar. Görürsən ki, biri Qarun kimi dünya mənfəətinin azalacağından ehtiyat edərək, yaxud Haman kimi ad-sanının itəcəyindən qorxaraq və ya Firon kimi mal-mülkünün əlindən çıxacağından çəkinərək, haqqı bilib, ona əməl etməyi tərk edir.

Bəzən də görürsən ki, bir qrup insan münafiqlər kimi batinən deyil, zahirən tövhidə əməl edirlər. Sən, ondan qəlbi ilə nəyi etiqad etdiyini soruşduqda onun heç nə bilmədiyini aşkar edirsən.

**Lakin sən Qurandan olan iki ayəni başa düşsən, kifayət edər.**

**Birinci ayə: ﴾***(Əbəs yerə)* **üzr istəməyin. Siz iman gətirdikdən sonra artıq kafir oldunuz...﴿** (Tövbə: 66). Peyğəmbərlə (*Sallallahu aleyhi və səlləm*) birlikdə Rumlulara qarşı döyüşə gedən bəzi insanlar zarafatla dedikləri sözə görə kafir olublarsa, mal-dövlətinin azalacağından və ya şan-şöhrətinin itəcəyindən qorxaraq, yaxud kiminsə xətrini qorumaq üçün küfr sözlər danışmaq zarafatla deyilən küfr sözdən daha da pisdir. Ona görə ki, adətən zarafat edən insan ətrafdakıları güldürmək məqsədi daşıdığı üçün dili ilə dediyinə qəlbən etiqad etmir. Məxluq qarşısında qorxub və ya tamahkarlıq məqsədi güdüb küfr sözlər danışan isə, şeytanın vədini təsdiqləmiş olur. **﴾*Şeytan sizi yoxsulluqla qorxudaraq alçaq işlərə sövq edər,...*﴿** (əl-Bəqərə: 268). Həmçinin şeytanın əzabından qorxar. **﴾*Sizi yalnız o Şeytan öz dostlarından qorxudub çəkindirir...*﴿** (Ali İmran: 175). Rəhman olan Allahın **﴾*Allah isə sizə*

***bağışlanmaq və bərəkət vədəsi verər...*** (əl-Bəqərə: 268) – sözləri ilə dediyi vədəsini isə təsdiqləməz. Güc və qüvvət sahibi Allahın əzab vədindən qorxmaz. ***Amma siz onlardan qorxmayın! Məndən qorxun!*** (Ali İmran: 175). Hal-vəziyyəti belə olan insan Allahın dostu olmağa layiqdir, yoxsa şeytanın?!.

**İkinci ayə:** Uca Allah buyurur: **Qəlbi imanla sabit olduğu halda** *(küfr sözünü deməyə)* **məcbur edilən** *(dil ilə deyib ürəyində onu təsdiq etməyən)* **şəxs istisna olmaqla, hər kəs iman gətirdikdən sonra küfr etsə** *(onu ağır təhlükə gözləyir).* **Lakin qəlbən küfrə razı olanlara** *(qəlbində könüllü surətdə küfrə yer verənlərə)* **Allahın qəzəbi tutar və onlar şiddətli bir əzaba düçar olarlar!** (ən-Nəhl: 106).

Uca Allah bu məqamda yalnız qəlbi imanla sabit olub küfr olan sözü deməyə məcbur edilənləri istisna etmişdir. Bundan başqası isə istər qorxudan, istər tamahkarlıqdan, istər kiminsə xətrini qorumaqdan, istər vətəninin, ailəsinin və ya malının sevgisinə görə, istərsə də zarafatla küfr sözlər işlətsə, üzürlü sayılmır. Yalnız məcbur edilən kimsələr üzürlü hesab oluna bilərlər. Ayə isə onu göstərir ki, insan söz və əməldə məcbur ola bilər. Qəlbdə isə onu heç kəs məcbur edə bilməz. Uca Allah buyurur: **Bu ona görədir ki, onlar dünyanı** *(fani dünya malını)* **axirətdən** *(axirət nemətlərindən)* **üstün tutarlar. Allah kafirləri doğru yola salmaz!** (ən-Nəhl: 107). Bu ayədə açıq-aşkar bildirilir ki, burada əzab etiqada, cahilliyə, dinə nifrətə və ya küfrü sevməyə görə deyil, dünya mənfəətini qazanıb, onu dindən üstün tutmağa görədir. Daha doğrusunu Allah bilir.

Allah səni doğru yola yönəltsin, bütün bu deyilənlərdən sonra sənin Rəbbinə tövbə etmək, Ona qayıtmaq və etdiklərindən əl çəkmək vaxtın çatmayıbmı. Eşitdiyin kimi məsələ bir tərəfdən çox təhlükəli, digər tərəfdən isə ciddi və önəmlidir.

**Əbdünnəbi:** Mən Allahdan bağışlanma diləyir və tövbə edirəm. Şəhadət verirəm ki, Allahdan başqa ibadətə layiq haqq məbud yoxdur, Muhəmməd isə Onun elçisidir. Mən Allahdan başqa ibadət etdiklərimin hamısını inkar edirəm. Allahdan istəyirəm ki, keçmiş günahlarıma görə məni üzürlü saysın, bağışlasın. Mənə qarşı Öz lütfkarlığı, mərhəməti və bağışlaması ilə davransın. Onunla görüşənə qədər məni tövhid və doğru əqidədə sabitqədəm etsin. Qardaşım Abdullah, belə gözəl öyüd-nəsihətə və *"Əbdünnəbi"* adıma etiraz etdiyinə görə Allah sənə də gözəl mükafat bəxş etsin. Doğrudan da din nəsihəti tələb edir. Onu da deyim ki, mən artıq adımı dəyişib *"Əbdürrəhman"* adını götürdüm. Eləcə də mənim daxili pisliklərimi, batil etiqadımı mənə bildirdiyin üçün sənə təşəkkür edirəm. Halbuki əgər mən belə etiqadla Allahın hüzuruna gəlsəydim, heç vaxt nicat tapmazdım.

Səndən sonuncu bir xahişim də var. İstərdim ki, çox vaxt insanların bilmədən etdikləri münkər işləri mənim üçün sadalayasan.

**Abdullah:** Buyur, diqqətlə məni dinlə;

- **Quran və sünnədə fikir ayrılığı ilə müşahidə etdiyin məsələlərdə fitnə-fəsad salmaq və istədiyin kimi məna vermək məqsədilə ixtilaflı məsələni seçməyi özünə şüar etmə.** Çünki, belə məsələlərin doğru yozumunu yalnız Allah bilir. Qoy sənin şüarın elmdə püxtələşmiş insanların şüarı olsun. Onlar Quranın çətin anlaşılan və dəqiq mənası bilinməyən *(mütəşabih)* ayələri haqqında: *"Biz onlara iman gətirdik, onların hamısı Rəbbimizin dərgahındandır"* – deyərlər. Peyğəmbər

(Sallallahu aleyhi və səlləm) isə ixtilaflı məsələlər barəsində belə bir qayda qoymuşdur: **"Səni şübhələndirən məsələni tərk et və arxayın olduğun məsələni götür."** *Əhməd və Tirmizi*. Digər hədisdə isə Peyğəmbər (Sallallahu aleyhi və səlləm) belə deyir: **"Kim şübhələrdən qorunarsa dinini və namusunu qorumuş olar. Şübhəli məsələlərə baş vuran isə harama düşər."** *Buxari və Müslim*. Həmçinin deyilmişdir: **"Qəlbinə gəlib insanların onu bilmələrini istəmədiyin hər bir iş günah qisminə daxildir."** Müslim. Başqa bir hədisdə isə belə deyilir: **"Üç dəfə öz qəlbindən də soruş, nəfsindən də. Yaxşı iş qəlbə xoş gələn, günah isə nəfsə gəlib qəlbdə tərəddüd edən işdir. Sənə bu işdə edib-etməməyin barədə fətva versələr də bu belədir"** Darimi və Əhməd.

- **Öz nəfsinin istəklərinə uyma.** ﴾*(Ya Peyğəmbər!)* **Nəfsini özünə tanrı edəni gördünmü?**﴿ (əl-Casiyə: 23).

- **Kiməsə və ya kiminsə fikrinə, yaxud dədə-baba yoluna kor-koranə bağlanmaqdan çəkin.** Çünki belə etmək, insanı haqdan yayındırır. Mömin üçün haqq, itmiş ov kimidir. Harada tapsa, onundur. Uca Allah buyurur: ﴾**Onlara: "Allahın göndərdiyinə** *(Qurana)* **tabe olun!" – deyildiyi zaman, onlar: "Biz, ancaq atalarımızın getdiyi yolla gedəcəyik!" – deyirlər. Bəs ataları bir şey anlamayıb doğru yolda deyildilərsə necə?**﴿ (əl-Bəqərə: 170).

- **Heç vaxt özünü kafirlərə oxşatma.** Doğrudan da bu hər bir bəlanın başıdır. Peyğəmbər (Sallallahu aleyhi və səlləm) demişdir: **"Kim özünü bir tayfaya oxşadarsa, o da onlardandır."** Əbu Davud.

- **Allahdan başqasına təvəkkül etmə.** Uca Allah buyurur: ﴾**Kim Allaha təvəkkül etsə,** *(Allah)* **ona kifayət edər...**﴿ (ət-Talaq: 3).

- **Allaha asi olan işlərdə heç bir məxluqa itaət etmə.** Peyğəmbər (Sallallahu aleyhi və səlləm) demişdir: **"Yaradana asilik olan heç bir işdə məxluqa itaət yoxdur".**

- **Allaha qarşı pis zənn etməkdən uzaq ol.** Uca Allah qüdsi hədisdə deyir: **"Bəndəm Mənim haqqımda necə zənn edirsə, Mən də onun üçün elə olaram".** *Buxari və Müslim.*

- Müsibət baş verməmədən və ya baş verəndən sonra onu özündən uzaqlaşdırmaq üçün nə badə qoluna dəmir halqa taxasan və ya ip bağlayasan.

- Gözdəymədən qorunmaq üçün gözmuncuğu və ya oxşar şeylər taxma. Bu doğrudan da şirkdir. Peyğəmbər (Sallallahu aleyhi və səlləm) deyir: **"Kim üzərinə** ***(gözmuncuğu və ya ona oxşar)*** **bir şey taxarsa, ona da həvalə olunar."** Əhməd və Tirmizi.

- Daşlara, ağaclara, qədimi əşyalara və ya məbədlərə əl sürtüb bərəkət istəmə. Bu doğrudan da şirkdir.

- Qarşına çıxan quşdan və ya hər hansı şeydən bədbinlik gələcəyini gözləmə. Bu da şirkdir. Peyğəmbər (Sallallahu aleyhi və səlləm) üç dəfə: **"Bədbinlik** ***(tətəyyür)*** **şirkdir..." – deyib, sözünü təkrarlamışdır."** Əhməd və Əbu Davud.

- Qeybi bildiklərini iddia edən sehrbazlara və falçılara, qəzetlərdə ulduz fallarını yayan, insanların xoşbəxtliyindən və bədbəxtliyindən xəbər verdiklərini iddia edən münəccimlərə heç vaxt inanma. Onlara inanmaq şirkdir. Çünki qeybi Allahdan başqa heç kəs bilə bilməz.

- Yağış yağmasını ulduzlara və ya fəsillərə nisbət etmə. Bu da şirkdir. Yağışın yağmasını yalnız Allaha nisbət etmək lazımdır.

- And içilən kim olursa olsun, sən Allahdan başqasına and içmə. Bu, Allaha şərik qoşmaqdır. Hədisdə deyilir ki, **"kim Allahdan başqasına and içərsə, ya küfr, ya da şirk etmiş olar."** Əhməd və Əbu Davud. Bu məsələyə, peyğəmbərə, əmanətə, namus-qeyrətə, özünə və ya həyatına and içməyi misal çəkmək olar.
- Heç vaxt zəmanəni, küləyi, günəşi, soyuğu və ya istini söymə. Çünki onları söymək, onları yaradan Allahı söymək kimidir.
- Başına gələn pis işdən sonra "əgər" kəlməsini işlətməkdən *(əgər belə etsəydim, bu baş verməzdi və s. deməkdən)* çəkin. Belə demək şeytan əməlinə yol açır və bunu deyən insan Allahın qəza-qədərinə etiraz etmiş olur. Bu sözün əvəzində belə demək lazımdır: Bu Allahın qədəridir və O, istədiyini etmişdir.
- Qəbirləri məscid etmə. İçərisində qəbir olan məsciddə namaz qılmaq olmaz. Buxari və Müslimin səhih kitablarında rəvayət olunur ki, Aişə ﵂ deyir ki, Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) ölüm ayağında olarkən belə deyirdi: **"Öz peyğəmbərlərinin qəbirlərini məscid etdikləri üçün Allah yəhudi və xaçpərəstlərə lənət etsin. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) öz ümmətini onların etdiklərindən çəkindirirdi".** Aişə ﵂ deyir ki, əgər bu qadağa olmasaydı, onun da qəbrini ucaldardılar. *Buxari və Müslim.* Həmçinin Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: **"Sizdən əvvəlki ümmətlər öz peyğəmbərlərinin və əməlisaleh insanların qəbirlərini məscid edərdilər. Siz isə qəbirləri məscid etməyin. Mən bunu sizə qadağan edirəm."** *Əbu Əvanə.*
- Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) özü ilə və ya əməlisaleh insanlarla təvəssül etməyin icazəli olması haqqında yalançıların uydurduqları hədislərə inanma. Bu hədislər onun adından uydurulub. Belə uydurmalardan; *"mənim xətrimlə təvəssül edin. Çünki Allah yanında mənim xətrim ucadır."*, *"İşləriniz çətinə düşəndə qəbir sahiblərinə üz tutun."*, *"Allah hər bir övliyanın qəbri üzərində bir mələk qoyub ki, insanların istəklərini həyata keçirsin."*, *"Əgər biriniz daş barədə yaxşı zənn edərsə, ona fayda verər."* Buna oxşar uydurma rəvayətlər çoxdur.
- Dini bayramlar adı altında keçirilən mövlud, İsra və Merac, şaban ayının orta gecəsi və s. bu kimi tədbirlərə qatılma. Bütün bunlar şəriətdə əsası olmayan yeniliklərdir. Nə Peyğəmbərdən (*Sallallahu aleyhi və səlləm*), nə də onu bizdən çox sevən səhabələrdən bu barədə heç bir əsas yoxdur. Səhabələr xeyirxah işlərdə bizdən daha fəal idilər. Əgər bu xeyirli bir iş olsaydı, onlar bunu bizdən öncə edərdilər.




# Lə iləhə illəllah – şəhadət kəlməsi

Bu kəlmə iki əsasa söykənir: **Birinci:** Allahdan başqasının haqq ilahlığını inkar edən *"Lə iləhə"* – kəlməsi. **İkinci:** Təkcə Allahın haqq ilahlığını isbat edən *"İlləllah"* – kəlməsi. Uca Allah buyurur: **﴾Yadına sal ki, bir zaman İbrahim atasına və qövmünə demişdi: "Mən sizin ibadət etdiklərinizdən** *(bütlərdən)* **tamamilə uzağam; - Yalnız məni yoxdan yaradan** *(Allahdan)* **başqa! Şübhəsiz ki, O məni doğru yola müvəffəq edəcəkdir!"﴿** (əz-Zuxruf surəsi). Allaha ibadət etmək kifayət deyil, bununla yanaşı ibadət təkcə Onun üçün olmalıdır. Tovhid etiqadı ilə tək Allaha ibadət etmədikcə, şirkdən və şirk edənlərdən imtina etmədikcə Tovhid etiqadı doğru sayılmaz.

**Rəvayətdə deyilir ki, "cənnətin açarı lə iləhə illəllah kəlməsidir. Amma bu kəlməni deyən hər kəsin üzünə cənnətin qapıları açılacaqmı?"**

Vahb ibn Münəbbihə ﷺ deyirlər ki, məgər *"Lə iləhə illəllah"* cənnətin açarı deyilmi? O isə cavabında deyir: *"Bəli, amma hər bir açarın dişləri olmalıdır. Əgər dişləri olan açar gətirsən, qapı sənin üçün açılar, əks təqdirdə isə açılmaz"*.

Peyğəmbərimizdən (*Sallallahu aleyhi və səlləm*) bu açarın dişlərini təyin edən bir çox hədislər rəvayət olunmuşdur. Məsələn, "kim "lə iləhə illəllah" kəlməsini xalis niyyətlə deyərsə...", "qəlbi ilə təsdiqləyərək deyərsə...", "qəlbində onun haqq olmasını bilərək deyərsə..." və sairə bu kimi hədislər vardır. Bu kəlməni deyib, cənnətə daxil olmağı təsdiqləyən hədislər, eyni zamanda onun mənasını bilməyi, ölənə qədər onu deməkdə sabit olmağı, dəlalət etdiyi mənaya itaət etməyi və sairə bu kimi şərtləri də təyin etmişdir.

Lə iləhə illəllah kələməsinin cənnətin açarı olması və öz sahibinə fayda verməsi üçün alimlər bir çox dəlilləri əsas götürüb, bu kəlmə üçün şərtlər qoyub, maneələri göstəriblər. Aşağıda qeyd olunacaq şərtlər açarın dişləridir. Həmin şərtlər bunlardır:

**1 Bilmək:** Hər sözün mənası olduğu kimi *"Lə iləhə illəllah"* kəlməsinin də cəhaləti dəf edən mənası var. Bu məna, Allahdan başqasında ilahlığın olmasını inkar etmək və haqq ilahlığı Allaha aid etməkdir. Başqa sözlə desək, Allahdan başqa haqq məbudun olmadığını bilmək. Uca Allah buyurur: ﴾*Ancaq mənasını bilərək haqqa şəhadət verənlər müstəsnadır.*﴿ (əz-Zuxruf: 86). Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: **"Kim ölərkən Allahdan başqa haqq məbudun olmadığını** ***bilib*** **ölərsə, cənnətə daxil olar."** Müslim.

**2 Yəqin olmaq:** Bu kəlmənin dəlalət etdiyi mənaya tam yəqinliklə inanmaq. Çünki bu kəlmə şübhəni, zənni, tərəddüdü və ehtimalı qəbul etmir. Əksinə, tam yəqinliyi sevir. Uca Allah möminləri vəsf edərək deyir: **﴾Möminlər yalnız Allaha və Peyğəmbərinə iman gətirən,** *(iman gətirdikdən)* **sonra heç bir** ***şəkk-şübhəyə***

*düşməyən*, **Allah yolunda malları və canları ilə vuruşanlardır! Məhz belələri** *(imanlarında)* **sadiq olanlardır!**﴿ (əl-Hucurat: 15). Bu kəlməni yalnız dildə demək kifayət deyil. Bununla yanaşı, qəlbdə yəqinlik olmalıdır. Qəlbdə yəqinlik olmazsa, sırf münafiqlik olar. Peyğəmbər (*Səllallahu aleyhi və səlləm*) demişdir: ***"Şəhadət verirəm ki, Allahdan başqa haqq məbud yoxdur və mən Onun elçisiyəm. Həqiqətən qəlbində bu iki kəlmə barəsində şəkk-şübhə olmadan onlar ilə Allah dərgahına gələn insan cənnətə daxil olar"***. Müslim.

**❸ Qəbul etmək:** Bildikdən və yəqin olduqdan sonra mütləq bu yəqin elmin əsər-əlaməti olmalıdır. Bu isə həmin kəlmənin daşıdığı mənanı qəlb və dil ilə qəbul etməkdir. Kim tövhid dəvətini rədd edib, onu qəbul etməzsə, kafir olar. Bu rəddetmə təkəbbürlük, inadkarlıq və ya həsəd səbəbi ilə olsa da, fərq etmir. Uca Allah bu kəlməni təkəbbürlülüklə rədd edənlər barəsində belə deyir: ﴾***Onlara: "Allahdan başqa heç bir haqq məbud yoxdur!" – deyildiyi zaman təkəbbür göstərirdilər.***﴿ (əs-Saffat: 35).

**❹ İtaətkarlıq:** Tövhidə tam itaətkarlıq olmalıdır. Sırf həqiqət və imanın əməldə təzahürü budur. Bu itaətkarlıq Allahın buyurduqlarına əməl edib qadağan etdiklərindən çəkinməklə olur. Uca Allah buyurur: ﴾***Kim yaxşı əməl sahibi olub özünü Allaha təslim edərsə, o artıq ən möhkəm ipdən yapışmış olur. Bütün işlərin axırı Allaha gəlib çıxacaqdır!***﴿ (Loğman: 22). Bu, itaətkarlıq göstərməyin kamil məqamıdır.

**❺ Sadiq olmaq:** Bu kəlməni deyərkən yalançılığın əksi olan sadiqliyi nümayiş etdirmək. Kim bu kəlməni yalnız dili ilə deyər qəlbi isə onu yalanlayarsa, o münafiqdir. Uca Allah münafiqləri məzəmmət edərək buyurur: ﴾***Onlar ürəklərində olmayanı dilləri ilə deyirlər...***﴿ (əl-Fəth: 11).

**❻ Məhəbbət:** Mömin bu kəlməni, ona əməl etməyi və ona əməl edənləri sevməlidir. Bəndənin rəbbinə olan sevgisinin əlaməti, nəfsinin istəyini tərk edib, Allahın istədiklərini üstün tutmaq, Allahı və rəsulunu dost tutanları dost tutmaq, düşmən olanlara düşmən olmaq, Peyğəmbərinə (*Səllallahu aleyhi və səlləm*) itaət etmək, onun yolunu tutmaq və şəriətini qəbul etmək.

**❼ İxlaslı olmaq:** Bu kəlməni deməkdə məqsədi yalnız Allahın rizasını qazanmaq olmalıdır. Uca Allah buyurur: ﴾***Halbuki onlara əmr edilmişdir ki, Allaha – dini yalnız Ona məxsus edərək ibadət etsinlər...***﴿ (əl-Bəyyinə: 5). Peyğəmbər (*Səllallahu aleyhi və səlləm*) demişdir: ***"Həqiqətən Allah Onun rizasını qazanmaq məqsədi ilə lə ilahə illəllah kəlməsini deyənləri cəhənnəm atəşinə haram etmişdir"***. Buxari.




# Muhəmmədən rəsuləllah

**Muhəmmədin Allahın elçisi olduğuna şəhadət vermək.**

Ölən insan qəbrində imtahan olunub üç sual ilə sorğu-sual olunur. Suallara cavab verən nicat tapır, cavab vermədikdə isə həlak olur. Həmin suallardan biri də **"Peyğəmbərin kimdir?"** – sualıdır. Dünyada olarkən bu kəlmənin şərtlərinə əməl edən kimsə Allah tərəfindən müvəffəqiyyət qazanaraq, qəbirdə isə Allahdan ilham alaraq suala cavab verə biləcəkdir. Bu kəlmə ona mal-dövlət və övlad köməyi fayda verməyən axirət günündə də ona xeyir verəcəkdir. Bu şərtlər aşağıdakılardır:

**❶ Muhəmməd Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) əmr etdiyi işlərdə ona itaət etmək:** Uca Allah ona itaət etməyi bizə əmr edərək deyir: ﴾***Peyğəmbərə itaət edən kimsə, şübhəsiz ki, Allaha itaət etmiş olur...***﴿ (Nisa: 80). ﴾*(Ya Rəsulum!)* **De: "Əgər siz Allahı sevirsinizsə, mənim ardımca gəlin ki, Allah da sizi sevsin...**﴿ (Ali İmran: 31). Cənnətə mütləq şəkildə daxil olmaq ona mütləq itaətdən asılıdır. Peyğəmbər ﷺ demişdir: "***Yalnız imtina edənlərdən başqa ümmətimin hamısı cənnətə daxil olacaq.***" Orada olanlar: Ey Allahın elçisi, bundan kim imtina edər? – dedilər. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) dedi: "***Kim mənə itaət edərsə, cənnətə daxil olar, asilik edən isə, imtina etmiş olar.***" *Buxari*. Kim Peyğəmbəri (*Sallallahu aleyhi və səlləm*) sevirsə, ona itaət etməlidir. Çünki itaət etmək sevməyin səmərəsidir. Kim Peyğəmbərə (*Sallallahu aleyhi və səlləm*) itaət etməyib, onun yolunu tutmayıb, onu sevdiyini iddia edirsə, o, öz iddiasında yalançıdır.

**❷ Dediklərini təsdiqləmək:** Kim şəhvətinə və nəfsinə uyaraq Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) dediyi dəqiq məlumatı yalan hesab edərsə, Allahı və rəsulunu yalançı saymış olar. Çünki Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) səhv etməkdən və yalan danışmaqdan qorunmuşdur. ﴾**O, kefi istəyəni** *(havadan)* **danışmır.**﴿ (ən-Nəcm: 3).

**❸ Onun qadağan etdiklərindən əl çəkmək:** İlk olaraq ən böyük günah olan şirkdən, sonra digər böyük və kiçik günahlardan, bəyənilməyən *(məkruh)* əməllərdən əl çəkmək lazımdır. Müsəlmanın imanı Peyğəmbərinə (*Sallallahu aleyhi və səlləm*) olan sevgisi qədərində artar. İmanı artdıqca, Allah da ona yaxşı işləri sevdirər, küfrə, fasiqliyə və asiliyə isə nifrətini artırar.

**❹ Allaha Peyğəmbərinin (*Sallallahu aleyhi və səlləm*) dili ilə deyilən şəriətlə ibadət etmək:** İbadət əsasən, qadağa üzərində qurulmuşdur. Allaha yalnız Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) gətirdiyi şəriət ilə ibadət etmək lazımdır. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: "***Kim bizim demədiyimiz bir işi görərsə, etdiyi rədd olunar.***" (Müslim).

*Faydalı məlumat:* Peyğəmbəri (*Sallallahu aleyhi və səlləm*) və onun gətirdiyi şəriəti sevmək hər bir müsəlman üçün vacibdir. Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) şəriətindən nəyəsə nifrət etmək küfrdür; Şəriət əhkamına nifrət edə-edə əməl etsə də hökmü yenə küfrdür. Peyğəmbərə (*Sallallahu aleyhi və səlləm*) mücərrəd sevgi bəsləmək kifayət deyil. O, sənin

üçün hər şeydən – hətta özündən sevimli olmalıdır. İnsan sevdiyini üstün tutar və ona uyğun davranar. Öz sevgisində Peyğəmbərə (*Sallallahu aleyhi və səlləm*) sadiq olan insan, əməllərində özünü ona oxşadan, söz və əməl ilə sünnəsinə riayət edən, əmrlərinə bağlanıb qadağalarından çəkinəndir. Həmçinin çətin və xoş anlarında onun əxlaqı ilə davranan insan ona sadiqdir. İtaət etmək sevginin bəhrəsidir. İtaətsiz sevgi sədaqətli olmaz.

Peyğəmbəri (*Sallallahu aleyhi və səlləm*) sevməyin əlamətləri çoxdur. Onlardan aşağıdakıları demək olar:

❁ Onun adını çox çəkmək və çoxlu salavat demək. İnsan sevdiyinin adını çox çəkər.

❁ Onunla Qiyamət günündə görüşmək arzusunda olmaq. Sevən insan sevdiyini görməyə can atar.

❁ Onun adı çəkiləndə hörmət göstərmək. İshaq adlı alim deyir: "Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) vəfat edəndən sonra əshabələri onun adını çəkəndə onu hörmətlə anır, təsirlənir və kədərlənirdilər".

❁ Ona nifrət edənə nifrət etmək, düşmənçilik edənə düşmənçilik etmək. Sünnəsinə müxalif olanlardan və dininə yeniliklər *(bidətlər)* əlavə edən bidətçi və ikiüzlülərdən uzaq olmaq.

❁ Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) sevdiyi insanları – həyat yoldaşları da daxil olmaqla əhli-beytini, mühascir və ənsarlardan olan əshabələrini sevmək. Onun düşmən kimi qəbul etdiklərini düşmən kimi qəbul etmək, nifrət etdiklərinə nifrət etmək. Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) nümunəvi əxlaqına əməl etmək də bu qəbildəndir. O, insanlar arasında ən nümunəvi əxlaq sahibi idi. Aişə رضي الله عنها deyir: "Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) əxlaqı Qurani-Kərim idi". Yəni o, Quranın ona əmr etdiklərinə əməl etməyi özünə borc bilirdi.

Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) vəsfi haqqında bunları demək olar: O, cəngavər və qızğın döyüş meydanında çox şücaətli idi. O, çox səxavətli və comərd idi, ələlxüsus ramazan ayında. O, insanlar üçün xeyir sevən və mülayim idi. Heç vaxt, heç kəsdən özünə görə qisas almamışdır. Allahın əmrlərini qorumaqda hər kəsdən məsuliyyətli idi. Fəxr etmək məqamı gələndə hər kəsdən təvazökar olardı. O, pərdə arxasından çıxmamış bakirə qızdan da çox həya sahibi idi. O, ailəsi üçün ən xeyirxah, məxluqat üçün mərhəmətli idi. Onun bu kimi vəsfləri çoxdur.




# ŞƏRİİ PAKLIQ
*(Təharət)*

Namaz İslamın ikinci əsasıdır. Onun düzgün olması üçün şəriətin tələb etdiyi qaydada təmizlənmək lazımdır. Bu təmizlik su və ya torpaq ilə olur.

**Suyun növləri: 1.** Özü təmiz olub başqasını da təmizləyən **təmiz su. 2.** Az miqdarda olduqda natəmiz şeylərlə çirklənmiş, çox miqdarda olduqda isə natəmizliklə dadı, rəngi və ya iyi dəyişmiş **murdar su.**

**Diqqət!** Çirkab qatılmış su çox miqdarda olduqda onun rəngi, dadı və ya iyi dəyişmədikcə murdar olmaz. Az miqdarda olan su çirkabın toxunması ilə murdar olur. Su iki qüllədən, yəni 210 lr-dən artıq olduqda çox sayılır.

**Qablar:** Qızıl və gümüş qablardan başqa, hər bir qabı istifadə etmək olar. Qızıl və gümüş qabda təmizlənən pak olur, amma bu qablardan istifadə etdiyinə görə günah qazanır. Həmçinin kafirlərin qab-qacaqlarını və paltarlarını istifadə etmək icazəlidir. Yalnız bunların murdarlığı isbat olunduqda qadağan olunur.

**Ölmüş heyvanın dərisi:** Bu birmənalı olaraq murdar sayılır. Ölmüş heyvan iki növ ola bilər: **1.** Əslən əti yeyilməyən. **2.** Kəsilmədən ölmüş, əti yeyilən heyvan. Bu növ heyvanın dərisi aşılanarsa, onu sulu işlərdə deyil, quru işlərdə istifadə etmək olar.

**Subaşından təmizlənmək *(əl-İstinca)*:** Ön və arxa ifrazat orqanlarından xaric olan natəmizliyin təmizlənməsi su ilə olduqda istinca, daş və ya kağız ilə olduqda isticmar adlanır. İsticmar etmək üçün istifadə olunan vasitə pak, icazəli və təmizləyici olmalı, yeyinti məhsulu olmamalıdır. Bu təmizlikdə üç və daha artıq daş istifadə olunmalıdır. İfrazat çıxışlarından xaric olan hər ifrazata görə istinca və ya isticmar etmək vacibdir.

Subaşında ehtiyacını ödəyərkən aldığı vəziyyətdə lazımi qədərdən artıq qalmaq haramdır. Həmçinin su mənbələrinə, istifadə olunan yola, insanların dincəldikləri kölgəliklərə, meyvəli ağacın altına və açıq sahədə üzünü qibləyə tərəf tutub, subaşına çıxmaq da haramdır.

Subaşına gedən insanın üzərində Allahın adı olan əşyanı özü ilə aparması və ya bu zaman danışması bəyənilmir *(məkruhdur)*. Həmçinin çala yerlərə yüngül subaşı etmək, sağ əl ilə övrət yerinə toxunmaq və bağlı yerdə qibləyə tərəf dönmək bəyənilmir *(məkruhdur)*. Bunları yalnız zərurət halında etmək olar.

Ehtiyacını ödəyən insanın təmizlənərkən yumaq və ya silmək saylarını tək sayda etməsi, eyni anda həm sudan, həm də daş *(kağız və s.)* istifadə etməsi müstəhəbdir.

**Misvaklanmaq:** Əl-Ərak ağacının çubuqları kimi yumuşaq çubuqlardan misvak kimi istifadə etmək sünnədir. Namazdan, Quran oxumadan və dəstəmazda ağzını yaxalamadan öncə, yaxud yuxudan oyanandan sonra, həmçinin məscidə və ya evə daxil olduqda, ağız boşluğunun qoxusu dəyişdikdə və s. hallarda misvakdan istifadə etmək daha gərəklidir. Misvaklanmaq və dəstəmaz almaq kimi işləri sağ tərəfdən başlamaq, natəmizlikləri isə sol əl ilə təmizləmək **sünnədir.**

**Dəstəmaz:** Dəstəmazın əsas əməlləri bunlardır; **1.** Üzü bir dəfə yumaq. Bura ağız və burnun yuyulması da daxildir. **2.** Əllərin dirsəklərə qədər bir dəfə yuyulması. **3.**Başın hər tərəfinə bir dəfə məsh etmək. Qulaqlara məsh etmək də buraya daxildir. **4.**Ayaqları topuqlara qədər yumaq. **5.** Tərtib. **6.** Ardıcıllıq.

**Dəstəmazın müstəhəb əməlləri isə bunlardır:** misvaklanmaq, əvvəldə əlləri yumaq, ağız və burunu üzdən öncə yaxalamaq və oruc olmadıqda bu əzaları dərindən təmizləmək, yaş barmaqları qalın saqqalın aralarına çəkmək, barmaqların aralarını

sürtmək, sağ əzalardan başlamaq, əzaları iki və ya üç dəfə yumaq, sağ əl ilə buruna su alıb, sol əl ilə təmizləmək, əl ilə əzaları sürtmək, dəstəmazı tam rahat şəkildə almaq və sonra bəlli duanı oxumaq.

**Dəstəmazın vacib əməlləri:** Əvvəldə "*Bismillah*"[1] demək. Gecə yuxusundan oyanan insanın əlini su qabına salmadan öncə əllərini üç dəfə yaxalaması.

**Dəstəmazın bəyənilməyən *(məkruh)* əməlləri:** Çox soyuq və ya isti su ilə dəstəmaz almaq. Bir əzanı üçdən artıq sayda yumaq. Əzalarda qalan suyu çırpmaq. Gözün içərisini yumaq. **Dəstəmazdan sonra əzaları qurulamaq isə icazəlidir.**

**Diqqət!** Ağızı yaxalayarkən suyu ağızda çalxalamaq lazımdır. Burunu yaxalayarkən suyu təkcə əl ilə deyil, həm də nəfəs ilə buruna çəkmək və elə də geri çıxartmaq lazımdır. Ağız və burunun təmizlənməsi yalnız bu qaydada doğru sayılır.

**Dəstəmazın təsviri:** Dəstəmaz almaq istəyən qəlbi ilə niyyət etməli, sonra bismilləh deyib əllərini üç dəfə yuyur, ağzını və burnunu yaxalayır, sonra üzünü *(baş tüklərinin bitən yerindən alt çənəyə qədər uzununa, bir qulaqdan digər qulağa qədər eninə)* yuyur, sonra bilək də daxil olmaqla əllərini dirsəklərlə birlikdə yuyur, sonra üz tərəfdən başlayıb, başın arxa tərəfinə qədər qulaq arxası dəri də daxil olmaqla məsh edir, sonra şəhadət barmaqlarını qulaq boşluqlarına daxil edib, baş barmaqlarla qulağının arxasına məsh edir, sonda isə ayaqlarını topuqlarlarla birlikdə yuyur.

**Diqqət!** Saqqal qalın deyilsə, üz dərisi yuyulmalı, qalındırsa, saqqalın üst tərəfi yuyulmalıdır.

**Xofların üzərinə məsh etmək:** Xoff dəridən və ya oxşar şeylərdən tikilən ayaq geyimidir. Yun və oxşar mallardan hazırlandıqda corab adlanır. Xofların üzərinə yalnız dəstəmaz aldıqda məsh etmək olar və bunun üçün aşağıdakı şərtlər tamamlanmalıdır: **1.** Xufları tam dəstəmaz alıb, ikinci ayağını yuduqdan sonra geyinmək. **2.** Təmizliyi su ilə etmək. **3.** Ayağa geyinilən geyim yuyulması vacib olan yerləri örtməlidir. **4.** Geyim geyinilməsi icazəli olan geyimlərdən olmalıdır *(yəni oğurluq, yaxud ipəkdən hazırlanmış olmamalıdır)*. **5.** Geyim pak olmalıdır.

**Əmmamənin də üzərinə məsh etmək olar,** amma bunun üçün aşağıdakı şərtlər tamamlanmalıdır: **1.** Əmmamə kişi geyimi kimi nəzərdə tutulmalıdır. **2.** Adətən əmmamə başın hansı hissələrini örtürsə, o yerləri örtməlidir. **3.** Məsh etmək qüslün deyil, dəstəmazın pozulmasına görə olmalıdır. **4.** Təmizlik su ilə aparılmalıdır.

**Qadın hicabının üzərinə də məsh etmək olar** və bunun üçün də müəyyən şərtlər tamamlanmalıdır: **1.** Baş örtüyü qadınlara xas olmalıdır. **2.** Baş örtüyü boğazdan örtülməlidir. **3.** Məsh etmək qüslün deyil, dəstəmazın pozulmasına görə olmalıdır. **4.** Təmizlik su ilə aparılmalıdır. **5.** Adətən hicab başın hansı hissələrini örtürsə, o yerləri örtməlidir.

**Məshin müddəti:** Daimi yaşadığı yerdə olan insan bir, səfərdə olub namazları qısaltmaq güzəştinə sahib olan insan isə üç sutka müddətində məsh edə bilər.

**Daimi yaşadığı yerdə yaşayan insan üçün məsh müddətinin başlama anı,** geyimi geyindikdən sonra dəstəmazı pozulduqda etdiyi ilk məshin vaxtından başlayıb ertəsi gün həmin vaxta qədər *(24 saat)* davam edir.

---

[1] Dəstəmazın əvvəlində "bismilləh" deməyin hökmü barədə alimlərin fikir ayrılığı mövcuddur. Bəziləri bunu vacib, bəziləri isə müstəhəb hesab edirlər. *(tərc.)*

*Faydalı məlumat:* Kim səfərdə olarkən məsh çəkib sonra daimi yaşadığı yerə gələr, yaxud yaşadığı yerdə olarkən məsh çəkib sonra səfərə çıxar, yaxud məshin başlama vaxtını xatırlamazsa yaşadığı yerdə yaşayan adam kimi *(24 saat)* məsh çəkməlidir.

**Gibs və sarğının üzərinə məsh etmək olar,** amma bunun üçün müəyyən şərtlər tamamlanmalıdır: 1. Sarğı ehtiyac üzündən daşınmalıdır. 2. Sarğı ehtiyac yerindən artıq yeri tutmamalıdır. 3. Dəstəmazın digər əzalarından sonra dərhal məsh etmək lazımdır. Əgər sarğı ehtiyac olan yerdən artıq yeri tutarsa, sarğını bu yerlərdən açmaq lazımdır. Əgər sarğının bu yerlərini açıb zərər görməkdən ehtiyat edərsə, sarğının üzərinə məsh edə bilər.

**Xoffun məsh çəkilən hissəsi,** ən çox halda ayaq barmaqlardan başlayıb topuqların üst hissəsinə qədərdir. Məsh edərkən əl barmaqlarını da aralı tutub, məsh etmək lazımdır.

**Faydalı məlumatlar:** ❁ Birinci sağ ayağa deyil, hər ikisinə eyni anda məsh etmək daha yaxşıdır. ❁ Xoffun altına və ya arxasına məsh etmək sünnədən deyil. Əgər xoffun yalnız bu hissələrinə məsh etməklə kifayətlənərsə, məshi düzgün sayılmaz. ❁ Xufflara məsh etmək əvəzinə, onları yumaq və ya məshi təkrarlamaq məkruhdur. ❁ Əmmamə və hicabın əksər hissəsinə məsh etmək vacibdir.

**Dəstəmazı pozan amillər:** 1. Ön və arxa ifrazat yerlərindən xaric olan yel və ya sperma kimi təmiz, yaxud sidik və ya məzi kimi nəcisin çıxması. 2. Yatmaqla və ya ürəyi getməklə ağlına hakim olmamaq. Oturaq halda və ya ayaq üstdə mürgüləmək müstəsnadır. 3. Kiçik və ya böyük subaşının adət olunmayan yerdən çıxması. 4. Kiçik və ya böyük subaşından başqa, bədəndən hər hansı murdar şeyin, qan və s. – çox miqdarda xaric olması. 5. Dəvə ətinin yeyilməsi. 6. Əl ilə övrət yerinə toxunmaq. 7. Arada heç bir maneə olmadan kişinin qadına və ya qadının kişiyə şəhvətlə toxunması. 8. Dindən çıxmaq.

Kim dəstəmazlı olduğunu yəqin bilib, onun pozulmasını ehtimal edər və ya dəstəmazının pozulmasını yəqin bilib pozulmadığını ehtimal edərsə, yəqin olduğu fikirə qərar verməlidir.

**Qüsl:** Qüslü vacib edən hallar bunlardır: 1. Spermanın ləzzət ilə çıxması. Yaxud yatmış insandan ləzzətlə və ya ləzzətsiz çıxması. 2. Orqanın baş hissəsinin qadının orqanında itməsi. Hətta boşalma olmasa belə. 3. Kafirin və ya mürtədin islamı qəbul etməsi. 4. Aybaşı qanının ifrazı. 5. Nifas qanının çıxması. 6. Müsəlmanın ölməsi. **Qüslün fərz əməlləri:** Qüsl alarkən bədənin hər hissəsinə, eləcə də ağız və buruna su vurmaq kifayətdir. **Qüslün kamil şəkildə alınması doqquz əməllə tamamlanır:** 1. Niyyət. 2. Bismilləh demək. 3. Əllərini qaba salmadan öncə onları üç dəfə yumaq. 4. Ayıb yerlərini və ətrafını yumaq. 5. Dəstəmaz almaq. 6. Başına üç dəfə su tökmək. 7. Bədəninə su vurmaq. 8. Yaş əl ilə bədənini sürtmək. 9. Sağ tərəfdən başlamaq.

**Dəstəmazı olmayan insanın bunları etməsi haramdır:** 1. Qurana əl vurmaq. 2.Namaz qılmaq. 3. Kəbəni təvaf etmək. Qüslsüz adama isə bunlarla yanaşı, aşağıdakılar da qadağan olunur: 4. Quran oxumaq. 5. Məsciddə dayanmaq. Boynunda qüsl olan insanın dəstəmaz almamış yatması və təmizlənərkən suyu israf etməsi məkruhdur.

**Təyəmmüm almaq üçün aşağıdakı şərtlər olmalıdır: 1.** Su tapmadıqda. **2.**Təyəmmümü pak, mübah, tozlu, yanmamış torpaq ilə almaq. **Təyəmmümün əsas əməlləri** üzə və əllərin bilək hissəsinə qədər tam məsh etmək, ardıcıllğı və tərtibi qorumaqdır. **Təyəmmümü pozan amillər: 1.** *Dəstəmazı pozan amillər.* **2.** Su olmadığı üçün təyəmmüm edən su tapdıqda. **3.** Təyəmmüm etməyə imkan verən amil, xəstəlik və s. – aradan qalxdıqda. **Təyəmmümün sünnə əməlləri: 1.**Ardıcıllığa və tərtibə riayət etmək. **2.** Təyəmmümü namazın son vaxtına qədər saxlamaq. **3.** Təyəmmümdən sonra dəstəmazdan sonra oxunan duanı oxumaq. **Təyəmmümün məkruh əməlləri.** Torpağa bir dəfədən artıq əli ilə sürtmək.

**Təyəmmüm etməyin qaydası:** Təyəmmüm etməyə niyət edərək, bismilləh deyib, əllərinin iç hissəsini bir dəfə torpağa vuraraq üzünə və saqqalına, sonra sol əlinin içi ilə sağ əlinin, sağ əlinin içi ilə də sol əlinin üzərinə məsh edir.

**Murdar şeyləri təmizləməyin qaydası; Canlılar:** Canlılar murdar və paklıq baxımından iki qismə bölünürlər: **1. Murdar *(nəcis)* olanlar:** Məsələn, it, donuz və əsası bunlardan olan hər şey, eləcə də əti yeyilməyən quşlar və yaradılış baxımından pişikdən böyük olan heyvanlar. Bu növ heyvanların sidiyi, peyini, təri, ağız suyu, sperması, südü və qusuntusu murdar *(nəcis)* sayılır. **2. Pak olanlar:** Buraya isə üç qism daxildir: **A.** İnsan. İnsanın sperması, təri, ağız suyu, südü, burun ifrazatı, bəlğəmi, qadın cinsiyyət orqanındakı nəmlik və digər bütün ifrazatları pakdır. Yalnız sidik, nəcis, məzi, vədi və qan murdar sayılır. **B.** Əti yeyilən heyvanlar və onların sidiyi, peyini, sperması, südü, təri, ağız suyu, burun ifrazatı, qusuntusu, məzisi və vadisi təmiz hesab olunur. **C.** O heyvanlar ki, özünü onlardan qorumaq çətindir. Məsələn eşşək, pişik, siçan və s. Bu kimi heyvanların yalnız ağız suyu və təri pak hesab olunur.

**Meyitlər:** İnsan, balıq, çəyirtkə, eləcə də əqrəb, qarışqa və ağcaqanad kimi bədənində axar qan olmayan canlıların ölüsündən başqa, bütün ölülər murdar sayılır.

**Cansızlar:** Yuxarıda deyilən murdar şeylərin cansızları istisna olmaqla yer, ağac və s. bu kimi cansızlar pak sayılır.

**Faydalı məlumatlar:** ✸ Qan, qusuntu və irin murdardır. Pak heyvanın az miqdarda olan bu ifrazatları namaz və digər hallarda bağışlanandır. ✸ İki növ qan pakdır. **1.** balıq qanı. **2.** kəsilmiş heyvanın ətində və damarlarında qalan qan. ✸ Əti yeyilən heyvan sağ ola-ola ondan qoparılan parça, qan laxtası və rüşeym murdar sayılır. ✸ Murdar şeyləri təmizləmək üçün niyət etmək lazım deyil. Məsələn əgər murdarlıq yağışın yağması ilə gedərsə, pak sayılar. ✸ Murdar şeyə əl ilə toxunmaq, yaxud ayaq ilə tapdalamaq dəstəmazı pozmur. Sadəcə olaraq, bədənin və paltarın harasına dəyibsə, oranı da təmizləmək lazımdır. ✸ Murdar şeylər aşağıdakı şərtlərlə təmizlənir. **1.** Təmiz su ilə yumaq. **2.** Əgər sıxılan şeydirsə, onu suyun xaricində sıxmaq. **3.** Yumaqla təmiz olmursa, batan yeri qaşımaq. **4.** İtin murdarladığı şeyi təmizləmək üçün yeddi dəfə su ilə, səkkizincidə isə torpaq və ya sabun[1] ilə yumaq lazımdır.

---

[1] Müəllif bu murdarlığın sabun ilə təmizlənməsini qeyd etmişdir. Lakin daha əsaslı görüşə görə, bu təmizlik tam olaraq yalnız torpaqla həyata keçirilə bilər.

**Qeydlər:** ❁ Yerə düşən murdar şey sidik kimi maye halındadırsa, onun üzərinə su töküb murdarlığı, iyini və rəngini itirmək kifayətdir. Yox, əgər murdar şey peyin kimi cisimlidirsə, murdar şeyin özünü və izini itirmək lazımdır. ❁ Murdarlıq sudan başqa, bir şeylə təmizlənmirsə, onu su ilə təmizləmək lazımdır. ❁ Əgər murdar olan yer dəqiq bilinmirsə, onun yuyulduğuna əmin olmaq üçün həmin yer tam yuyulmalıdır. ❁ Nafilə namazı qılmaq üçün dəstəmaz alan insan həmin dəstəmazla fərz namazı qıla bilər. ❁ Yatan və ya yel çıxan insan ifrazat orqanlarını yumamalıdır. Çünki yel pakdır. Belə halda namaz qılmaq və ya başqa iş üçün dəstəmaz almaq kifayətdir.

## Qadınlardan təbii yolla ifraz olunan aybaşı[1] və istihazə[2] qanı ilə bağlı əhkamlar.

| Sual | Şəriət qaydası |
|---|---|
| Qadının aybaşı olduğu az və çox yaş həddi nədir? | Aybaşı olmaq üçün ən az yaş həddi doqquzdur. Əgər bu yaşdan əvvəl qan ifraz olunarsa, bu istihazədir. Çoxu üçün isə yaş həddi yoxdur. |
| Aybaşı ən azı neçə gün davam edə bilər? | Ən azı bir sutka. Əgər az olarsa, bu istihazə sayılır. |
| Aybaşı ən çox neçə gün davam edə bilər? | Ən çox on beş gün davam edə bilər. Sonrakı günlərdə gələn qan istihazə qanıdır. |
| İki aybaşı arasında neçə gün təmizlik müddəti ola bilər? | Bu müddət on üç gün olmalıdır. Bu günlər tamamlanmadan öncə qan gələrsə, istihazə sayılır. |
| Adətən qadınlar ayın neçə günü aybaşı olurlar? | Bu altı və ya yeddi gün olur. |
| Adətən qadınlar ayın neçə günü aybaşıdan pak olurlar? | Adətən ayın iyirmi üç və ya iyirmi dörd günü pak olurlar. |
| Hamiləlik dövründə ifraz olunan qan aybaşı qanıdırmı? | Hamiləlik dövründə ifraz olunan qan, sarı və məxməri rəngli ifrazat istihazə sayılır. |
| Aybaşı qadın təmizləndiyini nə ilə bilir? | 1. Ola bilər bəzi qadınlarda ağ rəngli ifrazat çıxsın. 2. Əgər ağ rəngli ifrazat çıxmırsa, o zaman orqandan qanın, sarı və məxməri ifrazatın kəsilməsi ilə aybaşının bitməsini bilmək mümkündür. |
| Təmizlik müddətində orqandan ifraz olunan maye. | Əgər maye şəffaf, yaxud ağ və yapışqandırsa, təmiz sayılır. Əgər qan, sarı və ya məxməri mayedirsə, murdar hesab olunur. Bütün bunlar dəstəmazı pozur. İfrazat davamlı olarsa, istihazədir. |
| Orqandan ifraz olunan sarı və məxməri maye | Əgər bu maye aybaşıdan əvvəl və ya sonra ona birləşik çıxarsa, aybaşıdan sayılır. Yox əgər ayrı çıxarsa, istihazədir. |
| Hər ay müəyyən günlərdə aybaşı olub bəzən bu müddətdən öncə təmizlənərsə? | Adət etdiyi aybaşı günləri bitməmiş qan tez kəsilər və təmizlik əlamətlərini görərsə, təmiz sayılır. |
| Aybaşının adət | Aybaşı qanının vəsfinə uyğun gələn qan hər halda aybaşı qanı hesab |

[1] **Aybaşı,** heç bir xəstəlik olmadan qadınlardan vaxtaşırı ifraz olunan qandır.
[2] **İstihazə:** Bu, xəstəlik səbəbi ilə ana bətninin aşağı hissəsindəki damarlardan axan qandır. Aybaşı ilə istihazə arasındakı fərq bunlardan ibarətdir: 1. Aybaşı qanı qırmızı, qara rəngə meyilli olub, tünd rəngli olur. İstihazə qanı isə burundan axan qan kimi açıq qırmızı rəngli olur. 2. Aybaşı qanı qatı və parça-parça qanlarla müşahidə olunur. İstihazə qanı isə, kəsilmiş yaradan axan qan kimi duru olur. 3. Aybaşı qanı adətən kəskin və xoşagəlməz iyli olur. İstihazə qanı isə adi qan iyi verir. **İbadətlərə təsiri:** Böyük natəmizlik halında olan insana etməsi qadağan olunan: namaz qılmaq, məsciddə oturmaq, Quran oxumaq, oruc tutmaq və s. bu kimi – əməllər, o cümlədən cinsi yaxınlıq etmək aybaşı qadına da qadağandır.

| | |
|---|---|
| olunan vaxtdan öncə və ya sonra başlaması? | olunur. Bir şərtlə ki, iki aybaşı arasından (*təmizliyin ən az müddəti olan*) on üç gündən çox vaxt keçsin. Əks halda, bu istihazə sayılır. |
| Əgər aybaşı adət olunan müddətdən az və ya çox davam edərsə? | Bu müddət aybaşı sayılır. Lakin bir şərtlə ki, bu müddət aybaşının çox həddi sayılan on beş gündən çox olmasın. |
| Əgər qadından bir ay və ya daha uzun müddətdə qan ifraz olunarsa? | Bunun üç həlli vardır: 1. Hər ay nə vaxt və neçə gün aybaşı olduğunu bilirsə, aybaşı qanını başqa qandan fərqləndirə bilsə də, belə halda qanın necəliyinə deyil, nə vaxt və neçə gün aybaşı olduğuna uyğun əməl etməlidir. 2. Nə vaxt aybaşı olduğunu bilib, lakin aybaşının keçmiş adəti üzrə neçə gün davam etdiyini bilməyən qadın, bildiyi gündən başlayaraq, altı və ya yeddi gün aybaşı müddəti saxlayır. Bu, əksər qadınların adət etdikləri aybaşı günləridir. 3. Neçə gün aybaşı olduğunu bilib, amma ayın hansı günündə başladığını bilməyən qadın hər hicri ayının əvvəlindən başlayaraq, bəlli günləri aybaşı olaraq adət etməlidir. |

## Qadınlardan təbii yolla ifraz olunan nifas qanı *(doğuşdan sonrakı qanaxma)* ilə bağlı əhkamlar.

| Sual | Şəriət qaydası |
|---|---|
| Doğuşdan sonra qan gəlməzsə, | Bu halda nifas sayılmır və qüsl almaq da vacib olmur. Əgər orucdursa, orucu da pozulmur. |
| Doğuş əlamətlərini görərsə, | Doğuşdan öncə ağrı hissləri ilə ifraz olunan qan və suyun ifrazı nifasa daxil deyil. Bu istihazə sayılır. |
| Doğuş zamanı ifraz olunan qan | Uşaq tam və qismən çıxmasa da, bu qan nifas qanıdır. Bu zaman qılınmayan namazların qəzası qılınmır. |
| Nifas günləri hansı andan hesablanır? | Uşaq tam olaraq ana bətnindən çıxdıqdan sonra. |
| Nifas ən azı neçə gün davam edə bilər? | Nifasın azı üçün vaxt məhdudiyyəti yoxdur. Doğuşdan dərhal sonra qan kəsilərsə qüsl almalı və namazlarını qılmalıdır. Qırx günün bitməsini gözləmək lazım deyil. |
| Nifas ən çox neçə gün davam edə bilər? | Ən çox qırx gün davam edə bilər. Bu vaxtdan sonra ifrazat davam edərsə, nifas sayılmır. Belə halda qadının qüsl alıb namazlarını qılması vacib olur. Əgər bu müddət hamiləlikdən əvvəl adət etdiyi aybaşı günləri ilə üst-üstə düşürsə, bunu aybaşı kimi qəbul etməlidir. |
| Əkiz və ya daha çox uşağı olan qadının nifası nə zamandan başlayır? | Birinci uşaq olandan sonra nifas vaxtı başlayır. |
| Yarımçıq düşmüş uşaqdan sonra ifraz olunan qan | Əgər düşmüş uşaq səksən günlük və ya azdırsa, istihazə olur. Əgər doxsan günlük və daha artıqdırsa, bu nifas sayılır. Əgər səksən və doxsan gün arasındadırsa, bu uşağın yaradılış mərhələsindən asılıdır. Əgər rüşeym insan şəklinə düşübsə, bundan sonra ifraz olunan qan nifas, əks halda, istihazə qanıdır. |
| Qadın qırx gün ərzində təmizlənib və deyilən vaxt bitməmiş bir daha qan ifraz olunub | Qadın qırx gün ərzində təmizlik müşahidə etdiyi hallarda çimib təmizlənir və namazlarını qılır. Əgər qırx gün ərzində yenidən qan ifrazatı başlayarsa, nifasa aid olur. Qırx gün bitənə qədər bu qaydaya əməl olunmalıdır. |

**Qeydlər:** ✽ Boynunda qüsl olan insana etməsi haram olan əməllər aybaşı və nifaslı qadınlara da haramdır. ✽ İstihazəli qadının namaz qılması vacıbdir. Amma hər

namazdan öncə dəstəmaz almalıdır. ❁ Əgər qadın günəş batmadan öncə aybaşıdan və ya nifasdan təmizlənərsə, həmin günün zöhr və əsr namazlarını qılmalıdır. Əgər sübh namazının vaxtı girməmiş təmizlənərsə, o zaman həmin gecənin məğrib və işa namazlarını qılmalıdır. ❁ Namazın vaxtı daxil olduqdan sonra namazı qılmadan öncə aybaşı və ya nifas olan qadın həmin namazın qəzasını qılmalıdır. ❁ Aybaşıdan və nifasdan qüsl alarkən hörüklərini açmalıdır. Cənabət qüslü aldıqda isə bunu etmək vacib deyil. ❁ Aybaşı və nifaslı qadınlarla oynaşmaq və həzz almaq olar, amma cinsi əlaqəyə girmək haramdır. ❁ İstihazəli qadınla cinsi əlaqəyə girmək məkruhdur. Ərin buna ehtiyacı olduğu halda icazəlidir. ❁ İstihazəli qadının hər namaz üçün qüsl alması müstəhəbdir. Əgər buna imkanı olmazsa, zöhr ilə əsri bir qüsl ilə, Məğrib və İşanı bir, sübh namazını da bir qüsl ilə qılsın. Beləliklə, gün ərzində üç dəfə qüsl almış olar. Əgər buna da imkanı yoxdursa, gün ərzində bir dəfə çimib sonra hər namaz üçün dəstəmaz ala bilər. Əgər buna da imkanı yoxdursa, o zaman aybaşı qüslünü aldıqdan sonra hər namaz üçün dəstəmaz alsın. ❁ Həcc və ya ümrə ziyarətlərini yerinə yetirmək, yaxud ramazan orucunu tamamlamaq üçün aybaşının qarşısını müvəqqəti alan dərmanlardan istifadə edə bilər. Bunu dərmanın ona zərər verməyəcəyinə əmin olduqdan sonra etməlidir.

**İSLAMDA QADIN:** Allah qatında savab və dərəcə, iman və əməl etibari ilə qadın və kişi eynidir. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: "***Qadınlar da kişilər kimidirlər.***" **Əbu Davud.** Qadının öz hüququnu tələb etmək, yaxud zülmə qarşı şikayət etmək haqqı vardır. İslam şəriətinin müraciəti həm kişiyə, həm də qadına aiddir. Yalnız adı çəkilib fərq qoyulan məsələlər istisnadır. Dinin digər əhkamları ilə müqayisədə belə əhkamlar çox azdır. Şəriət kişi və qadının yaradılış və bacarıq xüsusiyyətlərini nəzərə alır. Uca Allah buyurur: ❴**Məgər yaradan bilməzmi?! O, *(hər şeyi)* incəliyinə qədər billəndir, *(hər şeydən)* xəbərdardır!**❵ **(əl-Mulk surəsi).**

Qadının özünə, kişinin də özünə məxsus vəzifələri vardır. Hər hansı biri digərinin işinə qarışarsa həyatın müvazinəti itər. Hətta qadın evində otura-otura kişinin qazandığı qədər savab qazanır. Əsma bint Yəzid deyir ki, mən Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) yanına gəldim. O əshabələri ilə birlikdə oturmuşdu. Mən dedim: Atam anam sənə fəda olsun! Mən qadınların sənin yanına gələn nümayəndəsiyəm. Bilirəm ki, yer üzünün şərqində və ya qərbində yaşayan hər bir qadın mənim buraya gəlişimi bilər və dediklərimi eşidərsə onlar da eyni fikirdə olarlar. Allah səni haqq din ilə həm kişilərə, həm də qadınlara elçi göndərmişdir. Biz sənə və səni göndərən İlahına iman gətirmişik. Biz qadınlar məhdudiyyət və naqislik içərisindəyik. Evlərinizdə oturur, şəhvətlərinizi qarşılayır və övladlarınızı dünyaya gətiririk. Siz kişilər cümə və camaat namazları, xəstə ziyarəti, cənazə müşayiəti, dəfələrlə həcc ziyarəti və ən üstün əməl ilə, cihadla bizdən öndəsiniz. Siz kişilərdən hər hansınız həccə, ümrəyə və ya cəbhəyə getdikdə biz sizin mal-dövlətinizi qoruyur, paltarınızı təmizləyir, övladlarınızı tərbiyə edirik. İndi ey Allahın elçisi! Biz sizin savablarınıza nə qədər ortaq olmuş sayılırıq? Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) üzünü tam şəkildə əshabələrinə tərəf çevirib dedi: "***Heç dini haqqında bu qadından daha yaxşı sual edən başqa qadın görmüsünüzmü?!***" Əshabələr dedilər: Ey Allahın elçisi! Biz hansısa qadının belə düşünəcəyini güman etmirdik.

Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) qadına tərəf çevrilib dedi: "***Ey qadın gedə bilərsən. Digər qadınlara da çatdır ki, sizin ərinizə qarşı gözəl davranışınız, onu razı salmağınız və istəklərinə uyğun davranışınız bütün bunlara bərabərdir.***" Qadın bu sözləri eşidib sevincindən təhlil *(lə ilahə illəllah)* və təkbir *(Allahu əkbər)* deyə-deyə getdi. *Beyhəqi rəvayət edib.* Qadınlar Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) yanına gəlib dedilər: "***Ey Allahın elçisi! Kişilər Allah yolunda cihad etməklə yüksək dərəcəyə qalxdılar, bəs bizim Allah yolunda cihad edənlərin əməlinə çatmağımız üçün bir əməl varmı?***" Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) dedi: "***Sizin evinizin qayğısına qalmağınız Allah yolunda cihad edənlərin əməlinə çatır.***" Beyhəqi rəvayət edib. Yaxın qohumlardan olan qadınlara yaxşılıq etməyin də böyük savabı vardır. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: "***Kim iki qadına, yaxud iki bacıya, ya da öz qohumlarından iki qadına təmənnasız maddi yardım edər və Allah onları onun köməyinə ehtiyac duymayacaqları qədər varlandırarsa o qadınlar onun üçün cəhənnəm atəşinə manea olarlar.***" Əhməd və Təbərani.

## Qadınlara aid bəzi əhkamlar:

- Bir qadının məhrəmi[1] olmadan yad kişi ilə tənhalıqda qalması haramdır. Peyğəmbər ﷺ demişdir: "***Heç bir kişi məhrəmsiz qadınla tənha qalmasın.***" Buxari və Muslim.
- Qadının məsciddə namaz qılması icazəlidir. Əgər fitnə-fəsad təhlükəsi olarsa məkruhdur *(bəyənilmir)*. Aişə رضي الله عنها deyir: "*Əgər Peyğəmbər (Sallallahu aleyhi və səlləm) qadınların etdikləri yeni işləri görsəydi, İsrail oğullarının qadınlarına məscidlərə getmək qadağan edildiyi kimi, onlara da məscidlərə getməyi qadağan edərdi.*" *Buxari və Muslim.* Kişinin məsciddə qıldığı namazın savabı necə qat-qat artırılırsa, qadının da evində qıldığı namaz o qədər artırılır. "*Bir nəfər qadın Peyğəmbərin (Sallallahu aleyhi və səlləm) yanına gəlib dedi: Ey Allahın elçisi, mən səninlə birlikdə namaz qılmağı çox istəyirəm. Peyğəmbər (Sallallahu aleyhi və səlləm) dedi:* "***Mən bilirəm ki, sən mənimlə namaz qılmağı çox istəyirsən. Amma sənin otağında qıldığın namaz evində qıldığın namazdan daha xeyirlidir. Evində namaz qılmağın isə həyatində namaz qılmağından daha xeyirlidir. Həyatində namaz qılmağın məhəllə məscidində namaz qılmağından daha xeyirlidir. Məhəllə məscidində namaz qılmağın mənim məscidimdə namaz qılmağından daha xeyirlidir.***" *Əhməd rəvayət etmişdir.* Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: "***Qadınların ən xeyirli məscidləri onların evləridir.***" Əhməd.
- Qadının həcc və ya ümrəsi vacib deyil. Yalnız əgər məhrəmi ilə getmək imkanı olarsa vacib olar. Qadının məhrəmsiz səfərə çıxması icazəli deyil. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: "***Heç bir qadının üç gündən artıq məsafəyə məhrəmsiz səfərə çıxması halal olmaz.***" Buxari və Muslim.
- Qadının qəbirləri ziyarət və cənazəni müşayiət etməsi haramdır. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: "***Allah qəbirləri ziyarət edən qadınları lənətləmişdir.***" *Ummu Atiyyə deyir: Bizə cənazələri müşayiət etmək qadağan olundu. Bu, bizə vacib olunmadı.* Muslim.

---

[1] Qadının məhrəmi, onunla evlənməsi əbədi olaraq haram edilən kişilərdir. Onlar bu qhumlardır: ata, baba, babanın atası və s. oğul, oğulun oğulu və s. qardaş və oğlanları, bacının oğlanları, əmi, dayı, ərinin atası, babası və s. ərin oğlan uşaqları, nəvələri, süd qohumluğu olan ata, oğul, qardaş, qızının əri və anasının əri.

Qadın saçını istədiyi rəngə boyaya bilər. Yalnız qara rəngə boyamaq məkruhdur. Ərə getmək məqsədi ilə saçını qaraya boyayıb qarşı tərəfi aldadarsa haram sayılar.

Allahın qadın üçün təyin etdiyi miras payını ona vermək vacib, onu mirasdan məhrum etmək isə haramdır. Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) belə dediyi rəvayət olunur: *"Kim varisinin mirasını kəsərsə, Allah təalə də qiyamət günü onun cənnət mirasından kəsər."* İbn Macə.

Ərin arvadının xərclərini qarşılaması vacibdir. Xərclik dedikdə yemək, içmək, geyim və mənzil nəzərdə tutulur. Uca Allah buyurur: **﴾7 - Varlı-karlı olan öz varına görə *(süd haqqı)* versin. İmkanı az olan isə Allahın ona verdiyindən versin...﴿** *(Talaq)*. Əgər qadının əri yoxdursa atasının, ya qardaşının, yaxud övladının onun xərcliklərini qarşılamaları vacibdir. Əgər qadının yaxın qohumları yoxdursa, hər bir insanın onun xərcliklərini qarşılaması müstəhəb *(yaxşı)* olar. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: *"Dul qadınlara və kasıb-kusuba əl tutan Allah yolunda cihad edən, yaxud gecələri namaz qılıb günüzləri oruc tutan kimidir."* Buxari və Muslim.

Qadın ərə getmədikcə onun körpə uşağını öz yanında saxlmaq haqqı daha çoxdur. Uşaq anasının yanında qaldığı müddətdə uşağın atasının onun xərclərini anasına ödəməsi vacibdir.

Qadının, ələlxüsus gənc qızın, yaxud fitnə təhlükəsi olarsa birinci salam verməsi yaxşı deyil.

Hər cümə günü ayıb yerlərin qırxılması, qoltuqaltı tüklərin yolunması və dırnaqların tutulması müstəhəbdir. Bunu qırx gündən gec etmək isə məkruhdur.

Qaşların alınması haramdır. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: *"Qaş alan və qaşını aldıran Allah lənət etmişdir."* Əbu Davud.

**Matəm:** Qadının ərindən başqası üçün üç gündən artıq yas saxlaması haramdır. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: *"Allaha və axirət gününə iman gətirən qadının öz ərindən başqası üçün üç gündən artıq yas saxlaması halal deyil..."* Muslim. Qadının ərinə görə dörd ay on gün yas saxlaması vacibdir. Bu yas dövründə qadının bəzək-düzətdən, ətirdən, zinət əşyalarından, rəngli paltarlardan, xına qoymaqdan, makiyaj etməkdən, qara sürmədən, ətirli mayelərdən və s. imtina etməsi vacibdir. Dırnaqların tutulması, tüklərin təmizlənməsi və çimmək kimi işlər icazəlidir. Həmçinin yas dövründə müəyyən rəngli paltar qara və s. geyinmək şərt deyil. Qadın yasını əri ilə yaşadığı evdə keçirməlidir. Yas dövründə zərurət olmadan evini tərk etməsi haramdır. Gündüz vaxtı zəruri ehtiyac olmadan evindən çıxmalı deyil.

Zəruri ehtiyac olmadan qadının saçını qırxması haramdır. Kişilərə oxşamamaq şərti ilə saçını qısalda bilər. Hədisdə deyilir: *"Peyğəmbər (Sallallahu aleyhi və səlləm) özünü kişilərə oxşadan qadınları lənətləmişdir."* Tirmizi. Özünü qeyri müsəlmanlara oxşatmaq da bura daxildir. Hədisdə deyilir: *"Kim özünü bir tayfaya oxşadarsa o da onlardandır."* Əbu Davud.

**Qadın evindən çıxarkən bu şərtlərə əsasən bədənini örtməlidir:** 1. Paltar bütün bədəni örtməlidir. 2. Paltar dəbdəbəli olmamalıdır. 3. Şəffaf olmamalıdır.

4.Geniş olmalıdır. 5. Ətirli olmamalıdır. 6. Kişi geyiminə oxşamamalıdır. 7.Kafirlərin geyiminə oxşamamlıdır. 8. Şan-şöhrət paltarı olmamalıdır. Üzərində insan və ya heyvan şəkili olan paltarı geyinmək, divardan asmaq, ondan pərdə kimi istifadə etmək və satmaq olmaz. Qadının öz övrətini qoruması üçün üç hal vardır: 1. Əri onun bədənini istədiyi kimi görə bilər. 2. Qadınlar və məhrəm kişilər adətə açıq olan bədən hissələrini görə bilərlər. Məsələn üzünü, saçını, boynunu, əlini, qolunu, pəncəsini və sairə. 3. Digər kişilərin qadının deyilən bədən hissələrini görməməlidirlər. Yalnız qadınla evlənmək istəyən kişi, yaxud müalicə edən həkim bəzi hissələri görə bilər.

**Gözləmə vaxtları:** Bunun bir neçə növü vardır; **1. Hamilə:** Boşanma və ya vəfat halında gözləmə müddəti hamiləlik bitdikdən sonra başa çatır. **2. Əri ölmüş qadın:** Əri ölmüş qadının gözləmə müddəti dörd ay on gündür. **3. Aybaşı halında talaq verilmiş:** Gözləmə müddəti üç dəfə aybaşı olmaqdır. Üçüncü aybaşıdan təmizlənməklə gözləmə müddəti başa çatır. **4. Aybaşı olmayan qadın:** Onun gözləmə müddəti üç aydır. Rici, yəni qaytarılması mümkün olan talaqla boşanmış qadının gözləmə müddəti ərzində əri ilə bir evdə qalması, ərinin onu istədiyi şəkildə görməsi, tənhalıqda qalması icazəlidir. Bu hal gözləmə müddəti bitənə qədər davam edə bilər. Bəlkə Allah, onları münasibətlərini yenidən düzəltməyə müvəffəq edər. Boşanmış qadının geri qaytarılması ərin ***"mən səni geri qaytardım"*** sözü ilə, yaxud cinsi yaxınlıqla hasil olur. Qadının geri qaytarılmasında, yəni rici *(yəni qaytarılması mümkün olan)* talaqın pozulmasında qadının razılığı olmasa da, olar.

- Qadın öz-özünü ərə verə bilməz. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: *"Vəlisinin icazəsi olmadan ərə gedən qadının kəbini batildir."* **Əbu Davud.**
- Qadının parik qoyması və ya tatuirovka etməsi haramdır. Bu iki əməl böyük günahlardan hesab olunur. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: ***"Allah parik qoyanı və qoyduranı, tatuirovka edəni və etdirəni lənətləmişdir."*** **Buxari və Muslim.**
- Qadının heç bir səbəb olmadan ərindən boşanma tələb etməsi haramdır. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: *"Hər hansı qadın heç bir səbəb olmadan ərindən boşanmağı tələb edərsə, cənnətin iyi ona haram olar."* **Əbu Davud.**
- Qadının yaxşı işlərdə ərinə itaət etməsi vacibdir. Ələlxüsus onu yatağına dəvət edərsə. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: *"Bir kişi arvadını yatağına çağırar qadın isə gəlməkdən imtina edərsə, səhərə qədər mələklər ona lənət edərlər."* **Buxari və Muslim.**
- Əgər qadın yad kişilərin yanından keçəcəyini bilirsə onun ətir vurması haramdır. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: *"Əgər bir qadın kişilərin onun qoxusunu hiss etsinlər deyə ətir vurarsa, zina etmək kimi günah qazanır."* **Əbu Davud.**




# Namaz

Yerli kişilər üçün **azan və iqamənin** oxunması fərzul kifayədir. Müsafir və təklikdə olanlar üçün müstəhəb, qadınlar üçün isə məkruhdur. Azan və iqamə vaxtından əvvəl olduqda məqbul sayılmır. Yalnız sübh namazının birinci azanı gecənin yarısından sonra verilərsə, məqbul sayılar.

**Namazın şərtləri: 1.** İslam. **2.** Əql. **3.** Seçmək bacarığı. **4.** İmkan daxilində təmiz olmaq. **5.** Namaz vaxtının daxil olması. **Zöhr** namazının vaxtı günəşin zenit xəttini keçməsindən sonra hər şeyin kölgəsinin özü mislində olduğu vaxta qədərdir. Bundan sonra **əsr** namazının vaxtı başlayır. Bu namazın ixtiyari[1] vaxtı hər şeyin kölgəsi iki özü mislində olana qədər davam edir. Sonra isə günəş batana qədər zəruri[2] vaxtıdır. Günəş batdıqdan sonra **məğrib** namazının vaxtı başlayır və qırmızı üfüq itənə qədər davam edir. Sonra **işa** namazının vaxtı başlayır və ixtiyari vaxtı gecənin yarısına qədər davam edir. Sübh girənə qədər zəruri vaxtı sayılır. Sonra isə günəş çıxana qədər **sübh** namazının vaxtı davam edir. **6.** İmkan daxilində dərini bildirməyən bir şeylə övrət yerini[3] örtmək. On yaşına çatmış oğlan uşağının övrəti göbəkdən dizə qədərdir. Həddi büluğa çatmış qız uşağının üzündən başqa bütün bədəni övrətdir. **7.** İmkan daxilində bədəni, paltarı və namaz qıldığı yerdə murdarlıqdan uzaq olmaq. **8.** İmkan daxilində qibləyə tərəf yönəlmək. **9.** Niyyət etmək.

**Namazın doğru olması üçün zəruri amillər (rükunlar):** Namazın on dörd rüknu vardır. **1.** İmkan daxilində fərz namazını ayaq üstə qılmaq. **2.** Namaza başlayarkən edilən birinci təkbir *(Təkbirətul ehram)*. **3.** Fatihə surəsini oxumaq. **4.** Hər rükətdə rüku etmək. **5.** Rükudan qalxmaq. **6.** Qalxdıqdan sonra düz dayanmaq. **7.** Yeddi əza üzərində səcdə etmək. **8.** İki səcdə arasında oturmaq. **9.** Sonuncu təşəhhüd. **10.** Bu təşəhhüd üçün oturmaq. **11.** Sonuncu təşəhhüddə Peyğəmbərə (*Sallallahu aleyhi və səlləm*) salavat demək. **12.** Birinci salam. **13.** Feli rükunları yerinə yetirərkən tələsməmək. **14.** Bu rükunları ardıcıllıqla emtək.

**Namaz bu rükunlarsız doğru sayılmır. Bunlardan birini qəsdən və ya səhvən tərk etməklə həmin rükət batil olur.**

**Namazın vacib əməlləri:** Bunlar səkkizdir. **1.** Birinci təkbirdən *(təkbirətul ehramdan)* başqa, digər bütün təkbirlər. **2.** İmam və təklikdə namaz qılanın ***"Səmiəllahu limən həmidəh"*** sözlərini deməsi. **3.** Rükudan qalxarkən ***"Rabbənə va ləkəl həmd"*** sözlərini demək. **4.** ***"Sübhanə rabbiyəl azim"*** sözlərini rükuda bir dəfə demək. **5.** ***"Sübhanə rabbiyəl alə"*** sözlərini səcdədə bir dəfə demək. **6.** İki səcdə arasında ***"Rəbbiğfirli"*** demək. **7.** Birinci təşəhhüd. **8.** Bu təşəhhüd üçün oturmaq. Deyilən vacibləri qəsdən tərk etdikdə namaz batil olur. Əgər səhv edib tərk edərsə, bunun üçün səhv səcdəsi etmək kifayətdir.

---

[1] İxtiyari: Yəni bu vaxt ərzində namazı qılmaq ixtiyaridir.
[2] Zəruri: Bu müddət ərzində namazı qılmaq zəruridir.
[3] **Övrət:** Övrət insanın gizli saxladığı və başqalarına göstərməyə həya etdiyi bədən hissələridir. Yeddi yaşına çatmış oğlan uşağının övrəti yalnız ön və arxa orqanlardır. On yaşı tamam olmuş oğlan uşağının övrəti göbək ilə diz arasıdır. Həddi-buluğa çatmış azad qadının əli və üzü istisna olmaqla bütün bədəni övrətdir. Əgər bir qadın məsələn qolu açıq halda namaz qılar, təvaf edərsə, onun ibadəti batildir, məqbul deyildir. Ön və arxa qəliz övrət yerlərini qeyri-namaz vaxtlarında da örtmək vacibdir. Təklikdə və ya qaranlıqda olarkən ehtiyac olmadan bu övrət yerini açmaq məkruhdur.

**Namazın deyilən və edilən sünnə əməlləri:** Bu əməlləri qəsdən tərk etdikdə namaz batil olmur. **Deyilən sünnələr:** **İstiftah[1] duasını oxumaq. İstiazəni[2]** və **bəsmələni[3]** demək. Səsli namazda səslə, səssiz namazda isə səssiz **amin** demək. Fatihədən sonra **Qurandan istədiyi qədər oxumaq**. **İmamın səslə oxuması**. İmamın arxasında dayananlara belə etmək qadağandır. Təklikdə namaz qılana isə seçim ixtiyarı verilir. "Rabbənə və ləkəl həmd" sözlərini dedikdən sonra **"Həmdən kəsirən tayyibən..."** duasını oxumaq. Rukuda, səcdədə və iki səcdə arasında edilən **zikrləri birdən artıq etmək.** Salamdan öncə **dua etmək**. **Feli sünnələr:** Təkbirətul ihramı deyərkən, rükuya gedərkən, rükudan qalxarkən və birinci təşəhhüdü dedikdən sonra qiyama qalxarkən **əlləri qaldırmaq**. Ayaq üstə dayanarkən **sağ əli sol əlin üzərinə sinənin altına qoymaq. Səcdə yerinə baxmaq.** Ayaq üstə olarkən **ayaqları aralı tutmaq**. **Səcdəyə gedərkən** birinci dizlərini, sonra əllərini, alnını və burnunu yerə qoymaq. **Səcdə zamanı** dirsəklərini böyürlərindən, qarnını baldırlarından, baldırlarını isə dabanlarından aralı tutmaq. Eləcə də dizləri aralı saxlamaq və ayaq pəncələrini dik tutub ayaq barmaqlarını alt hissəsini yerə qoymaq. **Əl barmaqlarını birləşdirib** əllərini isə açıq şəkildə çiyinlər bərabərliyində saxlamaq. Səcdədən qalxarkən **ayaq pəncələrinə yüklənib əlləri ilə dizlərinə** dayaq verib qalxmaq. İki səcdə arasında və birinci təşəhhüddə oturarkən **iftiraş[4]** oturuşu oturmaq. İkinci təşəhhüddə isə, **təvərrük[5]** oturuşu oturmaq. İki səcdə arasında və həmçinin təşəhhüddə **əl barmaqları birləşdirilib, əllər baldırların üzərinə qoyulur**. Təşəhhüd zamanı sağ əlin çeçələ barmağı ilə yanındakı barmaq yumulur, orta barmaq ilə baş barmaq bir-birinə halqa formasında birləşdirilir, Allahın adı çəkiləndə və dua edəndə Allahın təkliyinə işarə olaraq **şəhadət barmağı tərpədilir**. Salam verərkən sağ və sol tərəfə dönmək. Salam verərkən **birinci sağ tərəfə** dönmək.

**Səhv səcdəsi:** Namaz əsnasında hər hansı sözü səhvən başqa yerdə deyərsə, məsələn səcdədə Quran oxuyarsa, bu halda səhv səcdəsi etmək **sünnədir**. Sünnədən sayılan əməlləri tərk etdikdə isə istəsə, **səhv səcdəsi edə bilər**. Namaza rüku, səcdə, rükət və oturuş əlavə etsə, namazı bitirmədən öncə salam versə, oxunuşda mənanı dəyişən səhv etsə, namazın hər hansı vacib əməlini unutsa, əməli edən zaman artıq etdiyi barədə şübhə etsə, səhv səcdəsi vacibdir. Vacib buyurulan səhv səcdəsini qəsdən tərk etmək namazı batil edir. Səhv səcdəsini salamdan öncə və ya sonra edə bilər. Səhv səcdəsi unudulub üzərindən uzun müddət keçərsə, bu bağışlanandır.

**Namazın vəsfi:** Namaz qılmaq istəyən kimsə ayaq üstə dayanıb, qibləyə yönələrək "Allahu Əkbər" deyir. İmam arxada dayananlara işarə vermək üçün bu və digər təkbirləri səslə deyir. İmamın arxasındakılar isə namazı səssiz qılırlar.

---

[1] Birinci təkbirdən sonra oxunan dua istiftah (açılış) duası adlanır.
[2] İstiazə: Əuzu billəhi minəş şeytanir rəcim.
[3] Bəsmələ: Bismilləhir Rahmənir Rahim.
[4] İftiraş oturuş qaydasıdır. Sol ayağı yerə yatırıb onun üzərində oturmaq, sağ ayağı isə dik tutub ayaq barmaqlarını qibləyə tərəf istiqamətləndirmək.
[5] Təvərrük də oturuş qaydasıdır. Bu oturuşda sol ayaq sağ pəncənin önünə yerləşdirilir və sol baldır yerə qoyulur.

Birinci təkbiri deyən zaman əllərini çiyinləri bərabərliyinə qaldırır, sonra sağ əlini sol əlinin üstünə, sinəsinin altına qoyur. Gözünü isə səcdə yerinə dikir. Sonra sünnədə deyilən dualardan biri ilə başlayır. Məsələn, bu duanı oxuya bilər. «*Sübhanəkə Allahummə və bihəmdikə və təbarəkə ismukə və taalə cədduka və lə iləhə ğəyrukə*»[1]. Sonra "*Əuzu billəhi minəş şeytanir rəcim. Bismilləhir Rəhmanir Rəhim*" – deyir. Bunların heç birini səslə oxumur. Sonra **"əl-Fatihə"** surəsini oxuyur. Əgər namaz səslidirsə, imamın arxasında namaz qılan kimsə imam susan vaxtda fatihəni səssiz oxuması müstəhəbdir. Səssiz namazlarda imamın arxasında namaz qılan üçün fatihəni oxumaq vacibdir. Fatihədən sonra **"Amin"** deyilir. Bundan sonra Qurandan istədiyi surəni oxuyur. Sübh namazında "Qaf" surəsi ilə "Nəbə" surəsi arasında olan surələrdən, məğrib namazında "Duha" surəsindən sonuncu surəyə qədər olan surələrdən, digər namazlarda isə "Nəbə" surəsindən "Duha" surəsinə qədər olan surələrdən oxumaq müstəhəbdir. İmam dayanan kimsə sübh namazının hər iki rükətində, məğrib və işa namazlarının ilk iki rükətlərində səslə oxuyur. Digər rükətlərdə və namazlarda isə səssiz oxuyur. Sonra birinci təkbirdə olduğu kimi əllərini qaldırıb təkbir edir və rükuya gedir. Rüku zamanı ovuclarını dizlərinə qoyur, əl barmaqlarını aralayıb, onları diz qapaqlarına bərkidir və belini düz saxlayıb, başını da o səviyyədə tutur və üç dəfə "***Sübhanə rəbbiyəl azim***" – deyir. Sonra "***Səmiəllahu limən həmidəh***" deyərək qamətini rükudan qaldırır. Bu zaman birinci təkbirdə olduğu kimi əllərini də qaldırır. Qamətini tam düzəltdikdən sonra "*Rabbənə va ləkəl həmdu həmdən kəsiran tayyibən mubarəkən fihi mil`əs-səmavati və mil`əl-ardi və milə mə şi`tə min şey`in bə`d*" – deyir. Sonra təkbir edib səcdəyə gedir. Səcdə zamanı dirsəklərini böyürlərindən, qarnını baldırlarından, baldırlarını isə dabanlarından aralı tutaraq, ayaq pəncələrini dik tutub, ayaq barmaqlarının alt hissəsini yerə qoyur, əl və ayaq barmaqlarını qibləyə tərəf yönəldir və bundan sonra üç dəfə "***Sübhanə rəbbiyəl alə***" deyir. Bu məqamda hədislərdə deyilən bəzi duaları, yaxud özünün istədiyi duanı edə bilər. Sonra təkbir edib, səcdədən qalxır və sol ayağını yerə yatırıb, üzərində oturur, sağ ayağını isə dik tutub, barmaqlarını qibləyə tərəf yönəltmiş halda oturur. Yaxud hər iki ayağını dik tutub, ayaq barmaqlarını qibləyə tərəf yönəldərək, dabanları üzərində oturur və iki dəfə "***Rəbbiğfirli***" deyir. İstəsə bunu da əlavə edə bilər: "***...vərhəmni, vəcburni, vərfəni, vərzuqni, vənsurni, vəhdini, vəafini, vəfu anni***". Sonra birinci səcdə kimi ikinci səcdəni edir və təkbir edib səcdədən qalxır. Ayaqlarına dirənib ayağa qalxır və ikinci rükəti də birinci kimi qılır. İkinci səcdəsini bitirdikdən sonra təşəhhüdü oxumaq üçün sol ayağını yerə yatırıb, üzərində oturur, sağ ayağını isə dik tutub, barmaqlarını qibləyə tərəf yönəltmiş halda oturur. Sol əlini sol, sağ əlini isə sağ baldırının üzərinə qoyur. Təşəhhüd zamanı sağ əlin çeçələ barmağı ilə yanındakı barmaq yumulur, orta barmaq ilə baş barmaq bir-birinə halqa formasında birləşdirilir, Allahın adı çəkiləndə və dua edəndə Allahın təkliyinə işarə olaraq şəhadət barmağını tərpədir

---

[1] Tərcümə: «Ey Allahım, Sən naqisliklərdən paksan. Sənə həmd edirik. Sənin adın müqəddəs, cəddin ucadır. Səndən başqa haqq ilah yoxdur».

və bu duanı oxuyur: «*Əttəhiyyatu lillahi vəs səlavatu vət tayyibatu, əssəlamu alən nəbiyyi və rəhmətullahi və bərəkətuhu, əssəlamu aleynə və alə ibadillahis salihin. Əşhədu əllə iləhə illəllah və əşhədu ənnə Muhəmmədən abduhu və rəsuluhu*»[1]. Sonra üç və dörd rükətli namazı tamamlamaq üçün təkbir edib ayağa qalxır və əllərini də qaldırır. Namazın üçüncü və dördüncü rükətləri bu qayda ilə qılınır. Bu rükətlər səssiz oxunur və yalnız fatihə surəsinin oxunması kifayət edir. Sonra sonuncu təşəhhüdü oxumaq üçün sol ayağını yerə yayıb, dik tutduğu sağ pəncəsinin ön tərəfinə keçirir və oturacağını yerə qoyub oturur *(bu oturuş iki təşəhhüdlü namazların ikinci təşəhhüdündə edilir)*. Bu zaman birinci təşəhhüddə oxuduqlarını oxuyur və əlavə olaraq bunları da oxuyurur: «*Allahummə salli alə Muhəmmədin və alə ali Muhəmməd, kəmə salləytə alə İbrahimə və alə ali İbrahimə innəkə həmidun məcid. Allahummə barik alə Muhəmmədin və alə ali Muhəmməd, kəmə barəktə alə İbrahimə və alə ali İbrahimə innəkə həmidun məcid*».
Sonra bu və digər bu kimi duaları demək sünnədir: **"Əuzu billəhi min azəbin nar və azəbil qabr və fitnətil məhya vəl məmat və fitnətil məsihid dəccal"**
Sonra əvvəlcə sağ, ardınca sol tərəfə "Əssəlamu aleykum və rəhmətullah" deyib salam verilir. Bununla namaz tamamlanır. Bundan sonra hədislərdə deyilən duaları oxumaq sünnədir[2].

**Xəstə adamın namazı:** Əgər namazı ayaq üstə qılmaq xəstəliyini artırır, yaxud ayaq üstə qıla bilmirsə, o zaman namazı oturub qılmalıdır. Əgər belə vəziyyətdə qıla bilməsə, yan üstə uzanıb qılmalı, bunu da bacarmasa, arxası üstə uzanıb qılmalıdır. Rüku və səcdə etmək bacarığında olmazsa, azacıq əyilib etmək kifayətdir. Həmçinin qılmadığı namazları da qəza etməlidir. Əgər namazları vaxtında qılmaq çətin olsa, o zaman zöhr ilə əsri, məğrib ilə işanı ikisindən birinin vaxtında bir vaxtda qıla bilər.

**Müsafirin namazı:** Qət edilən məsafə təxminən 85 km-dən artıqdırsa, və şəriətin icazə verdiyi səfərdirsə, o zaman dörd rükətli namazları qısaldıb iki rükət qılmaq olar. Əgər səfər etdiyi yerdə dörd gündən artıq *(iyirmi namaz müddəti)* qalmaq

---

[1] Duanın tərcüməsi isə belədir: «*Ən gözəl salamlar, namazlar və yaxşı işlər Allaha məxsusdur. Ey Allahın Peyğəmbəri, sənə Allahın salamı,rəhməti və bərəkəti olsun. Bizə və Allahın əməlisaleh bəndələrinə Allahın salamı olsun. Mən şəhadət verirəm ki, Allahdan başqa ibadətə layiq olan haqq məbud yoxdur. Şəhadət verirəm ki, Muhəmməd Allahın qulu və elçisidir*».

[2] Həmin dualar bunlardır: Üç dəfə "*Əstəğfirullah*". "*Allahummə əntəs salam va minkəs salam təbarəktə ya zəlcələli vəl ikram. Lə iləhə illəllahu vəhdəhu lə şərikə ləhu ləhul mulku va ləhul həmdu va huvə alə kulli şeyin qadir. Lə hovlə valə quvvətə illə billəh. Lə iləhə illəllahu valə nəbudu illə iyyəh. Ləhun nimətu va ləhul fadlu va ləhus sənaul həsən. Lə iləhə illəllahu muxlisinə ləhud dinu va lov kərihəl kəfirun. Allahummə lə ma`niə limə atəytə valə mu`tiə limə məna`tə valə yənfəu zəl cəddi minkəl cədd*". Bunlarla yanaşı sübh və məğrib namazlarından sonra on dəfə bu duanı demək lazımdır: "*Lə iləhə illəllahu vahdəhu lə şərikə ləhu ləhul mulku va ləhul həmdu yuhyi və yumitu vahuvə alə kulli şeyin qadir*". Sonra hərəsi otuz üç dəfə olmaqla "sübhənallah", "əlhəmdulilləh" və "Allahu əkbər" – sözləri deyilir. Bunlar doxsan doqquz edir və yüzü tamamlamaq üçün bir dəfə də bu dua deyilir: "*Lə iləhə illəllahu vahdəhu lə şərikə ləhu ləhul mulku va ləhul həmdu vahuvə alə kulli şeyin qadir*". Sonra hərəsi bir dəfə olmaqla kürsü ayəsi *(ayətəl kürsü)*, ixlas *(Qul huvəllahu əhəd)*, fələq *(Qul əuzu birabbil fələq)* və nəs *(Qul əuzu birabbin nəs)* surələri oxunur. Sübh və məğrib namazlarından sonra ixlas, fələq və nəs surələri üç dəfə oxunur.

niyyətindədirsə, çatdığı andan namazları tam qılmalıdır[1]. Müsafir yerli adamın arxasında namaz qılarsa, yaxud səfərə çıxmamış hər hansı namazı unudub səfərdə xatırlayarsa, yaxud bunun əksi baş verərsə, bütün bu hallarda namazları tam qaydada qılmaq lazımdır. Müsafir namazı tam qıla bilər, amma qısaltmaq daha üstün sayılır.

**Cümə namazı:** Bu namaz zöhr namazından daha üstündür. Bu qısaldılmış zöhr namazı deyil, özü müstəqil namaz sayılır. Bu namazı dörd rükətli, yaxud zöhr niyyəti ilə qılmaq olmaz. Hətta səbəb olsa belə, bu namazı əsr ilə birlikdə qılmaq olmaz.

**Vitr namazı:** Bu namaz sünnə namazlarından hesab olunur. Qılınma vaxtı işa namazından sübh namazına qədərdir. Rükətlərinin sayı azı bir, çoxu isə on bir rükətdir. Hər iki rükətdən bir salam vermək daha yaxşıdır. Mükəmməl az rükət sayı iki salam verməklə üç rükət qılmaqdır. Birinci rükətdə "əl-Əla", ikincidə "əl-Kəfirun", üçüncüdə isə "əl-İxlas" surəsini oxumaq sünnədir. Rükudan sonra əlləri qaldırıb səslə qunut duası etmək müstəhəbdir.

**Cənazə namazı:** Müsəlmanın meyitini yumaq, kəfənləmək, cənazə namazı qılmaq, qəbiristanlığa daşımaq və dəfn etmək işlərinin bir qrup insan tərəfindən həyata keçirilməsi kifayətdir. Döyüş meydanında şəhid olanlar yuyulmaz və kəfənlənməzlər. Onlar üçün cənazə namazı qılmaq isə icazəlidir. Onlar öldükləri qaydada da dəfn olunurlar. Kəfənləməyin necəliyinə gəldikdə, kişi üçün üç qat ağ parça kifayətdir. Qadın üçün isə bir qurşaq, bir baş yaylığı, bir köynək və iki qat ağ örtük olmaqla, ümumilikdə beş parça lazımdır. Cənazə namazını qılarkən imamın kişi meyitinin sinəsi, qadın meyitinin qurşağı tərəfində dayanması sünnədəndir. **Cənazə namazı** dörd təkbirdən *(Allahu əkbər – sözlərindən)* ibarətdir. Dörd dəfə *"Allahu əkbər"* deyilir və hər dəfə əllər qaldırılır. Birinci təkbirdən sonra *"Əuzu billəhi minəş şeytanir rəcim. Bismilləhir rahmənir rahim"* – sözləri deyilib, fatihə surəsi səssiz oxunur. Sonra ikinci təkbir edilib, Peyğəmbərə ﷺ salavat deyilir. Sonra üçüncü təkbir deyilib, ölən üçün dua edilir. Sonra dördüncü təkbir deyilib, bir az fasilə verilir və salam deyilir. **Qəbri** bir qarışdan artıq qaldırmaq, üzərini tikmək, öpmək, ətirləmək, üzərində yazı yazmaq, oturmaq və ya onu tapdalamaq haramdır. Qəbirləri işıqlandırmaq, ətrafında dövrə vurmaq, üstündə məscid tikmək və ya öləni məsciddə dəfn etmək haramdır. Qəbirlərin üzərində tikilmiş məbədlərin dağıdılması vacibdir.

- **Təziyə sözlərində məhdudiyyət yoxdur.** Misal olaraq təziyədə başsağlığı verərkən belə demək olar: **"Ə`zəməllahu əcrakə və əhsənə azəakə və ğafərə li meyyitikə"**[2]. Ölmüş kafirə görə müsəlmana başsağlığı vermək üçün belə demək olar: **"Ə`zəməllahu əcrakə və əhsənə azəakə"**. Ölmüş insan müsəlman olsa da, kafirə başsağlığı vermək haramdır.

---

[1] Səfərdə namazların neçə gündən sonra qısaldılması məsələsi ətrafında fikir ayrılığı vardır. Tədqiqatçı alimlərin daha doğru hesab etdikləri rəyə görə, insan özünü müsafir kimi hiss etdiyi müddətdə səfərdə sayılır və namazlarını da bu hala uyğun qılır. *(tərc.)*

[2] Duanın tərcüməsi: "Allah savabını artırsın, kədərini aparsın, ölünə rəhmət etsin".

- Ölüm ayağında olan insan ailəsinin onun üçün ağı deyib, ağlaşma quracaqlarını ehtimal edərsə, onlara bu əməli etməsinlər deyə xəbərdarlıq etməlidir. Əks halda, onların ağı deyib, ağlaşma qurmalarına görə qəbirdə ona əzab veriləcəkdir.
- İmam Şafii ﷺ deyir: *"Təziyə vermək üçün oturmaq məkruhdur"*. Yəni ölən adamın yaxınlarının onlara başsağlığı vermək istəyənləri qəbul etmək üçün bir evdə toplaşmaları məkruhdur. Əslində hər kəs, istər kişi, istərsə qadın – öz işinin ardınca getməlidir.
- Ölənin ailəsi üçün yemək hazırlamaq sünnədir. Onların yeməyindən yemək, yaxud təziyəyə gələnlər üçün yemək hazırlamaq məkruhdur.
- Müsəlmanın qəbrini ziyarət etmək sünnədir. Amma bunun üçün səfər etmək olmaz. Kafirin qəbrini ziyarət etmək də icazəlidir. Kafirin müsəlman qəbrini ziyarət etməsi qadağan deyil.
- Qəbiristanlığa daxil olanın belə deməsi sünnədir: «*Əs-sələmu aleykum darə qovmin muminin. Va innə inşəa-l-lahu bikum lələhiqun. Yərhamu-l-lahu-l-mustəqdiminə minnə va-l-mustəxirin. Nəsəlu-l-lahə lənə va ləkumu-l-afiyətə. Allahummə lə təhrimnə əcrahum va lə təftinnə bədəhum. Vəğfir lənə və ləhum*».[1]

**İki bayram namazı:** Bu namaz bir qrup müsəlman tərəfindən qılınarsa, digərlərinin bu namazı qılmaması onlar üçün günah sayılmaz. **Bu namazın vaxtı** duha namazı kimi günəş tam çıxıb istisi yayıldıqdan sonra zöhr namazına qədər olan vaxtda qılınır. Zöhr namazının vaxtı dirdikdən sonra həmin günün bayram günü olduğunu bildikdə bayram namazı ertəsi gün qəza olaraq qılınır. Xütbədən başqa, digər bütün şərtləri cümə namazının şərtləri kimidir. Əgər bu namaz qeyri məsciddə qılınırsa, namazdan öncə və sonra nafilə namazı qılmaq məkruhdur. **Bu namazın qılınma qaydası belədir:** Namaz iki rükətdən ibarətdir. Birinci rükətdə təkbirətul ehramdan sonra altı dəfə, ikinci rükətə başlayıb, fatihəni oxumadan öncə beş dəfə təkbir edilir. Hər təkbir edərkən əllər qaldırılır. Sonra *"Əuzu billəhi minəş şeytanir racim"* deyib, uca səslə fatihə surəsi oxunur. Birinci rükətdə fatihədən sonra *"əl-Alə"* surəsi, ikinci rükətdə isə *"əl-Ğaşiyə"* surəsi oxunur. Namazı bitirdikdən sonra imam cümə namazında olduğu kimi iki xütbə ilə çıxış edir. Lakin yaxşı olar ki, bu xütbədə təkbir çox etsin. Əgər imam bayram namazını adi iki rükətli namaz kimi qıldırarsa, namazı məqbuldur. Çünki artıq sayda edilən təkbirlər və onların arasında zikrləri oxumaq sünnədir.

**Ay və günəş tutulması üçün qılınan "Küsuf" namazı:** Bu namazı qılmaq sünnədir. Bu namazın vaxtı günəşin və ya ayın tutulmasından başlayıb, tutulma bitənə qədər davam edir. Bu namazın qəzası yoxdur. **Bu namazın qılınma qaydası belədir:** Namaz iki rükətdən ibarətdir. Birinci rükətdə səslə fatihə və digər uzun surə oxunur. Sonra uzun müddətli rüku edilir. Sonra rükudan qalxarkən deyilən adi zikrlər deyilir, amma səcdəyə gedilmir. Yenidən fatihə və

---

[1] «Sizə salam olsun, ey möminlər diyarının əhli! Allah qoysa, biz də sizə qoşulacağıq. Bizdən qabaq və sonra olanlara Allahın mərhəməti olsun. Allahdan özümüzə və sizə salamatlıq diləyirik. Ey Allahım, bizi onların savabından məhrum etmə və bizi onlardan sonra fitnəyə düçar etmə. Həm bizi, həm də onları bağışla».

digər uzun surə oxunur və uzun müddətli rüku edilir. Rükudan qalxıb uzun müddətli iki səcdə edilir. Sonra ikinci rükət də eyni qayda ilə qılınır, təşəhhüd oxunur və salam verilir. İmamla namaz qılmağa gələn kəs birinci rükudan sonra namaza qoşularsa, onun birinci rükəti sayılmır.

**Yağış yağması üçün qılınan "İstisqa" namazı:** Quraqlıq artdıqda və yağış azaldıqda bu namazı qılmaq sünnədir. Bu namazın qılınma vaxtı, qaydası, əhkamları bayram namazı kimidir. Fərq yalnız ondadır ki, bu namazdan sonra iki xütbə deyil, bir xütbə oxunur. Yağış yağması üçün dua edərkən vəziyyətin dəyişməsi üçün paltarın ətəyini alt-üst çevirmək sünnədir.

**Nafilə namazlar:** Mötəbər mənbələrin məlumatına görə Peyğəmbər ﷺ gündəlik fərz namazlardan başqa, on iki rükət əlavə sünnə namazları qılardı. Həmin namazlar bunlardır: sübh namazından öncə iki, zöhrdən öncə dörd sonra iki, məğribdən sonra iki və işadan sonra iki rükət. Peyğəmbərin ﷺ bundan başqa nafilə namazlar qıldığı isbat olunmuşdur. *(Məsələn əsrdən öncə dörd rükət, məğrib azanından və vitrdən sonra iki rükət. Tərc.)*

**Qadağan olunmuş vaxtlar:** Namaz qılmaq qadağan olunan vaxtlarda nafilə namazların qılınması haramdır. Qadağan olunmuş vaxtlar bunlardır: **1.** Sübhdən günəş çıxıb üfüqdən bir nizə hündürlüyündə qalxana qədər. **2.** Günəş zenitdə olanda. **3.** Əsr namazından sonra günəş batana qədər. Bu vaxtlarda səbəbli namazları qılmaq icazəlidir. Misal olaraq məscidə girərkən qılınan salam namazını, təvafdan sonra qılınan iki rükəti, sübhün sünnətini, cənazə namazını, dəstəmaz üçün qılınan iki rükəti, şükr və tilavət səcdələrini misal çəkmək olar.

**Məscidlər:** Ehtiyac olan qədər məscid inşa etdirmək vacibdir. Allaha ən sevimli yer məscidlərdir. Məscidlərdə əl çalmaq, mahnı oxumaq, musiqi alətlərini ifa etmək, haram olunan şer söyləmək, kişi və qadınların bir-birinə qarışması, cinsi yaxınlıq, alqı-satqı kimi əməllər **haramdır**. İtmiş əşya, heyvan və s. haqqında məsciddə car çəkən insana: *"Allah ticarətinə bərəkət verməsin!"*, *"Allah itmiş malını sənə qaytarmasın!"* kimi sözlər demək **sünnədir**. Məscidə ziyan verməyən uşaqlara orada təhsil vermək, nikah bağlamaq, hökm kəsmək, icazəli şer oxumaq, etikaf və qeyri hallarda yatmaq, xəstə və zəif insanın orada yatması və ya uzanması **məqbuldur**. Məscidlərdə lağlağı və mübahisə etmək, çox danışmaq, xoşagəlməz uca səslə danışmaq, ehtiyac olmadan oradan keçid kimi istifadə etmək və dünya işlərini müzakirə etmək **məkruhdur**. Məscidin xalçalarını, çıraqlarını və ya elektrik xətlərini yas və ya toy üçün istifadə etmək olmaz.

# Zəkat

**Zəkatın vacib olması üçün şərtlər beşdir: 1.** Müsəlman olmaq. **2.** Azad olmaq. **3.** Malın müəyyən miqdara *(nisaba*[1]*)* yetişməsi. **4.** Tam mülkiyyət hüququnun olması. **5.** Əldə olunan malın üzərindən bir il müddətin keçməsi. Əkin məhsulları istisnadır.

**Ev heyvanlarının zəkata düşən üç növü:** Dəvə, inək və qoyun. Bu növ heyvanların zəkatı üçün iki şərt olmalıdır. **1.** İl boyu və ya ilin çox vaxtı otarılmalıdır. **2.** Ev heyvanı işlətmək üçün deyil, artırmaq və xeyir götürmək üçün olmalıdır. Əgər saxlanılan heyvan ticarət üçün olarsa, bu halda ticarət dövriyyəsində olan mala aid olar.

**Dəvənin zəkatı:**

| Sayı | 1 - 4 | 5 - 9 | 10 - 14 | 15 - 19 | 20 - 24 | 25 - 35 | 36 - 45 | 46 - 60 | 61- 75 | 76 - 90 | 91- 120 |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| Zəkatı | Zəkat düşmür | Bir qoyun | İki qoyun | Üç qoyun | Dörd qoyun | Bir yaşlı dəvə | İki yaşlı dəvə | Üç yaşlı dəvə | Dörd yaşlı dəvə | İki ədəd iki yaşlı dəvə | İki ədəd üç yaşlı dəvə |
| Əgər dəvlərin sayı 120-dən artıq olarsa, hər 50 dəvə üçün üç yaşlı, hər qırx dəvə üçün iki yaşlı dəvə zəkat verilməlidir. | | | | | | | | | | | |

**Inəyin zəkatı:**

| Sayı | 1-29 | 30 - 39 | 40 – 59 |
|---|---|---|---|
| Zəkatı | Zəkat düşmür | Bir yaşlı dana | Iki yaşlı dana |
| İnəklərin sayı 60 – dan artıq olarsa, hər 30 inək üçün bir yaşlı, hər qırx inək üçün iki yaşlı dana zəkat çıxarılmalıdır. | | | |

**Qoyunun zəkatı:**

| Sayı | 1 - 39 | 40 - 120 | 121 - 200 | 201 - 399 |
|---|---|---|---|---|
| Zəkatı | Zəkat düşmür | Bir qoyun | İki qoyun | Üç qoyun |
| Qoyunların sayı 400–dən artıq olarsa, hər 100 qoyun üçün bir qoyun zəkat verilir. Qoyunun zəkatını keçi, əldən düşmüş və ya kor heyvan vermək olmaz. Bala bəsləyən, boğaz və ən gözəl heyvanı da zəkat çıxarmaq olmaz. Zəkat çıxarılan qoyun ən azı altı aylıq olmalıdır. | | | | |

**Əkin məhsullarının zəkatı:** Əkilib becərilən dənli və meyvəli məhsulların zəkatını çıxarmaq vacibdir. Amma bunun üçün üç şərt tamamlanmalıdır: **1.** Məhsul mikyal[2] tərəzi ilə ölçülən və saxlanılması mümkün olan məhsullardan olmalıdır. Dənli məhsullara buğda və arpanı, meyvələrə isə üzüm və xurmanı misal çəkmək olar. Mikyal ilə ölçülməyən və saxlanılması mümkün olmayan məhsullara görə zəkat çıxarılmır. Misal olaraq tərəvəzləri, göy-göyərti və yaş paxlaya oxşar məhsulları qeyd etmək olar. **2.** Məhsulun müəyyən miqdara *(nisaba)* yetişməsi. 653 kq və çox olması. **3.**Zəkat vacib olan vaxtda məhsul insanın tam mülkiyyətində olmalıdır. Məhsul

---

[1] Zəkat bölümündə «Nisab» sözü çox işlədildiyi üçün onun mənasını bilmək lazımdır. «Nisab», mal-dövlətin növündən asılı olmayaraq, zəkatın vacib olması üçün toplanan və tələb olunan həddə çatan mal-dövlətdir. *(tərc.)*

[2] Mikyal vedrəyə bənzər xüsusi ölçülü qabdır və qədimdə ölçü vasitəsi kimi istifadə olunurdu. *(tərc).*

dəydikdə zəkat vacib olur. Meyvələrin dəyməsi onların qızarması və ya saralması, dənli bitkilərin yetişməsi dənlərin dolması və quruması ilə bilinir.

Yağış və çay suyu ilə rahat suvarılmış məhsulun 10 %-i, quyulardan su çıxarmaqla və s. bu kimi çətinliklərlə suvarılmış məhsulun 5 %-i zəkat çıxarılır. Əgər məhsul ilin bəzi günlərində məşəqqətlə, bəzi günlərində isə rahatlıqla suvarılarsa, bu hansı halın daha çox olmasından asılıdır. Hesablama məşəqqətli və rahat suvarılma günlərinə görə aparılır[1].

**Qiymətli əşyaların zəkatı:** Qiymətli əşyalar iki növdür: **1. Qızıl** 85 qr olmadıqca ona görə zəkat vacib sayılmır. **2. Gümüş** 595 qr olmadıqca ona görə zəkat düşmür. Kağız pullar qızıl və ya gümüşün ən az zəkat miqdarı dəyərində olmadıqca pula zəkat düşmür[2]. Qiymətli əşyaların ümumi məbləğinin 2,5 %-i zəkat çıxarılır.

**İstifadəsinə icazə verilən və istifadə olunan zinət əşyalarına görə zəkat düşmür.** Saxlanılan və ya icarəyə verilən zinət əşyalarına görə zəkat vermək vacibdir.

**Adəti üzrə qadınların taxdıqları qızıl və gümüş zinət əşyalarının istifadəsi icazəlidir.** Eləcə də az miqdarda gümüş ilə qab-qacağı bəzəmək olar. Həmçinin kişilər üz miqdarda gümüşdən düzəldilmiş üzük, eynək və s. istifadə edə bilərlər. Qızılı isə qab-qacağı bəzəmək isə haramdır. Kişilər nəyinsə üzərində az miqdarda qızıldan istifadə edə bilərlər. Misal olaraq, köynəyin düyməsini, diş düzəltməsini qeyd etmək olar. Amma bu, qadınlara oxşamadan edilməlidir.

**Artıb-azalan mal sahibi** əlində olan hər məbləğə görə ayrıca zəkat verməkdə çətinlik çəkirsə, o zaman ilin müəyyən bir gününü təyin edib, o gündə zəkatını versin. Həmin gün mülkündə olan mal-dövləti hesablayıb, 2,5 %-ni zəkat çıxarsın. Belə halda, sahib olduğu malın bir ili tamam olmasa da, zəkatını çıxarmış olur. Həmçinin gəliri maaş, yaxud digər vasitə ilə olan insan qazandığı malı xərcləyirsə, ona zəkat düşmür. Əgər qazandığı malı toplayırsa, o zaman malı qazandığı ilk gündən bir il keçdikdən sonra topladığı malın 2,5 %-ni zəkat verməlidir.

**Borcun zəkatı:** Varlı insanda borcda olan, yaxud batmadığı ehtimal olunan mal sahibinin əlinə keçən kimi zəkatı çıxarılmalıdır. Əgər borcun qayıtması mümkünsüz olarsa, buna görə zəkat düşmür. Çünki bu halda mal sahibi öz malına sahibliyini itirmiş sayılır.

**Ticarət dövriyyəsində olan malın zəkatı** dörd şərtlə vacib olur: **1.** Mala sahib olmaq. **2.** Əlində olan mal-dövləti ticarət məqsədi ilə işlətmək. **3.** Mal-dövlətin qızıl və ya gümüşün dəyəri ilə ən az məbləğlə zəkatı vacib edən miqdara *(nisaba)* yetişməsi[3]. **4.** Bir ilin tamamlanması. Deyilən şərtlər varsa, mal-dövlətin qiymətindən zəkat çıxarılır. Mal-dövlətin zəkatı vacib edən miqdara *(nisaba)* çatdırılması üçün əlində olan nəğd pul, qızıl və ya gümüşü də buna əlavə edib, zəkatını çıxarmalıdır. Ticarət

---

[1] Bu hal yarı-yarı olduqda məhsulun 7,5 %-i zəkat çıxarılır.

[2] Bunu dəqiq hesablamaq üçün günümüzdə qızıl və gümüşün qiymətinə baxırıq. Hansının dəyəri ilə pul daha tez zəkat məbləğinə uyğun gəlirsə həmin məbləğ və artığı üçün zəkat çıxarırıq. *(tərc.)*

[3] Ticarət dövriyyəsində olan malın zəkata düşən miqdarı 85 qr qızılın, yaxud 595 qr gümüşün dəyəridir. Deyilənlərdən hər hansının dəyəri az olub, malı zəkata daxil edirsə, onunla da zəkatı hesablamaq olar.

dövriyyəsində olan paltar, ev, maşın və s. bu kimi mal-dövlət növləri işlətmək üçün nəzərdə tutulubsa, buna görə zəkat düşmür. İşlətmək üçün nəzərdə tutulan mal-dövləti ticarət malına çevirərsə, o zaman onun zəkat vaxtını da yeni tarixdən hesablamalıdır.

**Fitrə zəkatı:** Bu zəkat, bayram günü özünün və ailəsinin bir sutkalıq qida ehtiyatından artıq mala sahib olan hər bir müsəlmana vacibdir. Bu növ zəkatın kişi və ya qadın olmasından asılı olmayaraq, hər adama vacib olan miqdarı 2,25 kq yerli qida məhsuludur. Üzərinə fitrə zəkatı vacib olan insan imkanı daxilində bayram gecəsi himayəsində olanların əvəzinə fitrə zəkatı çıxarmalıdır. Bu zəkatı bayram günü bayram namazından öncə çıxarmaq müstəhəb, namazdan sonraya saxlamaq isə qadağandır. Həmçinin bu növ zəkatı bayram günündən bir-iki gün öncə vermək olar. Bir dəstə insanın zəkatını bir adama, yaxud bir nəfərin zəkatını bir neçə adama vermək olar.

**Zəkatın çıxarılması:** Zəkatı vaxtında çıxarmaq lazımdır. Azyaşlı və ya dəli insanın zəkatını onun qəyyumu çıxarır. Yaxşı olar ki, bu kimi insanların zəkatı ayrı hesabla çıxarılsın. Həmçinin zəkatı zəkat niyəti ilə çıxarmaq şərtdir. Malı sədəqə niyəti ilə çıxararsa, bu zəkat hesab olunmaz. Hətta bütün malını bu niyyətlə sədəqə etsə, yenə də zəkat sayılmaz. Çıxarılan zəkatın hamısını yaşadığı yerin kasıblarına paylamaq daha yaxşıdır. Lazım gələrsə, zəkatı digər ölkəyə də göndərmək olar. Zəkatı vacıb edən miqdar hasil olubsa, öncədən iki ilin zəkatını çıxarmaq olar.

**Zəkat verilən insanlar səkkiz qrupa bölünürlər:** **1.** Yoxsullar. **2.** Miskinlər. **3.**Zəkart işində işləyənlər. **4.** Qəlbləri müsəlmanlığa isinişib bağlanmaqda olanlar. **5.** Azad ediləcək kölələr. **6.** Borclular. **7.** Allah yolunda döyüşənlər. **8.** Xərci qurtarıb, yolda qalan müsafirlər.

Yuxarıda adı keçən insanlara ehtiyacları miqdarında zəkat verilir. Zəkat işində işləyənlərə isə gördükləri işin müqabili verilməlidir. Bu işdə varlı kimsələr də işləyə bilərlər. Ölkəni işğal yolu ilə ələ keçirən xəvaric və zalım hakimiyyət zəkatı tələb edərsə, zəkatı onlara vermək icazəlidir. Həmçinin rəhbər tərəfindən zorla və ya xoşluqla götürülən zəkat da məqbuldur.

Kafirə, köləyə, varlıya, himayəsində olanlara və Bənu Haşimə zəkat vermək məqbul sayılmır. Əgər kimsə bilməməzliyi ucbatından zəkatı qeyri əhlinə verər, sonra bunu dərk edərsə, zəkatı məqbul sayılmır. Amma kimisə kasıb bilib, zəkatı ona verər və sonradan onun varlı olduğunu görərsə, zəkatı məqbul sayılır.

**Könüllü sədəqə:** Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: *"Möminin ölümündən sonra ona yetişən yaxşı əməllərindən – öyrətdiyi və yaydığı elm, özündən sonra qoyub getdiyi əməlisaleh övlad, miras qoyduğu Quran, tikdiyi məscid, yolda qalan müsafirlər üçün inşa etdiyi ev, çəkdirdiyi su, sağlam və sağ olanda öz malından veridiyi könüllü sədəqə. Bu əməllər ölümündən sonra ona yetişəcəkdir."* (İbn Macə).





# Oruc

Ramazan orucu müsəlman, aqil, oruc tutmaq iqtidarında olan və yetginlik yaşına çatmış **hər bir müsəlmana vacibdir.** Yalnız aybaşı və nifaslı qadınlar istisnadır. Azyaşlı uşaqlar oruca vərdiş etsinlər deyə, gücləri çatan qədər onlardan da oruc tutmaq tələb oluna bilər.

**Ramazanın başlamasını iki əlamətlə təyin etmək olar: 1.** Ramazan ayının başlamasını bildirən təzə doğmuş *(Hilal)* ayın görsənməsi. Bu barədə ən azı bir nəfər yetginlik yaşına çatmış ədalətli müsəlman kişi və ya qadının şahidliyi gərəkdir. **2.** Şaban ayını otuz gün hesablamaq.

**Oruc tutmağı vacib edən vaxt** sübh namazının vaxtı daxil olandan günəş batana qədərdir. **Vacib oruc üçün sübh namazının vaxtından öncə niyyət etmək lazımdır.**

**Orucu pozan amillər: 1. Tam əlaqəli cinsi yaxınlıq etmək:** Oruclu olarkən belə bir iş görən insan, həmin günün qəzasını oruc tutmalı və kəffarə verməlidir. Bu kəffarə bir kölə azad etməkdir. Azad etməyə kölə tapmayan insan iki ay ardıcıl oruc tutmalıdır. Əgər bunu bacarmasa, o zaman altmış nəfər kasıbı yedizdirməlidir. Buna da imkanı çatmazsa, onun boynunda bir şey qalmır. **2. Sperma ifraz etmək:** Bu öpmək, toxunmaq və ya masturbasiya yolu ilə olarsa, orucu batil edir. Amma yuxuda olduqda oruca zərər gətirmir. **3. Bilərəkdən yemək və içmək:** Əgər kimsə unudaraq yeyər və ya içərsə, orucu düzgündür. **4. Qanaldırma *(Ehticam)* və ya qanvermə yolu ilə qan çıxarmaq:**[1] Müayinə üçün götürülən, yaxud yaradan və ya burundan istəmədən ifraz olunan cüzi miqdarda qan orucu pozmur. **5. Qəsdən qusmaq.**

Əgər boğaza toz düşərsə, yaxud dəstəmazda ağzını və burnunu yaxalayarkən boğazına su gedərsə, eləcə də fikirdən və ya yuxuda olduğundan sperma ifraz edərsə, həmçinin iradəsindən asılı olmayaraq qusar və ya qan ifraz edərsə onun **orucu pozulmur.**

Kim vaxtın gecə olduğunu zənn edib yeyər, sonra gündüz olduğunu görərsə, bir gün qəza tutmalıdır. Sübh namazının vaxtının daxil olmasında şübhə edib yeyərsə, onun orucu pozulmur. Kim gündüz vaxtı günəşin batmasında şübhə edib yeyərsə, qəza etməlidir.

**Oruc tutmayanlarla bağlı hökmlər:** Ramazan ayında oruc tutulan vaxt üzürsüz iftar etmək haramdır. Aybaşı və nifaslı qadın, həmçinin həyatı təhlükə altında olan bir insanı xilas etmək üçün iftar etmək **vacibdir.** Namazı qısaldıb qılmağa icazə verilən səfərdə məşəqqətlə üzləşən insanın və ya zərər çəkəcəyindən ehtiyat edən xəstənin orucunu açması **sünnədir.** Gündüz vaxtı səfərə çıxan yerli adamın, yaxud özünə və ya övladına zərər toxunacağından ehtiyat edən hamilə və ya südverən qadının orucunu açması **icazəlidir.** Adı keçənlərin hamısı daha sonra **orucu qəza edirlər.** Övladına zərər toxunmasından ehtiyat edən hamilə və ya südverən qadın qəza etməklə yanaşı, hər günün əvəzində bir kasıbı yedizdirməlidirlər.

**Yaşlı və ya sağalmayan xəstəliyi olan insan** orucunu qəza etmir, sadəcə hər günün əvəzində bir nəfər kasıbı yedizdirir. **Üzürlü səbəbə görə** orucun qəzasını

---

[1] Əksər alimlərin qənaətinə görə hər iki halda oruc pozulmur. Fikrimcə bu rəy daha üstündür. Çünki bu mənaya dəlalət edən bir çox hədislər mövcuddur. Belə ki, Peyğəmbər ﷺ oruclu olduğu halda qan aldırmış və orucuna davam etmişdir... *(tərc.)*

digər ramazana qədər gecikdirən insan yalnız orucu qəza edir. Əgər bunu **üzürsüz olaraq edibsə**, qəza etməklə yanaşı, hər günün əvəzində bir nəfər kasıbı yedizdirməlidir. Qəzaya saxladığı orucunu **üzürlü səbəbə** görə tutmayan insan ölərsə, boynunda borcu yoxdur. Əgər **üzürsüz olaraq** bunu edibsə, o zaman onun əvəzində, hər günün yerinə bir kasıbı yedizdirmək lazımdır. Həmçinin səhlənkarlıq edib, oruc tutmadığı günlərin, yaxud nəzir dediyi orucların əvəzində, onun yaxınlarının oruc tutması və ya vəd etdiyi itaət nəzirlərinin onun əvəzindən icra olunması sünnədir. Kim gündüz vaxtı üzürlü səbəblə orucunu açar, sonra həmin səbəb götürülərsə, yaxud oruc tutulan gündə kafir islamı qəbul edərsə, aybaşı pak olarsa, xəstə sağalarsa, müsafir səfərdən gələrsə, aşyaşlı uşaq yetkinliyə çatarsa və ya dəli ağıllanarsa, bu zaman onlar həmin günün qəzasını tutmalıdırlar. Əgər onlar yuxarıda baş verən hallardan sonra oruc tutsalar belə, yenə də əlavə bir gün qəza etməlidirlər. Ramazan ayında orucunu açmasına icazə verilən insanın həmin gündə başqa oruc tutması düzgün deyil.

**Könüllü oruclar:** Könüllü tutulan **ən yaxşı oruc** bir gündən bir tutulan, sonra isə birinci və dördüncü günlər tutulan orucdur. Daha sonra qəməri ayların üç gününün orucudur. Bunun isə ən yaxşısı ayın ağ günlərində 13, 14 və 15-ci günlərində tutulanıdır. Muhərrəm və Şaban aylarının əksər günlərini, aşura, ərafa və şəvvalın altı gününü oruc tutmaq isə **sünnədir**. Rəcəb ayını, cümə və şənbə günlərini orucla məxsus etmək **məkruhdur**. Həmçinin şəkk edilən gündə oruc tutmaq. Bu, şaban ayının səmanın aydın olduğu otuzuncu günüdür. Fitrə və Qurban bayramlarında, həmçinin həcdə olarkən təşriq *(zülhiccənin 11, 12 və 13-cü)* günlərində oruc tutmaq **haramdır**. Boynunda təməttu və ya qiran həccinin qurbanı olub heyvan kəsməyə imkanı olmayanlar boyunlarına düşən orucu tuta bilərlər.

## Qeydlər:

- Boynunda cənabət, aybaşı, nifas kimi **böyük təmizlik** olanlar sübh namazından öncə təmizlənsələr, çimməyi sübh azanından sonraya saxlayıb, azandan öncə sühur yeməyini yeyə bilərlər. Bu halda oruc düzgün sayılır.
- Ramazan ayında müsəlmanlarla birgə ibadət etmək məqsədini güdən qadın sağlamlığına zərər verməyəcəyi halda, aybaşını gecikdirmək üçün dərman qəbul edə bilər.
- Oruc tutarkən daxildə olan tüpürcəyi və ya bəlğəmi udmaq olar.
- Peyğəmbər *(Sallallahu aleyhi və səlləm)* demişdir: ***"Ümmətim iftarı tezləşdirib sühuru gecikdirdikcə xeyir içərisində olarlar"***. *Əhməd*[1] *rəvayət etmişdir.* Peyğəmbər *(Sallallahu aleyhi və səlləm)* demişdir: **"İnsanlar iftarı tezləşdirdikcə din əzmətli qalacaqdır. Çünki yəhudi və xaçpərəstlər iftarı gecikdirirlər".** *Əbu Davud*[2] *rəvayət etmişdir.*
- İftar açarkən dua etmək müstəhəbdir. Peyğəmbər *(Sallallahu aleyhi və səlləm)* demişdir: **"Oruc tutanın iftar zamanı rədd olunmayan dua fürsəti vardır".** *İbn Macə*[3] *rəvayət etmişdir.* İftar açarkən edilən dualardan bunu qeyd etmək olar. Peyğəmbər *(Sallallahu aleyhi və səlləm)* demişdir: «ذَهَبَ الظَّمَأُ وَابْتَلَّتِ الْعُرُوقُ وَثَبَتَ الأَجْرُ إِنْ شَاءَ اللَّهُ» *"Zəhəbə-z-zəmau*

---

[1] Cild 5, səh. 172. Hədis №21893.
[2] Oruc kitabı, İftarı tezləşdirməyin müstəhəb olması fəsli. Hədis №2355.
[3] Oruc kitabı, Oruc tutanın duasının rədd olunmaması haqqında fəsil. Hədis №1825.

*vəbtəllətil uruq və səbətəl əcru inşəAllah*". **"Susuzluq getdi, damarlar islandı və Allahın istəyi ilə savab tamamlandı".** Əbu Davud[1] rəvayət etmişdir.

- Sünnəyə görə, iftarı tər xurma ilə açmaq yaxşıdır. Əgər tər xurma tapa bilməsə, adi xurma ilə iftar edir. Bunu da tapa bilməsə, su ilə iftar edir.
- Oruclu insan sürmə çəkməkdən, göz və ya qulaq damcısından ehtiyat etməlidir. Çünki bununla o, ixtilaflı məsələdən qaçmış olur. Əgər o, bu şeyləri qəbul etməyə möhtac olarsa, istifadə edə bilər. Hətta boğazında onların tamını hiss etsə də, onun orucu düzgündür.
- Daha doğru rəyə görə, oruclu olarkən hər zaman misvakdan istifadə etmək olar və burada heç bir bəyənilməyən hal yoxdur.
- Oruclu insan qeybətdən, sözgəzdirənlikdən, yalançılıqdan və s. əl çəkməlidir. Əgər kimsə onu söysə və ya təhqir etsə, ***"mən orucam"*** – desin. Oruclu insan dilini və digər əzalarını günahlardan qorumaqla orucunu mühafizə etmiş sayılır. Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) belə dediyi rəvayət olunur: "*Kim yalan danışmağı və ona əməl etməyi tərk etməzsə, Allahın onun yeməkdən və içməkdən imtina etməsinə ehtiyacı yoxdur*". Əhməd rəvayət etmişdir.
- Sünnəyə görə, oruclu olarkən yeməyə dəvət olunan insan həmin adam üçün dua etməli, əgər oruclu deyilsə, yeməkdən dadmalıdır.
- Qədr gecəsi ilin ən üstün gecəsidir. Bu gecə Ramazan ayının son on günündən birinə təsadüf edir. Bu gecənin ən çox ehtimal olunan günü iyirmi yeddinci gündür. Bu gecədə görülən saleh əməl min ayda edilən saleh əməldən daha xeyirlidir. Bu gecənin də öz əlamətləri var və onlardan aşağıdakıları qeyd etmək olar: Həmin gecənin səhəri günəşin ağ rəngdə az şüa ilə çıxması, havanın normal olması. Müsəlman özünün də xəbəri olmadan bu gecəni yaşaya bilər. Bu əsasla tələb olunan odur ki, insan Ramazan ayında, ələlxüsus son on gündə ibadətlə məşğul olsun. Müsəlman çalışmalıdır ki, bu ayın heç bir gününü gecə namazı qılmadan keçirməsin. Əgər təravih namazını camaat ilə qılırsa, ***"bütün gecəni ibadət etmək"*** savabına nail olmaq üçün imam namazı tam bitirənə qədər ondan ayrılmasın.
- Qeyri vacib oruc tutan kimsənin orucunu tamamlaması sünnədir, vacib deyil. Belə bir orucu qəsdən pozan üçün heç bir sıxıntı yoxdur və onun boynuna qəza düşmür.
- Etikaf: Bu aqil müsəlmanın ibadət məqsədi ilə məsciddə qalmasıdır. Etikaf edən insanın cənabətdən pak olması şərtdir. Etikaf edən insan yalnız zərurət hallarda məsciddən çıxa bilər. Buna yemək, ayaqyoluna getmək, qüsl almaq kimi zəruri əməlləri qeyd etmək olar. Zəruri ehtiyacı olmadan məsciddən çıxanın və cinsi yaxınlıq edənin etikafı pozulmuş sayılır. Sünnəyə görə, bu əməli hər zaman etmək olar, amma Ramazan ayında, ələlxüsus son on gündə bu daha önəmli sayılır. Etikaf üçün ən az müddət bir saatdır. Amma yaxşı olar ki, bir sutkadan az olmasın. Qadın isə ərinin icazəsi olmadan etikafa girə bilməz. Sünnəyə əsasən, etikaf edən insan ibadət və itaət işləri ilə məşğul olmalı, digər icazəli əməlləri və özünə aid olmayan işləri tərk etməlidir.

---

[1] Oruc kitabı, İftar açarkən edilən dua fəsli. Hədis №2359.

# Həcc və ümrə

**Ömürdə bir dəfə** həcc və ümrə etmək vacibdir. Bu əməlin vacib olması üçün aşağıdakı şərtlər olmalıdır: **1.** Müsəlman. **2.** Aqil. **3.** Yetginlik. **4.** Azad. **5.** İmkan. İmkan dedikdə yola çıxmaq üçün azuqə və minikə sahib olmaq nəzərdə tutulur. **Qadın üçün altıncı şərt**, yəni məhrəminin olması şərti əlavə olunur. Məhrəm dedikdə ömürlük onunla evlənməsi haram edilən yaxın qohum nəzərdə tutulur. Məhrəmsiz edilən həcc doğru sayılır, amma buna görə qadın günah qazanır. Kim ölənə qədər səhlənkarlıq edib, həcc və ümrə etməzsə, onun malından götürüb, əvəzinə həcc və ümrəyə adam göndərmək lazımdır. Kafirin və dəlinin həcci məqbul sayılmır. Uşaq və kölənin həcci isə məqbuldur. Amma bu onlar üçün İslam həccini əvəz etmir. İmkanı olmayan kasıb insan borc edib həccə gedərsə, həcci məqbuldur.

Kim özü üçün İslam həccini etməyib, başqasının əvəzinə həcc edərsə, bu **həcc onun özü üçün sayılar**.

**Ehram:** Ehrama girmək istəyən insanın qüsl alması, təmizlənməsi, ətirlənməsi müstəhəbdir. Ehrama girən insan tikili paltarını çıxarmalı, alt və üst hissədən ibarət ağ paltarı geyinməlidir. Bundan sonra **"Ləbbeykə Allahummə *umratən*"**, yaxud "***həccən***" və ya "***Həccən və umratən***" sözlərini deyib yola düşməlidir. Hər hansı səbəbdən yolda qalıb həccə çatmayacağını düşünən insan bu şərti kəsə bilər: "Fə in həbəsəni habisun fəməhilli heysu həbəstəni". *(Əgər yolda hansısa manea məni saxlasa, məni saxladığın yerdə də ehramdan çıxacam).*

Həccə gedən onun üç növündən birini edə bilər. Təməttü, ifrad və qiran həcci. Bu növlərin ən yaxşısı **təməttü** həccidir. Bu, həcc aylarında ümrə edib sonra ehramdan çıxmaq və həmin ilin həcc günü həccə getməkdir. **İfrad** həcci təkcə həccə niyyət etməkdir. **Qiran** həcci isə ümrə və həccə eyni anda, yaxud ümrə niyyəti ilə Məkkəyə gəlib təvafa başlamadan öncə, həccə də niyyət etməkdir.

Həccə niyyət edən insan miniyinin üzərinə minib yolda düşdükdə bu duanı deyir: **"Ləbbeykə Allahummə ləbbeyk. Ləbbeykə lə şərikə ləkə ləbbeyk. İnnəl həmdə vən nimətə ləkə vəl mulk, lə şərikə lək".** Bu duanı çox və qeyri qadınlar üçün uca səslə oxumaq müstəhəbdir.

**Ehramda qadağan olunan əməllər doqquzdur:** **1.** Saçı qırxmaq. **2.** Dırnaqları tutmaq. **3.** Kişilər üçün tikili paltar geyinmək. Əgər alt üst paltarı tamazsa o zaman şalvar, ayaqqabı tapa bilməyən isə xuff geyinə bilər. Buna görə onlara kəffarə də düşmür. **4.** Kişilərin başlarını örtməsi. **5.** Bədəninə və paltarına ətir vurmaq. **6.** Ov ovlamaq. Ov dedikdə yeyilməsi halal olan hər bir vəhşi heyvan nəzərdə tutulur. **7.** Nikah bağlamaq. Bu, haramdır və kəffarəsi də yoxdur. **8.** Qadınla tam yaxınlıq etmək deyil, şəhvət hissi ilə oynaşmaq. Bunun kəffarəsi bir qoyun kəsmək, yaxud üç gün oruc tutmaq və ya altı nəfər kasıbı yedizdirməkdir. **9.** Qadınla tam cinsi əlaqədə olmaq. Əgər bu yaxınlıq ehramdan çıxmanın birinci mərhələsindən *(təhəllüldən)* öncə olarsa, onun həcci batil olur. Bu halda, o, həcci tamamlayır və gələn il isə həcci qəza edib, bir dəvə kəsərək Məkkə fağırlarına paylamalıdır. Əgər bu yaxınlıq birinci mərhələdən *(təhəllüldən)* sonra olubsa, onun həcci düzgündür. Amma bir dəvə qurban kəsməlidir. Əgər bu yaxınlıq ümrə ehramında olarkən baş verərsə, ümrəsi batil olar. O, bir qoyun kəsib, yenidən ümrə etməlidir. Həcc və ya ümrə cinsi yaxınlıqdan başqa, heç bir əməllə pozulmur. Qadın da kişi ilə eyni hökmdədir. Sadəcə olaraq, qadın tikili paltar geyinə bilər. Yalnız əlcək və niqab geyinməməli və üzünü örtməməlidir.

**Kəffarə (*fidyə*) iki növdür: 1.** Seçənəkli kəffarə: Bu, ehrama girdikdən sonra saçı qırxmaq, ətirlənmək, dırnaqları tutmaq, kişilər üçün başı örtmək və tikili paltar geyinmək kimi qadağaları edənlərə aiddir. Belə qadağaları edən üç gün oruc tutmalı, yaxud altı nəfər kasıbı hərəsini yarım saa yəni, 1,5 kq qida ilə yedizdirməli, yaxud qoyun kəsməlidir. Əgər ov ovlayıbsa, ovladığı ovun mislində bir heyvan kəsməlidir. Ovlanmış heyvanın oxşarı yoxdursa, o zaman heyvanın qiymətini ödəməlidir. **2.** Ardıcıllıqla ödənilən kəffarə: Təməttü və Qiran həcci edənlərin kəffarəsi bir qoyun, cinsi yaxınlıq edənin isə bir dəvə kəsməkdir. Təməttü və Qiran həccini edənin imkanı yoxdursa, üç gün həcdə yeddi gün isə evinə qayıtdıqdan sonra oruc tutmalıdır. Qurban kəsmək və ya yemək yedizdirmək ancaq Məkkə kasıblarına şamil olunmalıdır.

**Məkkəyə daxil olmaq:** Hacı "Məscidül Hərama" daxil olduqda məscidə daxil olduqda oxunan duanı oxuyur. Sonra təməttü həcci edən ümrəyə, ifrad və qiran həcci edənlər isə qüdum təvafına başlayırlar. Təvaf zamanı üst paltarın bir hissəsini sağ qolun altına keçirib uclarını sol çiyinin üzərinə atmaqla sağ çiyin açıq qalır. Qara daşa əl vurub, yaxud öpüb və ya işarə edib *"Bismilləh Allahu əkbər"* deyərək onun bərabərliyindən təvafa başlayır. Bu hal hər təvafda təkar olunur. Təvaf zamanı Kəbə evi sol tərəfdə olmaqla yeddi dəfə təvaf olunur. İmkan daxilində ilk üç təvafda daha iti yerişlərlə yerimək lazımdır. Digər dörd təvafda isə adi yerişlə yerimək yetərlidir. Hər dəfə "Rüknul Yəmaniyə"[1] çatdıqda imkan daxilində əlini ora sürtür və qara daşın tininə çatana qədər bu duanı oxuyur: **"Rabbənə ətinə fid dunyə həsənətən və fil axirəti həsənətən və qinə azəbən nar"**. Təvafın qalan hissəsində ürəyindən keçən dua ilə dua edilir. Yeddi təvaf başa çatdıqdan sonra imkan daxilində İbrahim məqamının arxasında iki rükət namaz qılır. İki rükətdə "Kəfirun" və "İxlas" surələrini oxuyur. Sonra çoxlu miqdarda zəm-zəm suyu içir və imkan olarsa, yenidən qayıdıb qara daşa əl vurur və daş ilə qapı arasında dua edir. Sonra "Səfa" dağına tərəf yönəlir və dağın üzərinə çıxıb **"Allah nə ilə başlayıbsa, mən də onunla başlayıram"** deyir və bu ayəni oxuyur: **"İnnə-s-afə vəl mərvatə min şəairilləh. Fəmən həccəl beytə ov i`təmərə fələ cunahə aleyhi ən yəttovvafə bihimə. Va mən tətavvaə xayran fə innəllahə şə~kirun alim"**. "*(Ey möminlər!)* Həqiqətən, Səfa və Mərvə Allahın əlamətlərindəndir *(ibadət nişanələrindəndir)*. Evi *(Kəbəni)* həcc və ya ümrə yolu ilə *(qaydası ilə)* ziyarət edən şəxsin bunları təvaf etməsində *(ətrafına dolanmasında)* heç bir günah yoxdur. Hər kəs *(vacibdən əlavə)* könüllü olaraq yaxşı bir iş görərsə, Allah *(onun etdiyi yaxşı işdən)* razı qalandır *(əvəzini verəndir)*, *(onu)* biləndir." **(əl-Bəqərə: 158).**

Sonra uca Allaha təkbir gətirib, şəninə tərif söyləyir və üzü Kəbəyə dayanıb, əllərini açaraq dua edir. Sonra dağdan enib, yaşıl rəngli işarəyə tərəf gedir və oradan növbəti yaşıl işarəyə qədər qaçır. Sonra adi yerişlə Mərvaya tərəf yollanır. Burada da Səfanın üzərində etdiklərini edir. Sonra dağdan enib birinci dəfə etdiklərini təkrarlayır və beləliklə, yeddi dövrə edir. Səfadan Mərvaya bir dövrə, Mərvadan Səfaya da bir dövrə hesablanır. Sonra saçını qısaldır və ya qırxır. Saçı qırxmaq daha yaxşıdır. Yalnız təməttü həccin ümrəsində saçı qısaltmaq yaxşıdır. Çünki bundan sonra həcc üçün saçını qırxdırmalı olacaq. Qiran və ifrad həcci

---

[1] Bu, qara daşın tinindən öncəki tindir.

edənlər qüdum təvafından sonra bayram günü *"cəmərətul aqəbə"*yə daş atmayınca saçlarını qırxmırlar. Bu ayinlərin icrasında qadın ilə kişi arasında fərq yoxdur. Sadəcə olaraq, qadınlar təvafda və ya Səfa-Mərva arasında qaçmırlar.

**Həccin vəsfi:** Zülhiccə ayının səkkizinci *(tərviyə)* günü ehramda olmayanlar Məkkədə qaldıqları yerdən ehrama niyyət edir və doqquzuncu günün gecəsini minada qalmaq üçün oraya gedirlər. Doqquzuncu gün səhər günəş çıxıb qızdıqdan sonra Ərəfata yola düşürlər. Günəş zenit xəttini keçdikdə Ərəfatda zöhr və əsr namazlarını birləşdirib qısa şəkildə *(4 rükətli namazı 2 rükət)* qılırlar. Urənə vadisindən başqa Ərəfatın hər yerində oturmaq olar. Burada oturarkən *"Lə iləhə illəllah vəhdəhu lə şərikə ləhu, ləhul mulku və ləhul həmdu və huvə alə kulli şeyin qadir"* duasını çox oxumaq yaxşıdır. Ümumiyyətlə, bu gündə çoxlu dua və tövbə etmək, Allahdan bağışlanma diləmək lazımdır. Günəş batdıqdan sonra sakit və rahat şəkildə *"təlbiyə"*[1] zikrini oxuya-oxuya Muzdəlifəyə gedir. Muzdəlifəyə çatdıqda məğrib və işa namazını birləşdirib qısaldılmış qılır. Gecəni Muzdəlifədə qalır və sübh namazının vaxtı girən kimi namazı qılır və hava işıqlaşana qədər dua edir. Günəş çıxmadan öncə Minaya tərəf yola düşür. Muhəssir vadisinə çatdıqda bu yeri bacardığı qədər sürətlə keçir. Minaya gəlib ***"cəmərətul aqəbə"***yə noxud böyüklükdə yeddi ədəd çınqıl daş atır. Əlini qaldırıb hər daşı atanda təkbir ***(Allahu əkbər)*** deyir. Atılan daşın dirəyə dəyməsi elə də önəmli deyil. Əsas odur ki, daş hövzəyə düşsün. Daşı atmağa başlayanda "təlbiyə"ni dayandırmaq lazımdır. Sonra gedib qurbanını kəsir, saçını qırxır və ya qısaldır. Amma qırxmaq daha yaxşıdır. Daşı atdıqdan sonra qadınla cinsi yaxınlıq etməkdən başqa digər qadağalar götürülür. Buna ***"birinci təhəllül"*** deyilir. Daha sonra Məkkəyə gedib "ifadə təvafı"nı yerinə yetirir. Bu təvaf həcci tamamlayan təvafdır. Sonra təməttü həcci edənlər, yaxud qüdum təvafından sonra Səfa və Mərvanı dövrə etməyən İfrad və Qiran həcci edənlər Səfa və Mərva dağları arasında gedib-gəlirlər. Bunu etdikdən sonra həciyə hər şey, hətta qadına yaxınlıq etmək də halal olur. Buna *"ikinci təhəllül"* deyillər. Sonra Minaya qayıdır və gecələri orada qalır. Bu vacibdir. Bu günlərdə günəş zeniti keçdikdən sonra daş atılan yerə gedib, orada olan üç nişanəyə hərəsinə yeddi ədəd daş atır. İlk olaraq birinci nişanəyə yeddi ədəd daş atır və bir qədər irəli gedib dayanır və Allaha dua edir. Sonra orta nişanəyə eyni qayda ilə daş atır və dua edir. Sonda isə axırıncı nişanəyə daş atır və bundan sonra dayanmır. İkinci gündə də eyni əməlləri təkrarlayır. Əgər Minanı tez tərk etmək istəyirsə, o zaman ikinci gün günəş batmadan öncə oranı tərk etməlidir. Əgər Zülhiccənin on ikinci günündə günəş batmadan öncə oranı tərk edə bilməsə, həmin gecəni Minada qalmalı və ertəsi gün yenidən daş atmalıdır. Əgər Minadan çıxmaq əzmində olub izdiham səbəbi ilə günəş batana qədər bunu edə bilməyibsə, günəş batandan sonra yoluna davam edib oradan çıxa bilər. Qiran həcci edənlər də ifrad həcci edənlər kimidir. Sadəcə olaraq, Qiran həcci edən Təməttu həcci edənlər kimi qurban kəsməlidirlər. Məkkədən yola düşmək istədikdə isə sonuncu əməli Kəbə ilə vidalaşmaq olsun deyə Kəbəni təvaf etməlidir. Aybaşı və nifaslı qadınlar vida təvafını etmirlər. Əgər vida təvafından

---

[1] "Ləbbeykə Allahummə Ləbbeyk, Ləbbeykə lə şərikə ləkə ləbbeyk. İnnəl həmdə vən nimətə ləkə vəl mulk. Lə şərikə lək."

sonra ticarət edərsə, yenidən təvaf etməlidir. Kim vida təvafını etmədən öncə, yola düşərsə, yaxındadırsa, qayıdıb təvaf etməli, uzaqdadırsa, qurban kəsməlidir.

**Həccin dörd əsas əməli *(rüknü)* vardır: 1.** Ehrama girmək: Ehram, ibadətə başlamağı niyyət etməkdir. **2.** Ərəfatda dayanmaq. **3.** Həcc təvafı. **4.** Səfa və Mərva dağları arasında gedib-gəlmək *(Sə`y etmək)*.

**Həccin yeddi vacib əməli vardır: 1.** Miqatdan ehrama girmək. **2.** Ərəfatda gecəyə qədər dayanmaq. **3.** Muzdəlifədə gecənin yarısından bir qədər ötənədək gecələmək. **4.** Təşriq günlərinin gecələrini Minada qalmaq. **5.** Cəmərətda daş atmaq. **6.** Saçı qırxmaq və ya qısaltmaq. **7.** Vida təvafı.

**Ümrənin üç əsas əməli *(rüknü)* vardır: 1.** Ehrama girmək. **2.** Ümrə təvafını etmək. **3.** Ümrə səyini etmək.

**Ümrənin iki vacib əməli vardır: 1.** Miqatdan ehrama girmək. **2.** Saçı qırxmaq və ya qısaltmaq.

* **Əsas əməl *(Rükn)* yerinə yetirilmədikdə** ibadət məqbul sayılmır. Bu halda mütləq həmin əməl yenidən icra olunmalıdır.

* **Vacib əməli etmədikdə,** bunun əvəzində qurban kəsmək kifayət edir.

* **Sünnə əməli tərk etdikdə,** əvəzində heç bir kəffarə lazım deyil.

**Kəbəni təvaf etməyin məqbul sayılması üçün on üç şərt lazımdır: 1.**Müsəlman olmaq. **2.** Ağıl. **3.** Niyyət. **4.**Təvaf vaxtının başlaması. **5.** İmkanı olan adamın övrət yerlərini bağlaması. **6.** Dstəmazlı olmaq. Uşaqlar istisnadır. **7.** Yeddi dövrənin tamamlanması. **8.** Kəbə sol çiyin tərəfdə olmaqla təvaf etmək. Bu işdə səhv edən yenidən təvaf etməklə səhvlərini düzəltməlidir. **9.** Gəzərək geri qayıtmamaq. **10.** Gücü çatan adamın ibadətini gəzərək icra etməsi. **11.** Dövrələr arasında ardıcıllığın olması. **12.** Məscidul Həram daxilində etmək. **13.** Təvafın başlanğıcı qara daşdan olmalıdır.

**Təvafın sünnələri:** Qara daşa əl vurmaq, yaxud öpmək və ya onun qarşısından keçəndə təkbir *(Allahu əkbər)* demək. "Rüknul Yəməni"yə əl vurmaq. İlk üç dövrədə sağ çiyini açmaq və iti yerişlərlə yerimək, digər dövrələrdə isə adi yerişlə yerimək. Təvaf zamanı dua oxuyub zikr etmək. Kəbəyə yaxın olmaq. Təvafdan sonra "İbrahim Məqamı" arxasında iki rükət namaz qılmaq.

**Səfa və Mərva arasında səy etməyin *(gedib-gəlməyin)* doqquz şərti vardır: 1.** Müsəlman olmaq. **2.** Ağıl. **3.** Niyyət. **4.** Ardıcıllıq. **5.** Gücü çatanın yeriyərək gəzməsi. **6.** Yeddi dövrəni tamamlamaq. **7.** Səfa və Mərva arasındakı məsafəni başa qədər getmək. **8.** Məqbul təvafdan sonra səy etmək. **9.** Tək sayları Səfadan cüt sayları isə Mərvadan başlamaq.

**Səyin sünnələri:** Natəmizlikdən pak olmaq, dəstəmazlı olmaq. Övrət yerlərini örtmək. Bu əsnada zikr və dua etmək. Lazımlı yerlərdə qaçmaq və ya adi yerişlə getmək. Dağların üstünə çıxmaq. Səyi təvadan dərhal sonra etmək.

**Diqqət!** Daşların atılması lazımi gündə edilməlidir. Bir günün daşını ertəsi günə, yaxud bütün daşları sonuncu təşriq gününə saxlaya bilər, bu icazəlidir[1].

---

[1] Düzdür, bu icazəlidir, amma sünnəyə müxalif bir əməldir. Əgər kimsə belə bir hal ilə qarşılaşarsa, o zaman hər gün üçün ayrıca daş atmalıdır. Yəni bir günün daşını kiçik, orta və böyük cəmərata atıb qayıtmalı və digər günün daşını yenidən atmalıdır və s. *(tərc.)*

**Qurban:** Bu əməl təkidlə buyurulmuş sünnələrdəndir. Zülhiccə ayı başladıqda qurban kəsmək istəyən insanın qurbanını kəsənə qədər saçından, dırnağından və ya dərisindən tutması haramdır.

**Əqiq qurbanı:** Bu oğlan uşağı olduqda iki, qız uşağı olduqda isə bir qoyun kəsməkdir. Bu əməl sünnədir. Bunu körpənin yeddinci günü etmək daha yaxşıdır. Bununla yanaşı, həmin günü uşağın saçını qırxmaq və saçı ağırlığında gümüş sədəqə vermək sünnədir.

**Peyğəmbərin** (*Səllallahu aleyhi və səlləm*) **məscidinə daxil olan insan** ilk olaraq, iki rükət namaz qılır. Sonra Peyğəmbərin (*Səllallahu aleyhi və səlləm*) qəbrinə yaxınlaşıb, arxası qibləyə üzü qəbrə tərəf dayanaraq, sakit, rahat və ehtiram hissi ilə **"Ey Allahın elçisi, sənə Allahın salamı olsun"** – deyir. Sonra sağ tərəfə bir addım gedib **"Ey Əbu Bəkr əs-Siddiq, sənə Allahın salamı olsun, Ey Ömər əl-Fəruq, sənə Allahın salamı olsun"** – deyir. Allahım Peyğəmbərin (*Səllallahu aleyhi və səlləm*) və ümmətinin adından onlara xeyir bəxş et. Sonra ev sol tərəfində olan halda üzünü qibləyə tutaraq dua edir.

**Aşağıdakı cədvəldə həcc əməlləri tərtiblə qeyd olunmuşdur:**

| Həcc | Təməttü | Qiran | Ifrad |
|---|---|---|---|
| Başlama: Ehram və təlbiyə | Allahım sənin çağırışına səs veribÜmrəyə niyyət edirəm. | Allahım sənin çağırışıma səs verib ümrəyə və həccə niyyət edirəm | Allahım sənin çağırışıma səs verib həccə niyyət edirəm |
| Sonra | Ümrə təvafı | Qüdum təvafı | Qüdum təvafı |
| Sonra | Ümrə səyi | Həcc səyi | Həcc səyi |
| Sonra | Saçı qısaltmaq (*tam təhəllül*). | Ehramda qalır | Ehramda qalır |
| 8-ci gün zöhrdən öncə | Məkkədən həcc ehramına girmək və Minaya getmək | Minaya getmək | Minaya getmək |
| 9-cu gün günəş çıxdıqdan sonra | Ərəfata getmək. Zöhr və əsr namazları ilk vaxtda birləşdirilib qısa qılınır. Günəş batana qədər dua edilir. | | |
| Günəş batdıqdan sonra | Muzdəlifəyə gedib çatan kimi Məğrib və İşa namazlarını qısaldıb qılmaq, gecənin yarısına və ya sübhə qədər orada yatmaq. | | |
| 10-cu gün qurban kəsilən günü sübhdən sonra günəş çıxmadan öncə | Minaya getmək və sonuncu nişanəyə daş atmaq. | | |
| | Qurban kəsmək | Qurban kəsmək | -------------- |
| | Saçı qırxmaq və ya qısaltmaq. İfadə təvafını etmək. Bu üç əməldən ikisini etdikdə birinci təhəllül olur. Hamısını etdikdə ikinci təhəllül olur. | | |
| | Həcc səyi | -------------- | -------------- |
| Ayın 11, 12 və 13-cü günləri | Günəş zeniti keçdikdən sonra Kiçik, orta və böyük Nişanələrə daş atmaq | | |
| Yola düşərkən | Vida təvafı. Aybaşı və nifaslı qadınlar bu təvafı etmirlər. | | |




# Faydalı məlumatlar

**Günahlar bu işlərlə təmizlənir:** Səmimi tövbə etmək. "Əstəğfirullah" deyib bağışlanma diləmək. Yaxşı işlər görmək. Müsibətlərə düçar olmaq. Sədəqə vermək. Başqasının etdiyi dua. Əgər insanın Allah tərəfindən bağışlanmayan hər hansı günahı qalarsa, günahı təmizlənənə qədər qəbirdə, yaxud Qiyamət günündə və ya cəhənnəm odunda əzab görəcəkdir. Əgər bu insan tövhid etiqadı ilə ölübsə, günahı təmizlənəndən sonra cənnətə daxil olacaqdır. Əgər küfr, şirk və ya münafiqliklə ölərsə, cəhənnəm odunda əbədi qalacaqdır.

**Asiliklərin və günahların insana çoxlu təsiri vardır:** Qəlbə təsiri; onda qorxunun, zülmətin, zəlilliyin və xəstəliyin artması, Allahdan məhrum etməsidir. Dinə təsiri; qəlbə etdiyi təsirdən əlavə, insanı itaətdən, Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*), mələklərin və möminlərin duasından məhrum etməsidir. İnsanın ruzisinə təsiri; onu ruzidən məhrum etməsi, naz-nemətlərin əldən çıxması və mal-dövlətin bərəkətinin kasadlaşmasıdır. Fərdlərə təsiri; ömrün bərəkətini azaldır, güzəranı daraldır və işləri çətinə salır. Əməllərə təsiri: insanın əməllərinin qəbul olunmasına mane olur. Cəmiyyətə təsiri; Əminamanlıq nemətini məhv edir, bahalaşmaya səbəb olur, rəhbərlərin və düşmənlərin zülmünə məruz qoyur, yağışın yağmasına mane olur və s.

**Qəlbin rahatlığı və fərəhini əldə etmək, kədərini yox etmək hər kəsin qayəsidir.** Çünki bunun nəticəsində xoşbəxt həyat əldə olunur. Bunun baş verməsi üçün dini, təbii və əməli səbəblər vardır. Bunların hamısı yalnız möminlər üçün hasil ola bilər. **1.** Allaha iman. **2.** Əmrləri yerinə yetirib qadağalardan çəkinmək. **3.** Söz, əməl və digər yaxşı işlərlə insanlara qarşı xoş rəftar göstərmək. **4.** Dünyəvi və ya dini faydalı iş və ya elmlə məşğul olmaq. **5.** Gələcək və ya keçmiş əməllərin fikrini çəkməmək. Yalnız günlük işləri ilə məşğul olmaq. **6.** Allahı çoxlu zikr etmək. **7.**Allahın görsənən və görsənməyən nemətlərini dilə gətirmək. **8.**Dünya işlərində özündən üstün nemət verilənlərə baxmamaq. Özündən aşağıda olana baxmaq. **9.**Qəm-qüssəyə səbəb olan amilləri dəf etməyə və sevinc gətirən səbəbləri əldə etməyə səy göstərmək. **10.** Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) kədərini dəf etmək üçün Allaha pənah apardığı dualarla dua etmək.

**İbrahim əl-Xəvass** ﷺ **demişdir:** Qəlbin dərmanı beş şeydədir; Quranı düşünərəkdən oxumaq. Qarının boş olması. Gecə namazı. Səhər açılanda dua etmək. Əməlisaleh bəndələrlə oturub-durmaq.

**Zina etmək təhlükəsi olmayan insanın evlənməsi sünnədir.** Ümumiyyətlə, ehtiras hissi olmayan insanın evlənməsi isə icazəlidir. Lakin zina etmək təhlükəsi olan insanın evlənməsi isə vacibdir. Bu, hətta vacib həcdən də önəmlidir. Yad qadına baxmaq isə haramdır. Yaşlı qadına, mavilərə, yaxud ehtirasını oyadan heyvanlara şəhvət hissi ilə baxmaq haramdır.

**Oğlanın ailəsi onu istəmədiyi insanla evlənməyə məcbur edə bilməz.** Oğlanın da bu işdə onlara itaət etməsi vacib deyil və bu halda o, valideynlərinin üzünə ağ olmur.

**Bir kişinin qadınla evlənməsi üçün aşağıdakı şərtlər tamamlanmalıdır: 1.** Ər və arvadın dəqiq bilinməsi. Yəni bir neçə qızı olan insan, evlənmək istəyənə *"qızlarımın birini səninlə evləndirdim"* – deyə bilməz. **2.** Mükəlləf və aqil kişinin, həmçinin azad və aqil qadının razılığı. **3.** Vəlinin olması. Qadının öz-özünü

evləndirməsi doğru deyildir. Qadını onun vəlisindən başqası ərə verə bilməz. Əgər vəli haqsız olaraq, evliliyə mane olarsa, o zaman birinci vəlini əvəz edən digər vəli müdaxilə etməlidir. Vəliliyə daha haqlı olan ata, sonra baba, sonra oğul, oğulun oğlu, doğma qardaş, atabir qardaş, qardaş oğlu və i. a. **4.** Şahidlik: Evliliyə iki nəfər aqil və ədalətli kişinin şahid durması şərtdir. **5.** Evlənmək istəyən qız və oğlanın evliliyə mane olan: süd qohumluğu, nəsəb, kürəkənlik kimi – amillərdən xali olmaları.

✷ **Evlənməsi haram olanlar: Birinci;** əbədi haram olanlar və bunlar bir neçə qismə ayrılırlar: **1.** Nəsil: Buraya ana, nənə və yuxarıya doğru kim varsa daxildir. Həmçinin qız, qız nəvə və aşağıya doğru kim varsa, eləcə də bacı, bacı qızı, bacı oğlunun və ya bacı qızının qızı, qardaş qızı, onların qızları, övladlarının qızları və aşağıya doğru. Bibi, xala və yuxarıya doğru. **2.** Süd qohumluğu: Nəsil səbəbi ilə evlənməsi haram olanlar süd qohumluğu ilə də haram hesab olunurlar. Hətta kürəkənlikdə də belədir. **3.** Kürəkənlik: Onlar arvadının anası, nənəsi, arvadının nəsəb təməli sayılanların arvadları, arvadının qızları və aşağıya doğru.

**İkinci:** Müvəqqəti haram olunanlar: **1.** İki bacı ilə eyni zamanda evli olmaq. **2.**Müvəqqəti səbəbə görə. Məsələn, başqasının arvadı kimi. *(yəni, bir qadının öz ərindən boşanmadıqca başqasına ərə getməsi haramdır. Tərc.)*

✷ **Talaq *(boşanma)*:** Aybaşı və nifas adətində, həmçinin yaxınlıq etdiyi təmizlik müddətində qadını boşamaq **haramdır.** Amma əgər boşayarsa, talaq hesaba keçir. Səbəbsiz yerə talaq vermək **məkruh,** ehtiyac olduqda isə **icazəlidir.** Evlilikdən əziyyət çəkənin boşaması isə **sünnədir.** Talaq məsələsində ata anaya itaət etmək **vacib deyildir.** Arvadını boşamaq istəyən insanın bir dəfədən artıq boşaması haramdır. Həmçinin boşamanı aybaşıdan təmizləndikdən sonra yaxınlıq etmədiyi təmizlik müddətində etməlidir. Bir dəfə talaq deyib, gözləmə müddətinin başa çatmasını gözləməlidir. Rici, yəni qaytarılması mümkün olan talaqla boşanmış qadının ərinin evini tərk etməsi, yaxud müddət başa çatmamış ərinin onu zorla evdən çıxarması haramdır. Talaq dil ilə deyildikdə keçərlidir. Talaqa niyyət etmək talaq sayılmır.

✷ **Gözləmə vaxtları:** Bunun bir neçə növü vardır; **1. Hamilə:** Boşanma və ya vəfat halında gözləmə müddəti hamiləlik bitdikdən sonra başa çatır. **2. Əri ölmüş qadın:** Əri ölmüş qadının gözləmə müddəti dörd ay on gündür. **3. Aybaşı halında talaq verilmiş:** Gözləmə müddəti üç dəfə aybaşı olmaqdır. Üçüncü aybaşıdan təmizlənməklə gözləmə müddəti başa çatır. **4. Aybaşı olmayan qadın:** Onun gözləmə müddəti üç aydır. Rici, yəni qaytarılması mümkün olan talaqla boşanmış qadının gözləmə müddəti ərzində əri ilə bir evdə qalması, ərinin onu istədiyi şəkildə görməsi, tənhalıqda qalması icazəlidir. Bu hal gözləmə müddəti bitənə qədər davam edə bilər. Bəlkə Allah, onları münasibətlərini yenidən düzəltməyə müvəffəq edər. Boşanmış qadının geri qaytarılması ərin ***"mən səni geri qaytardım"*** sözü ilə, yaxud cinsi yaxınlıqla hasil olur. Qadının geri qaytarılmasında, yəni talaqın pozulmasında qadının razılığı olmasa da, olar.

✷ **Andlar:** Andiçmədə kəffarənin vacib olması üçün dörd şərt olmalıdır: **1. And içməyi qəsd etmək:** Əgər andını məqsədsiz şəkildə sadəcə dili ilə deyərsə, bu and bilmədən deyilən and hesab olunar. Misal olaraq, danışıq əsnasında "yox vallahi", "bəli vallahi" kimi ifadələri qeyd etmək olar. **2. Gələcəkdə baş verməsi mümkün**

**olan bir şey üçün and içmək:** Bilməyərəkdən keçmişdə baş vermiş bir işə and içmək, yaxud özünün düz dediyini zənn edib, and içmək, yaxud yalandan and içmək, özünün düz olduğunu zənn edib, gələcək bir işə and içmək kimi hallarda bu şərt pozulmuş hesab olunur. – Yalandan and içmək böyük günahlardan hesab olunur. **3. Andını heç bir məcburiyyət olmadan etmək: 4. Andını pozmaq:** Bir işi görməyəcəyinə and içib onu gördükdə, yaxud görəcəyinə and içib görmədikdə. And içərkən istisma edənin boynuna iki şərtlə kəffarə düşmür. **1.** İstisnanın andla birlikdə deyilməsi. **2.** Andını istisna ilə bağlamağı qəsd etməlidir. Misal olaraq "Vallahi inşəllah filan işi edəcəyəm" və s. bu kimi ifadələri demək olar. **Sünnəyə görə kim bir işə and içib, başqa işin daha xeyirli olduğunu görərsə**, andının kəffarəsini verib daha xeyirli hesab etdiyi işi görsün. **Andın kəffarəsi:** Andın kəffarəsi hər biri yarım saa (1,25 kq) qida məhsulu olmaqla on nəfər yoxsulu yedizdirmək, yaxud geyindirmək və ya bir kölə azad etməkdir. Buna imkanı çatmayan üz gün ardıcıl oruc tutmalıdır. Yedizdirməyə və ya geyindirməyə imkanı ola-ola oruc tutanın kəffarəsi keçərli deyildir. Kəffarəni andını pozmadan öncə və ya sonra ödəmək olar. Kim bir iş üçün bir dəfədən artıq and içibsə, bir kəffarə verməsi yetərlidir. Əgər and içdiyi məsələlər müxtəlifdirsə, kəffarə də bir o qədər olmalıdır.

✷ **Namazda və qeyri vaxtlarda oxunan zikrlər** özü eşidən tərzdə, başqalarını narahat etməmək şərti ilə tələffüz edilməlidir. Əks halda, zikrlərin oxunuşu keçərli deyildir.

✷ **Nəzir;** Nəzirin bir neçə növü vardır: **1. Mütləq nəzir:** Misal olaraq, "xəstəlikdən sağalacağım təqdirdə Allah üçün nəzir deyirəm" – deyib, hər hansı nəzir növünü təyin etmədikdə istədiyi həyata keçdikdən sonra and içmək kəffarəsini verməlidir. **2. Mübahisə və ya qəzəb halında nəzir etmək:** Bu, nəyisə özünə vacib və ya qadağan etmək üçün deyilən nəzirdir. Misal olaraq, "əgər mən səninlə danışsam bir il oruc tutacağam". Belə nəzir edən insan həmin adamla danışarsa, ya qoyduğu şərtə əməl edib bir il oruc tutmalı, yaxud and pozmağın kəffarəsini verməlidir. **3. İcazəli nəzir:** Misal, "Paltarımı geyinəcəyimə dair Allaha nəzir edirəm". Bu insan ya dediyi paltarını geyinməli, yaxud and pozmağın kəffarəsini verməlidir. **4. Məkruh** *(bəyənilməyən)* **nəzir:** Misal, "arvadımı boşamağı Allaha nəzir edirəm". Belə halda and pozmağın kəffarəsini verməyi sünnədir. Belə nəziri həyata keçirmək olmaz, lakin həyata keçirərsə kəffarə verən deyil. **5. Günah nəzir:** Misal, "oğurluq etməyi Allaha nəzir edirəm". Belə nəziri icra etmək haramdır. Bu halda and pozmaq kəffarəsi verir. Əgər etdiyi nəziri həyata keçirərsə, günah qazanar və boynuna nəzir kəffarəsi düşməz. **6. Savablı nəzir:** Misal, Allaha yaxınlaşmaq məqsədi ilə "Bu qədər namaz qılmağı Allaha nəzir edirəm" – demək. Nəziri deyərkən*(xəstənin sağalması və s.)* hər hansı işin həyata keçməsini şərt qoyubsa, dediyi hasil olduqdan sonra nəzirini etməlidir. Əgər nəzirini hər hansı şərtlə bağlamayıbsa, o zaman nəzirini birbaşa icra etməlidir.

✷ **Süd qohumluğu:** Nəsil qohumluğu ilə haram olunanlar süd qohumluğu ilə də haramdır. Bunun üçün üç şərt tamamlanmalıdır: **1.** Süd anası tərəfindən verilən süd doğuşdan qaynaqlanan süd olmalıdır. **2.** Süd əmizdirmə iki yaş ərzində olmalıdır. **3.** Uşağı tam dəqiqliyi ilə ən azı beş dəfə süd ilə doyuzdurmalıdır. Süd əmizdirmək

dedikdə uşağın döşü sorub buraxması bir hesab olunmaqla bunu beş dəfə təkrarlaması nəzərdə tutulur. Süd qohumluğu ilə himayədarlıq və ya varislik keçmir.

**Vəsiyyət:** İnsan öldükdən sonra onun başqasına çatacaq haqqını çatdırmaq vacibdir. İnsan ölümündən öncə bu barədə öz yaxınına bildirməlidir. Özündən sonra çoxlu mal-dövlət qoyub gedən insanın malının beşdə bir hissəsini qohum olmayan və varisliyə düşməyən yaxın kasıblara sədəqə verməyi sünnədir. Yaxud istənilən miskinə, alimə və ya əməlisaleh insana sədəqə edə bilər. Varisi olan kasıb insanın belə sədəqə etməyi məkruhdur *(bəyənilmir)*. Əgər varisləri varlı olsalar, o zaman kasıbın öz malının deyilən miqdarını sədəqə etməsi mübahdır *(icazəlidir)*. Həmçinin qeyri varislərə malının üçdə birindən çox vəsiyyət etməsi haramdır. Varisə isə az miqdarda olsa da, mal-dövlət vermək barədə əlavə vəsiyyət etmək haramdır. Ölümündən sonra varisləri buna icazə versələr, o zaman halaldır. Vəsiyyət sahibinin vəsiyyəti: "Vəsiyyətimi geri götürürəm", "Vəsiyyətimi pozuram", "Vəsiyyətimi dəyişirəm" və s. bu kimi sözləri ilə mahiyyətini itirir. Vəsiyyət sahibinin vəsiyyətin əvvəlində bu sözləri yazması müstəhəbdir: Rəhman və Rəhim Allahın adı ilə. Bu Allahdan başqa ibadətə layiq olan haqq məbudun olmadığına, Onun təkliyinə və heç bir şəriki olmadığına, eləcə də Muhəmmədin qulu və Allahın elçisi, cənnət və cəhənnəmin haqq, gözlənilən qiyamətin baş verəcəyinə, Allahın qəbirdə olanları dirildəcəyinə dair şahidlik edən filankəs oğlu filankəsin vəsiyyətidir. Mən, qoyub-getdiyim əhl-əyalıma Allahdan qorxmağı, öz aralarında islahedici olmağı, mömin olub, Allaha və rəsuluna itaətkarlıq göstərməyi, İbrahim ﷺ və Yaqub ﷺ peyğəmbərin öz oğlanlarına etdikləri vəsiyyəti edirəm. **"Ey övladlarım! Allah sizin üçün bir din seçmişdir. Siz də yalnız müsəlman olaraq ölməlisiniz."** *(əl-Bəqərə: 132)*.

**Peyğəmbərə** *(Sallallahu aleyhi və səlləm)* **salavat deyərkən salat və salam** ***(yəni, sallallahu aleyhi və səlləm*** *(Sallallahu aleyhi və səlləm)*) **demək müstəhəbdir.** Təkcə salat deyib salam deməmək yaxşı deyil. Peyğəmbərdən *(Sallallahu aleyhi və səlləm)* qeyrisinə ibtidaən salavat demək olmaz. Məsələn, Əbu Bəkr *(sallallahu aleyhi və səlləm)*, yaxud Əli *(əleyhissəlam)* demək məkruh hesab olunur *(bəyənilmir)*. Alimlərin yekdil rəyinə əsasən, Peyğəmbərə *(Sallallahu aleyhi və səlləm)* salavatdan sonra qeyrisinin adnı çəkmək olar. Məsələn, ***(Allahummə salli alə Muhəmmədin və alə ali Muhəmmədin və əshabihi və əzvacihi və zurriyyətihi.) Allahım Muhəmmədə, onun ailəsinə, əshabına, yoldaşlarına və nəsil-nəcabətinə salavat olsun.***

**Səhabələrin, tabiinlərin və onlardan sonra yaşayan alimlərin, zahidlərin və digər xeyirxah müsəlmanların adı çəkiləndə *(Allah ondan razı olsun!)*, yaxud *(Allah ona rəhmət etsin!)* demək müstəhəbdir.** Məsələn, Əbu Hənifə, Malik, Şafii və Əhməd *(Allah onlardan razı olsun!)*, yaxud *(Allah onlara rəhmət etsin)*.

**Heyvanın kəsilməsi:** Quruda yaşayıb, sahibinin mülkiyyəti sayılan əti yeyilən hər bir heyvanın yeyilməsi üçün ilk öncə onun kəsilməsi vacibdir. Heyvanın kəsilməsi üçün dörd şərt mütləqdir: **1.** Heyvanı kəsən insan aqil olmalıdır. **2.** Kəsici alət diş və dırnaqdan başqa istənilən alət ola bilər. Çünki, diş və dırnaqla heyvan kəsmək olmaz. **3.** Hülqumu, qırtlaqı, şah damarların ikisini, yaxud birini kəsmək. **4.** Əlini tərpədib, kəsməyə başladıqda ***"Bismilləh"*** demək. Bunu qeyri ərəb dilində demək keçərlidir. ***"Bismillah"*** sözü ilə bərabər ***"Allahu əkbər"*** demək

isə müstəhəbdir. Səhvən deməmək keçərlidir, cəhalətə görə deməmək, keçərli deyil.

✸ **Ov ovlamaq:** Ov, təbiətcə vəhşi və əlçatmaz heyvanı ələ keçirməkdir. Ehtiyac ucbatından ov etmək icazəli, əyləncə üçün ov etmək isə məkruhdur. Ovu qovub insanların əkin sahələrinə və yaşayış yerlərinə ziyan vurmaq haramdır. **Dörd şərt əsasında ov etmək halaldır:** **1.** Ov, kəsdiyinin yeyilməsinə icazə verilən insan tərəfindən icra olunmalıdır. **2.** Kəsici alət şəriətin icazə verdiyi alətlərdən olmalıdır. Bu nizə, ox və s. bu kimi iti alətlərlə olmalıdır. Əgər ov şahin quşu, yaxud ov iti ilə edilirsə, bu zaman ov edən heyvanın öyrədilmiş olması şərtdir. **3.** Ov etməyi nəzərdə tutmaq. Yəni atəş edərkən məqsəd ov etmək olmalıdır. Əgər məqsədsiz şəkildə ovlayar və canlını öldürərsə, onun yeyilməsi halal deyil. *(Əgər heyvanın can vermədiyini görər və onu kəsərsə, halal olar. Tərc.)* **4.** Atəş açarkən *"Bismilləh"* demək. Ov edərkən səhvən və ya cəhalət səbəbi ilə *"Bismilləh"* deməmək keçərli deyil. Yəni vurulmuş heyvanı yemək haramdır.

✸ **Qidalar:** İçiləcək və yeyiləcək nə varsa, qidadır. Qidalar əslən halal hesab olunurlar. Hər bir qidanı bu üç şərtlə yemək halaldır: **1.** Qida pak olmalıdır. **2.**Qida orqanizm üçün təhlükəli olmamalıdır. **3.** Qida iyrənc olmamalıdır.

Qan və leş kimi natəmiz, zəhər kimi təhlükəli, peyin, idrar, bit və birə kimi iyrənc qidalar haramdır.

Quruda yaşayan heyvanlardan ev eşşəkləri, aslan, bəbir, canavar, it, donuz, meymun, pişik, tülkü, sincab kimi **köpək dişləri ilə ov edən heyvanların yeyilməsi haramdır**. Quzğun, qartal, şahin, çalağan, bayquş kimi **caynağı ilə ov edən quşların yeyilməsi haramdır**. Kərkəs və hacıleylək kimi **leş yeyən quşları yemək haramdır.** Yarasa, siçan, eşşək arısı, bal arısı, milçək, kəpənək, şanapipik, kirpi kimi **nəfs çəkməyən canlıları yemək haramdır.** Qurd, böcək, kərtənkələ kimi **həşəratları da yemək haramdır. Şəriətin öldürməsini əmr etdiyi** əqrəb, yaxud **öldürməsini qadağan etdiyi** qarışqa kimiləri yemək haramdır. Əti yeyilən və yeyilməyən iki heyvandan törənmiş canlıları yemək haramdır. Yeyilməsi icazə verilən iki heyvandan törənmiş canlını da yemək halaldır. Misal olaraq, çöl eşşəyindən və atdan törənmiş qatırı demək olar. Ev heyvanları, at, eləcə də zürafə, dovşan, ərəbdovşanı, varan, antilop kimi çöl heyvanları, dəvəquşu, toyuq, tovuzquşu, tutuquşu, göyərçin, sərçə, ördək, qaz kimi quşlar və suda üzən digər quşlar halaldır. Suda quruda yaşayanlardan qurbağa, ilan və timsah istisna olmaqla, digərləri halaldır. Nəcasətlə suvarılan və ya gübrələnən bitkiləri və meyvələri yemək olar. Əgər məhsulda nəcasətin qoxusu və ya dadı hiss olunarsa, haramdır. Kömür, torpaq və palçıq yemək məkruhdur. Soğan və sarımsağı isə bişirməmiş yemək məkruhdur. Acıyıb, çıxılmaz vəziyyətə düşdükdə, haram edilmiş qidalardan ehtiyacını ödəyən miqdarda yemək vacibdir.

✸ **Kafirləri bayramlarına görə təbrik etmək, bu bayramlarda iştirak etmək və ya onlara birinci salam vermək haramdır.** Əgər birinci onlar salam versələr, onlara *"va aleykum"* sözü ilə cavab verməliyik. Kafirlər və bidətçilər üçün ayağa qalxmaq da haramdır. Onlarla əl ilə görüşmək isə məkruhdur. Onlara başsağlığı vermək, xəstələndikdə ziyarət etmək də haramdır. Yalnız şərii məsləhət olarsa, o zaman bunu etmək olar.

# Şərii ovsunlar

Uca Allahın yaratdığı həyata nəzər saldıqda görürük ki, imtahan olunmaq yaradılış qanunlarından biridir. Uca Allah buyurur: ﴾*Əlbəttə, Biz sizi bir az qorxu, bir az aclıq, bir az da mal, can və məhsul qıtlığı ilə imtahan edərik. Səbr edən şəxslərə müjdə ver!*﴿ (əl-Bəqərə: 155). Əməlisaleh insanların imtahandan xilas olduğunu zənn edənlər səhv edirlər. Əksinə, imtahan olunmaq imanın əlamətlərindəndir. Peyğəmbərdən (*Sallallahu aleyhi və səlləm*) "**ən şiddətli imtahan olunan kimlərdir?**" – deyə soruşduqda belə demişdi: "**Peyğəmbərlər, əməlisalehlər, sonra dərəcəsinə görə onlara yaxın olan insanlar. İnsan dininə görə imtahan olunur. O, dinində möhkəm olduqca imtahanı da çoxalar. Dinində zəif olarsa, imtahanı da zəif olar.**" Deyilən imtahan Allahın bəndəsinə olan məhəbbətindən irəli gəlir. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: "*Allah bir toplumu sevərsə, onları imtahan edər*". (Əhməd və Tirmizi). Allahın bəndəsi üçün xeyir istəməsinin əlamətlərindən biri budur. Deməк, Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: "*Allah bəndəsi üçün xeyir istədikdə onun cəzasını dünyada tezləşdirər. Bir bəndəsi üçün şər istədikdə onun günahının cəzasını gecikdirib qiyamət gününə saxlayar*" (Tirmizi). İmtahan az olsa, yenə də günahların bağışlanması deməkdir. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: "*Ağac yarpaqlarını tökdüyü kimi, hər müsəlmanın bədəninə batmış bir tikan və ya bundan artığı da onun günahlarını tökər*" (Buxari və Müslim). Elə buna görə, demək olar ki, imtahana çəkilmiş müsəlman əməlisalehdirsə, imtahanı onun keçmiş günahlarının bağışlanması, yaxud dərəcəsinin yüksəlməsidir. Əgər imtahan olunan insan günahkardırsa, imtahanı onun günahının bağışlanması və günahların təhlükəsi barədə xəbərdarlıqdır. Uca Allah buyurur: ﴾*İnsanların öz əlləri ilə etdikləri üzündən quruda və suda fəsad əmələ gələr ki, Allah onlara etdiklərinin bir qismini daddırsın və bəlkə, onlar qayıtsınlar.*﴿ (ər-Rum: 41).

**İmtahanlar müxtəlifdir:** Xeyirli imtahan; buna mal-dövlətin çoxalmasını misal çəkmək olar. Şərli imtahan; buna isə qorxunu, aclığı və müflisliyi misal çəkmək olar. Uca Allah buyurur: ﴾*Biz sizi şər və xeyirlə imtahana çəkərik...*﴿ (əl-Ənbiya: 35). Şər imtahana digər misal olaraq xəstəlik və ölümü göstərmək olar. Bunların baş verməsinə ən çox gözdəymə və həsəddən irəli gələn sehrdir. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: "*Ümmətimin əksəriyyəti Allahın qəza və qədərindən savayı gözdəymə ilə öləcəkdir*" (ət-Təyalisi).

**Qorunma yolları:** Biz gözdəymə və sehr olunmadan öncə onlardan qorunmağın yollarını bilməli və əməl etməliyik. Çünki qorunmaq müalicədən daha yaxşıdır. Qorunma bir çox şeylərlə ola bilər: ✷ Nəfsini *(özünüidarəetməni)* tövhid inancı ilə gücləndirmək. Kainatı idarə edənin tək Allah olduğuna iman gətirmək, yaxşı əməlləri çoxaltmaq. ✷ Allaha qarşı yaxşı zəndə olmaq və Ona təvəkkül etmək. Hər hansı səbəbdə xəstəlik və ya gözdəymə olduğunu zənn etməsin. Çünki belə zəndə olmağın özü bir xəstəlikdir[1]. ✷ Əgər bir insanın gözünün iti, yaxud sehrbaz olduğu deyilirsə, qorxudan deyil, səbəblərdən istifadə etmək baxımından ondan çəkinmək lazımdır. ✷ Başqasında xoşuna gələn bir şeyi gördükdə Allahı zikr

---

[1] Həkimlər deyirlər ki, əzalarda baş verən xəstəliklərin üçdə ikisindən çoxu əslində xəstəliyin olmadığı halda xəstələndiyini güman etməkdən irəli gəlir.

etmək və bərəkət diləmək lazımdır. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: "***Biriniz özündə, mal-dövlətində, yaxud qardaşında sevdiyi bir şeyi görərsə, onun üçün bərəkət diləsin. Həqiqətən gözdəymə haqdır***" (Əhməd və Hakim). Bərəkət diləmək "Allah bərəkət versin!" – ifadəsini deməkdir. ✸ Sehrdən qorunmağın yollarından biri səhər-səhər yeddi ədəd Mədinə şəhərində yetişən "əcva" xurmasından yemək. ✸Allaha pənah aparmaq, təvəkkül etmək, Onun haqqında yaxşı zəndə olmaq, göz və sehrdən Ona sığınmaq, səhər və axşam oxunan zikrləri daim etmək.[1] Allahın izni ilə bu zikrlərin az və ya çox təsiri olur.

**Bunun isə iki səbəbi vardır: 1.** Zikrlərin haqq və doğru, Allahın izni ilə faydalı olduğuna iman gətirmək. **2.** Dili ilə onları tələffüz etməli, qulaq və qəlbi ilə dinləməlidir. Çünki bunun özü bir duadır. Qafil və məşğul qəlbdən edilən dua qəbul olunmaz. Bu haqda Peyğəmbərdən (*Sallallahu aleyhi və səlləm*) səhih hədislər rəvayət olunmuşdur.

**Zikrlərin vaxtı:** Səhər zikrləri sübh, axşam zikrləri isə əsr namazından sonra oxunur. Əgər müsəlman bu zikrləri unudarsa, yadına düşən kimi oxumalıdır.

**Göz və ya başqa təsirlərə məruz qalmağın əlamətləri:** Şərii ovsunlarla təbabət arasında heç bir ziddiyyət yoxdur. Qiranda orqanik və ruhi xəstəliklər üçün müalicə vardır. Əgər insan orqanizm baxımından sağlamdırsa, bu əlamətlər özünü aşağıdakı xəstəliklərlə biruzə verir: daimi başağrısı, üzdə sarılıq, çoxlu tərləmə və kiçik subaşına çıxma, iştahanın zəifliyi, ətraflarda gicilti, istilik və ya soyuqluğun olması, ürəyin sıxılması, belin və kürəklərin aşağı nahiyəsində gəzən ağrıları, köksündə kədər və sıxıntının olması, gecələr yuxusuzluq, qeyri-təbii qorxu və əsəb hissiyatları, çoxlu gəyirmə, iç çəkmə, tənhalığı sevmək, tənbəllik və halsızlıq, çox yatmağa meyillilik və təbabətdə müalicəsi olmayan digər xəstəliklər. Xəstəliyin güclü və ya zəif olmasından asılı olaraq, bu əlamətlərin hamısı və ya bəzisi ola bilər.

***Müsəlman güclü iman və güclü qəlbə sahib olmalıdır.*** Onun qəlbinə vəsvəsələr daxil olmamalıdır. **Yuxarıda sadalanan əlamətlərdən birini hiss edən kimi özünün xəstələndiyini zənn etməməlidir.** Çünki belə bədbin zənn etməyin müalicəsi çox çətindir.Yuxarıda deyilən əlamətlər tamamən sağlam olan insanlarda ola bilər. Həmçinin bunun səbəbi orqanik xəstəliklər də ola bilər. Yaxud köksün sıxılmasına, kədərə və halsızlığa iman zəifliyi də səbəb ola bilər. Bu halda bəndə, Allah ilə olan əlaqəsinə yenidən nəzər salmalıdır.

**Xəstəlik gözdəyməyə[2] görədirsə, Allahın izni ilə bunun müalicəsi iki şeydən biri ilə olur: 1-** Əgər gözü dəyən adamın şəxsiyyəti məlumdursa, ondan

---

[1] Kitabın "Səhər və axşam zikrləri" adlı bölümünə bax.

[2] Gözdəymə Allahın izni ilə gözdəyməyə məruz qalan adama cinlər tərəfindən verilən əziyyətdir. Səbəb isə gözü dəyən adamın gözdəyməyə məruz qalana heyran olması və bu zaman şeytanların gəlib (namaz, zikr və bu kimi başqa) heç bir maneəyə rastlamamasıdır. Buna Buxarinin rəvayət etdiyi "Gözdəymə haqdır" hədisi şahidlik edir. Digər rəvayətdə isə deyilir: "Bu zaman şeytan və adəm oğlunun həsədi bir arata gəlir". *(Əhməd rəvayət etmişdir. Heysəmi hədisin səhih olduğunu demişdir.)* Gözdəymənin bu adla adlandırılmasına səbəb gözün vəsfedici vasitə olmasına görədir. Bu heç də gözün öz-özlüyündə təsir etməsi anlamına gəlməməlidir. Çünki bəzi hallarda kor insanın da başqasına gözü dəyir. Halbuki o, gözü ilə həmin adamı görmür.




çimməsini tələb edirsən. Sonra onun çimdiyi suyu, yaxud bir hissəsini götürüb onunla çimirsən. **2-** Əgər gözü dəyən insanın şəxsiyyəti məlum deyilsə, o zaman müalicə şəriətin dediyi ovsun *(ruqyə)*, dua və qan aldırma *(ehticam)* ilə olur.

**Əgər xəstəlik sehrə[1] görədirsə, o zaman müalicə Allahın izni ilə aşağıdakı vasitələrlə olur:**

**1. Sehrin olduğu yeri bilmək:** Əgər sehirin qoyulduğu yeri bilərsə, "Fələq" və "Nas" surələrini oxuya-oxuya sehri açmalı və yandırmalıdır.

**2. Şərii ovsunlar:** Ovsunlar Quran ayələrindən, ələlxüsus "Fələq", "Nas", "Bəqərə" surələri və aşağıda qeyd edəcəyimiz dualarla olur.

**3.** Sehri açmaq: Bu iki yolla ola bilər: **A. Haram yolla.** Bu, sehri sehrlə açmaq, bunu açmaq üçün sehrbazların yanına getmək. B. İcazəli yolla: Bunu sidr ağacının yeddi ədəd yarpağını götürüb döyüb əzir, sonra onun üzərinə üç dəfə "əl-Kəfirun", "əl-İxlas", "əl-Fələq" və "ən-Nas" surələrini oxuyur və onu suya tökür. Bundan sonra həmin sudan içir və su ilə çimir. Bunu Allahın istəyi ilə sağalana qədər davam etdirir. *(Əbdürrəzzaq "əl-Müsənnəf" kitabında rəvayət etmişdir)*.

**4.** Sehri çıxartmaq: Əgər sehr bətndədirsə, qusaraq, qandadırsa, qan aldırmaqla[2] *(hicamə ilə)* çıxartmaq olar.

**Ovsun etmək: Şərtləri: 1.** Ovsun Allahın ad və sifətləri ilə olmalıdır. **2.** Ovsun ərəb və ya başa düşdüyü dildə olmalıdır. **3.** Ovsunun öz-özlüyündə şəfa vermədiyini, şəfanı Allahın verdiyini etiqad etmək lazımdır.

**Ovsun edən adamda bu şərtlər tamamlanmalıdır: 1.** Müsəlman və əməlisaleh müttəqi olması müstəhəbdir. Ovsun edən nə qədər çox təqvalı olarsa, bir o qədər təsiri güclü olar. **2.** Ovsun edən zaman sidq ürəklə Allaha yönəlməlidir. Yəni qəlbi və dili ilə bağlanmalıdır. İnsanın öz-özünü ovsun etməsi daha yaxşıdır. Çünki əksər hallarda kənar adamın ürəyi başqa şeylərə bağlanır. Nə qədər olsa, yenə də heç kəs bu ağrıları və möhtaclığı onun özü kimi dərk edə bilməz. Uca Allah da möhtaclara yardım etməyi vəd etmişdir.

**Ovsun olunan adamda bu şərtlər tamamlanmalıdır: 1.** Mömin və əməlisaleh olması müstəhəbdir. İnsanın imanı nə qədər çox olarsa, ovsunun da bir o qədər təsiri çox olar. Uca Allah buyurur: ﴿***Biz Qurandan möminlər üçün şəfa və mərhəmət olan ayələr nazil edirik. O, zalımların ancaq ziyanını artırır.***﴾ (əl-İsra: 82). **2.**Allahın ona şəfa verəcəyinə sidq ürəklə ümid bəsləmək. **3.** Ovsundan sonra şəfa tapmaq üçün tələsməmək. Çünki ovsun etməyin özü bir duadır. Əgər tez qəbul olmağı üçün tələsərsə, duası əsla qəbul olmaya bilər. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: "***Kim "dua etdim amma duam qəbul olunmadı" deməsə, onun duası məqbul olar.***" (Buxari və Müslim).

---

[1] Sehr: Düyünlərdən, oxunan ovsun və sözlərdən, yaxud sehr olunan insanın birbaşa bədəninə, qəlbinə və ya ağlına təsir edən əməldir. Sehrin həqiqi təsiri mövcuddur. Sehr insanı öldürə və ya xəstələndirə bilər. Bəzi hallarda sehr insanı öz yoldaşına cinsi yaxınlıqdan məhrum edir. Bəzən isə onları ayırır. Sehr şirk, küfr və ya böyük günah dərəcəsində olur.

[2] Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: "Sizin üçün ən yaxşı müalicə üsulu qan aldırmaqdır." Uca Allah bu müalicə üsulu ilə əksər orqanik xəstəliklərə, xərçəng xəstəliyi kimi, göz və sehr xəstəliklərinə şəfa vermişdir. Bunlar hamısı reallıqdır.

**Ovsun etməyin bir çox yolları var: 1.** Ovsunu yüngül nəfəs üfürərək, yəni azacıq tüpürcək çıxan kimi oxumaq. **2.** Ovsunu adi qaydada, nəfəs üfürmədən oxumaq. **3.** Ağız suyunu barmağı ilə götürüb, torpaq ilə qatmaq, sonra ağrıyan yerə çəkmək. **4.** Ağrıyan yerə əl sürtə-sürtə ovsun oxumaq.

**Xəstəni ovsun etmək üçün oxunan ayə və hədislər:**

**Ayələr:** **"Əl-Fatihə", "Kəfirun", "İxlas", "Fələq" və "Nas" surələrini oxumaqla yanaşı aşağıdakı ayələri də oxumaq olar:**

Kürsü *(əl-Bəqərə 255)* ayəsi:

﴿ٱللَّهُ لَآ إِلَٰهَ إِلَّا هُوَ ٱلْحَىُّ ٱلْقَيُّومُ ۚ لَا تَأْخُذُهُۥ سِنَةٌ وَلَا نَوْمٌ ۚ لَّهُۥ مَا فِى ٱلسَّمَٰوَٰتِ وَمَا فِى ٱلْأَرْضِ ۗ مَن ذَا ٱلَّذِى يَشْفَعُ عِندَهُۥٓ إِلَّا
بِإِذْنِهِۦ ۚ يَعْلَمُ مَا بَيْنَ أَيْدِيهِمْ وَمَا خَلْفَهُمْ ۖ وَلَا يُحِيطُونَ بِشَىْءٍ مِّنْ عِلْمِهِۦٓ إِلَّا بِمَا شَآءَ ۚ وَسِعَ كُرْسِيُّهُ ٱلسَّمَٰوَٰتِ وَٱلْأَرْضَ
وَلَا يَـُٔودُهُۥ حِفْظُهُمَا ۚ وَهُوَ ٱلْعَلِىُّ ٱلْعَظِيمُ﴾ [1]

əl-Bəqərə surəsnin son iki ayəsi və bu ayələr:

﴿ءَامَنَ ٱلرَّسُولُ بِمَآ أُنزِلَ إِلَيْهِ مِن رَّبِّهِۦ وَٱلْمُؤْمِنُونَ ۚ كُلٌّ ءَامَنَ بِٱللَّهِ وَمَلَٰٓئِكَتِهِۦ وَكُتُبِهِۦ وَرُسُلِهِۦ لَا نُفَرِّقُ بَيْنَ أَحَدٍ مِّن رُّسُلِهِۦ ۚ
وَقَالُوا۟ سَمِعْنَا وَأَطَعْنَا ۖ غُفْرَانَكَ رَبَّنَا وَإِلَيْكَ ٱلْمَصِيرُ ﴿٢٨٥﴾ لَا يُكَلِّفُ ٱللَّهُ نَفْسًا إِلَّا وُسْعَهَا ۚ لَهَا مَا كَسَبَتْ وَعَلَيْهَا مَا ٱكْتَسَبَتْ ۗ
رَبَّنَا لَا تُؤَاخِذْنَآ إِن نَّسِينَآ أَوْ أَخْطَأْنَا ۚ رَبَّنَا وَلَا تَحْمِلْ عَلَيْنَآ إِصْرًا كَمَا حَمَلْتَهُۥ عَلَى ٱلَّذِينَ مِن قَبْلِنَا ۚ رَبَّنَا وَلَا تُحَمِّلْنَا مَا لَا
طَاقَةَ لَنَا بِهِۦ ۖ وَٱعْفُ عَنَّا وَٱغْفِرْ لَنَا وَٱرْحَمْنَآ ۚ أَنتَ مَوْلَىٰنَا فَٱنصُرْنَا عَلَى ٱلْقَوْمِ ٱلْكَٰفِرِينَ﴾ [2]

﴿إِنَّ فِى خَلْقِ ٱلسَّمَٰوَٰتِ وَٱلْأَرْضِ وَٱخْتِلَٰفِ ٱلَّيْلِ وَٱلنَّهَارِ لَءَايَٰتٍ لِّأُو۟لِى ٱلْأَلْبَٰبِ ﴿١٩٠﴾ ٱلَّذِينَ يَذْكُرُونَ ٱللَّهَ قِيَٰمًا
وَقُعُودًا وَعَلَىٰ جُنُوبِهِمْ وَيَتَفَكَّرُونَ فِى خَلْقِ ٱلسَّمَٰوَٰتِ وَٱلْأَرْضِ رَبَّنَا مَا خَلَقْتَ هَٰذَا بَٰطِلًا سُبْحَٰنَكَ فَقِنَا عَذَابَ ٱلنَّارِ﴾ [3]

﴿فَسَيَكْفِيكَهُمُ ٱللَّهُ ۚ وَهُوَ ٱلسَّمِيعُ ٱلْعَلِيمُ﴾ [4]

﴿يَٰقَوْمَنَآ أَجِيبُوا۟ دَاعِىَ ٱللَّهِ وَءَامِنُوا۟ بِهِۦ يَغْفِرْ لَكُم مِّن ذُنُوبِكُمْ وَيُجِرْكُم مِّنْ عَذَابٍ أَلِيمٍ﴾ [5]

﴿وَأَوْحَيْنَآ إِلَىٰ مُوسَىٰٓ أَنْ أَلْقِ عَصَاكَ ۖ فَإِذَا هِىَ تَلْقَفُ مَا يَأْفِكُونَ ﴿١١٧﴾ فَوَقَعَ ٱلْحَقُّ وَبَطَلَ مَا كَانُوا۟ يَعْمَلُونَ ﴿١١٨﴾ فَغُلِبُوا۟ هُنَالِكَ وَٱنقَلَبُوا۟ صَٰغِرِينَ﴾ [6]

---

[1] ﴿Allah, Ondan başqa ibadətə layiq olan məbud yoxdur, əbədi Yaşayandır, bütün yaratdıqlarının Qəyyumudur. Onu nə mürgü, nə də yuxu tutar. Göylərdə və yerdə nə varsa, Ona məxsusdur. Onun izni olmadan Onun yanında kim havadarlıq edə bilər? O, məxluqatın gələcəyini və keçmişini bilir. Onlar Onun elmindən, Onun istədiyindən başqa heç bir şey qavraya bilməzlər. Onun Kürsüsü göyləri və yeri əhatə edir. Bunları qoruyub saxlamaq Ona ağır gəlmir. O, Ucadır, Uludur.﴾

[2] ﴿285. Peyğəmbər öz Rəbbindən ona nazil edilənə iman gətirdi, möminlər də iman gətirdilər. Hamısı Allaha, Onun mələklərinə, kitablarına və elçilərinə iman gətirdilər. Onlar dedilər: "Biz Onun elçiləri arasında fərq qoymuruq!" Onlar dedilər: "Eşitdik və itaət etdik! Ey Rəbbimiz! Səndən bağışlanma diləyirik, dönüş də yalnız Sənədir!"
286. Allah hər kəsi yalnız onun qüvvəsi çatdığı qədər mükəlləf edər. Hər kəsin qazandığı xeyir yalnız onun özünə, qazandığı şər də yalnız öz əleyhinədir. "Ey Rəbbimiz, unutsaq və ya xəta etsək bizi cəzalandırma! Ey Rəbbimiz, bizdən əvvəlkilərə yüklədiyin kimi, bizə də ağır yük yükləmə! Ey Rəbbimiz, gücümüz çatmayan şeyi daşımağa bizi vadar etmə! Bizi əfv et, bizi bağışla və bizə rəhm et! Sən bizim Himayədarımızsan! Kafirləri məğlub etməkdə bizə yardım et!"﴾ (əl-Bəqərə: 285-286)

[3] ﴿Həqiqətən, göylərin və yerin yaradılmasında, gecə ilə gündüzün bir-birini əvəz etməsində ağıl sahibləri üçün dəlillər vardır. O kəslər ki, ayaq üstə olanda da, oturanda da, uzananda da Allahı xatırlar, göylərin və yerin yaradılması haqqında düşünər və deyərlər: "Ey Rəbbimiz! Sən bunları boş yerə yaratmamısan! Sən pak və müqəddəssən! Bizi cəhənnəm odunun əzabından qoru!﴾ (Ali İmran: 190-191).

[4] ﴿Allah sənə kifayət edər. O, Eşidəndir, Biləndir!﴾ (əl-Bəqərə: 137)

[5] ﴿Ey qövmümüz! Allahın təbliğatçısını qəbul edin və ona iman gətirin ki, Allah günahlarınızı bağışlasın və sizi ağrılı-acılı əzabdan qurtarsın!"﴾ (əl-Əhqaf: 31).

[6] ﴿Biz də Musaya: "Əsanı tulla!" – deyə vəhy etdik. Elə bu an əsa onların uydurub düzəltdikləri

﴿ وَإِذَا مَرِضْتُ فَهُوَ يَشْفِينِ ﴾ 2 ﴿ أَمْ يَحْسُدُونَ ٱلنَّاسَ عَلَىٰ مَآ ءَاتَىٰهُمُ ٱللَّهُ مِن فَضْلِهِۦ ﴾ 1

﴿ قُلْ هُوَ لِلَّذِينَ ءَامَنُوا۟ هُدًى وَشِفَآءٌ ﴾ 3 ﴿ وَيَشْفِ صُدُورَ قَوْمٍ مُّؤْمِنِينَ ﴾ 4

﴿ قَالُوا۟ يَٰمُوسَىٰٓ إِمَّآ أَن تُلْقِىَ وَإِمَّآ أَن نَّكُونَ أَوَّلَ مَنْ أَلْقَىٰ ﴿٦٥﴾ قَالَ بَلْ أَلْقُوا۟ ۖ فَإِذَا حِبَالُهُمْ وَعِصِيُّهُمْ يُخَيَّلُ إِلَيْهِ مِن سِحْرِهِمْ أَنَّهَا
تَسْعَىٰ ﴿٦٦﴾ فَأَوْجَسَ فِى نَفْسِهِۦ خِيفَةً مُّوسَىٰ ﴿٦٧﴾ قُلْنَا لَا تَخَفْ إِنَّكَ أَنتَ ٱلْأَعْلَىٰ ﴿٦٨﴾ وَأَلْقِ مَا فِى يَمِينِكَ تَلْقَفْ مَا صَنَعُوٓا۟ ۖ
إِنَّمَا صَنَعُوا۟ كَيْدُ سَٰحِرٍ ۖ وَلَا يُفْلِحُ ٱلسَّاحِرُ حَيْثُ أَتَىٰ ﴾ 5

﴿ وَنُنَزِّلُ مِنَ ٱلْقُرْءَانِ مَا هُوَ شِفَآءٌ وَرَحْمَةٌ لِّلْمُؤْمِنِينَ ۙ وَلَا يَزِيدُ ٱلظَّٰلِمِينَ إِلَّا خَسَارًا ﴾ 6

﴿ لَوْ أَنزَلْنَا هَٰذَا ٱلْقُرْءَانَ عَلَىٰ جَبَلٍ لَّرَأَيْتَهُۥ خَٰشِعًا مُّتَصَدِّعًا مِّنْ خَشْيَةِ ٱللَّهِ ﴾ 7

﴿ وَإِن يَكَادُ ٱلَّذِينَ كَفَرُوا۟ لَيُزْلِقُونَكَ بِأَبْصَٰرِهِمْ لَمَّا سَمِعُوا۟ ٱلذِّكْرَ وَيَقُولُونَ إِنَّهُۥ لَمَجْنُونٌ ﴾ 8

﴿ ثُمَّ أَنزَلَ ٱللَّهُ سَكِينَتَهُۥ عَلَىٰ رَسُولِهِۦ وَعَلَى ٱلْمُؤْمِنِينَ ﴾ 10 ﴿ فَٱرْجِعِ ٱلْبَصَرَ هَلْ تَرَىٰ مِن فُطُورٍ ﴾ 9

﴿ فَأَنزَلَ ٱللَّهُ سَكِينَتَهُۥ عَلَىٰ رَسُولِهِۦ وَعَلَى ٱلْمُؤْمِنِينَ وَأَلْزَمَهُمْ كَلِمَةَ ٱلتَّقْوَىٰ ﴾ 11

﴿ فَأَنزَلَ ٱللَّهُ سَكِينَتَهُۥ عَلَيْهِ وَأَيَّدَهُۥ بِجُنُودٍ لَّمْ تَرَوْهَا ﴾ 12

﴿ لَّقَدْ رَضِىَ ٱللَّهُ عَنِ ٱلْمُؤْمِنِينَ إِذْ يُبَايِعُونَكَ تَحْتَ ٱلشَّجَرَةِ فَعَلِمَ مَا فِى قُلُوبِهِمْ فَأَنزَلَ ٱلسَّكِينَةَ عَلَيْهِمْ وَأَثَٰبَهُمْ فَتْحًا قَرِيبًا ﴾ 13

﴿ هُوَ ٱلَّذِىٓ أَنزَلَ ٱلسَّكِينَةَ فِى قُلُوبِ ٱلْمُؤْمِنِينَ لِيَزْدَادُوٓا۟ إِيمَٰنًا مَّعَ إِيمَٰنِهِمْ ﴾ 14

---

bütün şeyləri udur. Artıq haqq zahir, onların uydurub düzəltdikləri yalanlar isə batil oldu. Onlar orada məğlub edildilər və xar olaraq geri döndülər.﴿ (Əraf: 117-119).

1 ﴾Yoxsa onlar Allahın öz nemətindən bəxş etdiyi şeylərə görə insanlara həsəd aparırlar?﴿ *(Nisa: 54).*

2 ﴾Xəstələndiyim zaman mənə yalnız O, şəfa verir.﴿ (Şuəra: 80)

3 ﴾O, iman gətirənlərə hidayətdir və şəfadır.﴿ (Fussilət: 44).

4 ﴾möminlərin ürəklərini fərəhləndirir.﴿ (Tövbə: 14).

5 ﴾Onlar dedilər: "Ya Musa! Ya sən tulla, ya da biz birinci tullayaq! O dedi: "Xeyr, əvvəlcə siz tullayın!" Onların sehri üzündən birdən elə gəldi ki, onların ipləri və dəyənəkləri hərəkətə gəlib sürünür. Musanın canına qorxu düşdü. Biz ona belə buyurduq: "Qorxma, üstün gələcək mütləq sənsən! Sağ əlindəki əsanı yerə tulla, onların düzüb qoşduqlarını udsun. Onların düzəltdikləri sehrbaz hiyləsindən başqa bir şey deyildir. Sehrbaz isə, hara gedirsə getsin, mətləbinə çatmaz!"﴿ (Taha: 65-69).

6 ﴾Biz Qurandan möminlər üçün şəfa və mərhəmət olan ayələr nazil edirik. O, zalımların ancaq ziyanını artırır.﴿ (əl-İsra: 82).

7 ﴾Əgər Biz bu Quranı bir dağa nazil etsəydik, sən onun Allahın qorxusundan parça-parça olduğunu görərdin. Biz bu misalları insanlar üçün çəkirik ki, bəlkə, düşünələr.﴿ (əl-Həşr: 21)

8 ﴾Həqiqətən, kafirlər Quranı eşitdikləri zaman az qala səni gözləri ilə yeyələr. Onlar: "O, divanədir!" – deyirlər.﴿ (Nun: 51)

9 ﴾Bir gözünü qaldırıb bax, heç orada bir yarıq görə bilərsənmi?!﴿ *(əl-Mülk: 3).*

10 ﴾Sonra da Allah Öz Peyğəmbərinə və möminlərə arxayınlıq nazil etdi,﴿ *(ət-Tövbə: 26).*

11 ﴾Allah Öz Elçisinə və möminlərə mənəvi rahatlıq nazil etdi və onlara təqva sözünü vacib buyurdu.﴿ (əl-Fəth: 26).

12 ﴾Allah ona arxayınlıq nazil etdi, sizin görmədiyiniz döyüşçülərlə ona yardım göstərdi…﴿ (Tövbə: 40).

13 ﴾And olsun ki, ağac altında sənə beyət etdikləri zaman Allah möminlərdən razı oldu. Onların ürəklərində olanı bildi, onlara arxayınlıq göndərdi və onları yaxın gələcəkdə qazanılacaq bir qələbə ilə mükafatlandırdı.﴿

14 ﴾Möminlərin imanı üstünə iman artırmaq üçün onların ürəklərinə arxayınlıq göndərən Odur.﴿ *(əl-Fəth: 4)*





## Hədislər:

❁ أَسْأَلُ اللهَ العَظِيمَ رَبَّ العَرْشِ العَظِيمِ أَنْ يَشْفِيَكَ **Yeddi dəfə:** «*Əsəlu-l-lahə-l-azım rabbə-l-arşi-l-azım ən yəşfiyəkə*»[1]

❁ أُعِيذُكَ بِكَلِمَاتِ اللهِ التَّامَةِ مِنْ كُلِّ شَيْطَانٍ وَهَامَّةٍ وَمِنْ كُلِّ عَيْنٍ لامَّةٍ **İki dəfə:** «*Uizukə bikəlimati-l-ləhi-t-təmməti min kulli şeytanin va həmmətin va min kulli aynin ləmmə*»[2]

❁ اَللَّهُمَّ رَبَّ النَّاسِ أَذْهِبِ البَأسِ وَاشْفِ أَنْتَ الشَّافِيْ لا شِفَاءَ إلا شِفَاؤُكَ شِفَاءً لايُغَادِرُ سَقَمًا **Üç dəfə:** *Allahummə Rabbən nəs əzhibil bəsə, işfi əntə-ş-şafi, lə şifəə illə şifəukə, şifəun lə yuğadiru saqəmən.*[3]

❁ اَللَّهُمَّ أَذْهِبْ عَنْهُ حَرَّهَا وَبَرْدَهَا وَوَصَبَهَا **Bir dəfə:** **"Allahummə əzhib anhu hərrahə və bardəhə və vasbəhə".**[4]

❁ حَسْبِيَ اللهُ لا إِلَهَ إِلا هُوَ عَلَيْهِ تَوَكَّلْتُ وَهُوَ رَبُّ العَرْشِ العَظِيمِ **Yeddi dəfə:** «*Hasbiyə-l-lahu lə iləhə illə huva, aleyhi təvakkəltu va huva rabbu-l-arşı-l-azım*»[5]

❁ بِسْمِ اللهِ أَرْقِيْكَ مِنْ كُلِّ دَاءٍ يُؤْذِيْكَ وَمِنْ شَرِّ كُلِّ نَفْسٍ أَوْ عَيْنٍ حَاسِدٍ، اللهُ يَشْفِيْكَ بِسْمِ اللهِ أَرْقِيْكَ **Üç dəfə:** "*Bismilləhi urqikə min kulli şəyin yuzikə, min şərri kulli nəfsin ov aynin həsidin. Allahu yəşfikə bismilləhi urqikə*".[6]

❁ **Əlini ağrıyan yerin üstünə qoyub, üç dəfə** بِسْمِ اللهِ "*Bismilləh*", **yeddi dəfə isə bunu deyirsən:** أَعُوْذُ بِعِزَّةِ اللهِ وَقُدْرَتِهِ مِنْ شَرِّ مَا أَجِدُ وَأُحَاذِرُ "*Əuzu biizzətilləhi və qudrətihi min şərri mə əcidu və uhaziru*".[7]

## Qeydlər:

❶ Gözü dəyən adamın idrarını içmək, yaxud öldükdə gözünün təsirinin itdiyinə və s. bu kimi xurafatlara inanmaq olmaz.

❷ Gözdəymədən qorunmaq üçün dəri və ya kağız üzərinə yazılmış dua, boyunbağı və qolbaq taxmaq olmaz. Bunlar qadağan olunmuş "təmimə"dir. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: "*Kim gözdən qorunmaq üçün bir şey taxarsa, taxdığına bağlanar*" Tirmizi. Əgər bu kimi dualar Quran ayələrindən olarsa, bunun taxılmasında ixtilaf vardır. Hər halda bu kimi şeyləri taxmamaq daha yaxşıdır.

❸ Maşallah, təbarəkəllah yazılarını yazmaq, qılınc, bıçaq və ya göz şəkli çəkmək, maşında Quran saxlamaq, evlərdə bəzi ayələri divardan asmaq kimi şeylərin heç bir gözdəymədən qorumur. Bu, bəzi hallarda haram olunmuş təmimə ola bilər.

❹ Xəstə insan etdiyi duaların qəbul olunacağına yəqin olmalı, tez şəfa tapmaq üçün narazılıq etməməlidir. Əgər ona, bu xəstəliyə görə həyatın boyu dərman qəbul etməlisən – deyilsə, narazılıq etməz, amma ovsun uzun müddət oxunarsa, narazılıq edər. Halbuki oxuduğu hər bir hərfə görə savab qazanır. Hər savab isə

---

1 (Əzəmətli ərşin Rəbbi, Əzəmətli Allaha yalvarıram ki, sənə şəfa versin).

2 (Sizin hər bir şeytan və həşəratın şərindən, hər bir pis gözdən qorunmanızı Allahın tam kəlamlarını ilə Ona pənah aparıram).

3 İnsanların rəbbi Allahım! Xəstəliyin şiddətini apar. Şəfa verən Sənsən bu xəstəyə də şəfa ver, həqiqətən bizə Səndən başqa şəfa verən yoxdur. Sənin verdiyin şəfadan sonra heç bir xəstəlik qalmaz".

4 "Allahım ondan xəstəliyin hərarətini, soyuqluğunu və ağrısını apar".

5 (Allahı mənim üçün kifayətdir. Ondan başqa ibadətə və itaətə layiq haqq məbud yoxdur. Ona arxalandım. O, uca ərşin Rəbbidir).

6 "Allahın adı ilə səni, sənə əziyyət verən hər şeydən, nəfslərin və ya həsəd aparan hər gözün şərrindən ovsun edirəm. Allah sənə şəfa versin. Allahın adı ilə səni ovsun edirəm".

7 "Allahın izzət və qüdrəti ilə çəkdiyim və çəkəcəyim xəstəliklərin şərrindən Allaha sığınıram".

on mislində artırılır. Xəstə insan dua etməli, bağışlanma diləməli, çoxlu sədəqə verməlidir. Şəfa tapmaq üçün sədəqə gözəl vasitədir.

5 Toplum şəkilində qiraət etmək sünnəyə müxalifdir. Təsiri də zəifdir. Həmçinin maqnitofonla dinləmək də düzgün deyil. Çünki bu halda oxuyanın niyyətini dəyişmək olmur. Halbuki ovsun edənin ovsuna niyyət etməsi şərtdir. Maqnitofonda dinləmək yaxşı təsir edə bilər. Şəfa tapana qədər ovsunu təkrar etmək sünnədir. Əgər yorulursa, həvəsdən düşməmək üçün az-az oxuya bilər. Hər hansı ayəni və ya duanı şəriətdə deyiləndən başqa müəyyən sayda təkrarlamaq düzgün deyil.

6 Ovsun oxuyanın Quranla deyil, sehr-cadu ilə ovsun etməsini aşkarlayan bir sıra əlamətlər vardır. Onun özünü dindar kimi göstərməsi, sözünü Quran ayələri ilə başlaması səni aldatmasın. Çünki bundan dərhal sonra sehrlə müalicəyə keçəcəkdir. Onlar insanları aldatmaq üçün məscidlərdə ibadət edər, sənin yanında Allahı çox zikr edə bilər. Amma bunlar səni aldatmamalıdır. Diqqətli ol!!!

**Sehrbaz və cadugərlərin əlamətlərindən bunları demək olar:** ✸ Xəstənin adını, atasının və ya anasının adını soruşmaq. Çünki əslində adı bilib-bilməmək müalicəyə təsir etmir. ✸ Xəstənin öz paltarlarından gətirməsini tələb etmək. ✸Cinlər üçün kəsməkdən ötrü xəstədən müəyyən vəsfli heyvan gətirməyi tələb etmək, yaxud onun qanından xəstəyə sürtmək. ✸ Başa düşülməyən və ya mənası olmayan tilsimlər yazmaq. ✸Xəstəyə içərisində kvadrat, hərflər, rəqəmlər yazılan vərəq vermək. ✸ Xəstəyə müəyyən müddət insanlardan uzaq olmağı, qaranlıq otaqda tənha qalmağı tövsiyə etmək. ✸ Xəstəyə müəyyən müddətdə sudan istifadə etməməyi demək. ✸ Xəstəyə torpağa basdırmaq, yandırıb tüstüsündə dayanmaq üçün nə isə vermək. ✸ Xəstəyə heç kəsin bilmədiyi xüsusiyyətləri barədə xəbər vermək. Yaxud xəstə danışmadan öncə onun adını, yaşadığı yeri, xəstəliyini söyləmək. ✸ Xəstə yanına daxil olan kimi, yaxud telefonda danışanda və ya poçt vasitəsi ilə ona diaqnoz qoymaq.

7 Əhli sünnə məzhəbinə görə, cin insana toxuna bilər. Uca Allah buyurur: "*Sələm yeyənlər qəbirlərindən ancaq Şeytan toxunmuş kimi qalxarlar.*" (əl-Bəqərə: 275). Təfsir alimlərinin yekdil rəyinə görə, ayədəki toxunma cinin insana toxunması nəticəsində ortaya çıxan şeytani dəlilikdir.

**Sehr mövcuddur.** Qurani-Kərim və səhih hədislər onun təsir etdiyini isbat edir. Sehr ilə məşğul olmaq haram və böyük günahdır. Peyğəmbər (*Səllallahu aleyhi və səlləm*) demişdir: "***İnsanı həlaka aparan yeddi günahdan çəkinin!***" Əshabələr: *Ey Allahın Rəsulu onlar hansılardır? – deyə soruşdular Peyğəmbər* (*Səllallahu aleyhi və səlləm*) *dedi:* ***"Allaha şərik qoşmaq, sehr etmək..."*** Buxari və Muslim. Uca Allah buyurur: ﴾***Həqiqətən, onlar belə şeyləri satın alanların axirətdə payı olmadığını yaxşı bilirlər...***﴿ (əl-Bəqərə: 102).

**Sehr iki növdür: 1.** Düyün və ovsunlar. Sehrbaz sehr etdiyi adama şeytanlar vasitəsi ilə təsir etmək üçün bunu onlara təqdim edir. **2.** Sehr olunan adamın bədəninə, ağlına, iradəsinə və istəyinə təsir edən dəva-dərmanlar. Bu "sərf və atf" adlanır. Bu növ sehr, sehr olunana qarşısındakı bir şeyin tərpəndiyini, çevrildiyini, gəzdiyini və sairə bu kimi xəyallar göstərir. Birinci növ sehr şirkdir. Çünki sehrbaz Allaha küfr etmədikcə şeytanlar ona xidmət etmirlər. İkinci növ sehr isə böyük günahdır. Əslində onların insanlara göstərdiklərinin hamısı Allahın qədəri ilə olur.




# Dua

Bütün məxluqat Allaha möhtacdır. Allahın isə onlara ehtiyacı yoxdur. Uca Allah dua etməyi bəndələrinə vacib buyuraraq demişdir: ﴿*Mənə dua edin Mən də sizin duanızı qəbul edim. Mənə ibadət etməyi təkəbbürlərinə sığışdırmayanlar alçaldılmış halda cəhənnəmə daxil olacaqlar.*﴾ (Ğafir (Mumin): 60). Dua etməyi öz təkəbbürünə sığışdırmayanların cəzası budur. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: "***Kim Allahdan istəməzsə, Allahın ona qəzəbi tutar***". Uca Allah Ondan istəməkdən əlavə bəndəsinin duasına sevinir. Dua edib yalvaranları daha çox sevir və onlara daha yaxın olur. Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) səhabələri bunu hiss edib, ən kiçik bir şeyi Allahdan istəməyə utanmazdılar. Onlar Allaha o qədər bağlanmışdılar ki, hətta başqa insanlardan da heç nə istəməzdilər. Bu, onların Allaha, Allahın da onlara olan yaxınlığının nəticəsi idi. Örnək isə uca Allahın bu ayəsidir: ﴿*Bəndələrim səndən Mənim barəmdə soruşsalar de ki, Mən yaxınam.*﴾ (əl-Bəqərə: 186). Duanın Allah yanında çox yüksək məqamı vardır. Dua Allahın ən çox dəyər verdiyi ibadətdir. Dua qəza-qədəri də dəyişə bilər. Müsəlmanın duası məqbuldur. Təbii ki, səbəblərdən düzgün istifadə olunduqda və maneələr götürüldükdə dua məqbul olar. Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) dediyinə görə, dua edən insana bunlar verilər: "***Bir müsəlman günah və qohumluq əlaqələrinin kəsilməsi olmayan bir dua edərsə, Allah bu duası ilə ona üç şeydən birini bəxş edər: Ya duası tez qəbul olunar, ya axirətə savab kimi saxlanılar, ya da duasının mislində bir pisliyi ondan uzaq edər.***" Səhabələr dedilər: "*Əgər belədirsə, biz daha çox dua edək*?" Peyğəmbər ﷺ dedi: "*Allah da sizə daha çoxunu verər*!" (Əhməd və Tirmizi).

**Duanın növləri:** Dua iki növdür; **1.** İbadət olan dua: Məsələn, namaz, oruc və s. **2.**İstəmək və tələb etmək duası:

**Əməllərin bir-birindən üstünlüyü:** Quran oxumaq daha üstündür, yoxsa zikr və ya dua? Quran oxumaq mütləq mənada əməllərin ən üstünüdür. Sonra zikr və tərif, sonra isə dua və tələb. Bu ümumi baxımdan deyilən sözdür. Amma bəzən üstünlüyü az olan əməl kənar səbəblərə görə, digər əməldən daha üstün ola bilir. Məsələn, ərəfa günü dua etmək Quran oxumaqdan daha üstündür. Fərz namaz qurtardıqda namazdan sonra oxunan zikrləri oxumaq Quran oxumaqdan daha üstündür.

**Duanın qəbul olunması üçün səbəblər:** Duanın qəbul olunması üçün zahiri və batini səbəblər vardır:

**1. Zahiri səbəblər:** Dua etmədən öncə sədəqə, dəstəmaz, namaz, qibləyə tərəf yönəlmək, əlləri qaldırmaq, Allaha Ona layiq olan tərzdə tərif demək, dua edib, istədiyinə uyğun olaraq, Allahın ad və sifətləri ilə istəmək kimi saleh əməllər etmək lazımdır. Əgər duada cənnət istənilirsə, bu zaman Allahın lütf və rəhmətini dilinə gətirəcək. Əgər zalıma qarşı dua edirsə, duasında ər-Rəhman, əl-Kərim adlarını deyil, əl-Cəbbar, əl-Qahhar adlarını çəkməlidir. Digər saleh əməl duanın əvvəlində, ortasında və sonunda Peyğəmbərə (*Sallallahu aleyhi və səlləm*) salavat demək, öz günahlarını etiraf etmək, Allahın nemətlərinə şükr etmək, şəriət dəlillərində duaların qəbul olunma ehtimalı qeyd olunan fəzilətli vaxtlarda dua etmək.

**Belə vaxtlar çoxdur; ✸ Gün ərzində:** Allahın dünya səmasına endiyi gecənin son üçdə birində, azan və iqamə arasında, dəstəmazdan sonra, səcdədə, namazda salamdan öncə, namazlardan dərhal sonra, Quranı xətm etdikdə, xoruz

banlayanda, səfərdə, məzlumun duası, möhtacın duası, valideynin övladı üçün etdiyi dua, müsəlmanın digər müsəlman qardaşı üçün qeybən etdiyi dua, döyüş zamanı düşmənlə üz-üzə gəldikdə edilən dua. ✷ **Həftədə:** Cümə günü, ələlxüsus cümə gününün son saatında. ✷ **Ayda:** Ramazan ayında iftar və suhur zamanı. Qədr gecəsi. Ərəfa günü. ✷ **Müqəddəs məkanlarda:** Bütün məscidlərdə, Kəbənin önündə, İbrahim Məqamında, Səfa və Mərva dağları üzərində, Ərəfatda, Müzdəlifədə, həcc günlərində Minada, zəmzəm suyu içəndə və s.

2. **Batini səbəblər:** Duadan öncə sadiq tövbə etmək, haqqını tapdaladığı adamın haqqını qaytarmaq, yemək, içmək, geyim və məskən işlərində paklığı və halallığı qorumaq, itaəti çoxaltmaq, haramlardan çəkinmək, şübhə və şəhvətlərdən uzaq olmaq, duanı ürəkdən etmək, Allaha tam inanmaq, güclü ümid və Allaha bağlılıq sahibi olmaq, təvazökarlıq, duanı təkrarlamaq, duanın qəbul olunub-olunmamaq ixtiyarını tam şəkildə Allahın öhdəliyinə buraxmaq, Ondan başqasına ümidli olmamaq.

**Duanın qəbul olunmasına mane olan amillər:** Ola bilər insan dua etsin amma duası qəbul olunmasın, yaxud gec qəbul olunsun. Bunun bir çox səbəbləri ola bilər məsələn: **Allah ilə yanaşı, başqasından istəmək. Duada təfsilata varmaq.** Məsələn, cəhənnəmin istisindən, sıxıntısından, qaranlığından sığınmaq. Halbuki bu təfsilata ehtiyac yoxdur, təkcə cəhənnəmdən sığınmaq yetərlidir. **Müsəlmanın özünə və ya başqasına qarşı etdiyi haqsız dua. Günah iş və ya qohumluq əlaqələrinin kəsilməsi üçün edilən dua. Duanı Allahın istəyi ilə bağlamaq.** Məsələn, dua edərkən *"Allahım istəyirsənsə, məni bağışla"* – demək. **Duanın qəbul olunması üçün tələsmək.** Məsələn, *"dua etdim amma duam qəbul olunmadı"* – demək. **Yorulub və ya həvəsdən düşüb duanı tərk etmək. Qeyri-ciddi və qafil qəlblə dua etmək. Allahın qarşısında ədəb-ərkana əməl etməmək.** Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) bir kişinin namazda ona salavat demədən dua etdiyini eşitdi və dedi: "bu insan tələsdi". Sonra onu yanına çağırıb, həm ona həm də digərlərinə dedi: **"biziniz dua edəndə ilk olaraq Allaha həmd-səna ilə başlasın, sonra Peyğəmbərə (*Sallallahu aleyhi və səlləm*) salavat desin, sonra isə istədiyi duanı etsin."** (Əbu Davud, Tirmizi). **Hökmü verilmiş bir iş üçün dua etmək.** Məsələn, dünyada əbədi yaşamaq üçün dua etmək. **Həmçinin duanın sözlərini çətin və məşəqqətli** *(hecaların bir-birinə uyğunluğunu tamamlayan)* **ifadələrlə edib, özünü çətinliyə salmaq.** Uca Allah buyurur: ﴿*Rəbbinizə yalvara-yalvara, həm də gizlicə dua edin. Şübhəsiz ki, O, həddi aşanları sevməz!*﴾ (əl-Əraf: 55). İbn Abbas ﷺ deyir: "**Məşəqqətli** *(hecaların bir-birinə uyğunluğunu tamamlayan)* **ifadələrlə edilən duadan uzaq olun. Çünki mən Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) və səhabələrinin belə etdiklərini görmüşəm. Yəni onlar, belə duadan yalnız uzaq durardılar.**" (Buxari). **Həmçinin duanı çox yüksək səslə etmək.** Uca Allah buyurur: ﴿*Namaz qılarkən səsini nə çox qaldır, nə də çox alçalt. Bunun arasında orta bir yol tut!*﴾ (əl-İsra: 110) Aişə ﷺ deyir: "**Bu ayə dua haqqında nazil edilmişdir**".

**Dua edənin duasını bu tərtibatla qurması müstəhəbdir: Birinci:** Həmd-səna ilə başlamaq. **İkinci:** Peyğəmbərə (*Sallallahu aleyhi və səlləm*) salavat demək. **Üçüncü:** Tövbə edib günahını etiraf etmək. **Dördüncü:** Allahın nemətlərinə şükr etmək. **Beşinci:** Duaya başlamaq. Duanı ümumi sözlərlə, xüsusən də Peyğəmbərdən (*Sallallahu aleyhi və səlləm*) və ya sələfdən rəvayət olunan sözlərlə etmək. **Altıncı:** Duanı Peyğəmbərə (*Sallallahu aleyhi və səlləm*) salavatla bitirmək.





## Əzbərlənməsi gərəkən dualar:

| Oxunma səbəbi | Dua: Peyğəmbər (Sallallahu aleyhi və səlləm) demişdir: |
|---|---|
| Yuxudan öncə və sonar | « بِاسْمِكَ اللَّهُمَّ أَمُوتُ وَأَحْيَا » «*Bismikə-l-lahummə əmutu və əhyə*»[1]<br>Yuxudan oyandıqdan sonra: « الْحَمْدُ لِلَّهِ الَّذِي أَحْيَانَا بَعْدَمَا أَمَاتَنَا وَإِلَيْهِ النُّشُورُ »[2]<br>«*Əlhəmdu li-l-ləhi-l-ləzi əhyənə badə mə əmətənə və ileyhi-n-nuşur*» |
| Yuxuda qorxarkən | « أَعُوذُ بِكَلِمَاتِ اللَّهِ التَّامَّاتِ مِنْ غَضَبِهِ وَعِقَابِهِ، وَمِنْ شَرِّ عِبَادِهِ، وَمِنْ هَمَزَاتِ الشَّيَاطِينِ، وَأَنْ يَحْضُرُونِ »<br>«*Əuzu bikəlimati-l-ləhi-t-təmməti min ğadabihi va iqabihi, va şərri ibədihi va min həməzəti-ş-şəyatıni va ən yahduruni*»[3] |
| Yatan insan yuxu gördükdə | "Biriniz yuxusunda sevdiyi röyanı görərsə, bu Allahdandır. Buna görə Allaha həmd-səna etsin və yuxusunu insanlara danışsın. Əgər xoşuna gəlməyən yuxu görərsə, bilsin ki, bu şeytandandır. Belə yuxunun şərindən Allaha sığınsın və onu heç kəsə danışmasın. Bu halda ona ziyan verə bilməz". |
| Mənzildən çıxarkən | « اللَّهُمَّ إِنِّي أَعُوذُ بِكَ أَنْ أَضِلَّ أَوْ أُضَلَّ، أَوْ أَزِلَّ أَوْ أُزَلَّ، أَوْ أَظْلِمَ أَوْ أُظْلَمَ، أَوْ أَجْهَلَ أَوْ يُجْهَلَ عَلَيَّ »<br>«***Allahummə inni əuzu bikə ən ədillə, auv udall, auv əzillə, auv uzəll,*** *auv azlım, auv uzlam, auv əchəl, auv yuchəl aleyyə*»[4]<br>« بِسْمِ اللهِ تَوَكَّلْتُ عَلَى اللهِ لا حَوْلَ وَلا قُوَّةَ إِلا بِاللهِ » **"Bismi-l-ləh təvəkkəltu alə-l-lah va lə hovlə va llə quvvətə illə billəh".**[5] |
| Məscidə girərkən | **Məscidə sağ ayaq ilə daxil olub bu duanı deyirsən:**<br>بِسْمِ اللَّهِ وَالسَّلَامُ عَلَى رَسُولِ اللَّهِ اللَّهُمَّ اغْفِرْ لِى ذُنُوبِى وَافْتَحْ لِى أَبْوَابَ رَحْمَتِكَ «*Bismi-l-ləh, va-s-salətu va-s-sələmu alə rasuli-l-ləh Allahummə-ğfir li zunubi və-ftəh li əbvabə rahmətikə*»[6] |
| əsciddən çıxarkən | **Məsciddən sol ayaqla çıxıb bu duanı demək** lazımdır:<br>بِسْمِ اللَّهِ وَالسَّلَامُ عَلَى رَسُولِ اللَّهِ اللَّهُمَّ اغْفِرْ لِي ذُنُوبِي وَافْتَحْ لِي أَبْوَابَ فَضْلِكَ<br>«*Bismi-l-ləh, va-s-salətu va-s-sələmu alə rasuli-l-ləhi, Allahummə-ğfir li zunubi və-ftəh li əbvabə fadlikə.*»[7] |
| Yeni evlənənə | « بَارَكَ اللَّهُ لَكَ، وَبَارَكَ عَلَيْكَ، وَجَمَعَ بَيْنَكُمَا فِى خَيْرٍ »[8] «*Bərakə-l-lahu ləkə va bərakə aleykə va cəməa beynəkumə fi xeyrin*» |
| Xoruz banını və ya uzunqulaq anqırtısını eşitdikdə | "Uzunqulağın anqırtısını eşitdikdə lənətlənmiş şeytandan Allaha sığının "Əuzu billəhi minə-ş-şeytani-r-rəcim" – deyin". Çünki bu zaman o şeytanı görür. Əgər xoruzun banladığını eşitsəniz Allahın səxavətindən istəyin. Çünki bu zaman o mələk görür". "Gecə vaxtı itlərin ulaşmasını və uzunqulağın anqırtısını eşitdikdə Allaha sığının, "Əuzu billəhi minə-ş-şeytani-r-rəcim" – deyin". |

---

[1] "Allahım! Sənin adınla ölürəm və dirilirəm".

[2] "Həmd – bizi öldürdükdən sonra dirildən Allaha məxsusdur, və biz Ona qayıdacağıq".

[3] "Qəzəbindən və cəzasından, qullarının şərindən, şeytanın vəsvəsələrindən və onların mənə hazırladıqlarından Allahın kamil kəlmələrinə sığınıram".

[4] "Allahım, Sənin yolundan azmaqdan, azdırılmaqdan, insanlar qarşısında alçalmaqdan və alçaldılmaqdan, zülm etməkdən, zülm edilməkdən, başqasına qarşı cahillik etməkdən və mənə qarşı cahillik edilməsindən Sənə sığınıram".

[5] "Allahın adı ilə Allaha təvəkkül etdim. Allahdan başqa kömək və dayaq ümidim yoxdur".

[6] "Allahın adı ilə, salavat və salam Allahın Rəsuluna olsun. Allahım! Mənim günahlarımı bağışla və mənə rəhmətinin qapılarını aç".

[7] "Allahın adı ilə, xeyir dua və salam Allahın elçisinə! Allahım! Mənim günahlarımı bağışla və mənə səxavətinin qapılarını aç".

[8] "Allah mübarək etsin və bərəkət versin, Allah hər ikinizi xeyirlə birləşdirsin".





| | |
|---|---|
| **Səni Allah üçün sevdiyini deyənə cavab** | Ənəs deyir ki, bir kişi Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) yanında dayanmışdı. Başqa bir nəfər də oradan keçərkən Peyğəmbərə (*Sallallahu aleyhi və səlləm*) dedi: Ey Allahın elçisi, mən bu adamı sevirəm. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) dedi: "Bunu ona bildirmisənmi?" O dedi: Xeyr. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) dedi: "Bunu ona bildir!" Kişi özünü o adama yetişdirib dedi: "Mən səni Allah üçün sevirəm!" O adam isə dedi: Məni kimə görə sevmisənsə O, da səni sevsin. |
| **Asqırdıqda** | "Biriniz asqırdıqda "əlhəmdulilləh" desin. Dostu və ya yoldaşı da ona "Yərhəmukəllah" (Allah sənə rəhm etsin) desin. Əgər ona yərhəmukəllah deyilərsə, belə cavab versin: "Yəhdiyəkumullahu və yuslih baləkum". Əgər kafir asqırıb Allaha həmd edərsə, sən ona: Yəhdiyəkumullahu de, yərhəmukəllahu demə. |
| **Qəm-kədər duası** | « لا إلَهَ إلا اللّهُ الْعَظِيمُ الْحَلِيمُ لا إلَهَ إلا اللّهُ رَبُّ الْعَرْشِ الْعَظِيمِ، لا إلَهَ إلا اللّهُ رَبُّ السَّمَوَاتِ وَرَبُّ الأَرْضِ وَرَبُّ الْعَرْشِ الْكَرِيمِ » "*Lə iləhə illə-l-lahu-l-azimu-l-həlim. Lə iləhə illə-l-lahu rabbu-l-arşi-l-azim. Lə iləhə illə-l-lahu rabbu-s-səmavati və rabbu-l-ardi va rabbu-l-arşi-l-kərim*"[1]<br>« اللَّهُ اللَّهُ رَبِّي، لا أُشْرِكُ بِهِ شَيْئًا » "*Allahu, Allahu rabbi. Lə uşriku bihi şey`ən*"[2]<br>« يَاحَيُّ يا قَيُّومُ بِرَحمتكَ أَسْتَغِيثُ » "*Ya həyyu ya qəyyumu birahmətikə əstəğisu*"[3]<br>« سُبحانَ اللهِ العَظِيمِ » "*Subhanəllahi-l-azim*".[4] |
| **Düşmənə qarşı** | «اللَّهُمَّ مُنْزِلَ الْكِتَابِ وَمُجْرِيَ السَّحَابِ سَرِيعَ الْحِسَابِ اهْزِمْ الأَحْزَابَ اللَّهُمَّ اهْزِمْهُمْ وَزَلْزِلْهُمْ» "***Allahummə** mucriyə-s-səhab, munzilə-l-kitab, səriə-l-hisab ihzimi-l-əhzab. Allahumməhzimhum va zəlzilhum*".[5] |
| **Gecə yuxusundan oyandıqda** | "Kim gecə yuxudan oyanar və aşağıdakı duanı oxuyub Allahım məni bağışla deyərsə, yaxud dua edərsə, ya da dəstəmaz alıb namaz qılarsa namazı qəbula keçər. « لا إِلَهَ إِلا اللهُ وَحْدَهُ لا شَرِيكَ لَهُ ، لَهُ الْمُلْكُ وَلَهُ الحَمْدُ وَهُوَ عَلَى كُلِّ شَيءٍ قَدِيرٌ، الحَمْدُ لله وَسُبحَانَ اللهِ وَلا إِلَهَ إِلا اللهُ وَاللهُ أَكْبَرُ وَلا حَوْلَ وَلا قُوَّةَ إِلا بِاللهِ »<br>"*Lə iləhə illə-l-lahu vahdəhu lə şərikə ləhu, ləhu-l-mulku, va ləhu-l-həmdu va huva alə kulli şeyin qadir. Əlhəmdulilləh, Subhanallah, va lə iləhə illə-l-lah, vallahu əkbər, va lə haulə va lə quvvatə illə bi-l-ləh.*" [6] |
| **Çətinliyə düşdükdə** | « اللَّهمَّ لا سَهْلَ إلا مَا جَعَلْتَهُ سَهْلا وَأَنتَ تَجْعَلُ الحزن إذا شِئْتَ سَهْلاً » "*Allahummə lə səhlə illə mə cəaltəhu səhlən va əntə təcəlu-l-huznə izə şitə səhlən*".[7] |
| **Borcu qaytarmaq üçün dua** | « اللَّهُمَّ إِنِّي أَعُوذُ بِكَ مِنْ الْهَمِّ وَالْحَزَنِ، وَالْعَجْزِ وَالْكَسَلِ، وَالْجُبْنِ وَالْبُخْلِ، وَضَلَعِ الدَّيْنِ، وَغَلَبَةِ الرِّجَالِ » «*Allahummə inni əuzu bikə minə-l-həmmi va-l-həzəni, va-l-kəsəli, va-l-buxli va-l-cübni, va daləi-d-deyni va ğaləbəti-r-ricəl*»[8] |

---

[1] "Əzəmətli və mərhəmətli Allahdan başqa ibadətə layiq haqq məbud yoxdur. Əzəmətli ərzin rəbbi Allahdan başqa ibadətə layiq haqq məbud yoxdur. Göylərin, yerin və hörmətli ərşin rəbbi Allahdan başqa ibadətə layiq haqq məbud yoxdur."

[2] "Allah, Allahdır mənim Rəbbim. Mən Ona heç nəyi şərik qoşmuram."

[3] "Ey həmişə diri və həmişə oyaq olan, Sənin rəhmətinlə kömək diləyirəm."

[4] "Əzəmətli Allah nöqsanlardan pakdır."

[5] "Buludları hərəkət etdirən, kitab endirən, haqq-hesabı tez edən Allahım düşmənləri məhv et. Allahım onları məğlub et, onları ixtilafa sal".

[6] (Allahdan başqa ibadətə və itaətə layiq haqq məbud yoxdur. Təkdir və şəriki yoxdur. Mülk və həmd-səna təkcə Ona layiqdir. O hər şeyə qadirdir. Allaha həmd olsun. O nöqsanlardan pakdır. Allahdan başqa ibadətə və itaətə layiq haqq məbud yoxdur. Allah böyükdür.)

[7] "Allahım Sənin asanlaşdırdığın işdən başqa asan iş ola bilməz və Sən istəsən kədəri də tahat edərsən."

[8] "Allahım! Həqiqətən, narahatçılıqdan və kədərdən, acizlikdən, tənbəllikdən, xəsislikdən və qorxaqlıqdan (cəsarətsizlik), borc yükü altında qalmaqdan və insanların çərənçiliyindən (boşboğazlığından) Sənə sığınıram".

| | |
|---|---|
| Ayaqyolu və hamama girib-çıxarkən | Ayaqyoluna girəndə: « اللَّهُمَّ إِنِّي أَعوذُ بِكَ مِنَ الْخُبُثِ وَالْخَبَائِث » «*Allahummə inni əuzu bikə minə-l-xubsi va-l-xabəisi*»[1]<br>"Çıxanda: غُفْرَانَكَ «*Ğufranəkə*» "Allahım, məni bağışla". |
| Namazda vəsvəsə gələrsə | "Namazda insana vəsvəsə verən şeytanın adı xinzəbdir. Əgər sənə vəsvəsə verdiyini hiss etsən, ondan Allaha sığın və sol tərəfinə üç dəfə tüpür". |
| Səcdədə | « اللَّهُمَّ اغْفِرْ لِي ذَنْبِي كُلَّهُ دِقَّهُ وَجِلَّهُ وَأَوَّلَهُ وَآخِرَهُ وَعَلَانِيَتَهُ وَسِرَّهُ » «*Allahummə-ğfirli zənbi kulləhu, diqqahu va cilləhu, va avvaləhu va əxirahu va aləniyətəhu va sirrahu*» [2]<br>✱ « سُبْحَانَكَ رَبِّي وَبِحَمْدِكَ اللَّهُمَّ اغْفِرْ لِي » "*Subhanəkə rabbi və bihəmdikə-l-lahummə-ğ-firli*" [3]<br>✱ « اللَّهُمَّ إِنِّي أَعوذُ بِرِضَاكَ مِنْ سَخَطِكَ وَبِمُعَافَاتِكَ مِنْ عُقُوبَتِكَ وَأَعوذُ بِكَ مِنْكَ لا أُحصي ثَنَاءً عَلَيْكَ أَنْتَ كَمَا أَثْنَيْتَ عَلَى نَفْسِكَ » «*Allahummə inni əuzu biridakə min səxatıkə va bimuafətikə min uqubətikə və əuzu bikə minkə, lə uhsı sənəən aleykə əntə kəmə əsneytə alə nəfsikə*»[4] |
| Tilavət səcdəsində | « اللَّهُمَّ لَكَ سَجَدْتُ وَبِكَ آمَنْتُ وَلَكَ أَسْلَمْتُ سَجَدَ وَجْهِي لِلَّذِي خَلَقَهُ وَصَوَّرَهُ وَشَقَّ سَمْعَهُ وَبَصَرَهُ تَبَارَكَ اللَّهُ أَحْسَنُ الْخَالِقِينَ » «*Allahummə ləkə səcədtu və bikə əməntu, və ləkə əsləmtu, əntə rabbi, səcədə vachiyə lilləzi şəqqa səmahu va basarahu, təbərakə-l-llahu əhsənu-l-xaliqin*».[5] |
| Namazın sonunda | « اللَّهُمَّ إِنِّي ظَلَمْتُ نَفْسِي ظُلْمًا كَثِيرًا وَلا يَغْفِرُ الذُّنُوبَ إِلا أَنْتَ فَاغْفِرْ لِي مَغْفِرَةً مِنْ عِنْدِكَ وَارْحَمْنِي إِنَّكَ أَنْتَ الْغَفُورُ الرَّحِيمُ » «*Allahummə inni zaləmtu nəfsi zulmən kəsiran, va lə yəğfiru-z-zunubə illə ənt, fəğfirli məğfiratən min indikə varhamni, innəkə əntə-l-ğafuru-r-rahim*»[6] |
| Namazdan sonra | « اللَّهُمَّ أَعِنِّي عَلَى ذِكْرِكَ وَشُكْرِكَ وَحُسْنِ عِبَادَتِكَ » «*Allahummə əinni alə zikrik, va şukrik, va husni ibədətik*»[7]<br>✱ « اللَّهُمَّ إِنِّي أَعوذُ بِكَ مِنَ الْكُفْرِ وَالْفَقْرِ وَعَذَابِ الْقَبْرِ » "*Allahummə inni əuzu bikə minə-l-kufi və-l-fəqri və azəbi-l-qabr*"[8] |
| Yaxşılıq edənə | Bir adama yaxşılıq edilər və o da yaxşılıq edənə "Cəzakəllahu xeyran" "Allah səni xeyirlə mükafatlandırsın!" – deyərsə, yetərincə tərifləmiş olar. Qarşı tərəf isə cavabında: "va cəzakə", yaxud "və iyyəkə" "Sənə də!" – desin. |
| Yağış yağdıqda | İki və ya üç dəfə: ✱ « اللَّهُمَّ صَيِّبًا نَافِعًا » «*Allahummə sayyibən nəfian*»[9]<br>✱ « مُطِرْنَا بِفَضْلِ اللهِ وَرَحْمَتِهِ » «*Mutırnə bifadli-l-ləhi va rahmətihi*» [10] |

---

[1] "Allahım, pislikdən və murdarlıqdan Sənə sığınıram!"
[2] "Allahım! Günahlarımın hamısını – kiçiyini və böyüyünü, ilkini və sonuncunu, gizlini və aşkarını bağışla".
[3] "Ey Rəbbim, sən nöqsanlardan və eyiblərdən paksan. Sənə həmd olsun. Allahım məni bağışla."
[4] "Allahım! Məndən razı qalmaq üçün Sənin qəzəbindən, bağışlanmaq üçün Sənin cəzandan və Səndən Sənə sığınıram, Sənə olan həmd-sənaların sonu yoxdur, Sən özünü həmd-səna edən kimisən"
[5] «Allahım, Sənə səcdə etdim, Sənə iman gətirdim və Sənə təslim oldum. Üzüm onu yaradana, surət verənə, ona eşitmə və görmə qabiliyyəti verənə səcdə edir. Ən gözəl yaradan Allah, pakdır, müqəddəsdir»
[6] "Allahım! Mən nəfsimə çox zülm etdim. Günahları bağışlayan ancaq Sənsən. Bağışla və rəhm et. Şübhəsiz, Sən Bağışlayan və Mərhəmətlisən".
[7] "Allahım! Sənə zikr etməkdə, Sənə şükr etməkdə və Sənə gözəl ibadət etməkdə mənə yardım et."
[8] "Allahım mən küfrdən, kasıbçılıqdan və qəbr əzabından Sənə sığınıram."
[9] "Allahım, bu yağışdan bizə fayda ver".
[10] "Bizim üçün Allahın fəziləti və mərhəməti ilə yağış yağdı". Bundan sonra istədiyi duanı edir. Bu zaman edilən dualar qəbul olunar.





| | |
|---|---|
| Külək əsdikdə | « اللهمّ إنى أسألك خَيْرَها وخير ما فيْها وخير ما أرسلت به ، وأعوذُ بكَ منْ شَرِّها وَشَرِّ ما فيْها وشَرِّ ما أُرسلت به » «Allahummə inni əsələkə xeyrahə, va xeyra mə ursilət bihi va əuzu bikə min şərrihə va şərri mə fihə, va şərri mə ursilət bihi»[1] |
| Təzə doğmuş ayı gördükdə | « اللهمّ أهلّه علَيْنَا باليمنِ والإيمانِ والسّلامَةِ والإسْلامِ، هلال خيْر ورُشد، ربّي وربّكَ اللّهُ » «Allahu əkbər, Allahummə əhilləhu aleynə bi-l-əmni va iməni va-s-sələməti va-l-isləm. Va hilalu xeyrin və ruşdin. Rabbunə va rabbukə-l-lah»[2] |
| Müsafirlə vidalaşarkən | « أَسْتَوْدِعُ اللّهَ دينَكَ وأَمَانَتَكَ وَخواتيمَ عَمَلِكَ » «Əstavdiu-l-lahə dinəkə va əmənətəkə va xavatimə a`məlikə»[3]<br>Müsafir isə belə cavab verir:<br>« أَسْتَوْدِعُكُمُ اللهَ الَّذي لا تَضيعُ وَدائِعُهُ » «Əstavdiukumu-l-lahu əlləzi lə tədıu vadəiuhu»[4] |
| Xoşladığın və xoşlamadığın bir şey gördükdə | Peyğəmbər (Sallallahu aleyhi və səlləm) xoşladığı bir şey görəndə belə deyərdi:<br>« الحمد لله الذي بنعمته تتم الصالحات » "Neməti ilə yaxşı işlər həyata keçən Allaha həmd olsun!"<br>Xoşlamadığı bir şeyi gördükdə isə belə deyərdi: «الحَمْدُ للَّه على كلّ حالٍ» "Əlhəmdulilləhi alə kulli həəl.""Hər bir halda Allaha həmd olsun!" |
| Səfər duası | اللهُ أَكْبَر، اللهُ أَكْبَر، اللهُ أَكْبَر ﴿ سُبحانَ الّذي سَخَّرَ لَنا هذا وما كُنّا لَه مُقرِنينَ ۞ وإنّا إلى ربِّنا لَمُنقَلِبونَ ﴾ اللّهمَّ إنّا نَسألُكَ في سَفَرِنا هَذا البِرَّ والتَّقوى، ومِنَ العَمَلِ ما تَرضى، اللّهمَّ هَوِّن عَلَينا سَفَرَنا هَذا واطوِ عَنّا بُعدَه، اللّهمَّ أنتَ الصّاحِبُ في السَّفَرِ والخَليفَةُ في الأهلِ، اللهم إني أعوذُ بكَ مِن وَعثاءِ السَّفَرِ وكَآبَةِ المَنظَرِ وسوءِ المُنقَلَبِ في المالِ والأهلِ.<br>«Allahu əkbər, Allahu əkbər, Allahu əkbər! ﴿Subhanə-l-ləzi səxxara lənə həzə va mə kunnə ləhu muqrınin va innə ilə rabbinə ləmunqalibun﴾. Allahummə innə nəsəlukə fi səfərinə həzə-l-birra va-t-təqva va minə-l-aməli mə tərda, Allahummə həvvin aleynə səfəranə həzə vatvi annə budəhu, allahummə əntə-s-sahibu fi-s-səfəri va-l-xəlifətu fi-l-əhli, Allahummə inni əuzu bikə min vasəi-s-səfəri, va kəabəti-l-manzari va sui-l-munqaləbi fi-l-məli va-l-əhli».[5]<br>Und wenn man zurückgekehrt ist, sagt man dies und fügt noch hinzu:<br>آيِبونَ تائِبونَ عابِدونَ لِرَبِّنا حامِدونَ «Əyibunə, təibunə, abidunə, lirabbinə hamidunə»[6] |

---

[1] "Allahım, Səndən onun xeyrini, onda olanın xeyrini, onunla göndərilmiş hər şeyin xeyrini diləyirəm. Onun şərindən, onda olanın şərindən, onunla göndərilmiş hər şeyin şərindən Sənə sığınıram."

[2] "Allah hər şeydən böyükdür. Allahım bizə təhlükəsizlik, iman, salamatlıq və islam bəxş et. Xeyir və düzgünlüklə dolu hilal, bizim də Rəbbimiz Allahdır, sənin də".

[3] "Sənin dinini, əmanətini və işinin nəticələrini Allaha əmanət edirəm".

[4] "Sizi əmanətləri itməyən Allaha əmanət edirəm."

[5] "Allah hər şeydən böyükdür. Allah hər şeydən böyükdür. Allah hər şeydən böyükdür. ﴿*Bunları bizə ram edən Pak və Nöqsansız Allahdır. Bizim onlara gücümüz çatmazdı. Həqiqətən, biz Rəbbimizin yanına qayıdacağıq*﴾. Allahım, bu səfərimizə Səndən möminlik və Allah qorxusu, Sənin razı qaldığın işləri görməyimizi diləyirik. Bu səfərimizi bizim üçün rahat et, onun uzaqlığını bizə bildirmə. Allahım, səfərdəki adamın özünə yoldaş, ailəsinə hami Sənsən. Allahım, yol yorğunluğundan, kədərli mənzərədən, mal və ailədə pis hadisədən Sənə sığınıram"

[6] "Evimizə qayıdırıq, tövbə, ibadət və öz Rəbbimizə həmd edənlərdənik."

| | |
|---|---|
| Yatmaq istəyərkən | «اللَّهُمَّ أَسْلَمْتُ نَفْسِي إِلَيْكَ وَفَوَّضْتُ أَمْرِي إِلَيْكَ وَأَلجَأْتُ ظَهْرِي إِلَيْكَ رَهْبَةً وَرَغْبَةً إِلَيْكَ لا مَلْجَأَ وَلا مَنْجَا مِنْكَ إِلا إِلَيْكَ آمَنْتُ بِكِتَابِكَ الَّذِي أَنْزَلْتَ وَبِنَبِيِّكَ الَّذِي أَرْسَلْتَ» «*Allahummə əsləmtu nəfsi ileykə, va fəvvadtu əmri ileykə, va vaccəhtu vachi ileykə, va əlcətu zahri ileykə, rağbətən va rahbətən ileykə, lə məlcəə va lə məncə minkə illə ileykə, əməntu bikitəbikə-l-ləzi ənzəltə va bi nəbiyyikə-l-ləzi ərsəltə*».[1] «الحَمْدُ لِلَّهِ الَّذِي أَطْعَمَنَا وَسَقَانَا وَكَفَانَا وَآوَانَا فَكَم مِمَّنْ لا كَافِيَ لَهُ وَلا مُؤْوِيَ» «*əl-həmdu lilləhi-l-ləzi atamənə va səqanə, va kəfənə, va avanə, fəkəm mimmən lə kəfiyə ləhu va lə muviyə*».[2] «اللَّهُمَّ قِنِي عَذَابَكَ يَوْمَ تَبْعَثُ عِبَادَكَ» 3 dəfə: «*Allahummə qini azəbəkə yaumə təbasu ibədəkə*».[3] «سُبْحَانَكَ اللَّهُمَّ رَبِّي بِكَ وَضَعْتُ جَنْبِي وَبِكَ أَرْفَعُهُ إِنْ أَمْسَكْتَ نَفْسِي فَاغْفِرْ لَهَا وَإِنْ أَرْسَلْتَهَا فَاحْفَظْهَا بِمَا تَحْفَظُ بِهِ عِبَادَكَ الصَّالِحِينَ» «*Bismikə rabbi vadatu cənbi va bikə ərfəuhu fə in əmsəktə nəfsi fərhəmhə, va in ərsəltəhə fəhfazhə, bimə təhfazu bihi ibədəkə-s-salihin*».[4] İxlas, Fələq və Nas surələrini oxuyur sonra əllərinə üfürür və bədəninə sürtür. Həmçinin hər gecə Səcdə və Mülk surələri oxunur. |
| Namazda ilk təkbirdən sonra | «اللَّهُمَّ بَاعِدْ بَيْنِي وَبَيْنَ خَطَايَايَ كَمَا بَاعَدْتَ بَيْنَ الْمَشْرِقِ وَالمَغْرِبِ، اللَّهُمَّ نَقِّنِي مِنْ خَطَايَايَ كَمَا يُنَقَّى الثَّوْبُ الأَبْيَضُ مِنَ الدَّنَسِ، اللَّهُمَّ اغْسِلْنِي بِالْمَاءِ وَالثَّلْجِ وَالبَرَدِ» «*Allahummə bəid beyni və beynə xətayəyə, kəmə baədtə beynəl məşriqi vəl məğrib. Allahummə nəqqini min xətayəyə kəmə yunəqqəs sovbul əbyadu minəd dənəs. Allahumməğsilni min xətayəyə bis səlci vəl məi vəl bərəd*».[5] |
| Evdən şıxıb namaza gedərkən | «اللَّهُمَّ اجْعَلْ فِي قَلْبِي نُورًا وَفِي لِسَانِي نُورًا وَفِي سَمْعِي نُورًا وَفِي بَصَرِي نُورًا وَمِنْ فَوْقِي نُورًا وَمِنْ تَحْتِي نُورًا وَعَنْ يَمِينِي نُورًا وَعَنْ شِمَالِي نُورًا وَمِنْ أَمَامِي نُورًا وَمِنْ خَلْفِي نُورًا وَاجْعَلْ فِي نَفْسِي نُورًا وَأَعْظِمْ لِي نُورًا وَعَظِّمْ لِي نُورًا وَاجْعَلْ لِي نُورًا وَاجْعَلْنِي نُورًا اللَّهُمَّ أَعْطِنِي نُورًا وَاجْعَلْ فِي عَصَبِي نُورًا، وَفِي لَحْمِي نُورًا، وَفِي دَمِي نُورًا، وَفِي شَعْرِي نُورًا، وَفِي بَشَرِي نُورًا» «*Allahummə-c'al fi qalbi nuran, va fi lisəni nuran, va fi səmi nuran, va fi basarı nuran, va min fauqi nuran, va min təhti nuran, va an yəmini nuran va an şiməli nuran, va min əməmi nuran, va min xəlfi nuran, va-cal fi nəfsi nuran, va azım li nuran, va azzım li nuran, va-c'əl li nuran, va-calni nuran, Allahummə ə'tıni nuran, va-cal fi asabi nuran, va fi ləhmi nuran, va fi dəmi nuran, va fi şə'ri nuran, va fi başəri nuran*»[6] |

---

[1] "Allahım! Nəfsimi Sənə təslim etdim. İşimi Sənə həvalə etdim. Üzümü Sənə çevirdim. Sənə ümid edərək və Səndən qorxaraq Sənə kürəyimi çevirərək Sənə arxalandım. Sənə pənah gətirmək və Səndən çəkinmək ancaq Sənə üz çevirməkdədir. Endirdiyin kitaba və göndərdiyin peyğəmbərə iman gətirdim"

[2] "Həmd, bizi yedirdən, içirdən, qoruyan və bəhrələndirən Allaha məxsusdur. Biz qorunmayan və bəhrələnməyən kəslərdən deyilik"

[3] "Allahim! Məni qiyamət gününün əzabindan qoru"

[4] "Rəbbim, vücudumu sənin adınla yatağa qoyuram və qaldırıram. Ruhumu alsan, ona rəhm et. Qaytarsan, onu mühafizə et, necə ki, saleh qullarının ruhunu mühafizə edirsən"

[5] «Allahım, şərqlə qərbi biri-birindən necə uzaq etmisənsə, məni də günahlarımdan elə uzaq et. Ağ paltar çirkabdan necə təmizlənirsə, mənim günahlarımı da elə təmizlə. Allahım mənim günahlarımı qar, yağış və buz ilə yu».

[6] "Allahım! Qəlbimi və dilimi, qulağımı və gözümü nurlu et, üstümü və altımı, sağımı və solumu, önümü və arxamı nurlu et, nəfsimi də nurlu et. Mənə böyük və uca nur ver, mənim üçün nur et, və məni də nurlu et. Allahım! Mənə, əzələlərimə, cəsədimə, qanıma, saçlarıma və vücuduma nur ver."

**İstixarə duası**

**Sizdən biriniz bir işi görməmişdən qabaq iki rükət namaz qılsın və sonra bu duanı desin:**

« اللَّهُمَّ إنّي أَستَخيرُكَ بِعلمِكَ، وَأَستَقدِرُكَ بِقُدرَتِكَ، وَأَسأَلُكَ مِن فَضلِكَ فَإنَّكَ تَقدِرُ وَلا أَقدِرُ وَتَعلَمُ وَلا أَعلَمُ وَأَنتَ عَلّامُ الغُيوبِ، اللَّهُمَّ فَإن كُنتَ تَعلَمُ هَذا الأمرَ (ثُمَّ تُسَمّيهِ بِعَينِهِ) خَيرًا لي في ديني ومَعاشي وَعاقِبَةِ أَمري. أو قال: عاجِلِ أَمري وَآجِلِه. فَاقدُرهُ لي وَيَسِّرهُ لي ثُمَّ بارِك لي فيهِ وَإن كُنتَ تَعلَمُ أَنَّ هَذا الأمرَ شَرٌّ لي في ديني ومَعاشي وَعاقِبَةِ أَمري. أو قال في عاجِلِ أَمري وَآجِلِه. فَاصرِفهُ عَنّي وَاصرِفني عَنهُ وَاقدُر لِيَ الخَيرَ حَيثُ كانَ ثُمَّ رَضِّني بِهِ »

«*Allahummə inni əstəxirukə biilmik, va əstəqdirukə biqudratik, va əsəlukə min fadlikə-l-azım, fə-innəkə təqdiru va lə əqdir, va tələmu va lə aləm, va əntə alləmu-l-ğuyub. Allahummə in kuntə tələmu ənnə həzə-l-əmra (Burada ehtiyacını söylə) – xeyrun li fi dini, və məaşi, va aqibəti əmri. Acilihi va əcilihi - fəqdurhu li, va yəssirhu li summə bərik li fihi. Va in kuntə tələmu ənnə həzə əl-əmra şərrun li fi dini, va məaşi, va aqibəti əmri, acilihi va əcilihi – fasrıfhu anni, vasrıfni anhu, vaqdur li əl-xeyra heysu kənə, summə ardıni bihi*»[1]

**Cənazə üçün oxunan dua**

« اللهم اغفر له وارحمه وعافِهِ واعفُ عنه وأكرِم نزلَه ووسِّع مدخلَه واغسله بالماءِ والثلجِ والبردِ ونقِّه من الخطايا كما نقّيتَ الثوبَ الأبيضَ مِنَ الدَّنَسِ وأبدِلهُ دارًا خيرًا مِن دارِهِ وأهلًا خيرًا مِن أهلِهِ وزَوجًا خيرًا مِن زَوجِهِ وأدخِلهُ الجَنَّةَ وأعِذهُ مِن عَذابِ القَبرِ ومِن عَذابِ النّارِ »

«*Allahumməğfir ləhu vərhəmhu və afihi vəfu anhu və əkrim nuzuləhu və vassi mudxaləhu vəğsilhu bilməi vəs səlci vəl bərəd. Və nəqqihi minəl xətayə kəmə nəqqaytə əs-sovbəl əbyadə minəd dənəs. Və əbdilhu darən xeyran min darihi və əhlən xeyrun min əhlihi və zovcən xeyrun min zovcihi və ədxilhul cənnətə və əizhu min azəbil qabr və min azəbin nar*».[2]

**Kədər duası**

« اللهم إني عبدك وابن عبدك وابن أمتك ناصيتي بيدك ماضٍ في حكمك عدلٌ في قضاؤك أسألك بكل اسمٍ هو لك سميت بِهِ نَفْسَكَ أَوْ عَلَّمْتَهُ أَحَدًا مِنْ خَلْقِكَ أَوْ أَنْزَلْتَهُ فِي كِتَابِكَ أَوِ اسْتَأْثَرْتَ بِهِ فِي عِلْمِ الْغَيْبِ عِنْدَكَ أَنْ تَجْعَلَ الْقُرْآنَ رَبِيعَ قَلْبِي وَنُورَ صَدْرِي وَجِلَاءَ حُزْنِي وَذَهَابَ هَمِّي »

"*Allahummə inni abdukə, ibnu abdikə, ibnu əmətikə, nasıyati biyədikə, madın fiyyə hukmukə, adlun fiyyə qadaukə, əsəlukə bikulli ismin huva ləkə, səmmeytə bihi nəfsəkə, auv ənzəltəhu fi kitəbikə, auv alləmtəhu əhədən min xalqikə, auv istəsərtə bihi fi ilmi-l-ğeybi indəkə, ən təcalə-l-quranə rabia qalbi, va nura sadri, va cələə huzni va zəhəbə həmmi.*"[3]

---

[1] "Allahım! Elminin xeyrini və Sənin qüdrətinə güvənərək güc istəyirəm. Səndən xeyir-dua diləyirəm. Sən Qadirsən, mən isə qadir deyiləm, Sən Bilənsən, mən isə bilmirəm. Təkcə Sən qeybi bilənsən. Allahım! Bu iş (burada ehtiyacını söylə) – mənim üçün dinimdə, yaşayışımda və işimin sonunda xeyirdisə, onu mənim üçün müəyyən et, asanlaşdır və bərəkətli et. Bu iş mənim üçün dinimdə, yaşayışımda və işimin sonunda ziyandırsa, onu məndən uzaqlaşdır. Və mənim üçün harada olursa olsun xeyri yaxınlaşdır. Sonra məni ondan razı sal".

[2] «Allahım, onu bağışla, ona rəhm et, onun əhvalını yaxşı et, onu əfv et, onun yerini yumşaq et, girdiyi yerini (qəbrini) geniş et, onu su, qar və dolu ilə yu. Xətalarından ağ paltarı çirkdən təmizlədiyin kimi təmizlə və onun evinin əvəzinə, daha yaxşı ev, ailəsinin əvəzinə, daha yaxşı ailə, həyat yoldaşının əvəzinə, daha yaxşı həyat yoldaşı ver! Onu Cənnətə göndər. Onu qəbr və Cəhənnəm əzabından qoru». Müslim rəvayət etmişdir

[3] (Allahım! Mən Sənin qulunam, Sənin qulunun oğluyam, Sənin kənizinin oğluyam! İxtiyarım Səndədir. Mənim barəmdə verdiyin hökm keçərlidir, bəxş etdiyin tale ədalətlidir. Sənə özün verdiyin, yaxud öz Kitabında nazil etdiyin, məxluqlarından birinə öyrətdiyin, yaxud öz yanında saxladığın qeyb elmində malik olduğun bütün adlarla yalvarıram ki, Quranı qəlbimin baharı, köksümün nuru et, qəmimdən və narahatlığımdan xilas olmağa səbəb et!





# Uğurlu ticarət

Uca Allah insanı digər məxluqatlardan üstün etmiş, ona danışıq qabiliyyəti vermişdir. Danışıq alətini isə dil etmişdir. Bu əzanı xeyir və şər üçün istifadə etmək mümkündür. Kim dilini xeyir üçün işlədərsə, dünyanın xoşbəxtliyinə, axirətin isə yüksək məqamlı cənnətinə nail olar. Kim dilini şərə sərf edərsə, həm dünyada, həm də axirətdə həlaka düçar olar. Quran oxumaqdan başqa dilin qazanacağı ən gözəl savab əməl Allahı zikr etməkdir.

**Allahı zikr etməyin fəziləti:** Bu barədə çoxlu hədislər rəvayət olunmuşdur. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: "*Sizə edəcəyiniz ən xeyirli, Rəbbiniz yanında ən pak, dərəcələrinizi yüksəldən, qızıl və gümüş sədəqəsindən, düşmənlə üz-üzə gəlib onlar sizin, siz də onların boynunu vurmaqdan daha xeyirli əməl haqqında xəbər verimmi*?" Orada olanlar dedilər: Bəli, ey Allahın elçisi, söylə. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) dedi: "*Bu, Allahı zikr etməkdir.*" (Tirmizi). Peyğəmbərin (*Sallallahu aleyhi və səlləm*) digər hədisində deyilir: "*Rəbbini zikr edən bəndə ilə zikr etməyən bəndənin timsalı ölü ilə diri timsalındadır.*" (Buxari). Həmçinin uca Allah qüdsi hədisdə deyir: "*Bəndəm Məni xatırladıqda onun yanında olaram. O Məni zikr etdikdə onunla olaram. Əgər o Məni nəfsində zikr edərsə, mən də onu nəfsimdə xatırlayaram, Məni bir toplum arasında zikr edərsə, Mən də onu daha xeyirli toplumda xatırlayaram, o Mənə bir qarış yaxınlaşarsa, Mən ona bir dirsək yaxınlaşaram.*" (Buxari). Başqa hədisdə Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: "*Mufərridlər önə keçdilər.*" Orada olanlar: Mufərridlər kimdir, ya rəsullələh (*Sallallahu aleyhi və səlləm*)? – deyə soruşdular. O dedi: "*Onlar, Allahı çox zikr edən kişi və qadınlardır.*" (Müslim). Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) səhabələrdən birinə tövsiyə edir və deyir: "*Çalış dilin daima Allah zikri ilə islaq qalsın.*" (Tirmizi). Bu məzmunlu hədislər çoxdur.

**Savabların çoxalması:** Quran oxumağın savabı çoxaldığı kimi saleh əməllərin savabı da çoxalır. Bu çoxalma aşağıda deyilən səbəblərdən asılıdır: **1.** Qəlbdə olan iman, ixlas, Allah sevgisi və bunlardan qaynaqlanan keyfiyyətlərin olması. **2.** Dil ilə mücərrəd oxumaq deyil, qəlbi ilə oxunan zikr barəsində fikirləşmək, ona bağlanmaq.

Əgər bu deyilən keyfiyyətlər əldə olunarsa, Allah insanın bütün pis əməllərini silər, tam savab verər. Bu keyfiyyətdə olan nöqsana görə isə oxuduğunun savabı az olar.

**Zikrin faydaları:**

- Zikr şeytanı qovar, alçaldar və peşman edər. Ər-Rəhman olan Allahı isə razı salar.
- Zikr Allah sevgisini, yaxınlığını, müşahidəsini, qorxusunu, tövbəni və itaətkarlığı hasil edər.
- Zikr qəlbdə olan kədəri, qəmi, qüssəni aparar və fərəhi hasil edər. Qəlbə həyat, güc və paklıq gətirər.

- Qəlbin elə boşluqları var ki, onları Allahın zikrindən başqa, heç nə doldura bilmir. Qəlbin elə sərtliyi var ki, onu Allahın zikrindən başqa, heç nə yumuşalta və əridə bilməz.
- Zikr qəlbin dərmanı, müalicəsi, gücü və əvəzolunmaz ləzzət mənbəyidir. Qəflət isə qəlbin xəstəliyidir.
- Zikrin az oxunması nifaqın, çox oxunması isə iman gücünün və Allah məhəbbətinin sadiqliyinin əlamətidir. Çünki kim birini sevərsə, onu çox xatırlayar.
- Əgər bəndə rahatlıq vaxtlarında zikr ilə Allahı yad edərsə, Allah da çətin günlərində onu yad edər. Ələlxüsus ölümdən qabaq can verən vaxtlarda.
- Zikr Allahın əzabından qurtarmaq, rahatlığın və rəhmətin qazanılması, mələklərin bağışlanma diləməsinə səbəbdir.
- Zikr edən dil qeybətdən, boşboğazlıqdan, nəmmamlıqdan, yalandan və digər bu kimi məkruh və haram əməllərdən uzaq olar.
- Zikr ibadətlərin ən yüngülü, həmçinin ən ali və ən üstünüdür. Zikr cənnətin bağbanıdır.
- Zikr edən heybət, şirinlik və üzündə nur əldə edər. Bu dünyada, qəbirdə və axirətdə nurdur.
- Zikr, onu edənə Allahın və mələklərinin salavatını qazandırır. Uca Allah zikr edənlər ilə mələkləri önündə öyünər.
- Əməl edənlərin ən yaxşıları Allahı daha çox zikr edənlərdir. Oruc tutanların ən yaxşısı oruclu ola-ola Allahı zikr edənlərdir.
- Zikr çətini asanlaşdırır, əlçatmazı yaxınlaşdırır, çətinlikləri yüngülləşdirir, ruzini cəlb edir, bədəni möhkəmlədir.

Faydalı məlumat: Şeyxul İslam İbn Teymiyyə ﷺ deyir: "Su balıq üçün nə qədər əhəmiyyətlidirsə, zikr də qəlb üçün bir o qədər əhəmiyyətlidir. Balıq sudan ayrıldıqda nə kökə düşər?"




# Səhər və axşam oxunan gündəlik zikrlər:

| N | Gündəlik zikr... | Sayı və vaxtı | Təsiri və savabı |
|---|---|---|---|
| 1 | Kürsü ayəsi [1] | Səhər, axşam və fərz namazlardan sonra ***bir dəfə*** | Şeytan ona yaxın durmaz və cənnətə girmək üçün səbəbdir |
| 2 | əl-Bəqərə surəsinin son iki ayəsi[2] | Gecə və ya yatmadan öncə ***bir dəfə*** | Hər şeyin şərindən qoruyur |
| 3 | əl-Ixlas, əl-Fələq və ən-Nas surələri | Səhər və axşam ***üç dəfə*** | Hər şeydən qoruyar |
| 4 | بسم الله الذي لا يضر مع اسمه شيء في الارض ولا في السماء و هو السميع العليم. «*Bismi-l-ləhi-l-ləzi lə yədurru məa ismihi şeyun fi-l-ardı va lə fi-s-səməi va huva-s-səmiu-l-alim*» [3] | Səhər və axşam ***üç dəfə*** | Ani bəla tutmaz və heç bir şey zərər verməz |
| 5 | "أَعُوذُ بِكَلِمَاتِ اللهِ التَّامَّاتِ مِنْ شَرِّ مَا خَلَقَ" «*Əuzu bikəlimati-l-ləhi-t-təmməti min şərri mə xaləq*» [4] | Axşam düşdükdə və ya hər hansı yerdə məskən saldıqda ***üç dəfə*** | Qaldığı yerdə bütün zərərdən qoruyar |
| 6 | "بِسْمِ اللهِ، تَوَكَّلْتُ عَلَى اللهِ، وَلاَحَوْلَ وَلاَ قُوَّةَ إِلاَّ بِاللهِ" «*Bismi-l-ləh, təvakkəltu alə-l-lah, va lə haulə va lə quvvatə illə bi-l-ləh*» [5] | Evdən çıxarkən | Həmin gün qorunar və şeytanı ondan uzaq olar |
| 7 | "حَسْبِيَ اللهُ لاَ إِلَهَ إِلاَّ هُوَ، عَلَيْهِ تَوَكَّلْتُ وَهُوَ رَبُّ الْعَرْشِ الْعَظِيمِ" «*Hasbiyə-l-lahu lə iləhə illə huva, aleyhi təvakkəltu va huva rabbu-l-arşı-l-azım*» [6] | Səhər və axşam ***yeddi dəfə*** | Dünya və axirət işələrində Allah ona kömək olar |
| 8 | "رَضِيتُ بِاللهِ رَبًّا ، وَبِالْإِسْلَامِ دِينًا وَبِمُحَمَّدٍ ﷺ نَبِيًّا" «*Radıtu bi-l-ləhi rabbən, va bi-l-isləmi dinən, va bimuhəmmədin* (*Sallallahu aleyhi və səlləm*) *nəbiyyən*» [7] | Səhər və axşam ***üç dəfə*** | Onu razı salmaq Allahın üzərində haqq olar |
| 9 | **Səhər:** "اللَّهُمَّ بِكَ أَصْبَحْنَا ، وَبِكَ أَمْسَيْنَا ، وَبِكَ نَحْيَا ، وَبِكَ نَمُوتُ ، وَإِلَيْكَ النُّشُورُ." «*Allahummə bikə asbahnə, va bikə əmseynə, va bikə nəhyə, va bikə nəmutu va ileykə-n- nuşur*» [8] **Axşam:** «*Allahummə bikə əmseynə, va bikə asbahnə, va bikə nəhyə, va bikə nəmutu va ileykə-l-masir*»[1] | Səhər və axşam ***bir dəfə*** | Təşviq edilmişdir |

---

[1] Kürsü ayəsi *əl-Bəqərə 255.*

ٱللَّهُ لَآ إِلَٰهَ إِلَّا هُوَ ٱلْحَىُّ ٱلْقَيُّومُ ۚ لَا تَأْخُذُهُۥ سِنَةٌ وَلَا نَوْمٌ ۚ لَّهُۥ مَا فِى ٱلسَّمَٰوَٰتِ وَمَا فِى ٱلْأَرْضِ ۗ مَن ذَا ٱلَّذِى يَشْفَعُ عِندَهُۥٓ إِلَّا بِإِذْنِهِۦ ۚ يَعْلَمُ مَا بَيْنَ أَيْدِيهِمْ وَمَا خَلْفَهُمْ ۖ وَلَا يُحِيطُونَ بِشَىْءٍ مِّنْ عِلْمِهِۦٓ إِلَّا بِمَا شَآءَ ۚ وَسِعَ كُرْسِيُّهُ ٱلسَّمَٰوَٰتِ وَٱلْأَرْضَ ۖ وَلَا يَـُٔودُهُۥ حِفْظُهُمَا ۚ وَهُوَ ٱلْعَلِىُّ ٱلْعَظِيمُ

[2] *əl-Bəqərə 285-286.*

ءَامَنَ ٱلرَّسُولُ بِمَآ أُنزِلَ إِلَيْهِ مِن رَّبِّهِۦ وَٱلْمُؤْمِنُونَ ۚ كُلٌّ ءَامَنَ بِٱللَّهِ وَمَلَٰٓئِكَتِهِۦ وَكُتُبِهِۦ وَرُسُلِهِۦ لَا نُفَرِّقُ بَيْنَ أَحَدٍ مِّن رُّسُلِهِۦ ۚ وَقَالُوا۟ سَمِعْنَا وَأَطَعْنَا ۖ غُفْرَانَكَ رَبَّنَا وَإِلَيْكَ ٱلْمَصِيرُ ﴿٢٨٥﴾ لَا يُكَلِّفُ ٱللَّهُ نَفْسًا إِلَّا وُسْعَهَا ۚ لَهَا مَا كَسَبَتْ وَعَلَيْهَا مَا ٱكْتَسَبَتْ ۗ رَبَّنَا لَا تُؤَاخِذْنَآ إِن نَّسِينَآ أَوْ أَخْطَأْنَا ۚ رَبَّنَا وَلَا تَحْمِلْ عَلَيْنَآ إِصْرًا كَمَا حَمَلْتَهُۥ عَلَى ٱلَّذِينَ مِن قَبْلِنَا ۚ رَبَّنَا وَلَا تُحَمِّلْنَا مَا لَا طَاقَةَ لَنَا بِهِۦ ۖ وَٱعْفُ عَنَّا وَٱغْفِرْ لَنَا وَٱرْحَمْنَآ ۚ أَنتَ مَوْلَىٰنَا فَٱنصُرْنَا عَلَى ٱلْقَوْمِ ٱلْكَٰفِرِينَ

[3] "Adı dilə gətirilərkən yerdə və səmalarda heç bir şeyin zərər verə bilməyəcəyi Allahın adı ilə! O, Eşidən və Biləndir."

[4] "Yaratdıqlarının şərrindən Allahın kamil kəlmələrinə sığınıram."

[5] "Allahın adı ilə, Allaha arxalanırıq. Güc və qüvvət Allaha məxsusdur."

[6] "Allahı mənim üçün kifayətdir. Ondan başqa ibadətə və itaətə layiq haqq məbud yoxdur. Ona arxalandım. O, uca ərşin Rəbbidir."

[7] "Rəbb olaraq Allahdan, din olaraq islamdan, peyğəmbər olaraq Məhəmmədən ﷺ razı qaldım."

[8] "Allahım Sənin sayəndə səhərə çıxırıq və Sənin sayəndə axşama çıxırıq. Sənin sayəndə dirilir və Sənin sayəndə ölürük və tale Sənin əlindədir."

| | | | |
|---|---|---|---|
| 10 | "أَصْبَحْنَا عَلَى فِطْرَةِ الإِسلامِ وعَلَى كَلِمَةِ الإخْلَاصِ وعَلَى دِينِ نَبِيِّنَا مُحَمَّد وعَلَى مِلَّة أَبِينَا إِبْراهيم حَنِيفا مُسْلِماً ومَاً كَنَا من الْمُشْرِكِينَ"<br>«*Asbahnə alə fitrati-l-isləm va alə kəlimati-l-ixlas, va alə dini nəbiyyinə muhammədin (Sallallahu aleyhi və salləm), alə milləti əbinə ibrahim, hənifən muslimən va mə kənə minə-l-muşrikin*» [2] | Səhər *bir dəfə* | Peyğəmbər (*Sallallahu aleyhi və salləm*) bununla dua edərdi |
| 11 | "اللَّهُمَّ مَا أَصْبَحَ (ما أمسى) بِي منْ نعْمَة أَوْ بأَحَد من خَلْقك فمنْك وَحْدَكَ لاَ شَرِيكَ لَكَ ، فَلَك الْحَمْدُ ولَكَ الشُّكْرُ"<br>«*Allahummə mə asbaha (mə əmsə) bi min nimətin av bi əhədin min xalqikə fəminkə vahdəkə lə şərikə ləkə, fələkə-l-həmdu və ləkə-ş-şukr*» [3] | Səhər və axşam *bir dəfə* | Həmin sutkanın şükrünü vermiş olar |
| 12 | "اللَّهُمَّ إِنِّي أَصْبَحْتُ (امسيت) أُشْهِدُكَ وَأُشْهِدُ حَمَلَةَ عَرْشِكَ، وَمَلائِكَتَكَ وَجَمِيعَ خَلْقِكَ، أَنَّكَ أَنْتَ اللهُ لاَ إِلَهَ إِلاَّ أَنْتَ وَحْدَكَ لاَ شَرِيكَ لَكَ، وَأَنَّ مُحَمَّداً عَبْدُكَ وَرَسُولُكَ"<br>«*Allahummə inni asbahtu (axşam: əmseytu) uşhidukə va uşhidu haməlatə arşikə va məlaikətikə va cəmia xalqikə, ənnəkə əntə-l-lahu lə iləhə illə ənt vahdəkə lə şərikə lək, va ənnə Muhammədən abdukə va rasulukə*» [4] | Səhər və axşam *dörd dəfə* | Bunu dörd dəfə deyəni Allah cəhənnəm atəşindən xilas edər |
| 13 | "اللَّهُمَّ فَاطِرَ السَّمَوَاتِ وَالْأَرْض عَالِمَ الْغَيْبِ وَالشَّهَادَةِ رَبَّ كُلِّ شَيْءٍ وَمَلِيكَهُ أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ أَنْتَ ، أَعُوذُ بِكَ مِنْ شَرِّ نَفْسِي وَمِنْ شَرِّ الشَّيْطَانِ وَشِرْكِهِ وَأَنْ أَقْتَرِفَ عَلَى نَفْسِي سُوءًا أَوْ أَجُرَّهُ إِلَى مُسْلِم"<br>«*Allahummə fatıra-s-səməvati va-l-ardı, alimə-l-ğeybi va-ş-şəhadəti, rabbə kulli şeyin va məlikəhu, əşhədu ən lə iləhə illə ənt, əuzu bikə min şərri nəfsi, va min şərri-ş-şeytani va şirkihi, va ən əqtərifə alə nəfsi suan, au acurrahu ilə muslimin*» [5] | Gecə yatmadan öncə və səhər *bir dəfə* | Şeytanın vəsvəsələri ndən qoruyar |
| 14 | "اللَّهُمَّ إِنِّي أَعُوذُ بِكَ مِنَ الْهَمِّ وَالْحَزَنِ، وَ أَعُوذُ بِكَ من الْعَجْزِ وَالْكَسَلِ، و أَعُوذُ بِكَ من الْجُبْنِ والْبُخْلِ، وَ أَعُوذُ بِكَ من غَلَبَةِ الدَّيْنِ و قهرالرِّجَالِ"<br>«*Allahummə inni əuzu bikə minə-l- həmmi va-l-həzəni, va əuzu bikə minə-l-əczi və-l-kəsəli, va əuzu bikə minə-l-cubni va-l-buxli, va əuzu bikə min ğaləbəti-d-deyni və qahiri-r-rical.*» [6] | Səhər və axşam *bir dəfə* | Qəm-kədərini aparar və borcu ödənər |

[1] "Allahım! Sənin sayəndə axşama çıxırıq və sənin sayəndə səhərə çıxırıq. Sənin sayəndə ölürük və Qiyamət günü insanlar Sənin hüzuruna gəlmək üçün diriləcəklər."

[2] "İslam təbiəti, İxlas kəlməsi və Peyğəmbərimizin (*Sallallahu aleyhi və salləm*) dini ilə müşriklərdən olmayan, müsəlman va hənif olan ulu atamız İbrahimin milləti olaraq səhərə çıxdıq."

[3] "Allahım! Mən və ya məxluqlarından biri nemətlərinlə səhərə (axşama) çıxdıq. O nemətlər ki, təkcə Sənə məxsusdur. Təksən və Şəriksizsən. Həmd və şükr Sənə məxsusdur."

[4] "Səhərə (axşama) çıxırıq Allahım! Səni və ərşini daşıyanları, mələkləri və bütün yaratdıqlarını şahid gətirirəm ki, Sən Allahsan, Səndən başqa ibadətə və itaətə layiq haqq məbud yoxdur, Təksən və Şəriksizsən, və Məhəmməd qulundur və rəsulundur."

[5] "Səmaları va yeri Yaradan, gizlini və aşkarı Bilən, Allahım! Hər şeyin Rəbbi və Sahibi! Səndən başqa ibadətə və itaətə layiq haqq məbud olmadığına şəhadət edirəm. Nəfsimin şərindən Sənə sığınıram. Şeytandan və onun şirk-şərindən, nəfsimə və ya bir müsəlmana pislik etməkdən Sənə sığınıram."

[6] "Allahım! Həqiqətən, narahatçılıqdan və kədərdən, acizlikdən, tənbəllikdən, xəsislikdən və qorxaqlıqdan, borc yükü altında qalmaqdan və insanların istilasından Sənə sığınıram."

| | | | |
|---|---|---|---|
| 15 | "اللَّهُمَّ أَنْتَ رَبِّي، لاَ إِلَهَ إلاَّ أَنْتَ خَلَقْتَنِي وَأَنَا عَبْدُكَ وَأَنَا عَلَى عَهْدِكَ وَوَعْدِكَ مَا اسْتَطَعْتُ أَعُوذُ بِكَ مِنْ شَرِّ مَا صَنَعْتُ ، أَبُوءُ لَكَ بِنِعْمَتِكَ عَلَيَّ، وَأَبُوءُ بِذَنْبِي فَاغْفِرْ لِي، فَإِنَّهُ لاَ يَغْفِرُ الذُّنُوبَ إلاَّ أَنْتَ" «*Allahummə əntə rabbi lə iləhə illə əntə, xaləqtəni va ənə abdukə, va ənə alə ahdikə va vadikə məstətatu, əuzu bikə min şərri mə sənatu, əbuu ləkə binimətikə aleyyə, va əbuu bizənbi fa-ğfirli fəinnəhu lə yəğfira-z-zunubə illə ənt*» [1] | Bağışlanma diləməğin seyididir. Səhər və axşam ***bir dəfə*** | Kim bunu iman gətirərək deyər və həmin gün və ya həmin axşam ölərsə cənnət əhlindən olar. |
| 16 | "يَا حَيُّ ، يَا قَيُّومُ ، بِرَحْمَتِكَ أَسْتَغِيثُ ، أَصْلِحْ لِي شَأْنِي كُلَّهُ، وَلاَ تَكِلْنِي إِلَى نَفْسِي طَرْفَةَ عَيْنٍ" «*Yə hayyu, yə qayyum, birahmətikə əstəğısu aslih li şəni kulləhu va lə təkilni ilə nəfsi tarfətə aynin*» [2] | Səhər və axşam ***bir dəfə*** | Peyğəmbər (*Sallallahu aleyhi və salləm*) Fatiməyə tövsiyə etmişdi. |
| 17 | "اللَّهُمَّ عَافِنِى فِى بَدَنِى اللَّهُمَّ عَافِنِي فِي سَمْعِى، اللَّهُمَّ عَافِنِي فِي بَصَرِي،اللَّهُمَّ إِنِّى أَعُوذُ بِكَ مِنَ الْكُفْرِ، وَالْفَقْرِ، اللَّهُمَّ إِنِّى أَعُوذُ بِكَ مِنْ عَذَابِ الْقَبْرِ، لاَ إِلَهَ إلاَّ أَنْتَ" « *Allahummə afini fi bədni Allahummə afini fi səmi, Allahummə afini fi basari, Allahummə inni əuzu bikə minə-l-kufri, va-l-faqri. Allahummə inni əuzu bikə min azabi-l-qabri, lə iləhə illə ənt*» [3] | Səhər və axşam ***üç dəfə*** | Peyğəmbərin (*Sallallahu aleyhi və salləm*) belə dua etdiyi deyilmişdi. |
| 18 | "لاَ إِلَهَ إلاَّ اللهُ وَحْدَهُ لاَ شَرِيكَ لَهُ ، لَهُ الْمُلْكُ وَلَهُ الْحَمْدُ وَهُوَ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ" «*Lə iləhə illə-l-lah vahdəhu lə şərikə ləhu, ləhu-l-mulk, va ləhu-l-həmd, va huva alə kulli şeyin qadir*» [4] | Səhər və axşam ***bir*** və ya ***on dəfə*** | Bunu demək bir kölə azad etməkdir. Həmçinin on savab qazandırır, on günah silir, on dərəcə qaldırır, şeytandan qoruyur. |
| 19 | "سُبْحَانَ اللهِ وَبِحَمْدِهِ عَدَدَ خَلْقِهِ ، وَرِضَا نَفْسِهِ ، وَزِنَةَ عَرْشِهِ ، وَمِدَادَ كَلِمَاتِهِ" «*Subhanə-l-lahi va bihəmdihi adədə xalqihi, va rıda nəfsihi, va zinətə arşihi va midədə kəlimətihi*» [5] | Səhər ***üç dəfə*** | Bunu demək sübhdən günortaya qədər Allahı zikr etməkdən daha xeyirlidir. |

---

[1] "Allahım! Sən mənim Rəbbimsən. Səndən başqa ibadətə və itaətə layiq haqq məbud yoxdur. Məni Sən yaratdın və mən Sənin qulunam. Sənə verdiyim vədi və əhdi bacardıqca yerinə yetirəcəyəm. Sənin yaratdıqlarının şərindən Sənə sığınıram. Mənə verilən neməti Sənə qaytarıram və öz günahlarımı etiraf edirəm. Məni bağışla. Səndən başqa günahları bağışlayan yoxdur."

[2] "Ey Daimi və Əbədi olan, ey hər şeyin Hamisi! Rəhmətinlə yardım diləyirəm. Bütün işlərimi sahmana sal bir göz qırpımı belə məni öz ixtiyarıma buraxma."

[3] "Allahım! Qulaqlarıma və gözlərimə sağlamlıq ver. Allahım! Küfrdən və yoxsulluqdan Sənə sığınıram. Qəbrin əzabından Sənə sığınıram. Səndən başqa ibadətə və itaətə layiq haqq məbud yoxdur."

[4] "Allahdan başqa ibadətə və itaətə layiq haqq məbud yoxdur. Təkdir və şəriki yoxdur, mülk və həmd Onundur və O, hər şeyə qadirdir."

[5] "Nöqsansız, pak Olan Allahdır və həmd Ona məxsusdur: yaratdıqlarının sayı, hər kəs razı olacağı, Ərşinin köləlikləri, kəlmələri çoxluğu qədər."

# Böyük savablar vəd olunan söz və əməllər

| № | Fəzilətli söz və ya əməl | Sünnədə deyilən savabı. Peyğəmbər (Sallallahu aleyhi və səlləm) demişdir: |
|---|---|---|
| 1. | *"Lə iləhə illəllahu vahdəhu lə şərikə ləhu ləhu-l-mulku va ləhu-l-həmdu va huvə alə kulli şeyin qadir."* | "Kim gün ərzində yüz dəfə *"Allahdan başqa ibadətə layiq haqq məbud yoxdur və O təkdir, heç bir şəriki yoxdur. Mülk və həmd-səna Ona məxsusdur və O hər şeyə qadirdir."* – deyərsə, on nəfər qul azad etmiş kimi savab qazanar. Əməl dəftərinə yüz savab yazılar, yüz günahı isə silinər. Həmin günü axşama qədər şeytandan qorunar. Daha çox çalışanlardan başqa, heç kəs bundan daha əfzəlini etmiş olmaz". |
| 2. | *"Sübhənə-l-lahil azim və bihəmdihi"* | Kim "***Əzəmətli Allah nöqsanlardan pakdır. Onun həmdi ilə Ona həmd-səna edirəm.***" – deyərsə, cənnətdə bir xurma ağacı əkilər. |
| 3. | *"sübhənəllahi və bihəmdihi, sübhənə-l-lahil azim"* | "Kim səhər və axşam yüz dəfə *"Allah **nöqsanlardan pakdır. Onun həmdi ilə həmd-səna edirəm.**"* - deyərsə, günahları bağışlanar, hətta dənizdəki köpüklər qədər olsa da bağışlanar. Qiyamət günü heç kəs bundan daha yaxşı əməl ilə gələ bilməz. Yalnız onun dediyini deyib əlavə edəndən başqa.". "Dildə yüngül, tərəzidə ağır, ***ər-Rəhmana sevimli*** olan iki ifadə vardır: ***"Allah nöqsanlardan pakdır. Onun həmdi ilə həmd-səna edirəm. Əzəmətli Allah nöqsanlardan pakdır.***" |
| 4. | *"Lə hovlə vala quvvətə illə billəh."* | Sənə cənnətin xəzinəsinin yerini bildirimmi? Əlbəttə bildir! Peyğəmbər (Sallallahu aleyhi və səlləm) dedi: *"Allahdan başqa kömək və qüvvət dayağı yoxdur."* – sözləri xəzinədir. |
| 5. | Cənnəti istəyib cəhənnəmdən Allaha sığınmaq | "Kim üç dəfə cənnəti istəyərsə, cənnət: *Ey Allahım! Onu cənnətə daxil et!* – deyər. Kim üç dəfə cəhənnəmdən Allaha sığınarsa, cəhənnəm: *Ey Allahım! Onu cəhənnəmdən qoru!* – deyər". |
| 6. | Məclisin kəffarəsi olan dua | Kim bir məclisdə oturar və çox danışarsa, məclisdən durmadan öncə *"Subhanəkə Allaahummə və bihəmdikə. Əşhədu əllə iləhə illə əntə, əstağfirukə və ətubu iləykə."* *"Nöqsansız və həmd sahibi Allahım! Şəhadət verirəm ki, Səndən başqa ibadətə və itaətə layiq haqq məbud yoxdur. Səndən bağışlanma diləyir və Sənə tövbə edirəm"* – deyərsə, məclisdə etdiyi günahları bağışlanar. |
| 7. | Peyğəmbərə (Sallallahu aleyhi və səlləm) salavat | "Kim mənə bir dəfə salavat oxuyarsa, Allah ona on dəfə salavat oxuyar, on günahını bağışlayar, dərəcəsini on dərəcə qaldırar". Başqa rəvayətdə deyilir: "Onun üçün on savab yazılar." |
| 8. | Qurani kərimdən bir neçə ayə oxumağın savabı | Kim gün ərzində əlli ayə oxuyarsa, qafillər siyahısına yazılmaz. Kim yüz ayə oxuyarsa, itaətkarlardan yazılar. Kim iki yüz ayə oxuyarsa, qiyamət günü Quran onun üzünə durmaz. Kim beş yüz ayə oxyarsa, ona bir qintar *(çox böyük)* savab verilər. ***"Qul huvəllahu əhəd"*** Quranın üçdə birinə bərabərdir." |
| 9. | Kəhf surəsindən bəzi ayələri əzbərləmək | "Kim Kəhf surəsinin əvvəlindən on ayə əzbərləyərsə, Dəccaldan qorunar." |
| 10. | Müəzzinlərin savabı | "Müəzzinin səsini eşidən insan, cin və hər şey qiyamət günü ona şahidlik edəcəklər." "Qiyamət günü müəzzinlər insanlar arasında ən uzun boğazlı olacaqlar." |
| 11. | Müəzzinlə bərabər azanı təkrarlamaq | "Kim azanı eşidərkən bu duanı deyərsə, qiyamət günü şəfaətimə layiq olar. «*Allahummə rabbə həzihi-d-dəvəti-t-təmmə, va-s-saləti-l-qaimə əti Muhəmmədən əl-vasılətə va-l-fadılətə,* |

| | | |
|---|---|---|
| | **və sonra dua etmək** | *vab`ashu məqamən məhmudan əlləzi vaadtəhu*» "*Ey bu kamil dəvətin və qılınacaq namazın Rəbbi olan Allahım! Muhəmmədə vasilə dərəcəsini və fəziləti bəxş et və onu vəd etdiyin tərifəlayiq məqama yüksəlt.*" |
| 12. | **Dəstəmazı tam şəkildə almaq** | "Kim gözəl şəkildə dəstəmaz alarsa, günahları bədənindən, hətta dırnaqlarının altından çıxar." |
| 13. | **Dəstəmazdan sonra dua oxumaq** | "Kim kamil şəkildə dəstəmaz alar və sonra: "Əşhədu əllə iləhə illəllah və ənnə Muhəmmədən abdullahi və rəsuluhu" – deyərsə, cənnətin səkkiz qapısı onun üzünə açılar və istədiyi qapıdan daxil olar." |
| 14. | **Dəstəmazdan sonra iki rükət namaz qılmaq** | "Bir müsəlman dəstəmaz alar və bunu gözəl şəkildə yerinə yetirər, sonra isə qalxıb səmimi qəlbdən, fikirini cəmləşdirərək iki rükət namaz qılarsa cənnət ona vacib olar." |
| 15. | **Məscidə gedərkən addımları çoxaltmaq** | "Kim camaat namazı qılmaq üçün məscidə gedərsə, gedib qayıdarkən atdığı bir addıma görə günahı silinər, digərinə görə isə savab yazılar." |
| 16. | **Cümə namazına hazırlaşmaq və namaza erkən getmək** | "Kim cümə günü çimər, erkən çıxıb məscidə piyada gedər, sonra imama yaxın yerdə əyləşər, xütbədə danışmayıb imamı dinləyərsə, atdığı hər addımla oruclu və namazlı bir ilin savabını qazanar." "Kim cümə günü çimər, bacardığı qədər təmizlənər, yağlanar, yaxud ətirlənər, sonra məscidə gedər, oturan iki nəfərin başı üstündən keçməz, sonra istədiyi qədər namaz qılar, imam danışanda sakit durarsa, bu cümədən digər cüməyə qədər olan günahları bağışlanar." |
| 17. | **Təkbirətul ehrama yetişmək** | "Kim Allah üçün qırx gün birinci təkbirə çatıb camaatla namaz qılarsa, iki şeydən: Cəhənnəmdən və münafiqlikdən – bəraət qazanar." |
| 18. | **Fərz namazları camaatla qılmaq** | "Camaat namazı təklikdə qılınan namazdan iyirmi yeddi dərəcə üstündür." |
| 19. | **İşa və sübh namazlarını camaatla qılmaq** | "İşa namazını camaatla qılan gecənin yarısını, sübh namazını camaatla qılan isə bütün gecəni namaz qılmış sayılır." |
| 20. | **Birinci səfdə namaz qılmaq** | "Əgər insanlar camaat namazının və birinci səfdə dayanmağın nə qədər çox savab olduğunu bilsəydilər, buna nail olmaq üçün püşk atmaqdan başqa çarələri qalmasaydı, püşk atardılar." |
| 21. | **Ratibə sünnələri daim qılan** | "Kim gün ərzində on iki rükət: zöhrdən öncə dörd, sonra iki, məğribdən və işadan sonra iki, sübhdən öncə isə iki rükət namaz qılarsa, onun üçün cənnətdə ev tikilər." |
| 22. | **Nafilə namazları çoxaltmaq və onları xəlvətdə qılmağa çalışmaq** | "Allaha çoxlu səcdə et. Çünki sənin Allaha etdiyin hər bir səcdə ilə Allah sənin dərəcəni bir pillə yüksəldər, onunla bir günahını silər."<br>"Bir adamın insanların onu görmədikləri yerdə könüllü namaz qılması, insanların gözü önündə qıldığı namazdan iyirmi beş dəfə üstündür." |
| 23. | **Sübh namazından öncə ratibə sünnəni və sübhün fərzini qılmaq** | "Sübhün iki rükəti dünya və onun içindəkilərdən daha xeyirlidir." "Kim sübh namazını qılarsa, Allahın öhdəliyində olar." |
| 24. | **Duha** | «Hər bir oynağınıza gündəlik sədəqə düşür. Hər bir "Təsbih" |

| | | |
|---|---|---|
| | **namazı** | *(sübhənəllah)*, "Təhmid" *(əlhəmdulilləh)*, "Təhlil" *(Lə iləhə illəllah)*, "Təkbir" *(Allahu əkbər)* deməк sədəqədir. Yaxşı işləri əmr etmək, pis işlərdən çəkindirmək sədəqədir. Amma duha vaxtı iki rükət namaz qılmaq bütün bunları əvəz edir» |
| 25. | **Namaz qıldığı yerdə oturub Allahı zikr edən** | "Bir insan namaz qıldığı yerdə oturub Allahı zikr etdikcə, mələklər onun üçün dua edər, "Allahım onu bağışla, ona rəhm et!" - deyərlər. Dəstəmazı pozulana qədər bu hal davam edər." |
| 26. | **Camaat ilə sübh namazını qıldıqdan sonra gün çıxana qədər Allahı zikr etmək sonra isə iki rükət namaz qılmaq** | "Kim sübh namazını camaat ilə qılar sonra günəş çıxana qədər oturub Allahı zikr edər, sonra isə iki rükət namaz qılarsa, bu onun üçün kamil həcc və ümrə savabına bərabər olar." |
| 27. | **Gecə qalxıb özü namaz qılan və arvadını da namaza oyadan** | "Kim gecə qalxıb arvadını da oyadar və birlikdə iki rükət namaz qılarlarsa onlar Allahı çox zikr edən kişi və qadınlar siyahısına düşərlər." |
| 28. | **Gecə namazı qılmağa niyət edib, yuxuya gedən** | "Gecə qalxıb namaz qılacağına niyət edib, amma yuxudan oyana bilməyən kimsəyə Allah təalə həmin namazın savabını yazar və yatıb qaldığı yuxusunu sədəqə edər." |
| 29. | **Bazara daxil olarkən oxunan dua** | "Lə iləhə illə-l-lah vahdəhu lə şərikə ləhu, ləhu-l-mulk va ləhu-l-həmd, yuhyi va yumit va huva hayyun lə yəmutu biyədihi-l-xeyru va huva alə kulli şeyin qadir." *(Allahdan başqa ibadətə və itaətə layiq haqq məbud yoxdur. O, tək və şəriksizdir, mülk və həmd Onundur, O, həyat Verəndir və Alandır, O, diridir, ölmür. Xeyir Onun əlindədir, O, hər şeyə qadirdir.*<br>Kim bu duanı deyərsə milyon savab qazanar, milyon günahı silinər, milyon dərəcə ucalar. |
| 30. | **Fərz namazlardan sonra 33 dəfə sübhənəllah, 33 dəfə əlhəmdulilləh, 33 dəfə Allahu əkbər demək və Lə iləhə illəllah... kəlməsi ilə tamamlamaq** | "Kim hər namazdan sonra otuz üç dəfə təsbih edər *(Sübhənəllah)*, otuz üç dəfə Allaha həmd edər *(Əlhəmdulilləh)* və otuz üç dəfə təkbir *(Allahu əkbər)* - deyərsə, bu, doxsan doqquz edər. Yüzü tamamlamaq üçün isə "Lə iləhə illəllah vəhdəhu lə şərikə ləhu ləhul mulku və ləhul həmdu vəhuvə alə kulli şeyin qadir", *(Allahdan başqa ibadətə layiq haqq olan məbud yoxdur. O təkdir, heç bir şəriki yoxdur. Malikanə və həmd-səna Ona məxsusdur. O, hər şeyə qadirdir)* – deyərsə onun günahları hətta dənizin köpükləri kimi olsa belə, yenə də bağışlanar." |
| 31. | **Fərz namazdan sonra kürsü ayəsini oxumaq** | "Kim hər fərz namazdan sonra Kürsü ayəsini oxuyarsa, onun cənnətə girməsinə ölümdən başqa maneə olmaz." |
| 32. | **Xəstəni ziyarət etmək** | "Bir müsəlman digər xəstə müsəlmanı günorta vaxtı ziyarət edərsə, yetmiş min mələk onun üçün axşama qədər dua edər. Əgər işa vaxtı ziyarət edərsə, yetmiş min mələk onun üçün səhərə qədər dua edər. Bundan əlavə onun üçün cənnətdə bir bağça hazırlanar." |
| 33. | **Xəstəni görərkən edilən dua** | "Əlhəmdu lilləhi-l-ləzi afəni mimmə-b-tələkə bihi va faddaləni alə kəsirin mimmən xələqa təfdılən." *(Səni tutan azara məni salmamış və xəlq etdiyi bəndələrin çoxundan üstün tutmuş Allaha həmd olsun)*. Kim bu duanı deyərsə xəstəlik ona keçməz. |
| 34. | **Başına müsibət** | "Başına müsibət gəlmiş adama başsağlığı verən kimsə qarşı |

| | | |
|---|---|---|
| | gəlmiş adama başsağlığı vermək | tərəf kimi savab qazanar." "Müsibətə görə, qardaşına başsağlığı verən mömini Allah təalə lütfkarlıq libasına bürüyər." |
| 35. | Cənazəyə namaz qılıb dəfn olunana qədər onu müşayiət etmək | "Kim cənazə üçün namaz qılıb onu müşayiət etməzsə, bir qirat, müşayiət edərsə, iki qirat savab qazanar. Orada olanlar: İki qirat nə qədərdir? – deyə soruşdular. Peyğəmbər (Sallallahu aleyhi və səlləm) dedi: "**Ən kiçiyi Uhud dağı böyüklükdədir.**" İbn Ömər dedi: "Biz çox qiratları əldən buraxmışıq." |
| 36. | Allah üçün məscid tikən və ya bu işdə kömək edən | "Kim quş yuvası qədər də olsa, Allah üçün məscid tikərsə, Allah da onun üçün cənnətdə ev tikər." |
| 37. | Malını Allah yolunda xərcləmək | "Hər gün insanlar səhərə çıxdıqda iki mələk nazil olar. Onlardan biri deyər ki, Allahım sədəqə verənə bunun əvəzini ver. Digəri isə deyər ki, Allahım xəsislik edib sədəqə verməyənə xəsarət ver." |
| 38. | Sədəqə | "Sədəqə malı azaltmaz və Allah, bağışlayan bəndəni yalnız izzətləndirər. Allaha görə təvazökarlıq edəni Allah ucaldar." "Bir dirhəm yüz mini keçdi. Orada olanlar dedilər: Ey Allahın elçisi bu necə olur? O dedi: bir adamın iki dirhəmi olur və o birini sədəqə edir. Digərinin isə çoxlu var-dövləti var. O da malının az bir hissəsindən yüz min sədəqə edir." "Əgər müsəlman bir ağac basdırarsa, yaxud tarla əkərsə, ondan yeyən hər bir quşa, insana və ya heyvana görə onun üçün sədəqə yazılar." |
| 39. | Mənfəət güdmədən verilən borc | "Əgər bir müsəlman digər müsəlmana mənfəət güdmədən iki dəfə borc verərsə, sanki onu bir dəfə sədəqə etmiş kimidir." |
| 40. | Borcu qaytarmağa çətinlik çəkənə qarşı səbirli olmaq | "Kim borcunu qaytarmaqda çətinlik çəkənə möhlət verərsə, borcu qaytarana qədər hər günün əvəzində ona sədəqə yazılar. Borcun vaxtı qurtardıqdan sonra möhlət verərsə gecikən hər günün əvəzində onun üçün iki sədəqə yazılar." |
| 41. | Allah yolunda bir gün oruc tutmaq | "Kim Allah yolunda bir gün oruc tutarsa, Allah da onun üzünü yetmiş il cəhənnəmdən uzaqlaşdırar." |
| 42. | Hər ayın üç gününü, ərəfə və aşura günlərini oruc tutmaq | "Hər ayın üç gününü və Ramazan ayını oruc tutmaq bir il oruc tutmaq kimidir." "Peyğəmbərdən ﷺ ərəfa orucu haqqında soruşduqda demişdi: "bu günü oruc tutmaq keçən ili və bu ilin qalanını bağışlayır." "Peyğəmbərdən ﷺ aşura orucu haqqında soruşduqda demişdi: "Keçən ilin günahlarını bağışlayır." |
| 43. | Şəvvalın altı gününü oruc tutmaq | "Kim Ramazan ayını oruc tutar, ardınca şəvvalın altı gününü də oruc tutarsa, bir ili oruc tutmuº kimi olar." |
| 44. | İmamla təravih namazını axıra qədər qılmaq | "Əgər bir insan imam namazı bitirənə qədər onunla bərabər namaz qılarsa, bu onun üçün gecə namazı kimi hesab olunar." |
| 45. | Məqbul həcc | "Kim nalayiq danışmadan və bəlli vaxtlarda qadınla yaxınlıq etmədən uca Allahın rizasını qazanmaq üçün həcc edərsə, həccdən sonra anadan doğulduğu kimi *(günahsız)* olar." "Həqiqətən günah işləmədən yerinə yetirilən həccin cənnətdən başqa savabı yoxdur." |
| 46. | Ramazan | "Ramazan ayında edilən ümrə həccə bərabərdir, yaxud |

| | | |
|---|---|---|
| | ayında ümrə etmək | mənimlə edilən həccə bərabərdir." "Kim Kəbəni yeddi dəfə təvaf edər və iki rükət namaz qılarsa bir kölə azad etmiş kimi savabı olar." |
| 47. | Zülhiccə ayının ilk on günündə saleh əməllər görmək | "Bu günlərdə edilən saleh əməllər digər günlərə nisbətən Allaha daha əzizdir." Yəni zülhiccənin ilk on günündə edilən əməllər. Səhabələr dedilər: Ey Allahın rəsulu, hətta cihad etmək? Peyğəmbər (Sallallahu aleyhi və səlləm) dedi: "Hətta Allah yolunda cihad etmək. Yalnız nəfsi və malı ilə cihada gedib heç biri ilə geri qayıtmayandan başqa." |
| 48. | Qurbanlıq | Peyğəmbərin (Sallallahu aleyhi və səlləm) səhabələri dedilər: Ey Allahın rəsulu, bu qurbanlar nə üçündür? Peyğəmbər (Sallallahu aleyhi və səlləm) dedi: **"Bu babanız İbrahimin ﷺ sünnəsidir."** Səhabələr dedilər: Ey Allahın rəsulu, bu işdə bizim savabımız nədir? Peyğəmbər (Sallallahu aleyhi və səlləm) dedi: **"Hər tükə görə on savab qazanırsınız."** Səhabələr dedilər: Ey Allahın rəsulu, bəs yuna görə? Peyğəmbər (Sallallahu aleyhi və səlləm) dedi: **"Hər bir yuna görə, on savab vardır".** |
| 49. | Alimin savabı və fəziləti | "Alimin abiddən üstünlüyü mənim sizin ən sadənizdən olan fərqim kimidir." Sonra Peyğəmbər (Sallallahu aleyhi və səlləm) dedi: "Allah, mələkləri, göylərin və yerlərin əhalisi, hətta yuvasında olan qarışqa, suda olan balina da insanlara xeyiri öyrədən müəllimə dua edirlər." |
| 50. | Sidq ürəkdən şəhidlik arzulamaq | "Kim sidq ürəkdən şəhidlik arzulayarsa, yatağında ölsə də, Allah təalə onu şəhidlər məqamına yüksəldər." |
| 51. | Allah qorxusundan ağlamaq və Onun yolunda keşik çəkmək | "İki gözə: Allah qorxusundan ağlayan və gecəni oyaq qalıb, Allah yolunda keşik çəkən gözə - cəhənnəm odu toxunmaz." |
| 52. | Allaha təvəkkül edib çıldaqdan, ovsun oxutdurmaqdan və bədbinlikdən uzaq olmaq | "Peyğəmbərə (Sallallahu aleyhi və səlləm), yuxuda ikən əvvəlki ümmətlər göstərildi. Onların arasında öz ümmətini də gördü. Onların yetmiş min nəfəri haqq-hesab olunmadan və əzab çəkmədən cənnətə daxil olanlardır. Onlar, çıldaq etdirməyən, ovsun oxutdurmayan və bədbinlikdən uzaq olub, Allaha təvəkkül edənlərdir." |
| 53. | Övladları kiçik ikən dünyasını dəyişənlər | "Üç nəfər həddi buluğa çatmamış uşağı olan müsəlman ölərsə, Allah təalə onu cənnətə daxil edər." |
| 54. | Gözü kor olub səbr edən | "Allah təalə buyurur: Bəndəmi qoşa əzizlərlə, yəni gözləri ilə imtahana çəksəm, səbr edərsə əvəzində ona cənnət verərəm." |
| 55. | Bir şeydən Allah rizası üçün imtina edən | "Sən Allah qorxusuna görə nədənsə imtina etsən, Allah təalə onun əvəzində sənə daha xeyirlisini verər." |
| 56. | Ayıb yerini və dilini qorumaq | "Kim çənə sümüklərinin və ayaqlarının arasındakılara zamin durarsa, mən də cənnətə girəcəyinə dair ona zamin duraram." Yəni dilini və ayıb yerini qoruyarsa. |
| 57. | Evə daxil olarkən və yeməyə başlayarkən "Bismilləh" demək | "Bir insan evinə daxil olarkən və yeməyə başlayarkən "Bismilləh" deyərsə, şeytan öz köməkçilərinə deyər: Burada sizin üçün nə gecələməyə yer, nə də yemək var. Evə daxil olub "Bismilləh" deməsə, şeytan deyər: Siz burada gecələyə bilərsiniz. Yeməyə başlayanda da "Bismilləh" deməsə şeytan belə deyər: "Sizin gecələməyə yeriniz və yeməyə yeməyiniz var." |
| 58. | Yeməkdən və təzə paltar geyindikdən | Kim yemək yedikdən sonra bu duanı deyərsə, keçmiş günahları bağışlanar. "Əl-həmdu lilləhi-l-ləzi <u>**ətaməni**</u> həzə va razəqanihi min ğeyri haulin minni va lə quvvatin." *"Özüm heç bir qüdrət və* |

| | | |
|---|---|---|
| | sonra Allaha həmd etmək | *güc sərf etmədən mənə bu **təamı** qismət edən və ruzini verən Allaha həmd edirəm."* Təzə paltar geyindikdən sonra əvvəlki duanı bu sözlərlə əvəz edir: təzə paltar geyindikdən sonra isə "Əl-həmdu lilləhi-l-ləzi **kəsəni...**" *(...mənə bu **geyimi** qismət edən...).* |
| 59. | Məşəqqətinin azalmasını istəyənin duası | Fatimə ﷺ Peyğəmbərdən (Səllallahu aleyhi və səlləm) xadim istədikdə Peyğəmbər (Səllallahu aleyhi və səlləm) ona və Əliyə ﷺ dedi: "Sizə bu istədiyinizdən daha xeyirlisini söyləyimmi? Yatağınıza daxil olduqda otuz dörd dəfə təkbir edin *(Allahu əkbər deyin)*, otuz üç dəfə təsbih edin *(sübhənəllah deyin)* və otuz üç dəfə Allaha həmd edin *(əlhəmdulilləh deyin)*." Bu sizin üçün xidmətçidən daha xeyirlidir. |
| 60. | Cinsi yaxınlıqdan öncə dua oxumaq | "Bismi-l-ləh, Allahummə cənnibnə-ş-şeytanə va cənnibi-ş-şeytanə mə razəqtənə." *"Allahın adı ilə! Allahım, şeytanı bizdən və bizə verdiyin ruzidən uzaq et."* – Əgər bu yaxınlıqda onlara uşaq bəxş edilərsə, şeytan o uşağa heç bir zərər toxundura bilməz. |
| 61. | Arvadın ərini razı salması | "Bir qadın beş vaxt namazını qılar, Ramazan ayını oruc tutar, iffətini qoruyar və ərinə itaət edərsə, ona: cənnətin hansı qapısından istəyirsənsə, oradan da cənnətə daxil ol! – deyilər." "Əri ondan razı olan bir qadın ölərsə, cənnətə daxil olar." |
| 62. | Valideynlərə yaxşılıq etmək və qohumluq əlaqələrini saxlamaq | "Allahın razılığı valideynlərin razılığındadır." "Kim ruzisinin çoxalmasını və ömrünün uzanmasını istəyirsə, qohumluq əlaqələrini bərkitsin." |
| 63. | Yetimə himayədarlıq etmək | "Yetimə himayədarlıq edən, mənimlə cənnətdə belə olacaqdır" – deyərək, şəhadət və orta barmağını bir yerdə göstərdi." |
| 64. | Gözəl əxlaq | "Mömin öz gözəl əxlaqı ilə davamlı namaz qılıb oruc tutanların dərəcəsinə yüksələr." "Əxlaqı gözəl olana cənnətin ən yüksək mərtəbəsində ev vəd edirəm." |
| 65. | Məxluqata qarşı mərhəmətli və şəfqətli olmaq | "Allah mərhəmətli bəndələrini bağışlayar. Siz yer üzərində olanlara mərhəmət edin ki, səmada olan da sizə rəhm etsin." |
| 66. | Müsəlmanlar üçün xeyir istəmək | "Heç kəs özünə istədiyini qardaşı üçün istəməyincə iman gətirməz." |
| 67. | Həya | "Həya yalnız xeyir gətirər." "Həya imandandır." "Dörd şey peyğəmbərlərin sünnəsidir: Həya etmək, ətirlənmək, misvaklanmaq və evlənmək." |
| 68. | Birinci salam vermək | "Bir kişi Peyğəmbərin (Səllallahu aleyhi və səlləm) yanına gəlib "əssəlamu elykum" – dedi. Peyğəmbər (Səllallahu aleyhi və səlləm) dedi: bu on savab qazandı. Sonra başqa biri gəldi və "əssələmu aleykum və rəhmətullah" – dedi. Peyğəmbər (Səllallahu aleyhi və səlləm) dedi: bu isə iyirmi savab qazandı. Daha sonra isə başqası gəldi və "əssələmu aleykum və rəhmətullahi və bərəkətuhu" – dedi. Peyğəmbər (Səllallahu aleyhi və səlləm) dedi: bu isə otuz savab qazandı." |
| 69. | Görüşərkən əl ilə görüşmək | "İki müsəlman qarşılaşdıqda əl ilə görüşsələr, bir-birindən ayrılmadan günahları da bağışlanar." |
| 70. | Müsəlman qardaşının namusunu müdafiə etmək | "Kim müsəlman qardaşının namusunu qoruyarsa, Allah təalə də qiyamət günü onu oddan qoruyar." |
| 71. | Əməlisaleh insanları sevmək və onlarla durub-oturmaq | "Sən sevdiyin adamla birsən." Ənəs ﷺ deyir: "Səhabələr bu hədisə görə sevindikləri kimi, heç bir hədisə belə sevinməmişdilər." |
| 72. | Bir-birini Allah | İzzət və cəlal sahibi Allah deyir: "Mənim cəlalıma görə bir- |

| | | |
|---|---|---|
| | **üçün sevənlər** | birini sevənlər üçün nurdan minbərlər vardır. Peyğəmbərlər və şəhidlər onların bu məqamına qibtə edərlər." |
| 73. | **Müsəlman qardaşı üçün dua edən** | "Kim qardaşının arxasınca onun üçün dua edərsə, ona həvalə olunmuş mələk "Amin! Sənin üçün də eynisi olsun!" – deyə dua edər." |
| 74. | **Mömin kişi və qadınlar üçün bağışlanma diləmək** | "Kim mömin kişi və qadınlar üçün bağışlanma diləyərsə, Allah təalə hər mömin kişi və qadına görə ona bir savab verər." |
| 75. | **Əziyyət verən maneəni yoldan götürmək** | "Mən bir nəfərin cənnətdə gəzindiyini gördüm. Həmin adam yolda insanlara əziyyət verən ağacı kəsib yoldan kənarlaşdırmışdı."[1] |
| 76. | **Mübahisə və yalançılıqdan çəkinmək** | "Haqlı olduğu halda mübahisəni tərk edənə cənnətin ortasında ev vəd edirəm. Zarafat etdikdə və ya qeyri halda yalanı tərk edənə cənnətin ortasında ev vəd edirəm." |
| 77. | **Əsəbinə hakim olan** | "Kim əməldə edə biləcəyi əsəbinə hakim olarsa, qiyamət günü Allah təalə onu məxluqatın önündə çağırar və istədiyi hurini seçməyə ixtiyar verər." |
| 78. | **Xeyirlə yad edilən kimsə** | "Siz kimi xeyirlə yad edərsinizsə, cənnət də ona vacib olar. Kimi ki, pis işlərlə yad edərsiniz, ona da cəhənnəm vacib olar. Siz, Allahın yer üzündəki şahidlərisiniz..." |
| 79. | **Müsəlmanın sıxıntısını unutduran, işini asanlaşdıran, eyibini örtən və ona kömək olan** | "Kim bir möminin dünya sıxıntılarından birini azaldarsa, Allah taala qiyamət günü onun sıxıntılarından birini azaldar. Kim çətinliyə düşənin işini asanlaşdırarsa, Allah taala də onun işini dünyada və axirətdə asanlaşdırar. Kim müsəlmanın eybini örtərsə, Allah taala həm dünyada, həm də axirətdə onun eybini örtər. Allah, öz qardaşına kömək edən bəndənin köməyində olar." |
| 80. | **Axirəti düşünən** | "Kimin fikri-zikri axirət olarsa, Allah təalə onun qənaətini qəlbində edər, işlərini bir edər, dünya da zəlil şəkildə onun ayağına gələr." |
| 81. | **Rəhbərin ədalətli, cavanın əməlisaleh olması, məscidlərə bağlanmaq və Allah üçün sevmək** | "Qiyamət günü heç bir kölgənin olmadığı halda, yeddi qisim insanlar Allah taalanın kölgəsi altında kölgələnəcəklər. Ədalətli rəhbər, Rəbbinə ibadət edə-edə böyüyən gənc, qəlbi məscidlərə bağlı olan, bir-birini Allah üçün sevib birləşən və bunun üçün də ayrılan iki nəfər, gözəl və nəsil-nəcabətli qadının zina çağırışına qarşı: mən Allahdan qorxuram – cavabını verən, sol əlinin sağ əlinin nə verdiyindən bixəbər olduğu halda sədəqə verən və tənhalıqda Allahı zikr edib, gözləri yaş ilə dolan." |
| 82. | **İstiğfar (bağışlanma diləmək)** | "Kim *(əstəğfirullah – sözünü deyib)* bağışlanma diləyərsə, Allah onun hər sıxıntısından bir çıxış yolu açar, kədərdən xilas edər və onu gözləmədiyi yerdən ruziləndirər." |

[1] Bir halda ki, şəriət yolda insanlara əziyyət verən ağacı kəsməyə görə mükafat verirsə, onda başqa maneələri qaldırmaq daha vacibdir.





# Edilməsi qad ağan olunan əməllər

| № | Qadağan olunmuş əməl | Peyğəmbərdən (Sallallahu aleyhi və səlləm) səhih hədislə rəvayət olunan sübut |
|---|---|---|
| 1. | Əməlini insanlar üçün etmək | "Uca Allah buyurur: Mən ortaqlığa ehtiyacı olan şəriklərdən deyiləm. Kim bir əməl edib başqasını Mənə ortaq tutarsa, onu və şirkini öz başlarına buraxaram." |
| 2. | İnsanın zahirinin əməlisaleh görsənib daxilinin fəsadlı olması | "Mən, Qiyamət Günü Təhamə dağları böyüklükdə savab əməllərlə gələcək qövmlər tanıyıram. Allah onların savablarını toza döndərib yox edəcəkdir." Sovban ﷺ dedi: Ey Allahın elçisi! Onların kimlər olduğunu bizə bildir ki, biz də bilmədən onlardan olmayaq. Peyğəmbər (Sallallahu aleyhi və səlləm) dedi: "Onlar sizin qardaşlarınız, sizin nəslinizdən olan və sizin kimi gecə namazları qılanlardır. Amma onlar Allahın haram buyurduğu işlərlə təklikdə qaldıqda haram edərlər." |
| 3. | Təkəbbürlük | "Qəlbində misqal qədər təkəbbürlülük olan cənnətə daxil olan deyil. Təkəbbürlülük haqqı inkar etmək və insanları özündən alçaq görməkdir." |
| 4. | Paltarın uzadılması | "Paltarın uzadılması izara (şalvara), köynəyə və əmmaməyə aiddir. Kim bu libaslarını təkəbbürlük üçün uzun edərsə Qiyamət günü Allah onun üzünə baxan deyil." |
| 5. | Həsəd | "Həsəd etməkdən çəkinin. Həqiqətən od odunu yandırıb kül etdiyi kimi, həsəd etmək də savabları elə məhv edir." |
| 6. | Sələm | "Peyğəmbər (Sallallahu aleyhi və səlləm) sələm yeyəni və yedirdəni lənətləmişdir." "Bir insanın sələmdən əldə olunan bir dirhəmi bilərəkdən yeməsi otuz altı dəfə zina etməkdən pisdir." |
| 7. | İçkiyə qurşanan | "Beş xislətli insan cənnətə girməz: İçkiyə qurşanan, sehrə inanan, qohumluq əlaqələrini kəsən, cadugər və söz gəzdirən (nəmmam)." |
| 8. | Yalan | "İnsanları güldürmək üçün yalan danışanın vay halına, vay halına, vay halına." |
| 9. | Cəsusluq | "Kənar adamların eşitməsini istəməyən və ya gizlinə çəkilib söhbət etmək istəyənlərin söhbətinə qulaq asanın qulağına qiyamət günü əridilmiş qurğuşun töküləcəkdir." |
| 10. | Rəsm çəkmək | "Qiyamət günü ən şiddətli əzab görən insanlar rəsm çəkənlərdir." "İçərisində surət və ya it olan evə mələklər daxil olmazlar." |
| 11. | Nəmmamlıq | "Nəmmam cənnətə girən deyil." Nəmmamlıq, fitnə-fəsad törətmək üçün insanlar arasında söz gəzdirməkdir. |
| 12. | Qeybət | "Bilsiniz qeybət nədir? Səhabələr ﷺ dedilər: Allah və Rəsulu daha yaxşı bilər! Peyğəmbər (Sallallahu aleyhi və səlləm) dedi: Qeybət, qardaşın haqqında xoşlamadığı şeyi danışmaqdır. Səhabələr ﷺ dedilər: Əgər mənim dediyim həqiqətən də qardaşımda varsa necə? Peyğəmbər (Sallallahu aleyhi və səlləm) dedi: Əgər sənin dediyin onda varsa, qeybət edirsən, dediyin onda yoxdursa, böhtan atırsan." |
| 13. | Lənətləmək | "Mömini lənətləmək onu öldürmək kimidir." "Küləyə lənət oxuma! Çünki o əmr icraçısıdır. Kim lənətə layiq olmayan birini lənətləyərsə, lənəti özünə qayıdar." |
| 14. | Sirri ifşa etmək | "Qiyamət günü Allah yanında ən şər təbəqəli insanlar, ər və arvad bir-biri ilə yaxınlıq edib, sonra arvadının sirrini insanlara yayandır." |
| 15. | Tərbiyəsizlik | "Qiyamət günü Allah yanında ən şər təbəqə insanlar, başqalarının onu tərbiyəsizliyindən çəkinib, tərk etdiyi kimsədir." "Adəm övladının günahlarının çoxu dilindən edilir." |

| | | |
|---|---|---|
| 16. | Müsəlmanı kafirlikdə ittiham etmək | "Əgər bir insan öz qardaşına: Ey Kafir! – deyərsə, bu söz ikisindən birinə çatar. Əgər dediyi kimidirsə, heç, əks halda, sözü özünə qayıdır." |
| 17. | Özünü atasından başqasına nisbət edən | "Kim bilərəkdən özünü qeyri atasında (onun oğlu olduğunu) nisbət edərsə cənnət ona haram olar." "Kim öz atasından imtina edərsə küfr edər." |
| 18. | Müsəlmanı qorxutmaq | "Bir müsəlmanın digər müsəlmanı qorxutması ona halal deyil." "Kim qardaşına tərəf dəmir parçası uzadarsa, onu geri çəkədə qədər mələklər ona lənət oxuyarlar." |
| 19. | Allah dostlarına düşmənçilik etmək | "Uca Allah buyurur: Kim mənim dostlarıma düşmən kəsilərsə ona qarşı müharibə elan edərəm." |
| 20. | İslam ölkələrində aman verilmiş *(müstəmən)* kafirləri öldürmək | "Əhd bağlamış insanı haqsız yerə qətlə yetirən kimsə cənnətin iyini hiss edən deyil. Halbuki onun iyi yüz illik məsafədən gəlir." |
| 21. | Münafiq və fasiqə seyid və ya ağa demək | "Münafiqə seyid (ağa, cənab) deməyin. Əgər o seyid olsa, onda siz Rəbbinizi qəzəbləndirmiş olarsınız." |
| 22. | Rəiyyəti aldatmaq | "Allah taalanın rəiyyət üzərində hakim etdiyi bir bəndə öz hakimiyyəti zamanı onları aldadarsa, Allah taala ona cənnəti haram edər." |
| 23. | Elmsiz fitva vermək | "Elmsiz fitva verilənin günahı ona fitva verənin üzərinə düşür." |
| 24. | Cümə və əsr namazlarını tərk etmək | "Kim cüməyə səhlənkar yanaşıb, onu üç dəfə tərk edərsə, Allah onun qəlbinə xətm vurar." Bu, cüməni üzürsüz tərk edənə aiddir." "Kim əsr namazını tərk edərsə əməli batil olar." |
| 25. | Namaza laqeyd yanaşmaq | "Bizimlə onlar arasında olan əhd namazdır. Kim onu tərk edərsə, küfr etmişdir." "Bir insanla şirk arasında namazı tərk etmək durur." |
| 26. | Namaz qılanın önündən keçmək | "Namaz qılanın önündən keçən bunun günahını bilsəydi, orada qırx gün dayanmağı keçməyindən daha xeyirli olardı." |
| 27. | Namaz qılanlara əziyyət vermək | "Kim soğan, sarımsaq və kəvər yeyərsə, məscidimizə yaxınlaşmasın. Adəm oğluna əziyyət verən şeylər mələklərə də əziyyət verir." |
| 28. | Torpağı qəsb etmək | "Kim zülm ilə bir qarış torpağı qəsm edərsə, Qiyamət günü Allah təalə ona yeddi qat yeri yükləyər." |
| 29. | Allahı qəzəbləndirən bir söz danışmaq | "İnsan nə danışdığına əhəmiyyət vermədən Allahı qəzəbləndirən bir söz danışmaqla yetmiş il cəhənnəm əzabına məhkum edilər." |
| 30. | Çox danışıb Allahı zikr etməmək | "Çox danışmayın, Allahı çox zikr edin. Çünki Allahı zikr etməkdən başqa digər sözləri çox danışmaq qəlbi sərtləşdirir." |
| 31. | Boşboğazlıq etmək | "Mənim nifrət etdiyim və qiyamət günü məndən uzaq olan kimsələr – boşboğazlıq edən, insanları lağa qoyan və ağzını əyə-əyə çətin ifadələr tapıb danışanlardır." |
| 32. | Allahı zikr etməkdən qafil olmaq | "Bir qrup insan məclisdə oturub Allahı zikr etmədən, Peyğəmbərinə (*Sallallahu aleyhi və səlləm*) salavat demədən məclisi başa vurarlarsa onlar üçün peşmançılıq olar. Allah istəsə onlara ya cəza verər, ya da bağışlayar." |
| 33. | Müsəlmanı söymək | "Din qardaşını söymə. Allah onu bağışlayıb səni cəzalandırar." "Kim günah (edib sonra tövbə) etmiş qardaşına eyib edərsə özü də o günahı etməmiş ölməz." |
| 34. | Müsəlmanların küsülü qalmaları | "Bir mömінin öz qardaşı ilə üç gündən artıq küsülü qalması halal olmaz. Kim qardaşı ilə üç gündən artıq küsülü qalıb ölərsə, cəhənnəmə düşər." |

| | | |
|---|---|---|
| 35. | Günahları aşkarda etmək | "Ümmətimin hər kəsi bağışlanar, yalnız günahlarını aşkarda edənlərdən başqa." |
| 36. | Pis əxlaq | "Sirkə balı korladığı kimi, pis əxlaq da müsəlmanı elə korlayar." |
| 37. | Hədiyyəsini geri götürən | "Hədiyyəsini geri götürən, qusduğunu yalayan it timsalındadır." "Bir insanın hədiyyə verib, sonra onu geri götürməsi halal deyil." |
| 38. | Qonşuya zülm etmək | "Bir insanın qonşusunun qadını ilə zina etməyindənsə, başqa on qadınla zina etməsi az günahdır. Bir insanın öz qonşusunun evindən oğurluq etməyindənsə, başqa on evdən oğurluq etməsi az günahdır." |
| 39. | Yad qadınlara baxmaq | "Adəm övladının zinadan olan payı artıq yazılmışdır. O, mütləq bununla qarşılaşacaqdıq. Gözün zinası baxmaq, qulağın zinası dinləmək, dilin zinası danışmaq, əlin zinası isə toxunmaqdır... ürək isə arzulayır, meyillənir. Cinsiyyət orqanı isə bunu təsdiq və ya təkzib edir." |
| 40. | Kişinin naməhrəm qadına toxunması | "Bir kişinin başına dəmir nizənin batması, onun halal olmayan qadına əl vurmasından daha yaxşıdır." "Mən qadınlarla əl ilə görüşmürəm." |
| 41. | Şiğar nikahı | "Peyğəmbər (Sallallahu aleyhi və səlləm) şiğar nikahını qadağan etmişdir." Şiğar nikahı, bir kimsənin öz qızını arada mehr olmadan qarşı tərəfə ərə verərək, əvəzində onun qızını istəməsidir. |
| 42. | Ölünün arxasınca vay-şivən qoparmaq | "Arxasınca vay-şivən qoparılan adam qiyamət günü buna görə əzab çəkər." "Peyğəmbər (Sallallahu aleyhi və səlləm) vay-şivən qoparanı və onu dinləyəni lənətləmişdir." |
| 43. | Allahdan başqasına and içmək | "Kim Allahdan başqasına and içərsə, küfr və ya şirk edər." "Kim and içmək istəyirsə, Allaha and içsin, əks halda, sussun." "Kim əmanətə and içərsə bizdən deyildir." |
| 44. | Yalan and | "Kim yalandan and içər və bununla müsəlmanın malını haqsız mənimsəyərsə, Allahla qarşılaşarkən Allah ona qəzəbli olar." |
| 45. | Alış-veriş edərkən and içmək | "Alqı-satqı zamanı çox and içməyin. Bununla malın eyibi örtülür, bərəkəti itir." "And içmək malın eyibini örtər, bərəkətini də aparar." |
| 46. | Özünü kafirlərə oxşadan | "Kim özünü bir topluma oxşadarsa, o da onlardandır." "Özünü bizdən başqasına oxşadan bizdən deyil." |
| 47. | Qəbirin üzərində tikili tikmək | "Peyğəmbər (Sallallahu aleyhi və səlləm) qəbirlərin ucaldılmasını, onların üzərində oturulmasını və üstündə tikili tikilməsini qadağan etmişdir." |
| 48. | Xəyanət etmək | "Qiyamət günü Allah təalə bütün insanları topladıqda xəyanət edən hər kəs üçün bir bayraq qaldırılacaq və deyiləcəkdir: Bu filankəs oğlu filankəsin xəyanətinin əlamətidir." |
| 49. | Qəbirin üstündə oturmaq | "Közün üstündə oturub paltarını, sonra da dərisini yandırmaq qəbirin üstündə oturmaqdan daha xeyirlidir." |
| 50. | İçəri daxil olanda onun üçün ayağa qalxmasını istəyən | "Kim insanların onun üçün ayağa durmasını sevərsə, oturacağını cəhənnəmdə hazır bilsin." |
| 51. | Dilənçilik qapısını açan | "Əgər bir bəndə dilənçilik qapısını açarsa, Allah təalə də onun üzünə kasıblıq qapısını açar." "Kim varlanmaq üçün dilənçilik edərsə, köz dilənmiş kimidir. Bundan sonra ya işindən əl çəksin, əks halda közdən çox götürsün." |

| | | |
|---|---|---|
| 52. | Malın qiymətini qaldırmaq üçün əlbir olmaq | "Peyğəmbər (Sallallahu aleyhi və salləm) şəhərlinin kəndliyə satmasını, malın qiymətini qaldırmaq üçün əlbir olmağı və başqa müsəlmanın satışına qarışmağı qadağan etmişdir." |
| 53. | İtirdiyini tapmaq üçün məsciddə elan vermək | "Bir insanın itirdiyini məsciddə elan etdiyini görən belə desin: Allah onu sənə qaytarmasın. Məscidlər bunun üçün inşa edilməyib." |
| 54. | Şeytanı söymək | "Şeytanı söyməyin, onun şərrindən Allaha sığının." "Səhabələrdən biri deyir: Mən Peyğəmbərlə (Sallallahu aleyhi və salləm) bir miniyin üzərində idim. Birdən miniyi büdrədi və mən: şeytanı görüm həlak olsun! – dedim. Peyğəmbər (Sallallahu aleyhi və salləm) dedi: şeytanı görüm həlak olsun! – demə. Sən belə deyəndə şeytan qürurlanıb ev böyüklükdə olur və: mənim gücüm budur – deyir. Belə halda "bismilləh" de. Sən bu kəlməni deyəndə şeytan kiçilib milçək kimi olar. " |
| 55. | Qızdırma xəstəliyini söymək | "Qızdırma xəstəliyini söyməyin. Od dəmirin pasını təmizlədiyi kimi, o da Adəm övladının günahlarını elə təmizləyir. " |
| 56. | İnsanları pis yola çağırmaq | "Kim insanları pis yola çağırarsa, o da həmin işləri görənlər kimi günah qazanar və onların günahından heç nə azalmaz." |
| 57. | İçməyə aid qadağalar | "Peyğəmbər (Sallallahu aleyhi və salləm) tuluğun və ya bardağın ağzından su içməyi qadağan etmişdir." "Peyğəmbər (Sallallahu aleyhi və salləm) ayaq üstə su içməyi qadağan etmişdir." |
| 58. | Qızıl və gümüş qablarda su içmək | "Qızıl və gümüş qablarda su içməyin. İpək və dibac geyinməyin. Bunlar dünyada onlar üçün, axirətdə isə sizin üçündür." |
| 59. | Sol əl ilə içmək | "Heç kəs sol əli ilə yeyib içməsin. Çünki sol əl ilə şeytan yeyib içər." |
| 60. | Qohumluq əlaqələrini kəsmək | "Qohumluq əlaqələrini kəsən cənnətə girməz." |
| 61. | Peyğəmbərə (Sallallahu aleyhi və salləm) salavat deməyi tərk etmək | "Mənim adım çəkiləndə mənə salavat oxumayanın burnu yerlə sürünsün." "Paxıl insan, yanında adım çəkildikdə mənə salavat deməyən insandır." |
| 62. | İt saxlamaq | "Kim ov və ya qoyun itindən başqa, it saxlayarsa, hər gün savabından iki qirat azalar." |
| 63. | Canlılara əzab vermək | "Pişiyi öləne qədər həbsdə saxlayan qadın buna görə cəhənnəmə daxil olmuşdur." "Ruhu olan canlıları hədəf etməyin." |
| 64. | Heyvanların boynuna zınqırov asmaq | "İt və zınqırov olan dəstəni mələklər müşayiət etməzlər." "Zınqırov şeytanın çalğı alətidir." |
| 65. | Naz-nemət verilən asi insan | "Bir insanın günahları müqabilində Allahın ona dünya neməti verdiyini görsən bil ki, bu onu azdırmaq üçündür. Sonra Peyğəmbər (Sallallahu aleyhi və salləm) bu ayəni oxudu: ***﴾(Kafirlərə) edilmiş xəbərdarlığı unutduqları zaman (küfrlərini daha da artırmaq məqsədilə) hər şeyin (bütün nemətlərin) qapılarını onların üzünə açdıq. (Kafirlər) özlərinə verilən nemətlərə sevindikləri vaxt onları qəflətən yaxaladıq və onlar (hər şeydən) məhrum oldular.﴿*** (əl-Ənam: 44)." |
| 66. | Dünyanı düşünən | "Kimin fikri-zikri dünya olarsa, Allah təala kasıbçılığı onun gözü önünə qoyar, işlərini qarışdırar, dünyadan isə qədərinə yazılanı əldə edər." |





# Əbədiyyət yolçuluğu

**Sənin yolun ya cənnətə, ya da cəhənnəmədir**

**Qəbir:** Axirətin ilk mənzili qəbirdir. Kafir və münafiq üçün odlu xəndək, mömin üçün bir bağçadır. Qəbirdə bir neçə günaha görə əzab veriləcəyi deyilmişdir. Bunlar aşağadakılardır: Sidik və nəcisdən təmizlənməmək, qənimətdən oğurluq etmək, yalan danışmaq, namaza yatıb qalmaq, Quranı tərk etmək, zina, homoseksualizm, sələm, borcu qaytarmamaq və s. Bu əməllərlə isə insan bu əzabdan qurtula bilər: Sırf Allah xatirinə edilən saleh əməllər, qəbir əzabından Allaha sığınmaq, Mülk surəsini oxumaq və s. Şəhidlər, Allah yolunda gözətçilik edənlər, cümə günü ölən, qarın ağrısından vəfat edən və b.

**Sura üfürmək:** Sur İsrafilin saxladığı buynuza bənzər böyük alətdir. O üfürmə əmrini gözləyir. Birinci qorxutma üfürməsini üfürəcəkdir. Uca Allah buyurur: "*Sur çalınacağı gün Allahın istədiklərindən başqa, göylərdə və yerdə olanlar dəhşətli bir qorxuya düşər...*" (ən-Nəml: 87). Bundan sonra bütün kainat dağılacaq. Qırx gün keçdikdən sonra diriltmək üçün ikinci dəfə üfürüləcək. Uca Allah buyurur: "*Sonra bir daha çalınan kimi onlar qalxıb müntəzir olacaqlar!*" (əz-Zümər: 68).

**Dirilmək:** Sonra uca Allah yağış yağdıracaq və bütün məxluqatın cəsədi büzdüm sümüyündən cücərəcəkdir. Onlar ölməz yeni bir məxluqa dönəcəklər. Çılpaq, ayaqyalın və sünnət olunmamış olacaqlar. Cinləri və mələkləri də görəcəklər. Onlar dünyada etdikləri sonuncu əməl ilə diriləcəklər. Ehramda olan təlbiyə duasını deyəcək, şəhid qanı axa-axa gələcək, qafil insan isə boş əyləncə ilə gələcəkdir. Peyğəmbər (Sallallahu aleyhi və səlləm) demişdir: "*Hər bir bəndə öldüyü vəziyyətdə diriləcəkdir.*" (Müslim).

**Toplanma:** Sonra uca Allah məxluqatı haqq-hesaba çəkmək üçün onları bir yerə toplayacaqdır. Bir günü əlli min il olan bu gündə onlar qorxu içində, sərxoş kimi olacaqlar. Onların dünyada yaşadıqları ömür bir saat kimi görsənəcəkdir. Günəş onların başı üzərində bir mil məsafədə olacaq və onlar əməllərinə görə tərlərində boğulacaqlar. Orada zəiflər və təkəbbürlülər boğuşacaq, kafir öz dostu, şeytanı və əzaları ilə mübahisə edəcəkdir. Onlar bir-birini lənətləyəcək, zalım barmaqlarını çeynəyə-çeynəyə: "*Vay halıma! Kaş filankəsi özümə dost etməyəydim;*" – deyəcəkdir. Cəhənnəm yetmiş min tutacaqla gətiriləcək və hər bir tutacağı yetmiş min mələk çəkəcəkdir. Kafir bu halı gördükdə nəfsini fəda etməyi və ya torpağa dönməyini arzu edəcəkdir. Zəkat verməkdən imtina edən günahkarların mal-dövləti oda dönüb onu bürüyəcək, təkəbbürlülər qarışqa kimi olacaq, xəyanətkar, qənimət oğrusu və qəsbkar biabır ediləcək, oğru oğurladığı ilə gələcək, həqiqətlər və gizli qalan işlər aşkara çıxacaqdır. Amma bu gün müttəqilərə heç bir qorxu gətirən deyil. Onlar üçün bu müddət zöhr namazının vaxtı qədər qısa olacaqdır. "*Onları ən böyük qorxu məhzun etməyəcəkdir...*" (əl-Ənbiya: 103).

**Şəfaət:** Böyük şəfaət Peyğəmbərimizə (Sallallahu aleyhi və səlləm) məxsusdur. Məhşər günündə Peyğəmbərimiz (Sallallahu aleyhi və səlləm) məxluqatın qarşılaşdığı kədərin, qorxunun qurtarması və haqq-hesabın başlaması üçün şəfaət edəcəkdir. Məhşər günündən sonra edilən digər şəfaətlər isə həm peyğəmbərlərə, həm də digərlərinə aiddir. Misal olaraq cəhənnəmə düşən möminlərin oradan çıxarılmasını, yaxud dərəcələrin yüksəldilməsi üçün şəfaəti göstərmək olar.

**Haqq-hesab:** İnsanlar cərgə-cərgə Allaha ərz olunacaq və O da onlara əməllərini göstərəcək, sorğu-sual edəcəkdir. Suallar ömrünü, gəncliyini və malını nəyə sərf etdiyindən, elmindən, əhdindən, nemətlərdən, eşitmə və görmə qabiliyyətindən, qəlbindən olacaqdır. Kafirlər və münafiqlər məxluqatın önündə sorğu-sual olunacaqlar. Əməllərinin nə qədər çirkin olduğunu və qarşılarına qaçılmaz dəlil-sübutun qoyulduğunu onlara bildirmək üçün belə ediləcəkdir. İnsanlar, yer, günlər, gecələr, mal-dövlət, mələklər və öz əzaları onlara qarşı şahidlik edəcəklər. Onların günahı sübut olunacaq və özləri də bunu təsdiqləyəcəklər. Allah təalə mömini təklikdə sorğu-sual edəcək və günahlarını ona etiraf etdirəcək. Onun həlak olduğunu gördükdə ona deyəcəkdir: "Bu günahlarını dünyada gizli saxlamışdım, bu gün isə onları bağışlayıram." Muhəmmədin (*Sallallahu aleyhi və səlləm*) ümməti ilk sorğu-sual olunacaqdır. Onlardan soruşulan ilk əməl namaz, ilk hökm isə qan haqqında olacaqdır.

**Əməl dəftərlərinin uçması:** Sonra əməl dəftərləri uçacaq və "***heç bir kiçik və böyük günahı gözdən qaçırmadan sayıb yazmış!***" kitabı götürəcəkdir. Mömin kitabını sağ tərəfi ilə, kafir və münafiq isə kitabını sol və arxa tərəfindən götürəcəkdir.

**Tərəzi:** Sonra mükafatların verilməsi üçün bəndələrin əməlləri tərəziyə qoyulacaqdır. Bu iki gözlü həqiqi tərəzidir. Allah üçün ixlasla edilmiş şəriətə müvafiq əməllər tərəzidə ağır gələcək. Tərəzidə ağır gələn əməllərə misal olaraq "Lə iləhə illəllah...", gözəl əxlaq, "əlhəmdulilləh", "Sübhənəllah və bihəmdihi sübhənəllahi-l-azim" zikrləri demək olar. İnsanların yaxşı və pis əməlləri tərəzidə ölçüləcək və müvafiq hökm veriləcəkdir.

**Hovuz:** Sonra möminlər hovuz başına gələcəklər. Bu hovuzun suyundan bir dəfə içən bir daha susayan deyil. Hər bir peyğəmbərin öz hovuzu olacaqdır. Ən böyük hovuz isə Peyğəmbərimiz Muhəmmədin (*Sallallahu aleyhi və səlləm*) hovuzu olacaqdır. Onun suyu süddən ağ, baldan dadlı, müşki-ənbərdən daha ətirlidir. Hovuzun qızıldan və gümüşdən olan qədəhləri ulduzların sayı qədərdir. Uzunluğu isə İordaniyanın Əylə şəhərindən Yəmənin Ədən şəhərinə qədər olan məsafədən də çoxdur. Onun suyu "Kövsər" çayından qaynaqlanır.

**Möminlərin imtahanı:** Məhşər gününün sonunda kafirlər ibadət etdikləri ilahların ardınca gedəcək və onları qoyun sürüsü kimi ayaq üstə və ya üzü üstə cəhənnəm oduna aparacaqlar. Meydanda yalnız möminlər və münafiqlər qalacaqlar. Uca Allah onlara deyəcək: "**Nə gözləyirsiniz?**" Onlar: "Biz Rəbbimizi gözləyirik" – deyə cavab verəcəklər. O öz baldırını açdıqda hər kəs Onu tanıyacaq və münafiqlərdən başqa, hər kəs Ona səcdə edəcəkdir. Uca Allah buyurur: "***Baldır açılacağı zaman səcdəyə dəvət olunacaqları gün onlar buna qadir olmayacaqlar.***" (əl-Qələm: 42). Sonra onlar, Onun ardınca gedəcək, Sirat körpüsü qoyulacaq və hər kəsə nur verəcəkdir. Münafiqlərin nuru isə sönəcəkdir.

**Sirat körpüsü:** Bu möminlərin cənnətə daxil olmaları üçün cəhənnəm üzərində qoyulmuş körpüdür. Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) onu bu sözləri ilə vəsf etmişdir: "***O sürüşkəndir. Üzərində qarmaqlar və tükdən nazik, qılıncdan iti dəmir şişlər vardır.***" (Müslim). Hədisdə deyilir ki, möminlərə əməllərinə görə nur

veriləcəkdir. Ən yüksəkdə olanlara dağlar böyüklükdə, ən aşağıda olanlara isə ayağının çöçələ barmağı qədər nur veriləcəkdir. Nur işıq saçdıqda onlar da öz əməlləri qədər irəli gedəcəklər. Möminlərin bəzisi bir göz qırpımında, bəziləri isə ildırım, külək, quş, cıdır və minik atı sürətində keçəcəklər. "*Körpünü keçən qurtular, şişə keçən də oradan keçər, qarmağa keçən isə cəhənnəmə gedər.*" (Buxari və Müslim). Münafiqlərin nuru olmadığından geri qayıdacaqlar. Möminlərlə onlar arasında divar çəkiləcək. Onlar körpünü keçmək istəyəndə cəhənnəmə düşəcəklər.

**Cəhənnəm:** Cəhənnəmə kafirlər, bəzi günahkar möminlər və münafiqlər düşəcəklər. Onun yeddi qapısı vardır. Atəşi isə dünya atəşindən yetmiş dəfə güclüdür. Kafirin bədəni orada böyüyəcəkdir ki, əzabı daha çox hiss etsin. Onun iki çiyninin arası üç günlük yol məsafəsi, dişi Uhud dağı qədər böyük olacaqdır. Dərisi də codlaşacaqdır. Onların içəcəkləri mədələrini deşəcək qaynar su, yeməkləri isə zəqqum, irin və qanlı su olacaqdır. Orada ən yüngül əzab çəkənin ayağının altına köz qoyduqda beyni qaynayacaqdır. Dərinliyi isə çox dərindir. Əgər təzə doğulmuş uşaq oraya atılsa, dibinə çatmamış yetmiş yaşı tamamlanar. Onun yanacağı kafirlər və daşlardır. Havası qaynar, kölgəsi qara tüstüdür. O, heç kəsi sağ qoymaz və salamat buraxmaz. Dərini yandırıb sümüyə keçər, ürəkləri yandırıb-yaxar. O qəzəblənər, nərə çəkər, hər min nəfərdən doqquz yüz doxsan doqquzunu qapar. Libası isə oddur.

**Qəntərə:** Peyğəmbər (*Sallallahu aleyhi və səlləm*) demişdir: "*Möminlər oddan qurtulduqdan sonra cənnət ilə cəhənnəm arasında qəntərədə saxlanılarlar. Bir-birindən dünyada ikən aralarında olan zülmün qisası alınar. Onlar təmizlənib paklığa çıxdıqda cənnətə daxil olmalarına icazə verilər. Muhəmmədin nəfsi əlində olana and olsun, onlar cənnətdəki evlərinin yerini dünyadakı evlərindən daha yaxşı tanıyacaqlar.*" (Buxari).

**Cənnət:** Ora möminlərin qayıdış yeridir. Onun hörgüsü gümüş və qızıldan, boyağı müşki-ənbərdən, çınqıl daşları yaqut və ləl-cəvahiratdan, torpağı isə zəfərandandır. Onun səkkiz qapısı vardır. Hər qapının eni üç günlük yol uzunluğundadır. Amma yenə də bu qapının önündə izdiham yaşanacaqdır. Oranın yüz dərəcəsi var. Bir dərəcə ilə digəri arasında göy ilə yer arasındakı qədər məsafə vardır. Firdovs cənnəti ən yüksək mərtəbədir. Cənnətin çayları da oradan qaynaqlanır. Tavanı isə ər-Rəhmanın ərşidir. Onun çayları xəndəksiz axır və mömin oradan istədiyi kimi keçə bilir. Çayların mayesi bal, süd, içki və sudur. Qidaları daimidir və iştahası çəkən adama özü yaxınlaşır. Orada ləl-cəvahiratdan düzəlmiş bir çadır var. Eni altmış mildir. Onun hər küncündə bir dəstə adam oturar. Oranın əhalisi həmişə gəncdir. Saçları ağarmaz və paltarları köhnəlməz. Orada nə kiçik, nə də böyük subaşı vardır. Heç orada natəmizlik də yoxdur. Daraqları qızıldan, ətirləri müşki-ənbər, qadınları gözəl, bakirə və gəncdir. Oraya ilk daxil olan Muhəmməd (*Sallallahu aleyhi və səlləm*) və digər peyğəmbərlər olacaqlar. Ən az nemət arzu edənə istədiyinin on qatı veriləcəkdir. Xidmətçiləri isə səpələnmiş mərcan dənələri kimi əbədi yaşayan gənc oğlanlardır. Oranın ən böyük neməti isə Allahı görmək, Onun rizası və daimi həyatdır.

# DƏSTƏMAZ



Dəstəmazsız namaz məqbul sayılmır. Dəstəmaz mütləq təmiz, yəni orijinallığını itirməmiş su ilə alınmalıdır. Misal olaraq dəniz, quyu, çay və bulaq sularını qeyd etmək olar.

**Diqqət!** Az miqdarda su murdar şeylərin qarışması ilə dərhal murdar olur. Çox miqdarda, yəni 210 litrdən çox olan su isə dərhal murdar olmur. Əɷər suyun rənɷi, dadı və ya iyi dəyişərsə o zaman murdar sayılır.



Dəstəmaz "*bismillah*" kəlməsi ilə başlanır. Hər dəfə dəstəmaz alarkən əvvəlcə əlləri biləklərə qədər yumaq yaxşıdır. Səhər yuxudan durduqda isə əlləri mütləq yumaq lazımdır.

**Diqqət!** Dəstəmaz alarkən hər əzanın üç dəfədən çox yuyulması bəyənilmir.



Ağızı bir dəfə yaxalamaq vacibdir. Üç dəfə yaxalamaq isə daha yaxşıdır.

**Diqqət!** **1.** Ağızın yaxalanması üçün suyu sadəcə ağıza almaq kifayət deyil. Suyu ağızda mütləq dövr etdirmək lazımdır. **2.** Ağızı yaxalayarkən misvakdan istifadə etmək yaxşıdır.



Buruna bir dəfə su almaq vacib, üç dəfə isə yaxşıdır.

**Diqqət!** Burunu təmizləmək üçün sadəcə su vurmaq kifayət deyil. Suyu mütləq nəfəsi ilə buruna idxal etməlidir. Sonra suyu əl ilə deyil, nəfəsi ilə ɷeri qaytarmalıdır.



Üzü bir dəfə yumaq vacib, üç dəfə yumaq isə yaxşıdır. Üzün yuyulması dedikdə, bir qulaqdan diɷər qulağa, çənə sümüyünün aşağı hissəsindən baş tüklərinin bitdiyi hüduda qədər yumaq nəzərdə tutulur. Bu vacibdir.

**Diqqət!** Seyrək bitmiş saqqala su yeritmək vacib, sıx bitmiş saqqala su yeritmək isə müstəhəbdir *(yaxşıdır)*.



Qollar barmaqların ucundan dirsəklərə qədər bir dəfə yuyulur. Bir dəfə yumaq vacib, üç dəfə isə yaxşıdır.

**Diqqət!** Birinci sağ, sonra sol əlini yumaq müstəhəbdir *(yaxşıdır)*.



Sonra başın hər tərəfinə məsh çəkilir. Məsh çəkərkən şəhadət barmağı qulaq boşluğuna daxil edilir və baş barmaqla qulağın arxasına sürtülür. Bunu yalnız bir dəfə etmək lazımdır.

**Diqqət!** 1. Başın məsh çəkilən vacib hissəsi alından ənsəyə qədərdir. 2. Saçın uzanan hissəsinə məsh etmək vacib deyildir. 3. Əɷər başda tük yoxdursa baş dərisinə məsh çəkilir.



Sonra hər iki ayaq topuqlarla birlikdə bir dəfə yuyulur. Bir dəfə yumaq vacib, üç dəfə isə yaxşıdır.

**Önəmli məlumatlar:**

**1.** Dəstəmazda yuyulan əzalar dörddür: **A.** Ağız ilə burunun yaxalanması və üzün yuyulması. **B.** İki əlin yuyulması. **C.** Başa və qulaqlara məsh etmək. **D.** Ayaqları topuqlarla birlikdə yumaq. Dəstəmaz əsnasında əzaları deyilən ardıcıllıqla yumaq vacibdir. Bu ardıcıllığın pozulması dəstəmazı batil edir.

**2.** Əzaların yuyulması zamanı uzun fasilə vermək olmaz. Əzanı yuyarkən, özündən əvvəlki əza quruyana qədər fasilə vermək dəstəmazı pozur.

**3.** Dəstəmazdan sonra bu duanı demək sünnədir: "***Əşhədu əllə iləhə illəllah vahdəhu lə şərikə ləhu və əşhədu ənnə Muhəmmədən abduhu va rasuluh***". Şəhadət verirəm ki, Allahdan başqa ibadətə haqqı olan heç bir məbud yoxdur. O təkdir, şəriki yoxdur. Şəhadət verirəm ki, Muhəmməd Onun qulu və elçisidir.

# NAMAZ TƏLİMİ



Namaz qılmaq istədikdə ayaq üstə dayanıb "Allahu əkbər" deyirsən. Camaata imamlıq edən kimsə, bu və digər təkbirləri səslə deyir ki, arxada namaz qılanlar da eşitsinlər. İmamdan qeyrisi təkbirləri səssiz deyirlər. Təkbir edərkən əl barmaqları bitişik halda iki əlini çiyinlər bərabərinə qaldırır. İmama tabe olanlar imamdan sonra təkbir edirlər.

**Diqqət!** Rükun və ya vacib hesab olunan sözlər, insanın özü eşidən səslə oxunmalıdır. Bu, səssiz qılınan namazlara da aiddir. Səsli oxumağın ən az həddi oxuduğunu başqasına eşitdirməkdir. Səssiz oxumağın ən az həddi oxuduğunu özünə eşitdirməkdir.



Sağ əli ilə sol əlini və ya biləyini tutur və onları sinəsinin altına yerləşdirir. Gözlər isə səcdə yerinə baxır. Hədislərdə deyilən bəzi dualar ilə namazını açır. Məsələn, **«Sübhanəkə Allahummə və bihəmdikə və təvarəkə ismukə və təalə cəddukə və lə iləhə ğəyrukə». «Ey Allahım, Sən naqisliklərdən paksan. Sənə həmd edirik. Sənin adın müqəddəs, cəddin ucadır. Səndən başqa haqq ilah yoxdur».** Sonra *"Əuzu billəhi minə-ş-şeytanir-r-əcim"*, *"Bismilləhi-r-Rəhmani-r-Rəhim"* deyir. Bu deyilənlərin heç birini aşkar səslə oxumur. Sonra **Fatihə surəsini oxuyur**. İmamın arxasında dayanan adamın aşkar səslə qılınan rükətlərdə Quran oxuması vacib deyildir. İmam oxunuşda fasilə verdiyi anlarda, yaxud səssiz olduğu hallarda arxadakıların fatihəni oxuması müstəhəbdir *(yaxşıdır)*. Fatihədən sonra Qurandan istədiyi surəni, ayəni oxuyur. İmam Sübh namazını, İşa və Məğrib namazlarının ilk iki rükətlərini aşkar səslə oxuyur. Digər namazları isə gizli səslə oxuyur.

**Diqqət!** Yaxşı olar ki, surələr Quranda yazılan ardıcıllıqla oxunsun. Bunun əksi bəyənilmir. Quranın sözlərinin ardıcıllığını dəyişib, yaxud eyni surənin ayələrini dal-qabaq oxumaq haramdır.



Sonra əllərini qaldırıb təkbir edir və rükuya gedir, diz qapaqlarını ovuclayırmış kimi əllərini diz qapaqlarına qoyur və barmaqlarını aralı tutur. Belini düz, başını isə dik tutur. Rükuda üç dəfə **"Sübhanə rəbbiyəl azim"** *(Əzəmətli Rəbbim nöqsanlardan və eyiblərdən pakdır)* – deyir. Namazda rükuya qoşulmaqla həmin rükəti qılmış sayılırsan.

**Diqqət!** ***"Təkbir"*** və ***"Səmiəllahu limən həmidəh"*** sözlərini nə hərəkətdən öncə, nə də sonra deyil, hərəkət əsnasında demək lazımdır. Bu, namazın bütün təkbirlərinə aiddir. Əgər bunu qəsdən gec deyərsə, namazı batil olar.



Sonra ***"Səmiəllahu limən həmidəh"*** *(Allah ona həmd edənin duasını qəbul edər)* – deyərək, rükudan qalxır və əllərini qaldırır. Ayaq üstə tam düz dayandıqdan sonra deyir: ***"Rabbənə va ləkəl həmd. Həmdən kəsirən, tayyibən, mubarəkən fihi. Milə-s-səmavati və mil-ələrdi və milə mə şitə min şeyin bədu.*** *(Rəbbimiz Sənə həmd olsun! Allahım Sənə göylər və yer dolusu, onların arasında və Sənin istədiyin qədər Sənə həmd olsun!)*

**Diqqət!** ***"Rabbənə va ləkəl həmd."*** sözlərini rükudan qalxarkən deyil, rükudan tam qalxdıqdan sonra demək lazımdır.



Sonra təkbir edib səcdəyə gedir. Qollarını böyürlərindən, qarnını isə baldırlarından aralı tutur. Əllərini isə çiyinləri bərabərliyində saxlayır. Əl barmaqlarını və ayaq barmaqlarının ucunu qibləyə tərəf yönəldir, ayaqlarını isə dik tutur və üç dəfə bu sözləri deyir: ***"sübhanə rabbiyəl alə"*** *(uca Rəbbim nöqsanlardan pakdır)*.

**Diqqət!** Səcdə yeddi əza üzərində edilməlidir. Ayaqların ucu, iki diz, iki əl və burunla alın. Üzrsüz, yaxud qəsdən yeddi əzadan birini yerə qoymayanın namazı batil olur.



Sonra təkbir edib səcdədən qalxır və oturur. İki səcdə arasında oturmaq üçün iki doğru oturuş növü vardır. **1.** Sol ayağını yayıb üzərində oturmaq. Sağ ayağını isə dik tutub, barmaqlarının ucunu qibləyə yönəltmək. **2.** Hər iki ayağını dik tutub, barmaqlarını qibləyə yönəldib dabanları üzərində oturmaq. Bu oturuş zamanı üç dəfə *"Rəbbiğfirli"* (*Rəbbim məni bağışla*) – deyilir. İstəyərsə ***"vərhəmni, vəcburni, vərfəni, vəhdini, vəafini, vərzuqni"*** (*mənə rəhm et, Öz xəzinəndən məndən aldıqlarının əvəzini ver, məni ucalt, məni hidayət yoluna yönəlt, mənə rahatlıq bəxş et və ruziləndir*) – sözlərini də əlavə edə bilər.

Sonra ikinci səcdəni də birinci səcdə kimi edir. Təkbir edib səcdədən durur və ikinci rükəti qılmaq üçün ayağa qalxır. İkinci rükəti də eynilə birinci kimi qılır.

Diqqət! Fatihəni ayaq üstə olarkən oxumaq lazımdır. Ayağa qalxarkən qamətini tam düzəltməmiş fatihəni oxumağa başlayarsa, tam düzələndən sonra fatihəni yenidən oxumağa başlamalıdır. Əks halda namazı batil olar.



İkinci rükəti bitirdikdən sonra sağ ayağını dik tutub barmaqlarının ucunu qibləyə yönəldir və sol ayağını yayıb birinci təşəhhüdü oxumaq üçün oturur. Sağ əlini sağ baldırının, sol əlini isə sol baldırının üzərinə qoyur. Çeçələ barmağı ilə adsız barmağını bükür, baş barmağı ilə orta barmağını **halqa şəklində birləşdirir, şəhadət** barmağı ilə işarə edir və deyir: ***"Əttəhiyyatu lillahi vəs səlavatu vət tayyibatu, əssəlamu aleykə əyyuhən nəbiyyu və rəhmətullahi və bərəkatuhu, əssəlamu aleynə və alə ibadillahis salihin. Əşhədu əllə iləhə illəllah və əşhədu ənnə Muhəmmədən abduhu və rəsuluhu».*** (*Ən gözəl salamlar, namazlar və yaxşı işlər Allaha məxsusdur. Ey Allahın Peyğəmbəri, sənə Allahın salamı,rəhməti və bərəkəti olsun. Bizə və Allahın əməlisaleh bəndələrinə Allahın salamı olsun. Mən şəhadət verirəm ki, Allahdan başqa ibadətə layiq olan haqq məbud yoxdur. Şəhadət verirəm ki, Muhəmməd Allahın qulu və elçisidir*). Üçrükətli və dördrükətli namazı qılmaq üçün təkbir edib əllərini qaldıraraq ayağa qalxır. Qalan rükətləri də eynilə qılır. Amma bu rükətləri aşkar səslə qılmır. Yalnız fatihə surəsini oxuyur.




Sonra sonuncu təşəhhüdü oxumaq üçün oturur. Əgər namaz üçrükətli və ya dördrükətlidirsə təvərrük oturuşu oturur. Bu oturuşun bir neçə növü var və hamısı doğrudur: 1. Sol ayağını yerə yatırır, sağ ayaq pəncəsinin qarşısından, baldırının altından keçirir, sağ ayağını dik tutur, oturacağını da yerə qoyur. 2. Sol ayağını yerə yatırır, sağ ayaq pəncəsinin qarşısından, baldırının altından keçirir, sağ ayağını yerə yatırır, oturacağını da yerə qoyur. 3. Sol ayağını yerə yatırır, sağ ayağını baldırının və budunun arasına keçirir, oturacağını isə yerə qoyur. Bu oturuşu iki təşəhhüdlü namazların sonuncu rükətində oturur. Oturuş zamanı birinci təşəhhüdü oxuyur və sonra bunları əlavə edir: "**Allahummə salli alə Muhəmmədin və alə ali Muhəmməd, kəmə salləytə alə ali İbrahimə innəkə həmidun məcid. Allahummə barik alə Muhəmmədin və alə ali Muhəmməd, kəmə barəktə alə ali İbrahimə innəkə həmidun məcid".** Bundan sonra bəzi duaları da oxumaq yaxşıdır. Məsələn, "Allahummə inni əuzu bikə min azəbi cəhənnəm, və min azəbi-l-qabr, və min fitnəti-l-məhya və-l-məmat, və min şərri məsihi-d-dəccal".



Sonra "Əssəlamu aleykum və rəhmətullah" – deyib, birinci sağ tərəfə, sonra sol tərəfə salam verir.

Salam verdikdən sonra oturan yerdə namazdan sonra oxunan dua və zikrləri oxuyur.

# Bilmək əməl etməyi tələb edir.

Əməlsiz elm, uca Allah, peyğəmbəri (Sallallahu aleyhi və səlləm) və möminlər tərəfindən məzəmmət olunur. Uca Allah buyurur: *"Ey iman gətirənlər! Etməyəcəyiniz bir şeyi niyə deyirsiniz? Etməyəcəyiniz bir şeyi demək Allah yanında böyük qəzəbə səbəb olar".* (əs-Saff: 2,3).

Əbu Hureyrə deyir: *"Əməl olunmayan elm, Allah yolunda xərclənməyən xəzinə kimidir".*

Fudeyl deyir: *"Alim bildiyinə əməl etmədikcə o barədə cahil olaraq qalar".*

Malik ibn Dinar demişdir: *"İnsan var ki, danışanda dili heç vaxt topuq vurmur. Amma əməllərinə baxdıqda başdan-ayağa topuq vurur".*

**Müsəlman qardaşım, müsəlman bacım:**

Uca Allah bu faydalı kitabı oxumağı sənə nəsib etdi. Oxuduğunun səmərəsi qalıb, o da, oxuduğuna əməl etməkdir.

*** Kitabda Qurani Kərimin bəzi surələrini və onların təfsirini oxudun.** Oxuduğun ayələrdən çıxardığın mənalara əməl etməyə çalış. Peyğəmbərin (Sallallahu aleyhi və səlləm) əshabələri "*ondan on ayə öyrənər, ayələrin elmi məzmununu və hansı əməli tələb etdiyini öyrənməmiş digər ayələrə keçməzdilər*". Onlar deyərdilər: "**Biz elmi və əməl etməyi öyrənirdik**". Belə ki, şəriətimiz bu işə təşviq etmişdir. İbn Abbas uca Allahın bu ayəsi haqqında deyir: "*Verdiyimiz kitabı layiqincə oxuyanlar həmin kitaba iman gətirənlərdir...*" (əl-Bəqərə: 121). *Yəni "onlar bu kitaba layiqincə riayət edərdilər".* Fudeyl deyir: "*Quran əməl olunmaq üçün nazil edilmişdir. İnsanlar isə onu oxumağı əməl kimi qəbul edirlər*".

*** Kitabda Peyğəmbərin (Sallallahu aleyhi və səlləm) sünnəsindən bəzi hədislərlə qarşılaşmısan.** Bu hədislərə anında cavab ver və əməl et. İslam ümmətinin ən xeyirli zümrəsi öyrəndiklərinə əməl edər, insanları da bu xeyrə çağırardılar. Onların örnəyi Peyğəmbərin (Sallallahu aleyhi və səlləm) bu hədisidir: "*Mən sizə bir işi əmr etdikdə bacardığınız qədər əməl edin. Qadağan etdiklərimdən isə əl çəkin.*" (Buxari, Müslim). Onlar həmçinin uca Allahın vəd etdiyi şiddətli əzabdan ehtiyat edərdilər. *﴾...Peyğəmbərin əmrinə qarşı çıxanlar başlarına gələcək bir bəladan, yaxud düçar olacaqları şiddətli bir əzabdan həzər etsinlər!﴿* (ən-Nur: 63).

**Nümunə olaraq bunları qeyd etmək olar:**

- Möminlərin anası Ummu Həbibə belə hədis rəvayət edir: "*Kim sutka ərzində on iki rükət namaz qılarsa bununla onun üçün cənnətdə ev tikilər*". (Müslim). Ummu Həbibə deyir: "**Bu sözləri Peyğəmbərdən (Sallallahu aleyhi və səlləm) eşidəndən sonra heç vaxt bu namazları tərk etməmişəm**".
- İbn Ömər belə bir hədis rəvayət edir: "*Nə isə vəsiyyət etmək istəyən müsəlmanın iki gün keçməmiş vəsiyyətinin yazılıb hazır olmaması ona yaraşmaz*" (Müslim). İbn Ömər hədisi rəvayət etdikdən sonra dedi:

**"Peyğəmbərin (Sallallahu aleyhi və səlləm) bu sözləri dediyini eşitdikdən sonra hər gecə vəsiyyətim başımın altında olub".**

- İmam Əhməd ﷺ deyir: **"Yazdığım hər bir hədisə əməl etmişəm. Hətta bir dəfə belə bir hədis oxudum ki, Peyğəmbər (Sallallahu aleyhi və səlləm) qan aldırıb və Əbu Taybə adlı adama bir dinar verib. Mən də qan aldırıb qan alan adama bir dinar verdim".**
- İmam əl-Buxari ﷺ deyir: **"Qeybətin haram olmasını eşitdikdən sonra heç kəsin qeybətini etməmişəm. Mən dua edirəm ki, Allahın hüzurunda haqq-hesab verəcəyim zaman məni kiminsə qeybətini etdiyimə görə sorğu-sual etməsin".**
- Peyğəmbər (Sallallahu aleyhi və səlləm) demişdir: **"Kim hər namazdan sonra Kürsü** *(əl-Bəqərə 255)* **ayəsini oxuyarsa cənnətə daxil olmasına yalnız ölüm mane olar".** *(Nəsai). İbn əl-Qeyyim* ﷺ deyir: **"Şeyxul İslamın belə dediyini eşitmişəm: Mən bunu namazdan sonra yalnız unudaraq tərk edə bilərdim".**
- Elm və əməldən sonrakı məsuliyyət, uca Allahın sənə bəxş etdiyi xeyri təbliğ etməkdir. Nə özünü savabdan, nə də başqasını xeyirdən məhrum etmə. Peyğəmbər (Sallallahu aleyhi və səlləm) demişdir: ***"Kim bir insanı xeyrə yönəldərsə o da onu edən kimi savab qazanar".*** (Müslim). Digər hədisdə Peyğəmbər (Sallallahu aleyhi və səlləm) demişdir: ***"Sizin ən xeyirliniz Quranı öyrənən və öyrədəndir".*** (Buxari). Bir hədisdə isə belə demişdir: ***"Heç olmazsa məndən bir ayə çatdırın".*** (Buxari, Müslim). Sən xeyirli işləri çox təbliğ etdikcə savabın da bir o qədər çox olar. Həm sağlığında, həm də ölümündən sonra savabın olar. Peyğəmbər (Sallallahu aleyhi və səlləm) demişdir: ***"İnsan öldükdə üç əməlindən başqa bütün əməlləri dayanar. Daimi sədəqə, faydalı elm və ya onun üçün dua edəcək əməlisaleh övlad".*** (Müslim).

**Nəzər nöqtəsi:** Biz hər gün əl-Fatihə surəsini on yeddi dəfədən çox oxuyuruq. Orada "**Allahın qəzəbinə gəlmişlərdən**" və "**yolunu azmışlardan**" Allaha sığınırıq. Sonra qəzəbə və azğınlığa düşənlərin etdiklərini edirik. Öyrənirik, amma əməl etmirik. Bu, qəzəbə düçar olmuşların simasıdır. Yaxud öyrənməyib cahil qalırıq. Bu da, yolunu azmışların simasıdır.

Uca Allahdan diləyirik ki, həm bizə, həm də sənə faydalı elm və saleh əməllər nəsib etsin.

Daha doğrusunu Allah bilir. Peyğəmbərimizə, ailəsinə və əshabına Allahın salavatı və salamı olsun.

